*Çapa hazırlayan və*
*elmi redaktoru:*

**AYBƏNİZ KƏNGƏRLİ**
***filologiya elmləri doktoru***

**Behruz Həqqi. Türk deyimləri.**
**Bakı, "Nurlan", 2005.**

Almaniyada yaşayan tanınmış yazıçı-alim Behruz Həqqinin "Türk deyimləri" kitabı onun Azərbaycanda nəşr olunan üçüncü kitabıdır. Kitabda ilk dəfə olaraq Azərbaycan və ümumiyyətlə, türk xalq deyimlərindən örnəklər toplanmışdır. Hər bir deyimin izahı və həmin deyimlə bağlı bədii əsərlə-dən seçilmiş nümunələr də oxucuya təqdim edilir. Kitab dilçilər, folklorşünaslar, bütövlükdə geniş oxucu kütləsi üçün nəzərdə tutulmuşdur.

$H\frac{4702000000}{N-098-2005}$ *Qrifli nəşr*



## ÖN SÖZ

***Türkün dili tək sevgili, istəkli dil olmaz,***
***Özgə dilə qatsan, bu əsil dil əsil olmaz.***
***Türkün məsəli, folkloru dünyada təkdir,***
***Xan yorğanı, kənd içrə məsəldir, mitil olmaz.***
*Seyid Məhəmmədhüseyn Şəhriyar*

Bu kitabda tarixin ən əski, ən mədəni millətlərindən olan, ürəyi sevgi ilə dolu türkün zəngin dilinin maraqlı deyimləri toplanıbdır. Türk islamı qəbul edərək onu Şərqin, hətta Avropanın bir çox ölkələrinə yaymaqla türk dilini də islam imperatorluğuna rəsmi dil kimi yayıbdır. Türk sözü Miladdan 2000 ildən də çox öncədən "köçəri" anlamında işlənibdir. Ensiklopediyalarda "doğuş" və "artım" anlamında işlənilir. İslam ensiklopediyasında bu günkü türklər "Hi unq-un" adlandırılıb. Türklər min illər öncə əsil vətənindən, yəni Orta Asiyadan, Quzey Çindən müxtəlif səbəblərə görə köçmək məcburiyyətində qalıbdır. Türklər Tiyan-Şan dağlarından aşaraq, böyük, geniş bir məntəqədə - Kaşğar, Soğd, Fərqanə, İran, Midiya, Qafqazdan ta Qara dəniz boğazına, Əlcəzairə qədərki ərazilərdə yerləşibdir. Orxon abidələrində türk "xalq", "kütlə" mənasında işlədilibdir. Ola bilər ki, Orxon abidələrində "türk" dedikdə hökmdarlar, onların ailəsi nəzərdə tutulmuşdur. "Toğuz"-"oğuz" bu abidələrdə "türk" sözü ilə həmqafiyə kimi işlədilmişdir. Bu fərqlə ki, "türk" sözü el, tayfa kimi nəzərdə tutulmuşdur. Minorski yazır ki, "türk" – qüdrət və güc anlamındadır. Bəzi alimlərin nəzərinə görə, "türk" sözü törəmə, soyartımı mənasındadır. Çin və yunan tarixçiləri miladın 6-cı yüzilliklərindəkı hadisələrdən bəhs edərək, bu qəbiləni "tokut" və ya "turkey" adı ilə yad edirlər.

Türkün qədim tarixi onun fatehlik və mədəniyyət sahəsində üstünlüklərinin tarixidir.

Monteskye "İran məktubları" adlı əsərində Naarqomun dilindən Özbəyə məktubunda türklər barədə belə yazmışdır:

"Əziz dostum Özbək, dünyanın heç bir xalqı fatehlik şöhrəti və əzəməti ilə tatarlarla (türklərlə –B.H.) yarışa bilməz. Bu xalq kainatın əsil hökmranıdır. Bütün başqa xalqlar sanki onlara qulluq etmək üçün yaranmışlar. Bu xalq həm imperatorluqlar yaradır, həm də onları dağıdır. Onlar tarixin bütün dövrlərində dünyanı öz qüdrətləri ilə sarsıtmış, həmişə xalqların qənimi olmuşlar. Tatarlar iki dəfə Çini fəth etmişlər və hələ də onu itaətdə saxlayırlar. Onlar Böyük moğolların ucu-bucağı bəlli olmayan torpaqlarına indi də hökmranlıq edirlər, İranın hökmranları onlar, Kuruşun və b. taxtında oturan onlardır. Onlar Moskvanı diz çökdürüblər.

Onlar türk adlanıb Avropada, Asiyada, Afrikada nəhəng fatehliklər edib, dünyanın üç qitəsində ağalıq edirlər. Əgər hələ qədim zamanlara nəzər salsaq, görərik ki, Rum imperatorluğunu darmadağın edənlər də onların nəsilləri idi. Çingiz xanın fəthləri ilə müqayisədə İskəndərin qələbələri nədir ki... Bu zəfərli xalqın yalnız tarixçiləri çatışmayıb ki, onların ağlasığmaz qələbələrinin şöhrətini yaysınlar. Nə qədər tarixi hadisələr əbədilik dəfn olunub. Tatarlar (türklər–**B.H.**) tarixlərini bilmədiyimiz nə qədər dövlətlərin əsasını qoyublar. Bu döyüşçü xalq öz gündəlik şöhrəti ilə məşğul olub əbədi məğlubedilməzliyinə inanıb, keçmiş qələbələrinin əbədiləşdirilməsi qayğısına qətiyyən qalmamışdır. (346, səh. 4).

Türklər təkcə fateh millət kimi deyil, həm də dünyanın ən qədim mədəniyyətinin yaradıcıları kimi də tarixə əbədilik daxil olmuşlar. Bu mədəniyyətin yaranmasında Azərbaycan türklərinin də rolu böyükdür.

Vil Dorant yazır: "Bizim Avropa və Amerika mədəniyyətimiz əsrlər boyu Yunanıstan və Roma yolu ilə həmin Yaxın Şərq mədəniyyətindən alınmışdır. Azərbaycan diyarı da həmin Yaxın Şərq torpaqlarının şimal hissəsinin mərkəzində, özü də şimal-cənub, şərq, qərb yollarının kəsişdiyi yerdə, təbiətcə mülayim, sərvətli bir ölkədir. Ariyaların özləri mədəniyyət yaradıb-quran olmamışlar. Bəlkə onu Babildən və Misirdən mənimsəmişlər. Yunanlar da mədəniyyət sarayı yaradan sayılmırlar.





Ona görə ki, onların başqalarından aldıqları özlərininkindən qat-qat artıqdır. Həqiqətdə yunan bir varisdir ki, hərbi qənimətlər və ticarətlə Şərqdən oraya gəlmiş, 3 min illik elm və hünər xəzinələrinə nahaq olaraq yiyələnmişdir (336, səh. 141).

Təkcə yunanlar deyil, Hind-Avropa dilli parslar da miladdan 900 il əvvəl elam hökumətinin icazəsi ilə elam şahzadələrinin hakimiyyəti altında olan Şərq tərəfində çağdaş Fars və Kirman əyalətlərində yerləşib. İran ərazisində onlardan təqribən 3500 il əvvəl mədəniyyət sahibi olan türklərdən hər zaman istifadə edib, ayaqları yer tutandan sonra minlər hiylə və xəyanətlə yerlilərin milli mədəniyyət nümunələrini özləri ilə bərabər aradan götürməyə çalışıblar".

Azərbaycan türkcəsinin zənginliyi, digər dillərlə müqayisədə üstünlüyü bu gün də tədqiqatçılar tərəfindən dönə-dönə qeyd edilir.

Filologiya elmlər doktoru, professor Tofiq Hacıyev Azərbaycan türkcəsi haqqında yazır: "Azərbaycan türkcəsi çox təmizdir, mükəmməldir. Öz keçmişini qoruyub saxlayır. Bu günkü dilimiz çox dəhşətli şəkildə korlanıb. Bu gün dilimiz əcnəbi, yabançı təsirlərə məruz qalır" (52, səh.194).

Ehsan Doğramacı yazır: "Azərbaycan türkcəsi türk dillərinin içərisində ən gözəlidir. Hazırda türk dünyası üçün ortaq türk dili problemi vardır. Azərbaycan türkcəsi bütün türk dünyası üçün, türk xalqları üçün ortaq dil olmağa layiqdir" (52, səh.195).

Azərbaycan milli azadlıq hərəkatının öndərlərindən S.C.Pişəvəri düşmənlərin dilimizə ünvanladığı böhtanlara qarşı Azərbaycan türkcəsinin məziyyətləri barədə yazırdı: "Dilimiz, düşmənlərin boş iddialarına baxmayaraq, çox geniş yayılmış və zəngin bir dildir. Onun rişəsi xalqımızın qanında və ürəyindədir. Biz onu ana südü ilə əmib, vətənimizin ruhundakı hava ilə tənəffüs etmişik. Onu təhqir etmək istəyənlər, onu aşağılamaq istəyənlər, ona böhtanlar yağdıranlar bizim həqiqi düşmənlərimizdir. Çox xain və əcnəbi ünsürlər əsrlərlə bu gözəl dili ortadan qaldırmağa çalışmışlar. Onun tərəqqisinə, yaşamasına mane olmaq məqsədilə qəddar, azadlıq düşməni Rza xan dövləti var

qüvvəsini sərf etmişdir. Bununla belə bu dil sarsılmaz, möhkəm bir halda xalqın içərisində həmişəlik qalıb, öz məqamını saxlamış, bu vasitə ilə də mədəni, mütərəqqi bir dil olduğunu sübut etmişdir. Dilimiz dəmyə bir dil deyildir. Onun böyük xalq, geniş camaat qüvvəsi kimi arxası vardır. Dilimiz xalqın yaratdığı dastanlar, zərb-məsəllər, hekayələr, nağıllar vasitəsilə dünyanın ən böyük dilləri ilə rəqabət apara bilər. Bizim vəzifəmiz onu genişləndirmək, müasir hala salmaq, onun gözəlliklərini, incəliklərini toz-torpaq arasından çıxarıb, təmiz, ali bir zərf içərisində xalqa təqdim etməkdən ibarətdir"(30, 1945).

Türk milləti vahid bir millət olduğu üçün vahid bir ədəbi dilə də malik olması vacibdir. Təəssüflə, türk dünyasının dilinin bir olmasına baxmayaraq, türk xalqları tarixən əməldə birlikdən məhrum olduqlarına görə, uzun müddətdir ki, tarixi düşmənlərimiz bizim içimizdə ayrı-seçkilik toxumunun zəhərli meyvəsi ilə ixtilaf yaradırlar. Və ya ondan da faciəli budur ki, Azərbaycan türklərinin iki yerə bölünməsinin nəticəsi olaraq, "biz təbrizliyik", "siz naxçıvanlısınız", və ya "Aran Azərbaycanı", "o tay Azərbaycan" kimi ifadələrlə bu millətin birliyinə dözülməz zərbələr vururlar. Bu neçə ildə üzdəniraq, kimliyinə biganə olan aydıncığazların hakim ideologiyaya boyun əyib işlətdikləri, təhlükəli "qafqazlı", "azərbaycanlı", "azəri", "osmanlı türkü" sözləri ilə birliyimizi, milli varlığımızı əldən verməkdəyik. Bu uydurma sözlərin ardında gizlənən iyrənc siyasət bizim onurğa sütunumuz sayılan milli kültürümüzə, folklorumuza, onun ən incə, zərif tumurcuğu kimi nəzərdə alınan deyimlərə, milli ənənələrimizə də böyük xəstəliklər ərməğan gətirmişdir. Milli mədəniyyət və kimliyimizə xor baxan hakimiyyətlər illər boyudur ki, 300 milyondan artıq olan türkü, xüsusilə Azərbaycan və qardaş Türkiyə Cümhuriyyətini "o türk" və "bu türk" siyasəti ilə parçalayıb, yemək məqsədini işə salıbdır. Hakim rejim İranın daxilində olan 30 milyondan artıq türkə rəva gördüyü faciəli taleyi başqa ölkələrdə yaşayan türklərdən də əsirgəməyibdir. «Dünya bilir ki, o türk, bu türk yoxdur. Bunlar, fars olmayan millətlərin dilini boğazından





çıxarıb, mədəniyyətini talan edən şovinistlər bu gün o türkləri bəhanə edib, fəqət və fəqət bu günkü türk oğlu adına işgəncə, əzab vermək merammdadırlar» (315, səh. 22).

Azərbaycan dili öz tarixi boyunca olduqca mürəkkəb, ziddiyyətlər, mübarizələr dolu bir yol keçmişdir.

Dünyada yeni teatrın təməl daşını qoyan təbrizli Qulamhüseyn Saidi milli zülmdən, mədəniyyətlərin assimilyasiyasından nə gözəl və sadə dildə danışır: «Cənubi Azərbaycanda mədrəsə Azərbaycan uşaqları üçün savad öyrənmə yeri yox, bəlkə xarici dil, yəni, fars dili öyrənmək yeri idi. Ondan əvvəl, yəni Milli Hökumət dövründən əvvəl, hər gün mədrəsəyə getmək, qorxunc və böyük bir əzab idi. Elə bil uşaqları hər gün bir adaya təhvil verirdilər ki, oranın sakinləri məcbur olub yəcuc-məcuc dili ilə danışmalı idilər. Bu qəribə sözləri anlamaq işgəncədən əlavə təhqir və töhinlə də yanaşı idi. Öz dilində danışmaq da suda islanmış söyüd ağacları ilə ovucun içinə vurmaqla cəzalandırılırdı. Əgər bu ağır vəziyyət mədrəsədən qaçmaqla nəticələnməsəydi də, əvəzində həddən artıq yorucu idi. Təkcə 1945-46-cı illərdə Azərbaycanın məktəb uşaqları anladılar ki, mədrəsə də o qədər qorxunc yer deyil, ola bilər ki, dərs məşğələlərindən nəinki əzab çəkməyəsən, qorxmayasan, bəlkə ondan da ləzzət aparmaq mümkündür, Buna görə ki, birdən-birə əcnəbi dili, fars dili siniflərdən eşiyə tullandı, hamı o dildə yazıb-oxuyurdu ki, o dildə danışırdı. O bir il müddətində uşaqlar ana dillərindəki sözlərin dəqiq anlamı ilə tanış oldular. Onların təhsil aldıqları dil işçilərin, kəndçilərin və adi adamların danışdıqları dil idi. "Zəfər qazanan ordu" Azərbaycana daxil olandan sonra idi ki, dərs kitabları yenə də farsca oldu. Yerli dildə yazıb-oxumaq yasaq oldu. Buna görə ki, Azərbaycan dili Azərbaycanın özü üçün hakim rejimin nəzərində əcnəbilərin və əcnəbipərəstlərin dili olmuşdur. İranın mərkəzi hökumətinin məmurları şahənşahlıq qüdrətini rəhmsizliklə hakim etməkdə cürbəcür silahlardan başqa fars dili silahından hamısından çox istifadə edirdilər. Çarəsiz qalan adi camaatın qəzetləri və ölülər

üçün divara vurulan nekroloqları oxuyub başa düşməkdən ötəri tərcüməçiyə ehtiyacları var idi" (172, 1979, №6).

Dünya imperialistlərinin yardımı ilə Azərbaycanın milli azadlığını qanda boğan düşmənlərimiz ana dilində yazılmış kitablarımızdan tonqal qalayaraq, toy-düyün tutub 25 mindən artıq Azərbaycanı canlarından artıq sevən oğul və qızlarımızı qan dəryasında boğdular. Milli hökumət dövründə bir il azadlıq məşəlini, milli hakimiyyəti qoruyan millət, milli azadlığımızı qan dəryasında boğan ordunun hakimiyyətindən sonra "əcamir obaş"(lümpen- B.H.), "əcnəbipərəst" sözləri ilə təhqir olundu.

Tarix göstərir ki, millətlərin nicatı onların milli dillərinin, mədəniyyətlərinin yüksəlişindədir. XX yüzilin əvvəllərində Seyid Hüseyn Əlipaşa Səbura yazdığı məktubunda qeyd edirdi ki, "bizə türk dili, türk ədəbiyyatı lazımdır. "Od" əvəzinə "atəş", "qara" əvəzinə "siyah" yazmaq türk dilinə zərbələr vurmaq deməkdir ( 165, səh.272).

Dil hər bir millətin kültür və mədəniyyət həyatının təməl daşıdır. Hər bir diri millət gündəlik danışdığı dildə olan incəliklərdən, milli-ictimai ənənələrdən, boya-başa çatdığı ölkənin ab-havasından qidalanaraq, hamı üçün bəlli olan sözlərdən deyimlər yaratmaq bacarığına sahib olur ki, bunlar ümumi mənalarından ara açaraq, yeni bir anlama, yeni bir qəlibə düşürlər. Dünyanın tanınmış zəngin dillərindən olan türk dili Azərbaycandan başqa Türkiyədə və İraq sərhədlərindən tutmuş, Xorasan və Xəzər dənizinin kənarlarına qədər Şiraz, Kazron, Çahbahar, Bəndərabbas və sairə yerlərdə də işlənən bir dildir. Buna görə də, müəyyən zaman kəsiyində ümumtürk ədəbi dili, ortaq türkcə konsepsiyası özünə tərəfdarlar toplamış, nüfuzlu cərəyan kimi milli tariximizə daxil olmuşdur. Tarixdə türk dilini vahidləşdirmək, qüdrətləndirmək təşəbbüsləri zaman-zaman meydana atılmışdır. XIX yüzilin sonlarında ümumtürk ədəbi dili konsepsiyasını ilk ortaya atan İsmayıl bəy Qasprinski idi.

Məhəmməd Əmin Rəsulzadə yazırdı ki, o dövrdəki cədidçilərin lideri İsmayıl bəy, orqanları da "Tərcüman" qəzeti idi. "Dildə, fikirdə, işdə birlik!" şüarı hər nə qədər bütün





türkləri böyük bir türk dövləti halında birləşdirmək niyyəti bəsləyən bütün türkçülüyün təsəvvür etdiyi şəkildə həqiqətləşməkdən bu günkü varlığına görə çox uzaq idisə də, bu şüarı özünə bayraq edən "Tərcüman" tarixi rolunu, heç şübhəsiz, müvəffəqiyyətlə oynamışdır (166, səh.181).

"Azərbaycanda ümumtürk ədəbi dili məsələsini sistemli şəkildə irəli sürən, bu ideyanı əsərlərində olduqca ciddi şəkildə işlədən, müdafiə edən XX əsr Azərbaycan romantizminin ideoloqu Əli bəy Hüseynzadə idi (166, səh.163).

Seyid Əhməd Kəsrəvi yazır: "Zəncanda da türk dilində danışırlar. Ancaq onların dili ilə Azərbaycan türkcəsi arasında olan azca təfavüt məni türkü dili barəsində axtarışa və araşdırmaya sövq etdi. Mazandaranda "Əl lüğəti Türki fi İran" ünvanlı bir məqalə yazıb "Əl-urfan"a göndərmişdim. Zəncanda olan zaman türk kitablarından Füzuli qəzəli və Əmir Əlişir Nəvainin divanını ələ gətirdim, Heydəci adında bir molla var idi ki, Tehranda "Sədre-Nasirəddin" mədrəsəsində yaşayırdı. Onun çoxlu türki şerləri vardı ki, xalqın dil əzbəri idi. Onları da topladım, bu axtarış və çalışmalardan bir sıra nəticələr çıxardım. Məsələn, türk dilindəki fellər fars dili ilə müqayisədə çox üstündür. Ona görə ki, türk dilində 15 cür keçmiş zaman, 4 cür indiki zamandan istifadə olunur. Hazırda fars dilində onlarla müqayisədə dörd cür keçmiş zaman və bir cür indiki zamandan başqası yoxdur. Bu o faktlardan idi ki, məni fars dilinin xəstəliyindən və çatışmamazlığından xəbərdar elədi (170, səh.231-232).

Türk dili ən əski zamanlardan tarixi köçlər nəticəsində Orta Asiyadan və Yenisey çayının sahillərindən, Orta Şərqdən tutmuş Balkana qədər geniş bir yerdə yaşayanların dili olmuşdur. "Bu gün bizim gözəl türk dilimizə ikrah edən, kökündən bir kəlmə türk dilində danışmayan farslar, kölgəmizi ox ilə vuranlar o günlər nədən qapımızda, ayağımızda məddahlıq edib, nədən boy-buxunumuza tərif yazmışlar? Amma əgər türk, ərəb zalım və yırtıcı, dilbilməz idilərsə, bəs Firdovsi ərəb əlifbası ilə nə üçün türk şahı Mahmud Qəznəviyə "Şahnamə"sini yazıb? Və uzun zamanlar boyu Həkim

Fərruxiye-Sistani, Ünsüri, Ənvəri, Qaani Şirazi, Hafiz Şirazi, Vüsal Şirazi, Sədi Şirazi, Kərim Kaşani, Zəhir Fariyabi, Ğəzair Razi, Sanei Qəznəvi, Mənuçehri, Əmir Müəzzi, Ədib Sabir, Rəşidəddin Vətvat, Seyid Həsən Qəznəvi, Xaqani, Qaani, Ünsüri Bəlxi, Əbdürrəhman Cami, Ənvəri Əbiverdi, Kəmaləddin İsmayil İsfahani, Məliküşşüara Bahar Xorasani və yüzlərcə, minlərcə şairlər, məddahlar hünərlərini, bacarıqlarını ərəb, məxsusən türk üçün nisar və təqdim ediblər. Ərəblər, türklər əgər ədəbsevər, hünərsevər, insanlıq, gözəlliksevər deyildilərsə, bəs nə üçün bunları müdafiə edirdilər? (314, s.19-22).

İnsan yalnız ananın cismindən, südündən yaranmır, bəlkə ana öz südü ilə bərabər övladına milli ruhu, vətənin ab-havasını, bundan daha önəmli olan ana dilini də bağışlayır. Dil fikir və duyğudan ayrılmaz bir ünsürdür. Elə buna görə də, bir millətin dilini yasaq edən cahil düşmənlər, onun təfəkkür qüdrətini, duyğusunu və yaradıcılıq istedadını da məhv etmək istəyirlər. Dil duyğunun qaynağı və çeşməsidir. Dili talan olan millətin bütün tarixin qatlarından qalan mənəvi varlığı da talan olur, dilini əldən verməklə daha nə rejim yarada bilir, nə də zamanın istəyi əsasında yeni sözlərə malik ola bilir.

Türk, türkmən kimi qardaş millətlərin müəyyən bir yolu, milli məqsəd və hədəfi olmadığı surətdə onların gələcəyi də sual altında qalır. Bu millətlərin tarixi düşmənləri belə fürsətdən istifadə edərək, onların hər bir milli, maddi və mənəvi sərvətlərini mənimsəyirlər. Beləliklə, millətlər öz ata-babadan qalan vətənlərində qərib kimi yaşamaq məcburiyyətində qalırlar. Türk dünyasının vahid bir dili olsa da, vahid bir istək yolunda addım atılmadığına görə milli azadlıqdan günbəgün uzaqlaşır. Gələcəkdə bu suallar hər bir vətənpərvər qız və oğlanların qarşısında baş qaldıracaq. Kimlərdir bizim ağzımızı bağlayanlar, milli kültürümüzü dananlar, onu talan edənlər? Kimlərdir bizi ana dilimizə həsrət qoyanlar? Kimlərdir qardaş millətləri bir-birindən uzaq saxlamaqla vahid milli hissiyyatımızı puç edib, kökünə su bağlayanlar? Kimlərdir qardaşları yad şəklinə salaraq, onu Suri-İsrafildən də güclü olan tarixin səsinə





biganə qoyanlar? Məncə, bunların hamısının qabağında yalnız düşmənləri məhkum etməklə, biz nicat tapmayacağıq. Düşmənlə yanaşı hər millətin milli kimliyindən uzaqlaşan ziyalıları da müqəssirdir, günahkardır.

*Lənət sənə ey cəhl, nə bidad ediyorsan?*
*Hər gün yeni mələnət icad ediyorsan.*
*Sərməşq edərək Habili-Qabil hərəkatın,*
*Qardaşları qardaşlara cəllad ediyorsan.*
*Nakəslərə imdad elə, bikəslərə bidad,*
*Bir gör kimə yardım, kimə bidad ediyorsan?*

Unutmayaq ki, türk milləti tarix boyu ikitərəfli qılıncın yaralısı olub. Qılıncın bir tərəfi xarici düşmənlərimiz olursa, o biri tərəfi öz kimliyini, milli varlığını itirən manqurtlaşmış aydınlarımız, üzdəniraq millət başçıları və böyük məsuliyyətdə oturan kiçik adamlar olublar. Yenə də deməliyəm ki, biz, uzun müddətdir ki, fəxr etməli keçmiş tariximizə biganə qalaraq, onu unutmağa məhkum olan yazıq millətə çevrilmişik. Buna görə də, bizim özümüz kimi tarixi hafizəmiz də məzlum olub. Gündəlik tariximizə baxanda bu faciəni daha da aydın görə bilərik. Dağlarımızın, bulaqlarımızın, yurdlarımızın adının dəyişməsi ilə yanaşı, küçələrimizin, xiyabanlarımızın da adları nə milli qəhrəmanlarımızın, nə də o torpaqda canını, malını qoyan milli şəxsiyyətlərimizin adınadır. Düşmənlər quduz qurd tək bizim milli varlığımızı talayır. Əgər belə getsə, daha da talayacaqlar. Milli ənənələrimiz ölkəyə müvəqqəti hakim olan şovinist ideologiya əsasında danılır. Aydındır ki, milli ənənələrini əldən verən bir millət sağlamlığını da, mənəvi gücünü də əldən verir. Belə millətləri tarixin səhifəsindən silmək, düşmənlər üçün çox da çətin iş sayılmır. Biz uzun müddətdir ki, sorğu-sual haqqı olmayan bir xalqa çevrilmişik. Aydındır ki, sorğu-sual haqqını əldən verən bir millət, millət kimi yox, bəlkə kölələr kimi yaşamağa layiqdir. Bizim öz əlimizlə hakimiyyətə çatanlar az bir müddətdə şəxsi mənafelərini millətin mənafeyindən üstün tutmaqla, o

millətin düşmənlərinin baltasının sapına çevrilirlər. Belə "özümüzünkülər" bizə düşmənlərdən qat-qat dəhşətli zərbələr endirirlər.

Ölkəmizdə şovinist hakimiyyət dilimizi yasaq etməklə kifayətlənməyib, bizi iqtisadi-ictimai fəlakətlərlə də üzbəüz qoyubdur. Aydındır ki, qalib gələn hakimiyyətlər fürsət tapdıqca dilin aradan getməsinə yox, bəlkə o milləti tarix səhifəsindən silməyə çalışacaqlar. Tarixi abidələrimiz nəinki qorunmur, hətta belə bir əsrdə ki, tarixi abidələr beynəlxalq təşkilatlar tərəfindən qorunur, bəşəriyyətin gözünün qarşısında Ərk qalası və Şirixurşid teatr salonu kimi möhtəşəm binalar bombalarla məhv edilir. Qacar zamanında "məmalüki- məhrusə" adlanan ölkənin ən böyük, ən zəngin məmləkəti olan Azərbaycan qurbanlıq əti kimi qonşu əyalətlərə pay-püllüş olunmaqdadır. Bunlar hamısı düşmənin "vəhdəti-milli" şüarı altında həyata keçirilir. "Vəhdəti-milli" müxtəlif millətlərdən təşkil olunan ölkədə belə bir anlamdadır ki, "səninkin yeyək, mənimkin oynadaq". Fars dili millətin varlığını tarac edən bir dəhşətli silaha çevrilir. Beləliklə, bu dil fars olmayan millətlərin nifrətini qazanır. Hakim qüdrətlər təkcə universitetlərdə, idarələrdə, məktəblərdə və gündəlik başqa millətləri təhqir edən televiziya və qəzetlərdə fars dilini hakim edib, başqa millətlərin kökünü kəsməyə razı olmur. O, var qüvvəsi ilə, arasıkəsilməz çalışmaqla, bir millətin aradan getməsinə çalışır. Öz kimliyinə əl tapmağı müqəddəs sayan hər bir cavan qız və oğlanı xəlvət küçələrdə tutub zindanlara aparıb, orda fiziki və mənəvi işgəncərə məruz qoymaqla, ondakı ağır yuxudan diksinib oyanan milli hissləri də öldürür.

Bizim bu günkü ağır vəziyyətimizə şərait yaradanlar öz dibinə işıq salmayan, ətəyində ilan becərən şahlarımız, ədiblərimiz, şairlərimiz olubdur. İndi də vardır. Milli azadlığımızın qabağında dayanan manqurtlar az deyildir. Hələ milli azadlıq yolunda bir addım da götürməsək, köynəyini yırtıb düşmənin yarılmamış başına sarıyan özümüzünkülər az deyildir. Onların bu işləri ata-babalarımızın hikmətli sözlərini xatırladır: "Ağanın malı gedər, nökərin canı".





Buna görə də, deyim hər millətin milli duyğu və təfəkkürünün ən dəyərli fidanlarından hesab olunur. Düşmən baltası ilə kəsilən dillə yanaşı onun milli kimliyi, milli varlığı, ənənələri, milli torpağını tarix boyu müdafiə edən qəhrəmanları da unudulur. Aydındır ki, milli qəhrəmanlarını unudan bir millət daha öz ölkəsini müdafiə edən qəhrəman qızlar, oğlanlar yetirməkdən aciz qalır. Torpaqları düşmənlərin at oynatmaq meydanına çevrilir. Millətin dilini bilməyən ziyalılar nə onun dərdinə dərman edə bilir, nə də millətlərini milli zülm və milli fəlakətdən qoruya bilirlər.

Müxtəlif millətlər yaşayan bir ölkədə yalnız bir dil hakim olur, bir dil atını çapdırır, başqa millətlərin folkloru, ədəbiyyatı rəsmi tanınmır, onların milli dili televiziya, qəzet, mədrəsə və universitetlərdə, dövlət müəssisələrində işlədilmir. Beləliklə, millətlər öz məmləkətlərində, öz vətənlərində özgə və doğmaya bölünürlər.

Sizə təqdim etdiyim deyimlər dilimizin zənginliyini nümayiş etdirən nümunələr, əyani dil faktlarıdır. Bu vaxta qədər ayrıca araşdırma obyekti olmamış deyimlər bir sıra özünəməxsusluqlara malikdir. Deyimlər ata sözlərindən yığcam, qısa olsa da, anlam, dolğunluq baxımından daha zəngindirlər. Deyimlər və atalar sözləri öz mahiyyətinə görə bir-birinə olduqca yaxındır. Deyimlər türkün duyğularını, düşüncələrini diqqətəlayiq bir ifadə ilə bəyan edir, onu anlamaq üçün gərək insan mənəvi gücünü, beynini, əldə etdiyi biliyini, şüurunu işə salsın. Deyim bir həyat təcrübəsini, bir fikri ortaya qoymaq üçün yaradılmış ifadə vasitəsi, ifadə formasıdır. Bu forma türk dilində geniş yayılmış olduğuna görə, imkan verir ki, deyim və atalar sözünün fərqini başa düşək. Misal üçün:

"Yalan tikan deyil ki, dilə batsın", "Halva biş, ağzıma düş", "Bu gün görülən iş, sabaha tapılmışdır" və s.

Ata sözləri, ümumiyyətlə, soy- kökümüzdə duran el və tayfanın eniş-yoxuşlu həyatlarının acı, şirin xatirələrindən, təcrübələrindən yaranıbdır. Onlar tarix boyu xalqın sinəsində mühafizə olunaraq, onlara yol göstərib, ictibdadların təkrar

olunmasının qabağını alıb. Atalar sözləri türk ədəbiyyatında həmişə nəsihət formasında bəyan olunur. Buna görə ata sözlərini həyat bulaqlarına oxşadırlar. Onu millətin yaşadığı kültürün, həyat tərzinin aynası hesab edirlər.

Hər millət min illərdən bəri yadda qalan atalar sözlərinin yardımı ilə keçmişini bu günə, bu gününü gələcəyə bağlayır. Xalq deyimi yaratmaqla öz fikrini - bir olaydan aldığı acı nəticəni, ya şirin xatirəni yeni bir qəlibə salır. Deyimlər bəzən zamanın istəyi əsasında yaranır, yaranandan bir müddət sonra zamanın keçməsi, həyat tərzinin dəyişməsi ilə əsil mənasını əldən verir, və ya ondan uzaqlaşaraq, təzə bir ictimai məsələnin haqqında işlədilir.

Müəyyən tarixi dövrdə bir deyimi aydınlar həqiqi mənası ilə tanıyıb işə aparsalar da, kütlələr mütaliədən məhrum olduqlarına görə, öz deyimlərinə biganə qalıb, onların gerçək anlamından uzaqlaşırlar. Müəyyən siyasi-ictimai baxımdan yaranan deyim zaman keçdikcə öz anlamını xalqın tarixi hafizəsində əldən verib, dedi-qodular əsasında yaranan anlamlarla işlədilir. Xalqın dil əzbəri olan: "İşin var ver culfaya" deyimi nəinki cavanlar, bəlkə yaşlılar üçün də əsil mənasından uzaq, yanlış şəkildə izah olunur. Burada "culfa" sözü keçmişdə türklər üçün tam anlaşıqlı olan toxucu anlamında deyil, yanlış olaraq yer adı kimi, yəni Culfa şəhəri mənasında işlənir. Bu deyimdə "iş" sözü altında xalı, bez kimi toxunma şeylər nəzərdə tutulur.

*Dağdan gəlir dağ arabası,*
*Heç kim onu mindiyi yox.*
*Culfa toxur nazik bezi,*
*Heç kim onu geydiyi yox* (20, s.234)

Örnək olaraq "palanı əyri" deyimini bu baxımdan gözdən keçirmək olar.

Məşrutə dövründən başlayaraq, Cənubi Azərbaycanda mütrəcelər tərəfindən ziyalılar haqqında işlənən "palanı əyri" sözü illərdir ki, öz anlamını əldən verib, cahillər tərəfindən xalqın şəxsi həyatına burun uzadaraq, qadınlar haqqında





işlənilir. Bu gün "palanı əyri" sözü onların nəzərində əxlaqsız qadınlar haqqında işlənilir. Misal üçün:

*Sən də ki, bəzi cavanlar tək, əyibsən palanı,*
*Əldə "Quran"dı dəlilim, sözümün yox yalanı* (168).

Deyimlər bəzən sadə, bəzən də mürəkkəb cümlə formasında işlədilir. "Qırğı Şirvanı aşdı" və ya "Atı alan Üsküdarı keçdi", "İt araba kölgəsində yatar, elə bilər öz kölgəsidir", "Yağışdan çıxdıq, yağmura düşdük", "Yarıdıq, yaza çıxdıq", "Mənə bax, nə gündəyəm, yara bax, nə sallanır?", "Hacdan gələn mənəm, xəbər gətirən sən" və s. Bəzən də kəlmə formasında xalq öz hədəf və istəyini həyata keçirir. "Göy", "Yekəbaş", "əli dar", "əli qabarlı", "ürəyi yaralı", "dırnaqsız", "ipi qırıq" kimi. Bir sıra deyimlər də qalıblanmış sözlərdən çıxan məna və kəlmələrin həqiqi anlamının içində bulunur. "İyi günün dostu", "Göydən yerə yağar, yerdən göyə yox". Türk dilində bir kəlmədən də yaranan deyim çoxdur. Bizim deyimlərimiz bir, iki kəlmədən də ibarət olur. "Qırmızı", "qurd", "tülkü", "eşşək", "qırmızı adam", "dəvə daylağı".

Aydındır ki, ata-babadan yadigar qalan deyimlər mənim və ya başqasının istəyi əsasında başqa qəlibə girə bilməz. Başqa sözlə desək, onların qəlibləri dəyişməzdir. "Aç qapını, ört qapını" deyimini heç zaman "ört qapını, aç qapını" şəklində işlədə bilmərik. Deyimlər ilk dəfə işlədildiyi formanı zaman-zaman hifz edib qoruyur.

Deyimlər çox vaxt məsdər formasında da yaranırlar. "Balta olmaq", "kölgə olmaq", "çalı tikanı olmaq", "gözü doymaq" "Əli aşından da, Vəli aşından da əli olmaq" kimi. Aşağıda gətirilən və ifadə olunanları deyimlərdən saymaq olmaz. Bunlar, bənzətmələr hesab olunur. Misal üçün, "pambıq kimi"- "çox yumşaq", "kağız kimi"- "çox ağ və incə", "bal kimi"-"çox şirin və dadlı", "Koroğlu kimi"- "çox igid və qorxmaz" bu kimi bənzətmələr deyimlərə həddən artıq yaxındırlar.

Geniş bir coğrafi məntəqədə, at belində yaşayan ata-babalarımız, bir-birindən çox zaman 180 dərəcə fərqli olayları təcrübə edən, ən əski kitablardan sayılan Dədə Qorqudlar yaradan türk imperatorluqları deyimləri hər yaşadığı torpağın, coğrafiyanın özünəməxsus formalarında bizə miras qoymuşdular. Sanamalar, tapmacalar, bilməcələr, qaravəllilər, ovsunlamalar, bayatılar, atalar sözləri, deyimlər, gəraylılar, ağılar və daşların üstündə ən əski zamanlardan qalan Qobustan, Əhər Kəleybər ətrafında daşlara həkk olunan rəssamlıq işləri bu millətin zəngin sərvətə malik olmasının böyük nümunələrindən hesab oluna bilər.

Bu mənəvi varlığımızda milli xarakterimiz, milli ruh və kimliyimiz fərqli boyalarda olsa da, vahid bir soy-kökümüzdən xəbər verir. Bu araşdırmada atalar sözləri ilə deyimləri bir-birindən ayırmaq, məncə, siyasət və kültürün arasında Çin divarı çəkməkdən də çətin və ağlabatmayan bir düşüncədir. Biz deyimlər və atalar sözləri ilə bağlı millətimizin tarixini, kültürünü, mədəniyyətini, milli kimlik və ruhunu öz əsərlərində əbədiləşdirən siyasi xadimlərdən, şairlərdən, yazıçılardan misal gətirməyə çalışmışıq. Deyimlər danışıq dilinin, eləcə də bədii dilin ayrılmaz komponentləridir. Tarixin və zamanın istəyinə zidd olan, türkün parlaq keçmişinə düşmənlər tərəfindən ağ yamaq kimi vurulan iyrənc, qondarma deyimlərin, atalar sözlərinin yazılmasını məqsədə uyğun bilmədik, xüsusən, milli şüurun azlığından yaranan deyimləri nəzərdə tuturuq. Şimalda güneylilər haqqında işlənən "həmşəri" deyimi XIX yüzilin sonu, XX yüzilin əvvəllərində Cənubdan çörək pulu qazanmaq üçün Bakı neft mədənlərinə üz tutan Azərbaycan türkləri, daha sonra ümumiyyətlə, Güney azərbaycanlıları haqqında işlənən təhgqiqamiz deyimdir. Eləcə də Ermənistanla savaşın ilk dövrlərində yaranan "yeraz" deyimi- İrəvan azərbaycanlıları, "qıraz" -Gürcüstan azərbaycanlıları haqqında işlənir. Qədim türk tayfalarından birinin adı olan "ayrım" sözü bəzi zonalarda yaşayanlara ünvanlanaraq təhqiramiz mənada işlənir. Bu deyimlər millətin bütövləşməsinin, birləşməsinin qarşısını alan,





düşmən dəyirmanına su tökən ifadələrdir. Millətimizin yarısını təşkil edən qız və analarımızın haqqında islamdan sonra dilə gələn təhqirlərdən, iyrənc deyim və atalar sözlərindən də çalışdıq ki, uzaq gəzək.

«Ana evin ürəyidir», «Ana haqqı, Tanrı haqqı», «Arvadsız ev, susuz dəyirman», «Qız üz qızardar» kimi türk təfəkkürünü əks etdirən deyimlərlə yanaşı: «Ər arvadın tacıdır», «Ər ağacı, gül ağacı, var təqsirim – vur ağacı», «Arvad yıxan evi, fələk də yıxa bilməz», «Arvad yuxusu yalan olar», «Arvadın öyüdü arvada keçər», «Arvad şeytana papış tikər», «Arvadın xirtdəyi olmaz», «Saçı uzunun ağlı olmaz», «Arvad üzlü kişidən, kişi üzlü arvaddan əlhəzər», «Kişi seldir, arvad göl» kimi deyimlər də mövcud olmuşdur ki, türkün qadına münasibətini əks etdirmir.

Deyimlər ictimai-siyasi, mədəni həyatın, məişətin müxtəlif sahələri ilə bağlı yaranır: "Allahın bacısı oğlu", "Firon", "dinar çıxıb ceyran belinə", "dərə xəlvət, tülkü bəy", "mücöür (mücavir-B.H) aşı", "iynə yemiş it", "almaçı eşşəyi", "başına and içmək" və s.

Bəzən deyimlər zamana uyğunluğunu əldən vermək məcburiyyətində qalaraq, milli kültürü tərk edirlər, demək olar ki, xalqın hafizəsindən silinib getmək məcburiyyətində qalırlar. Elm, texnika və başqa istəklərlə yeniliklərə əl tapmaq əsasında yeni deyimlərin, kəlmələrin tapılıb, xalqın folklor və mədəniyyətində yaranması zəruri olur. Demək olar ki, heç bir deyim zamandan qıraqda yaranmır. Başqa sözlə desəm, hər bir deyimin öz doğum günü var. Bu tarix hər bir araşdırıcının kiçicik diqqəti ilə aydınlaşa bilər. Həmin deyimin yarandığı zamanın sosial, iqtisai, siyasi və mədəni vəziyyətini aydınlaşdırmaq olar.

«Ağazadələr», «Allahın bacısı oğlu», «Top kimi», «Valaylamaq» və s.

*Elə bil ki, sənin beynin valaylıdır,*
*Sağlamlığa nisbət təsdiq varındırmı?* ( 219, səh. 110).

«Malı qaz», «yataq yandırmaq», «radiatoru qaynadıb», «saşısı əyilmək», «yağ yandırmaq», «atom partlatmaq», «ayaqlarım Fransa yazır», «açar Fransa», "əlifi gülüf oxumaq" kimi deyimləri xatırlatmaq olar.

Ata-babalarımız təbiətdən və quşlardan ilham alaraq, yeyinliyi bildirən "qırğı", "ildırım", "ley", "cıdır atı", "güllə" kimi, cet (böyük, sürətlə gedən təyyarə- B.H), "təyyarə" kimi deyimlər yaradırlar.

Və ya «ayaqdan çəkmək» düşmənçilik mənasında işlənir.

*Zülm ilə bizi ayrı salıblar elimizdən,*
*Ayrı salalı həm elimizdən, dilimizdən,*
*Düşmənlərimiz handadı çəksinlər ayaqdan,*
*Bir dost tapılmır ki, yapışsın əlimizdən* (338, səh.74).

Bəzi deyimlər ölkəmizin müəyyən bir bölgəsində yaranmaqla, orda başqa yerlərdən daha da doğma olur. Misal üçün, 1882-ci ildə ölkəmizin şimalında xəstəlik yayılır. Ölənləri milli ənənələr əsasında yox, pal-paltar ilə torpağa basdırmaq məcburiyyətində qalırlar. Ramana kəndindən olan Məhəmməd Cəfər bəy adlı bir xeyirxah kişi top-top ağ alıb, kəfən üçün ehsan edir. Xalq faciəni yüngülləşdirərək, özünə təsəlli verib, bu deyimi yaradır:

«Ölüm haqdan, kəfən Məmməd Cəfər bəydən».

Deyimlər çox zaman məcazi məna daşıyır, həqiqi məna daşıyan sözlə bir qəlibdə və formada olsalar da, bəzən tam zidd anlamda da işlədilir. Misal üçün, "toy tutmaq" həqiqi mənada, şadlıq, toy-düyün anlamı daşıyır. Amma deyimdə «toy tutmaq» - əzab vermək, birini və ya bir milləti ağır vəziyyətə salmaq anlamında işlədilir.

Kərbəlayi Vəli: «Mənim bacım Gülnisəni siyahıya saldır. Qoy yazıq arvad dirilsin. Və öz dili ilə cənabınıza ərz eləsin, görün bu Hacı Baxşəli onun başına nə toy tutub» ( 195, II cild).

«Ağacdan maşa olmaz, çingənədən paşa», «divarı nəm yıxar, insanı qəm» kimi atalar sözlərində çox zaman deyim,





atalar sözü bir millətin acı və ya xoş taleyini, ictimai ədaləti, millət adına milli varlığı talan etmək nəticəsində yaranan zülmü tarixdə zəbt edir. Misal üçün, «Səksən-doxsan, bir gün yoxsan», «Yaş yetmiş, iş bitmiş».

Aydındır ki, keçmişin əksinə olaraq, bu gün Azərbaycanımızın həm şimalında, həm də cənubunda ağır vəziyyətin hakim olmasına görə, səksən və ya doxsan il yaşamaq ağlasığmaz yaşam həddidir. Əgər yuxarıdakı atalar sözü ölkəmizin təmiz havasını, qızıl torpağından gələn nemətlərin bolluğunu, nəticədə orada yaşayan insanların sağlam və uzun ömürlü olmasını xatırladırsa, bu gün cavan olmamış solan qız və oğlanlarımızın vəziyyəti keçmişin ziddindən xəbər verir. Və qızıl üstündə acyalavac yaşayan azərbaycanlı soydaşlarımızın bu günkü durumu ilə keçmişi heç bir cəhətdən bir-birinin üstünə düşmür. Əgər ata-babalarımız qılıncla, kişiliklə vətən keşiyində durub, orda yağılara və işğalçılara qalib gəlməklə milli kimliklərini qoruyub saxlayıbsa, bu gün biz keçmişimizə biganə olaraq, nə təkcə torpaq almaq fürsətini əldən veririk, bəlkə ata-babalardan bizə qalan müqəddəs vətənimizi də düşmənlərə verib, onu almaq fikrindən də vaz keçirik. Bu faciələr bizim həm deyimlərimizdə, həm də atalar sözlərimizdə gələn nəsillərə qoyduğumuz utanmalı bir mirasdır. Təbiidir ki, bu atalar sözlərinin mahiyyəti tam başqa olmaqla bərabər, gələn nəsillərin də bizlər haqqındakı düşüncələri bambaşqa olacaqdır.

Dil, yazı insanların müasirləri, xələfləri ilə əlaqə yaratmaq üçün bir vasilədir, yoldur. Əgər bu yol hamardırsa, burda maneələr yoxdursa, onda təbiidir ki, kültürün, onunla əlaqədar iqtisadi-ictimai vəziyyətin gəlişməsi olduqca rahat və yüngül olur. Belə bir yolda ağır-ağır yükü daşımaq da mümkün olur. Bu yol əgər hakim şovinist siyasətlərin yaratdığı maneələrlə olursa, çətin keçilirsə, onda fikrin məhsuldarlığı, əlaqə imkanları iflic olur. Bu maneələr, xüsusən, çox millətlərdən ibarət olan ölkələrdə daha da qabarıqdır. Əgər bir millət mədəni sahədə istisna olursa, onun hər varlığı, milli şüuru ilə bərabər milli torpağı da yoxa çıxır. Hakim dil, səratan (xərçəng –B.H.) kimi

yerli dili xəstələndirərək, o dilə malik olan millətin də milli şüurunu aradan aparır. Və o millətin ürəyində olan müqəddəs arzularını külə döndərir.

Ana dilimiz, əgər zamanla ayaqlaşırsa, məcburdur ki, zamanın nailiyyəti olan texnologiya əsasında yaratdığı yeni sözlərlə yanaşı, yeni deyimlər də formalaşdırsın.

Keçmişdə Azərbaycan vahid tarixə və mədəniyyətə malik olsa da, düşmənlər əli ilə bağlanan Gülüstan və Türkmənçay müqavilələri, onların davamı kimi hakimiyyətə gələn şovinist rejimlər bizi başqa bir tale yaşamağa məcbur edibdir. Düşmənlərin bərəkətli süfrəmizin başında oturub, gecə-gündüz bizim isti aşımıza soyuq su qatmaqları aydınca duyulur. Berextin sözü bizim haqqımızda olduqca doğrudur: "O zaman ki, faciə geniş surətdə baş verir, nəzərlərdən gizli qalır. O zaman ki, əzab və zəhmət dözülməz olur, insan daha fəryadları eşitmir. Əgər adi bir durumda günahsız insanın yumruq yeməsinə kütləvi etiraz olursa, amma faciələr sel kimi başdan aşan zaman daha heç kəs kütləvi qışqırıqlara da gözünün ucu ilə baxmır".

Əgər biz türklər, gözümüzün önündə ana vətənimizin çırpınan qəlbi, sehrli səsi olan Qarabağın düşmən əlində qalmasına etiraz etmiriksə, daşdan səs çıxır, biz isə sükut ediriksə, onda biz "diri ölülər" deyimi ilə yox, bəlkə bir ölü millətin bu günkü təmsilçisi kimi tarixdə zəbt olunmağa layiq görülərik.

Azərbaycanın şimalı rus imperiyasının, Güneyi dünənədək hakim olduğu fars millətinin əlində əsir düşdüyünə görə, bu vahid millət milli formalaşma prosesini, təbii ki, müxtəlif formalarda keçirmək məcburiyyətində qalıbdır. Bizim vahid tariximiz, mədəniyyətimiz danılmaz olsa da, düşmənlər əli ilə iki müxtəlif siyasi-ideologiya sərhədlərində əsir düşdüyümüzə görə, vahid dünyəvi mənəviyyatımız da böyük zərbələrə məruz qalıb. Biz illərdir ki, təkcə Türk dünyasının yox, bəlkə də arasından su keçməz vahid Azərbaycanın da dərdini başa düşmək qüdrətini əldən vermişik. Bunların səbəbləri də hamıya aydındır.

Əgər rəqs, rəssamlıq, teatr və şeri başa düşmək üçün, onların dilini, məğzini bilmək lazımdırsa, deyimləri də yağ kimi





qəbul edib, başa düşmək üçün, o xalqın yaşamını, o mühitin sosial keçmişindən əlavə, bu günkü durumunu, habelə millətin milli varlığının nə dərəcədə gəlişməsini də başa düşmək gərəkdir. Misal üçün, «Qoçulanmaq» deyimi, bu gün ölkəmizin quzey və cənubunda vahid anlamda işlədilir. Buna baxmayaraq quzeydə bu deyim daha da doğmadır. Bundan başqa, özünəməxsus tarixini yaşayır.

"Əli kəsiyəm" deyimi, o deyimin atalar sözü forması- "əli kəsiyin dərdini əli kəsik bilər" nə qədər adi bir cümlə olsa da, geriçilərin mənafeyini qoruyan qanunlar adı ilə yaranan boğuntunun, ictimai faciənin yaşamından xəbər verir. Deyim surətində bəyan olunan "əli kəsikdi" və ya "əli kəsiyəm" bir saf güzgü kimi, yaxud da bir tənqidçi kimi o toplumun iqtisadi, ictimai, əxlaqi vəziyyətini özünə əks etdirir. Göz çıxardıb, əl kəsməklə millətin tərbiyəsinə çalışan hakimiyyətlərin nə qədər zamandan geri qalmasını, o cəmiyyətin gəlişməsinin qabağına manea olmalarını aydınca nişan verir. "Quş var, ətin yeyərlər, quş var ət yedirdərlər", "nənəsinin əmcəyini kəsən", "qursaqsız", "çıraq qoymaq" kimi deyimlər tariximizin bir səhifəsini gözümüzün qabağında açıb onu bu günün mühakiməsinə verir. Məşrutə dövründə milli azadlıq uğrunda mübarizə edən, ölkənin şimal və cənubunu vahid ana torpağı kimi nəzərdə tutan Heydər Əmioğluya həsr olunan şerdə "çıraq qoymaq" deyimi öz anlamını bəlli edir:

*Baqqal bazara çıraq qoydu,*
*Kasıbların qarnı doydu,*
*Hər bir işə qanun qoydu,*
*Yaşasın gözəl Əmioğlu!*

Güneydə, bazarda çıraq qoymaq hər şeyin ucuzlaşmasından xəbər verirdi.

Bəzi deyimlər bir şəhərin tarixi abidələrinin adı ilə bağlı olmaqla, müəyyən tarixi hadisəni bəyan etməklə, o şəhərin, ya kəndin keçmişi, gələcəyi haqqında məlumat verir. Məsələn, Təbrizin möhtəşəm qalası sayılan Ərkin adını çəkmək olar:

Aşağıdakı şer milli dəyərlərə yalançı tarixçilərin deyil, şərəfli bir millətsevərin münasibətini vaxtında, dəqiqliklə əls etdirir:

*Tapılmış indisə bir təzə düşmən,*
*Nədir Çingiz, nədir Hitler, Ayşimən?*
*Dedi tez yıxdırın Ərkin qalasın,*
*O şahlar qondaran zülmün binasın.*
*Teatra ümmətin yoxdur niyazı,*
*Behişt almaq gərək, yıx, qıl namazı.*
*Hünər var, incəlik- qanmaz, nə anlar,*
*Qoyuldu dörd bucaqda güclü bombalar.*
*Yıxıldı əlqərəz, Ərk oldu yarı,*
*Rahatlaşdı bir az Tehranda qarı! (Dəmirçi).*

Mədəniyyətimizdə milli əxlaq və gündəlik yaşamımızda o zamana qədər ki, insanların ictimai, dövləti məsuliyyətinə baxmayaraq, sorğu-sual öz yerini almayıb, hər bir vətəndaşın danılmaz həqqi tanılmayıbdır, o toplumda dövləti senzuraya gərək yoxdur, çünki belə bir boğuntuda yaşayan millətin hər birisi özü bilmədən dilini, qələmini və hətta gözlərini də reallıqları dilə gətirib, qələmə alınaqdan, görməkdən də senzura edir. Həmin toplumda "millət" sözü yox, bəlkə islamın ilk zamanında yaranan "ümmət" sözü və ya sadəcə olaraq, "çoban və sürü" anlamı daha da yerinə düşər. Belə bir toplumlarda iyrənc, milləti hər cür təbii faciələrdən də dəhşətli fəlakətlərlə üz-üzə qoyan deyimlər, atalar sözləri yarana bilər.

"Əyilən boynu vurmazlar", "öpməklə ağız murdar olmaz".

Ataşahlıq və anaşahlıq dövründən qalan, bu günkü həyatımızda da öz tarixi mənasını daşıyan deyimlərə, ata sözlərinə rast gəlmək mümkündür. "Arvadın bir qabırğası əskik olar" və s.

Qeyd etmək lazımdır ki, əski mədəniyyətimizdə elin, tayfanın içində adlım adamlar "qabırğası artıq" deyimi ilə tanınardı. İslam dini qalib gələndən sonra elin, tayfanın yarısını təşkil edən, gündəlik həyatda kişilərlə bərabər hüquqlu Tomrus





analar, Həcərlər və b. "qabırğası əskik" deyimi ilə təhqir olunurlar. Beləliklə, bütün ictimai fəaliyyətlərindən məhrum edilərək, dörd divar arasında zindan həyatı yaşamaq məcburiyyətində qalırlar.

"Qırx arvadın ağlı bir qara toyuqca olmaz" deyimi, eləcə də həyat boyu kişi ilə isti-soyuğa, yaman günlərə dözən həyat yoldaşını "bizim ev", və ya "uşaqların anası" adlandırıb, həqiqi adını dilə gətirməkdən utanc hissi duymaq da cəmiyyətin geri qalmasından xəbər verir.

"Arvadın şərikli olsun, malın şərikli olmasın" və ya "Yeddi oğlun olsun, bir qızın" kimi kədərli sözlər təəssüflə toy-düyünlərdə dilə gətirilib, belə düşüncə ilə fəxr edilməsi də utanc doğuran bir hərəkətdir.

Ölkədə yaxşı sərlövhələrin altında aşkarcasına haqsızlıq-lara, rüşvət alıb vətəni satmağa əl bulaşdırmaqla o ölkədə hər zad həqiqi mənasından uzaqlaşır. Demək olar ki, hər zad həqiqi mənasını əldən verir, başqa bir adla çağırılır. Misal üçün, yeri gələndə "aslanın erkəyi, dişisi olmaz" atalar sözünü biz həm radiodan, həm televiziyadan, həm də gündəlik həyatımızda hər yerdə eşidirik. Bu günkü türk qadınının yaşayışı isə heç bir ictimai, iqtisadi, siyasi mövqelərlə üst-üstə düşmür. Bir yerdə ki, türk qadını qanunsuzluq və iqtisadi vəziyyətdə bir tikə çörəyə möhtac olaraq, dörd divar arasında zindan kimi yaşayırsa, orada min illərlə yaşanan atalar sözünü təkrar eləmək, bu günkü faciəli durumumuza pərdə çəkmək deyilmi?

Keçmiş yüzilliklərdə siyasətçilərin, ideololoqların barmağı ilə dillər əzbəri olan bu ifadələr həm şimalda, həm də cənubda toplanırsa, böyük bir ensiklopediya yarana bilər. Buna görə də, əgər bir toplumda oğru sözünün oğru haqqında, tülkü sözünün tülkü haqqında işlənməsi yasaq olursa, onda hər bir aslana da siçan demək adi bir hala çevrilir. Orda həm əxlaq, həm də dil təhrif olunursa, insan oğlu insanın bütün varlığı da təhrif olunur.

Siyasət ilə, siyasətin qələmi ilə ölməyə məhkum olan insanlar kimi ifadələr də təbii həyatlarını itirir. İdeologiya divarlarının arasında çürüməyə məhkum olurlar.

Azad və inkişaf etmiş ölkələrdə həyatın dəyişməsi ilə bilik, incəsənət yaşadığı dövrün yeni yaranan təzə deyim və atalar sözlərinin ehtiyacını duyur. Beləliklə, dilin və ifadələrin zənginliyi təmin olunur.

Çox zaman sözü kişilərdən kəskin olan türk qadını, türk yaşamının hər bir sahəsində kişilərlə çiyin-çiyinə iştirak edən, at belində qılınc oynadan ana-bacılarımız elə bir faciələrlə üzləşirlər ki, hətta o zamanlardan yüz illər keçməsinə baxmayaraq, indiki dövrdə də islami baxışdan nə təkcə hünər, o cümlədən musiqi, oxumaq, rəqs, hətta dini mərasim sayılan azan vermək də qadınlar üçün yasaq sayılır. Bu islam donuna bürünmüş köhnə fikir və mütləq haqsızlıq türk toplumunu bütün zamanlarda geri qoymaqdadır.

Təbiidir ki, türk millətinin yarısını təşkil edən qadının səsi kişiciyəzləri yoldan çıxarırsa, onda bu yerlərdə qadın səssiz qul və kənizə çevrilir. Aydındır ki, danışmaq haqqı olmayan, bütün toplumda məsuliyyət daşıyan dövlət adamlarını yuxarıdan aşağıya qədər tənqid edə bilməyən qadın, heç vaxt ölkəsinin gəlişməsinə, inkişafına, azadlığına və istiqlaliyyətinə yardım edə bilməyəcək. Belə bir ölkədə boya-başa çatan qadınlar heç vaxt vətən uğrunda canlarından keçən, elm-hünər sahəsində böyük nailiyyətlər qazanan qəhrəmanlar və alimlər yetişdirmək iqtidarına malik olmayacaqlar.

Azərbaycanın güneyində baş verən milli-azadlıq hərəkatlarının rəhbərlərinin nitqlərində, məqalələrində də deyimlərdən geniş istifadə olunmuşdur.

Səttarxan: "Azərbaycan bir **daş qazana** bənzər, gec qızar, gec də soyuyar"(3).

"Bu sudur qurban, (şərab–**B.H.**) sizi görən kimi xəcalətindən **rəngi qızardı**" (3, s.59).

Xiyabani: "**Ağciyər** adamlar, yəni cəsarətsiz, ürəksiz qocalar, gənclər, qadınlar, oğlanlar təbii olaraq qorxaq bir ictimaiyyəti, qorxaq camaat və milləti təşkil edirlər" (153, s.16).





S.C.Pişəvərinin işlətdiyi deyimlərdən bəzi nümunələr diqqətəlayiqdir: "**Başınızın altına yastıq qoya bilməzlər** və məram-məqsədimizdən münhərif edə bilməzlər" (246, s.156 ).

"**Zirək quş dimdiyindən tələyə düşər**" (246, s.148).

"Biz Tehran mürtəce və muzdur ruznamələrinin yazdıqlarına əhəmiyyət vermirik. Əl çəkib bizi öz yaralarımızı sağaltmağa buraxın, bizə **aşdan isti kasa** olmayın" (30, №39 ).

"Mərkəzi dövlətin rəsmi nümayəndəsi olan Müstofinin təhqiredici sözləri, **bayquş səsi** kimi hənuz Azərbaycan xalqının qulaqlarında tənin-əndazdır".

"Mərkəz **kəklik kimi başını qara qoymaqla**, xalqın hissiyyatının üzərinə pərdə çəkmək istəyir" və ya "**çadra altından boğma çıxartmaq**"

Bəzi deyimlər ictimai şəraitin acı olaylarını özündə əks etdirir. Şovinist siyasətlər nəticəsində bərəkətli torpağından mühacirət etməyə məcbur olan türkün acı taleyindən xəbər verir.

*Kənddən qaçdım Tehrana,*
*Evim qaldı virana,*
***Əlim qolumdan uzun,***
*Qalmışam yana-yana* (60, səh.39).

*Dil var ki, acıdır, **ilan quyruğu***
*Dil də var ki, min bəlanı yan verər* ( Pərviz Qaradağlı).

Bəzi deyimlər çox vaxt müxtəlif formalarda yaransalar da, vahid bir hədəf daşıyırlar. Məsələn, eyni anlamda yaranan bir deyim, hər məkanın özünəməxsus şivə və forması ilə tarixdə qalır. Məsələn,

Mahmud Kaşğari: "Dili isti yerdən çıxır"(162). Tərtər: "Ağzı isti yerdədir". Təbriz: "Səsi isti yerdən gəlir".

"İpə un sərmək", və ya "şəritə un sərmək"

Kültür heç zaman siyasət kimi olmur. Bəlkə siyasətdir ki, insanın mənəvi, əxlaqi inkişafı ilə hər rəngə yaxınlaşır.

Deyimlər də bir sıra kəlmələr, ifadələr kimi ictimai, texnoloji dəyişikliklər, tarixi proseslər nəticəsində unudulur, və ya zamana uyğunluğunu əldən verir. Dünənədək əyri olan inək dərisindən düzələn gönləri hamarlamaq üçün Təbrizin gönçülər bazarında ayaqlar altına salardılar. Mürtəce və ikiüzlü şeyxlər sahibindən icazəsiz gönə ayaq vurmaq, küfr, yəni günah sayılır bəhanəsi ilə gönün üstündən tullanıb keçərdilər. Bu hadisə «Gön atlayan şeyxlər» deyiminin yaranmasına səbəb olmuşsa da, bu gün texnologiyanın inkişafı ilə əlaqədar nə o əyri gönlər, nə də o vaxtkı tarixi şərait var. Təbii ki, deyimlərin yaranması müəyyən tarixi zərurətlə bağlıdır.

«Qılı qıldan ayırmaq» deyimi bu şəkildə işlədilmişdir:

*Xəzinə tökdü, ləşkərin çatırdı,*
*Ədalətdən, **qılı qıldan ayırdı*** (Təbrizli Fədai).

Deyimlər və atalar sözləri nə qədər qısa, hətta bir, və ya bir neçə kəlmədən ibarət olursa, çox zaman türk dünyasının genişliyindən, tarix boyu böyük impratorluqlar yaradan, idarə edən türkün geniş coğrafi bölgələrdə yaşamasından hekayət edir. Məsələn: "Ana kimi yar olmaz, Bağdad kimi diyar", "Həmədan uzaq, kərdisi yaxın", "Hökmavar uzaq, kərdisi yaxın", "Hələb ordasa, arşını burda", "İsfahanda yüz iynə boyu atlamaq", "Balı olanın çibini Şamdan gələr", v. s.

Keçən yüzildə ieologiya əsasında sinfi mübarizəni hər zaddan üstün, əsas tutmaq, bəzi milli şüurdan məhrum edibdir. Bu xəstəlik türkü milli kökündən, türk dünyasından uzaqlaşmaq xəstəliyinə düçar edibdir.

Bu kitabda deyimlərlə bərabər bir sıra bənzətmələr və hətta şovinist siyasətlər nəticəsində xalqın hafizəsindən silinmək təhlükəsi ilə üzbəüz olan kəlmələr də qeyd olunubdur. Bir qayda olaraq, bunlar məcazi məna daşıyırlar. Misal üçün: "quzu kimi", "ayı kimi", "ayı şuxluğu", "dəvə inadlı", "fal yox, yumurta yox" v. s.





Göründüyü kimi, bunlar iki kəlmədən ibarət olsalar da, böyük, geniş anlam daşıyırlar.

Müxtəlif formalı deyimlər bəzən eyni məna ifadə edirlər. Firudin bəy Köçərli yazır: "İsmayıl bəy əlindəki toyuğu havada uçan qaza dəyişdirən adamlardan deyildi" (166, səh.198).

Bu deyimlə eyni məna daşıyan daha bir neçə deyimimiz var: "Dəryada balıq sevdası", "Sabahkı quyruq kababından, indiki övkə yaxşıdır".

Nəriman Nərimanov yazır: "İndi bu məsələdə də boşboğazlıqdan qeyri bir şey meydana gəlməz isə, əmin olun ki, millətin başdaşı üzərində bu sözlər yazılacaqdır" (166, səh.190).

Eyni anlamda aşağıdakı deyimlər dilimizdə işlənməkdədir: "Əvvəl yumruğunu düyünlə, sonra qanmaza söz çatdır", "Əvvəlcə arxı hoppan, sonra "bərəkallah" de"., "Ayını soymamış dərisinə qiymət qoyma!"

Nizami, Füzuli, Xaqani, Saib, M.Xalxali, M.Ə.Sabir, H.Cavid, M.Ə.Möcüz, Şəhriyar, Səhənd, S.Vurğun, S.Rüstəm, B.Vahabzadə, H.Sahir, Yalqız, Kərimi, Nəccaroğlu, Şəhrək kimi şairlərimiz, M.F.Axundov, Ə.Haqverdiyev, C.Məmmədquluzadə, N.Vəzirov, C.Cabbarlı, İ.Hüseynov, H.Abbaszadə, S.Rəhimov, Anar, M.Süleymanlı kimi yazıçılarımız xalqa, xalq dili və ədəbiyyatına ağlasığmaz qədər bağlı olduqlarına görə, hər kiçik şerlərində, hekayə və povestlərində onlarca atalar sözlərini, deyimləri muncuq təki ipə-sapa düzüblər. Təsadüfi deyil ki, Nəcəf bəy Vəzirovun əksər əsərlərinin adı ata sözləri və deyimlərdən ibarət idi. Təsadüfi deyil ki, Ə.Haqverdiyevin əsərlərinin yüksək sənətkarlıq məziyyətləri sırasında onun xalq deyimlərindən geniş istifadə etməsi üzərində də geniş dayanılmışdır( 217, s.282-298).

Klassiklərin əsərlərində geniş işlədilmiş ata sözlərinin, deyimlərin böyük əksəriyyəti bu gün dilin lüğət tərkibindən çıxmaqda, unudulmaqdadır. Bədii əsərlərdə həmin deyimlər tarixi dil faktı kimi yaşayır. Biz də imkan daxilində dildə işlənən deyimlərin bədii ədəbiyyatda işlədilməsinə dair nümunələr də verməyə çalışmışıq. Nümunə tapmadıqda deyimin izahını

verməklə kifayətlənmişik. Deyimin qarşısında onun izahı, altında isə onun bədii ədəbiyyatda işlədilməsinə dair nümunə verilmişdir. Bəzi deyimlər bir neçə məna verir, bu halda həmin mənalar vergüllə ayrılmışdır. Bəzən canlı danışıqda, şifahi eşitdiyimiz bir ifadəni xatırlatmaqla kifayətlənmişik. Kitab üzərində iş on illər boyunca davam etdiyi üçün, digər tərəfdən mühacirətdə mənbələri əldə etmək çətinliyi üzündən deyimləri seçdiyimiz mənbələrin bəzilərinin səhifələrini, nəşr ilini dəqiqliklə göstərə bilməmişik.

Deyimlər hər bir yazıçını qadir edir ki, öz şer və nəsrini qüvvətləndirərək, oxucuda axtarış hissini gücləndirsin. Və atalar demişkən, dinləyicini zəhmətə salmayaraq, bir balaca işarə ilə yolun yarısından əlidolu qaytarsın. Deyimdən faydalanan hər bir ziyalı və ya adi bir insan, öz kəlamını gözəlləndirərək, sözün təsirini qat-qat artırsın. Deyimlər də teatr kimidir ki, əgər onda olan əsil mənanı birinin üzünə desən, acı bir həqiqət kimi çoxlarını qəzəbləndirə bilər. Deyim uzun izahı lazım olan bir mövzunun rəsmi kimi işlədilir, nağılçıya oxşayır ki, bir hadisəyə, olaya əfsanəvi don geydirməklə onu şirinləşdirir. Aydındır ki, qoçular və donuz kimi xalqın məhsulunu, əlinin zəhməti ilə qazandığı var-dövlətini talan edən hakimlər olan ölkələrdə xalq yaradıcıları onların basıb-kəsməyindən nicat tapdıqlarına görə, onları rəmz kimi yaratmaq məcburiyyətində qalırlar. Təbiidir ki, boğuntu olan və diktatorluq mədəniyyəti hökm sürən ölkələrdə dilə gətirilə bilməyən həqiqətlər həmişə heyvanların, quşların dili ilə, və ya kinayə, əfsanə, rəmz formasında ifadə olunur.

Acı həqiqətləri azad surətdə dilə gətirmək mümkün olmayan ölkələrdə həqiqətlər əfsanə donu geymək məcburiyyətində olacaq. Məsələn, İranın böyük şairəsi, Azərbaycanın unudulmaz qızı Pərvin Etisami elə bu baxışla Azərbaycanı "tavus", İranı isə "qarğa" timsalında verərək, çoxmənalı bir tərzdə deyir:

*Qarğa gözəl deyil, buna tavuz neyləsin?*
*Cəhlin səni sürükləyir irad tutmağa* (149, səh.69).





Elə həcmcə kiçik şer parçaları, bədii mətnlər var ki, onların az qala hər sətrində deyimlərdən istifadə olunmuşdur. O sənətkarlar deyimlərdən uğurla, yerli-yerində istifadə edə bilir ki, onlar xalq həyatına, xalqın zəngin folkloruna dərindən bələddir və onu hifz edib saxlamağın zərurətini dərk edirlər.

*Oğlan ürəyinin sandığın açır,*
*Oğlan acıqlanıb, dodağın büzür.*
*Bütün el-obanın daşını atır,*
*"Vətən" deyə tutur burnunun ucun.*
*Ürəyi ağacda yarpaq tək əsir.*
*Başım daşdan-daşa dəydi,*
*Ölüncə götürməm üz ayağından* ( Səhənd).

Bir sıra deyimlər müəyyən yerdə baş verən hadisələrlə əlaqədar yaranır. "Meymun gözünü açdı" kimi deyimi xatırlatmaq olar. Türkiyədə dükançı bir yerə gedən zaman, dükanı meymuna arxayın olub, gedir. Bir oğru gəlib meymuna baxaraq, o qədər əsnəyir ki, meymunu yuxu aparır. Oğru fürsətdən istifadə edərək, dükanı boşaldır. Dükan sahibi gəlib işi belə görən zaman, meymunu bərk döyür. Başqa bir gün yenə oğru gəlib, istəyir yenə də meymunu yuxuya verib, dükanı boşaltsın. Nə qədər çalışırsa, görür ki, meymun daha gözlərini yummur. Ona belə deyir: "Meymun gözünü açdı" (2, səh.16 ).

"Sağ əl" deyiminin işlədilməsinə də tez-tez təsadüf edilir. - "Amirhaşım xan Xiyabani Bağırxanın sağ əli idi. O, Sarıdağ səngərlərinə baş vuran zaman, orda şəhid olur".

Deyimlər türkün mənəvi varlığının və milli kültür birliyinin danılmaz örnəyidir. "İynə salmağa yer yox idi", "Yalan ayaq tutar, amma yeriməz" və s.

Bəzən bir kəlmədən istifadə yolu ilə bir sözün neçə formaya düşməsi ilə müxtəlif deyimlər yaranır. Məsələn, "şorgöz", "gözü açıq", "acgöz", "göz tikmək", "göz kötəyi vurmaq", "göz verib, işıq verməmək" və s. deyimlər "göz" sözündən istifadə yolu ilə yaranmışdır.

Bir sıra deyimlər də vardır ki, dəyişik bölgələrdə dəyişik kəlmələrlə yaransa da, anlam baxımından eynidir. «Dil ustası, iş xəstəsi», «çənəsi boş», «əngəbəy», «dırnaqsız», «Siyədöyün iti», «suya düşmüş siçan», «dəvəsi ölmüş ərəb», «iynə yemiş it kimi», «hamam fitəsi kimi hər gələnin belinə bağlanan», «gələnə qardaşdır, gedənə yoldaş», «dəvə kimi böyüdükcə dalıya işəyən», «çürükbaş» və s. "Tehrandakı o çürükbaşlar, fasidbeyinlər bilməlidirlər ki, nə vaxta qədər o qorxulu, zülm, əsarət nişanəsi olan (Rzaxanın Təbrizdəki mücəssəməsinə işarədir –B.H.) mücəssəmələr aradan getməyibdir, nə vaxta qədər bunlar millətin əli ilə götürülüb, sərnigun olmayıbdır, İranda azadlıq ola bilməz» (S.C.Pişəvəri).

Bağırxan: 1326-cı ilin Şəvval ayının 25-də Eynüldövlənin Səttarxana təslim olmaq üçün göndərdiyi kağıza Bağırxan cavab verərək deyir: «Hər nə əllərindən gəlir, əsirgəməsinlər» (149, səh. 52).

«Gözdən sürməni çəkmək» və ya «gözdən sürmə oğurlamaq» deyiminin yaranma tarixi də maraqlıdır.

Bir zamanlar İstanbulda, Qayımpaşada qayıq yapılan yerlərə göz və qayıq yapımında istifadə olunan taxtalara da «sürmə» deyilərmiş. Bəzi açıqgöz hırsızlar "göz" deyilən qayıq otaqlarından taxtaları aşırırlarmış (2, səh. 15).

Bəzi deyimlər və atalar sözləri hakimiyyət və hakim olan ideologiyanın dəyişməsi ilə əsil anlamını əldən verir, tam əks mənada işlədilir. Məsələn, Anaşahlıq dövründə ictimai qüdrəti təmsil edən "Al arvadı» deyimi Ataşahlıq hakimiyyəti dövründə, öz mənasını əldən verərək təhqiredici, fəlakət və törəniş ziddi olan anlam daşıyır. Bəzi deyimlər vardır ki, insanların şikar (ovçuluq–**B.H.**) dövründən qalan ənənələrlə əlaqədar yaransa da, bu gün də öz həyatını davam etdirir. Misal üçün, "cöcəmə bəzəmək", və ya "pişik bəzəmək".

Bəzi deyimlər məsdər şəklində işlədilir. Misal üçün, "pişik bəzəmək". Bəzi fellər əmr şəklində, deyim surətindən çıxıb, atalar sözü anlamını daşıyır. Məsələn, "pişik bəzəmə!".





"Göz dağı" deyiminin yaranma tarixinə nəzər salaq. Təbriz, Güney Azərbaycanın mərkəzi şəhəridir. Hələ eramızdan əvvəl şəhər qala kimi düşmənə göz dağı üçün tikilib. "Göz dağı" deyimi ilə bərabər "göz kötəyi" deyimi də işlədilir. Ağır şəraitdə qalanda insanlar öz istək və arzusunu həyata keçirə bilmədikdə ona baxmaqla ürəyini soyudarlar. Məsələn, əmim arvadının dediyinə görə, anam mən zindana düşəndən sonra, imkansız olan zamanlar qızıl dükanına kənardan baxaraq deyərmiş: "Bizim ki, almağa gücümüz çatmır, qoy heç olmasa, göz kötəyi vurmaqla, ürəyimizi soyudaq".

Bəzi deyimlər var ki, ata-babalarımızın islamdan əvvəlki inamlarını, o cümlədən odpərəstliyi və hətta ondan əvvəlki dövrləri də özündə əksi etdirir. Bu gün də "od qisməti" kimi deyimlər əski zamanlarda odun türklərin yaşadığı soyuq məkanlarda nə qədər dəyərli olduğunu isbat edir. Və ya "od aparmaq" deyimi vacib olan məqamda lazım olanı ələ gətirib, təmkinlə vaxtı əldən verməməyə işarədir.

Bu gün odun dəyəri dünyada texnologiyanın və elmin inkişafı nəticəsində təbiidir ki, keçmiş zamanlardakı kimi deyil. Aya, günəşə yol tapan insan bu gün bir çox sahələrdə qələbə çalmışdır. Təəssüflə deyə bilərik ki, biz odlar yurdunda yaşasaq da, neftsiz, neft mədənlərindən məhrum olan ölkələrin əksinə bizim çoxlu vətəndaşlarımız yuyunmaqdan, sıcaq su tapmaqdan ötrü, və ya isti otaqda yatmaqdan ötrü yad ölkələrə üz tuturlar. Belə bir ağır vəziyyətlər göstərir ki, biz müxtəlif səbəblər üzündən hələ də geridə qalan ölkələr sırasındayıq. İnanıram ki, qəhrəman ruhlu, yüksək iradə və milli şüurdan bəhrələnərək, milli faciələrə son qoymaq istəyən insanların əli ilə hər cür çətinliklərə qalib gəlmək mümkündür. Bunu da unutmayaq ki, təkcə qədim dövrlərdə olduğu kimi kişiliklə, mərdliklə bu texnoloji əsrdə düşmənlərimizə qalib gəlmək mümkün deyil. Biz gərək bu günkü texnologiyaya, biliyə sahib olaraq, türkün fədakar oğul, qızlarının yüksək iradəsi ilə hər bir torpağımıza göz dikənləri yerində oturmağa nail olaq. Buna inanmaq istəyirik ki:

*Yad qardaş olammaz bizə, qardaş da yad olmaz,*
*Qəlbim sən ilə şad olu, sənsiz də şad olmaz.*

Biz gərək qardaşlıq yumruğunu düyünləyəndən sonra qanmaz düşmənlərimizə türkün gücünü anladaq.

"Başa çıxartmaq" deyimi. Elə bil dünəndir, Azərbaycan Milli Elmlər Akademiyasında böyük Mirəli Seyidovla oturmuşuq. Ermənilər Qarabağı zəbt eləmək fikirlərini hərdən dilə gətirirlər. Mirəli Seyidov onlara cavab verərək, ermənilərə "dostlar"a deyir:

"Bizim evimizi məhəbbət yıxıb. Düşmənə məhəbbət etmək, öz xalqına xəyanət etmək deməkdir. Biz əski zamanlardan başlayaraq, qardaşlıq və internasionalizm şüarı altında Azərbaycan torpaqlarını qurbanlıq əti kimi düşmənlərə paypülüş etmək siyasətini başa düşməmişik. Beləliklə, düşmənləri öz süfrəmizin başında oturtduğumuza görə, onları tanıya bilməmiş, onları sözün əsil mənasında **başımıza çıxartmışıq**".

*Ayağın münbərə qoycaq, elədin hökme- cəhad,*
*O qədər dad elədin, xəlqi çıxartdın başıma.*
*Tökdü hürriyyəti- İran əcəb, kül başıma* ( 93, səh. 46).

Deyimlərimizdə türkün əski inamları da özünü əks etdirir. Göy rəngi türk dilli xalqlarda bir tərəfdən qıtmırlıq (xəsislik- B.H.), digər tərəfdən də qara gün, matəm, yas simvolu olubdur. Elə bu inamı çağdaş dövrümüzdə də deyimlərimizdə çox qabarıq surətdə görə bilirik. «Hacı Qara» əsərində Tükəz əri Hacı Qaranın qıtmırlığını, xəsisliyini görərkən, onu «ay göyərmiş» sözü ilə təhqir edib, tanıtdırır. Və ya Qarabağ zonasında təkcə kəlmədən ibarət olan «göy» deyimini işlədib, bir insanın xəsis, səxavətsiz olduğunu ifadə edirlər. Bu inam, mədəniyyət "Dədə Qorqud»da da gözə çarpır. Orda ən rəhmsiz düşməni "göygöz kosa" adlandırırlar. Eyni anlam xalqımızın ən məşhur şairi aşıq Ələsgərdə də çox aydın təzahür edir.





"«göylük»", "zəylik" olan məclislərdən qaç ki, orda xeyir-bərəkət olmaz ( 14, I cild, səh. ).

Gördüyünüz kimi, burda "göylük" namərdlik, qıtmırlıq, xəsislik, əzab-əziyyət verən anlamında işlədilir. Bu dünyagörüşü şer formasında xalqımızın əzbəri olan atalar sözlərimizdə də işlədilir. Misal üçün:

*Bərhəzər etmək gərək üç zaddan:*
*Göy göz, üz qırmızı, tük sarıdan.*

Və ya «üzü qırmızı" deyimi yenə də mənfi xislətli insancığazlar haqqında işlədilir. Yəni utanmaz, heç bir qohum-qardaş, yoldaş tanımayan insancıqları bu deyimlə xarakterizə edirlər.

Rənglər və boyalar türk folklorunda, gündəlik yaşamında çox böyük yer tutur. «Qara kölgə» deyiminə bir nəzər salaq. 1917-ci ildə çıxan «Beyrəqi- ədalət»in 3-cü sayında oxuyuruq: «Hər bir millət arasında bir növ insanlar var ki, onlardan hamı bezardır. O cür insanlara türklər «qaşmar» və ya «qəmşər» deyirlər. «Qaşmar»ın lüğəti mənası «qara basmaq» deməkdir. Ədibi-möhtərəm Əli bəy Hüseynzadənin «Kölgə» təbirinə biz də bir qara əlavə edərək, «kaşmar» adamları «qara kölgə» deyimi ilə «qarayine- girami həzəratına» təqdim edirik. «Qara kölgə»lər özləri başqalarını narahat etmək, başqalarının vaxtını zay etmək və istirahətini xələldar etməkdən ləzzət duyarlar. Özgələrin bədbəxt və zəbun hallarından məmnun və xoşnud olarlar. «Kaşmar»ın qəlbində səlaməti-əqidə, səlaməti-fikir ola bilməz. O, fəqət, özgələrini işləməyə qoymaz. Yoldaşları bir-birindən soyudar, sadədil yoldaşlar arasında nifaq salar, xalqa keçmiş xəyanətləri malalamağa, özlərini heysiyyət tərəfdarları kimi göstərməyə çalışarlar».

Göründüyü kimi, bu deyimin hətta yaranma tarixi, günü, harada rəsmiləşməsi də özünü açıq-aydın büruzə verir. Bu deyim Cənubi Azərbaycanda 1905-ci illərdə Səttarxanın başçılığı ilə milli azadlıq yolunda başlanan Məşrutə inqilabı

dövründə də «olvat, dəli, lotu», bu günkü sözlə desək, «lümpen» adı ilə işlədilir.

Böyük inqilabçı, Azərbaycanı canından çox sevən Behruz Dehqani (Aydın) "Məşrutə hərəkatında lümpenlər" adlı məqaləsində yazır:

"Lümpenə fərq etməz ki, Yezid bayrağı altına getsin və ya şəhidlərə sinə vursun. Məşrutiyyət dövründəki lümpenlərin bir hissəsinin adından, ləqəbindən də onların şəxsiyyətini tanımaq mümkündür. Misal üçün, «it Xəlil», «qulağı kəsik Əsgər», və ya «Məşəabbasəli Əllaf» kimi ikiüzlülər ki, Səttarxanla zahirdə dost idilər, əncüməni-islaminin felinə uymaqla, onu bir evə aparıb, onun canının qəsdinə təcavüz etmək istəyirlər. Güllə Səttarxanın çiyninə dəyir, özü güclə sağ qalır. Bu lümpənlərdən və ya «qara kölgə" adlanan lümpenlərdən bir neçəsi var ki, sədaqətlə xalq ordusuna qoşulub, hətta bu mübarizə yolunda canlarından keçirlər. Misal üçün, Təbrizin məşhur "Qara kölgə"lərindən olan Həsən Dəli, bir müddət lümpənlikdən sonra məşrutə hərəkatına qoşulub, Eynüldövlənin Basmıncda olan ordusuna gecə hücum edir. Bu qorxmaz insan top olan yerə yaxınlaşıb, topun lüləsinə minib, öz qışqır-bağırı ilə düşmən ordusuna qorxu salıb, özü də orda şəhid olur. O gecə indi də xalqın yaddaşında "Dəli Həsən" gecəsi" kimi qalmışdır".

Elin bahadırları, elin və tayfanın ağır günlərində qara geyib, göy sarınardılar. Beləliklə, bu inam bu günümüzədək bizim ədəbiyyatın təməl daşı sayılan folklorumuzda, mənəvi varlığımızda da öz əksini tapır.

Türk dünyasının böyük şairi Şəhriyarın bir şerinə diqqət yetirək.

*Yar günümü göy əskiyə tutdu ki, dur məni boşa,*
*Cütçü görübsən öküzə öküz qoyub, buzov qoşa?*

Bəzi deyimlərimizdə keçmiş dövrün adət-ənənələri, məişət tərzi də gözə dəyir. Bağın bir guşəsində, və ya Xanabağın damında üzümü kişmiş eləmək üçün sərib qurutmağa "vərəzən





sərmək" deyimini işlədirlər. Bu deyim təkcə bağda yox, evdə, idarələrdə hansısa kağızları sərib, töküb-dağıtmaq mənasında da işlədilir. Azərbaycanın müasir satirasının istedadlı yaradıcılarından olan **Yalqızın** şerinə müraciət edək:

Başlaram şer yazam, dillənəsən son bu sayaqda:

*"Qara Seyid yenə də pir-pitiyin tökdü qabaqda.*
*Vərəzən sərdi, kitab-dəftərini taxta-tabaqda,*
*Çəkdi siqar yenə də tüstü-duman saldı otaqda!*
*His iyi yatdı damaqda!"* (338, səh.161 ).

Heydər Əliyevin nitqlərinin birində oxuyuruq: "Azərbaycanda yaxşı bir söz var: keçənə güzəşt deyərlər"(52, səh. 21).

Bəzi deyimlər var ki, Azərbaycan qadınının ən dəhşətli, ağır günlərdə yaşamasından xəbər verir. Bu da türk dünyasına başucalığı gətirməyən bir haldır. Azərbaycanın görkəmli alimi və şərəfli yaşamağın simvolu olan professor Elməddin Əlibəyzadədən eşitdiyim bir deyimi nəzərinizə çatdırmaq istərdim. Bu deyim çağdaş zəmanəmizin reallığını özündə olduqca gözəl əks etdirir. Evlənmək yaşında olan qeyrətli oğullarının böyük bir hissəsi Qarabağ savaşında şəhid olan, böyük bir hissəsi isə ölkəmizin sərvəti müəyyən adamların əlində cəmləşdiyinə görə, bir parça çörək dalınca Sibirə, Rusiyaya (2 milyondan milyondan artıq–**B.H.**) üz tutub, orada ruslarla, qeyri-millətlərlə gün keçirən böyük millətimizin namuslu, qeyrətli qızlarının, gəlinlərinin ən böyük problemlərindən biri də vaxtında ailə qura bilməməkdir. "Arvad şalonladır, kişi talonla". Bu deyim türk millətinin ən ağır dövranda yaşantısının rəmzi kimi gələcək nəsillərə bir işarədir.

Təbiidir ki, qadınları "şalon"la dəyərləndirən bir millətin gələcəyi oluqca ağır, acınacaqlı olacağı indidən bəllidir. Əgər milləti bir dəmir parçası, onun başında duranları isə bir sənətkar kimi qiymətləndirsək, onda gözəl sənətkarın əlində bu dəmir parçası kəskin, düşmənə qarşı işlənən kəsərli bir qılınca və ya tarixdə öz sözünü deyə bilən qələm ucuna çevrilə bilər. Ya da

əksinə, bu dəmir çürüyüb aradan getmək məcburiyyətində qalan bir nala çevrilə bilər.

Hüseyn Cavidə məxsus olan bir atalar sözünü də unutmayaq: "Yaman günün ömrü az olar, acısı çox". Biz bu acıları ata-babalarımızdan irs alıb, bu gün də buna son qoya bilmiriksə, belə bir acını biz daha da faciəli surətdə gələn nəsillərə utanc gətirici irs kimi qoyuruq.

*Türkü vallah, analar oxşağı, lay-lay dilidir,*
*Dərdimi mən bu dava ilə müdava elədim* (Şəhriyar).

İnanırıq ki, dilimizin zənginliyinin parlaq nümunəsi olan deyimlərimizdən sizə təqdim etdiyimiz bu nümunələr millətimizin birləşməsində, gələcəkdə qüdrətli bütöv Azərbaycanın yaranmasında müəyyən rol oynayacaq.

Mən ağlım kəsəndən xalqımızın şifahi söz sərvətini toplamaqla məşğul olmuşam. "Atalar sözlərinin kökləri" kitabı da topladığım şifahi xalq ədəbiyyatımızın bir budağı hesab oluna bilər. Topladığım folklor nümunələri bu vaxta qədər bir neçə kitab şəklində işıq üzü görüb. Təbriz Universitetinin Dağçılıq müəllimi işlədiyim zamanlardan başlayaraq kəndbəkənd dolaşıb xalq deyimlərini toplamağa çalışırdım. Bu zəngin mənəvi xəzinənin itib-batmaması üçün 40 ilə yaxındır ki, eşitdiyim hər bir deyimi qeyd etməyə çalışmışam. Kitabda Azərbaycanın güneyində işlədilən deyimlər ağırlıq təşkil edir. Bu bir tərəfdən, güneydəki deyimlərimizin daha artıq aradan çıxmaq, məhv olmaq təhlükəsi ilə bağlıdır, ikinci tərəfdən mən bu mühitə daha dərindən bələd olmaq imkanına malik olmuşam. Bununla bərabər, Azərbaycanın şimalında, eləcə də İranda yaşayan digər türklərin- Xorasan, qaşqay, Həmədan, Kərkük türklərinin işlətdiyi deyimləri də əhatə etməyə çalışmışam. "Türk deyimləri" adlansa da, bu kitab əslində türk deyimləri dəryasından bir damladır. Türk deyimlərini hamısını toplayıb ərsəyə gətirmək bütün xalqın, millətin borcudur. Bu da milli hökuməti olan ölkələrdə mümkündür.





Bu kitabın işıq üzü görməsində çoxlu dostlarım yardımçı olublar. Bu deyimlərin böyük hissəsini xalq deyimlərini sinəsində yaşadan atam Hüseyn Səlablı və anam Xanım Qəffari-Cabbaridən eşitmişəm. Qardaşım Firuz Həqqi 10-15 il qabaq Almaniyaya qonaq gəlsə də, vaxtının çoxunu mən sərhəddən keçərkən çaya düşmüş, çürümüş hala gəlmiş deyimlərin yenidən yazılmasına sərf etmişdir. Bu kitabdakı bir çox deyimin sizə təqdim olunması üçün mən ona borcluyam. "Hər zadın təzəsi, dostun köhnəsi" deyimini xatırlayaraq cavanlıq dövranımın dostlarından olan Həmzə Fərahətiyə, Hüseyn Təvəkküliyə, Vahid İslampənaha, Həmid Dadpura, Marağalı Kəriminin çoxlu deyim seçdiyimiz "Rəngarəng" kitabını bizə təqdim etmiş əziz Mahmud Tikana və b. bütün bu kitabda əsərlərindən örnək gətirdiyimiz yazıçıların, şairlərin, siyasi xadimlərin tək-təkinə minnətdarlığımı bildirirəm. Kitabın işıq üzü görməsində, çapa hazırlanmasında uzun zaman bir alim kimi yaxından kömək göstərmiş həyat yoldaşım Aybəniz Kəngərliyə ayrıca təşəkkür edirəm.

Kitab mühacirətdə yazıldığı, üzərində uzun illər işləndiyi üçün bir çox bədii nümunələrin qaynaqlarını dəqiqləşdirə bilmədik. Ədəbiyyat siyahısında sizə təqdim olunan qaynaqlar mənim istifadə etdiyim qaynaqların ancaq bir hissəsidir. Gələcəkdə bu kitabın daha mükəmməl nəşr olunması üçün deyimlərimizi sinələrində yaşadan həmvətənlərimizdən yardımçı olmalarını, xatirlərində olan xalq deyimlərini bizim internet ünvanımıza göndərmələrini xahiş edirik: **btabrizli@gmx.de**

Göstəriləcək tənqidi qeydlər, veriləcək məsləhətlər üçün əvvəlcədən öz təşəkkürümüzü bildiririk.

**Behruz Həqqi**
**Bakı, mart-aprel 2005-ci il.**

# -A-

**Abad olar bülbülüyəm, xarab olan bayquşu** – bu «mənə nə var»ların, çörəyi gün bahasına yeyənlərin şüarıdır.

**Abad yerin bülbülü, xarab yerin bayquşu** - alçaq adam, öz şəxsi mənafeyini hər şeydən üstün tutaraq hər alçaqlığa dözən.

**Abı donun parıldar, bağırsaqların quruldar** - zahiri çox parıltılı olsa da, əslində vəziyyəti yaxşı deyil. Bahalı geyinib yeməyə bir şey tapmayan adama deyilir.

**Abırını ətəyinə bükmək** -biabır eləmək, ovcunu açmaq, hörmətdən salmaq.

Deginən ona adam içində mənimlə bir az yaxşı rəftar eləsin. Abrımı bükür ətəyimə (84, s.115).

**Abrısını əlinə vermək** - aradan pərdəni götürmək.

Abrısını alıb əlinə verdi (64).

**Abrı tökülmək** – həyası getmək, biabır olmaq.

Qardaş, mənim abrım töküldü, belə də rəftar olar? (195, c.II, s.136).

**Acan- pastar görüb** - Azərbaycanda şah zamanında acan və mollalar hakimiyyətində pastar zor deyən, xəlqi qorxudan mənasında işlədilirdi. Yəni, çay da yazıq insanlar kimi acanı, pastar görməyə görə rəngini itirib. Rəngsiz çaya deyilir. Şimalda bu deyim "çayın milisioner / ajdan görüb?" formasında işlənir.

**Ac canavar ağız ağıza yatar** - həqiqətdə yeməyə bir şey tapmayan adamlar başqasının mənafeyini gözləməzlər. Canavarlar da ac olanda bir-birini yeyər. Yoxsulun imanı olmaz.

**Acdın çobana, yoruldun sarvana** – hər şeyi hamıdan ummaq olmaz. Hər şey hamıda olmaz.

Çoban qardaş, "acdın çobana, yoruldun sarvana", yeməyə bir şeyin varmı?(46, s.15)

**Ac doğrar, tox yeyər** -yaxud dövlətlinin burnu qanasa, kasıb donun cırıb onun qanın bağlar.

**Acgöz** - xəsis, tamahkar, gözü onun-bunun malında olan.





Udmuş nə qədər bilsən zalimləri bu torpaq
Lakin yenə doymaz bu acgöz adam udmaqdan (163).
Var sürüylə qoyunu, ilxı ilə at-öküzü,
Olsa da min bu qədər mal-qarası, acdı gözü (267, s.206).

**Aci bağırsaq kimi uzanmaq** – xoşa gəlməyən bir zadın uzanması.

Acı bağırsaq kimi uzun, ağır qar yağışıdır ki, yerin çırpınmayan sinəsində xirmən kəsər ( 204).

Həmidi də arxasınca çağırırdı. "Bu yol acı bağırsaq kimi nə yaman uzandı" (1, s.315).

Arzum budur: bizim mənzilin əsaslı təmiri acı bağırsaq kimi uzana-uzana qışa qalmasın (253, s.14).

**Acından köpük qusmaq** -ən yoxsulluq.

**Acından yuxuda un süfrəsi görmək** - maddi cəhətdən çox ağır vəziyyətdə yaşamaq, aclıq çəkmək.

**Acı söz** – həqiqəti əks etdirən söz.

Mərhum Mirzə Kiçik xanın Tehran haqqında çox acı bir sözü xatirimə gəldi. Tehran abad olmaq üçün bütün İran bərbad edilmişdir (161, səh 83.).

**Acı yel** - pis vəziyyət, quldurların əlində bir ölkənin əsir qalması.

Bostanın qeydinə yarəb, görəsən kim qalacaq,
Acı yel aldı həyat ruhunu torpaqlardan (231, s.35).

**Ac qarına soyuq su** - bugünkü tibbdə ac qarına su içmək faydalı sayılır. Ancaq qədimdə insanlar lazım olan bir şeyi kənara qoyub lazımsız iş görməyə belə deyərdilər.

**Ac qatıq istəməz, yuxulu yastıq** - doğrudan ehtiyacı olan adam şəraitə və əldə olana qane olar.

**Ac qulağım, dinc qulağım** – gündəlik dava-dalaşdan ac qalıb rahat yaşamaq yaxşıdır.

- "Ac qulağım, dinc qulağım", Məmmədqulu! (253, s.284).

**Ac qurşağında çörək dayanmaz** - yoxsulluqla yaşayan adam heç bir zad artıra bilməz.

**Aclıqdan qaralmaq** – çox ac qalmaq.

Yenə hər vaxt uşaqlar qaralır aclıqdan,

Mən özüm də ilin on payını lap ac qalaram (80, c. II, s.135).

**Ac toyuq dışında buğda / darı görər** - darı görər şəklində də işlənir. Yoxsul adam yüksək məqamlara, xoş yaşayışa fikirləşir.

**Ac yavanlıq istəməz, yuxu da yastıq** – insanın istəkləri şəraitdən asılıdır.

Ac yavanlıq istəməz, yuxu da yastıq (103, s.70).

**Acaram sandığı, tökərəm pambığı** -bildiyim gizli mətləbləri açıb deyərəm. Hədə- qorxu mənasındadır

Bir dərd bilən axtarıram,

Bir aça biləm sandığı, tökə biləm pambığı (284).

**Açar Fransa** -vintaçandır ki, ağzı istənilən qədər açılır, yumulur. Hər bir yerə düşür. Hər bir işə əl vuran, hər işdən baş çıxardan mənasında işlənir.

Hər gün düşürlər bir oda,

Hər ləhzə bir moda, guya açar Fransadır, hər möhrəyə düşər.

**Acıb ağartmaq** - sirrini açmaq, biabır etmək, aradan pərdəni götürmək.

Açıb ağartmadı o sirri vaxtsız (337).

Yer haqqı, göy haqqı, biz bu işi açıb ağartmarıq. Arxayın olun (195, c.II, s.15).

**Acıb vərəzən etmək** - bir sirrin üstün açmaq, hamıya bildirmək.

Vərəzən Azərbaycanda bağın bir tərəfində alu, üzüm və ərikləri sərib qurutmaq üçün hamarlanan və düzələn yerə vərəzən deyilir.

**Açıq dil** - düşüncə və elm əsasında danışılan söz, yazılan yazı.

Ruznamələr firqəmizin açıq dili və kəskin silahıdır (30, 1945).

**Açıq gözdən kirpik qoparmaq** - od -alov, kələkbaz.

**Açıq ürək** -səmimi, şad adam.

Əllərdə saz ola, dildə söz ola,





Açıq ürək ola, gülər üz ola (283, s.181).

**Açım gül ağzımı?** – ağır söz deyim?

Əh, çox mənim hövsələm var? Açım gül ağzımı, dişimin dibindən çıxanı sadalayım( 72, c.III, s.121).

**Aç qapını, ört qapını** - faydasız bir işlə məşğul olmaq, vaxtı boş keçirtmək.

**Açsa ovcundadır, yumsa yumrugunda** -bir adamın nüfuzunda olmaq.

**Adamdan eşşək olmasa, eşşəyin biri çıxar min tümənə** – adam var ki, eşşəkdən də pisdi.

Olmasa eşşək əgər insanidən,

Qiymətе- xər onda keçər saydan (168, səh. 262).

**Adamın adı çıxınca, canı çıxsın** - bir adam pis ad çıxartsa, onun yenidən yaxşı ad qazanması çətindir.

Ey kaş adamın adı çıxınca canı çıxsın( 168, s.111).

**Adamı tanıyan yerdə qurd yesin** - qürbətə etiraz, vətəndə yaşamaq arzusu.

**Adam yerinə qoymaq** - hörmətini saxlamaq, ehtiramla yanaşmaq.

Sən məni o qədər incitmisən ki, mən səni daha adam yerinə qoymuram(195, c.II, s.56).

**Adamyeyən** - tarixdə həqiqi mənada adam yeyən tayfalar mövcud olmuşdur. Məcazi mənada üzlü, qorxulu adam mənasındadır.

Əbəs, əbəs neyçün qaçırsan bəndən,

Mən ki zalım, adamyeyən deyiləm? (329).

Şeyx Nəsrüllah adamyeyən deyil ki (195, c.II, s.58).

**Ad bizimdir, at özgənin** - yəni bizim adımız ilə kef çəkib, xoş yaşayırlar.

Havaxtacan ad bizim, at özgənin olacaq (142, səh 286).

**Ad bizim, dad özgələrinin** - yəni adı bizim üstümüzdə, xeyri başqaları görür.

**Adda- budda** -ordan- burdan.

Sözlərinin içində atdaq-butdaq bir kişidən danışdılar (203, səh. 48).

**Addımbaşı** -təkrar-təkrar, dönə-dönə, az bir məsafə vahidi.

Addımbaşı bir bank idi hər şəhərdə bari (168, səh. 466).

**Adı başqa, dadı başqa** – "igidin adını eşit, üzünü gormə" deyimi ilə təxminən bir mənadadır. Çox vaxt xoşzahir, bədbatil adam haqqında işlənir.

**Adı qulağına dəyib** -özünü başqalarından üstün tutmaq

Bağır: Bu Xaspoladov kimdir e.. Hardan adı qulağıma dəyir? (9, s.192).

**Adımı an bir çürük qoz ilə** – dost məni yad eyləsin bir çürük qoz ilə, yəni əsas hədiyyənin kiçik, böyüklüyü deyil, diqqətdir.

**Adımı sənə qoyum, səni yana-yana qoyum** – öz pis əməllərini başqasının boynuna salan adam, lazım olan zaman belə deyər.

**Adım yadımdan çıxıb** – başım çox qarışıqdı, durumum yaxşı deyil.

İbişli: Lap çaşıb qalmışam, öz adım yadımdan çıxıb (9, s.181).

**Adın daşa yazılması** – ölmək anlamındadır.

Töküldü torpağım, tutuldu gözüm

Mustafayam, adım daşa yazıldı (97, səh 67).

**Adını çıxardıb, özü dəyirmanda oturub** -böyük şöhrət qazansa da özü bir iş görmür, o şöhrətlə onun əməli arasında böyük fərq var.

**Adın nədir, Daşdəmir, yumşalısan, yumşalı** – yəni təcrübəsiz adam kobudcasına davranar, yəni o nə desə, o olacaq, ya kötək və ya düşüncə gücü ilə əvəz olunar.

Sərhəng – deyirsən, cənab bolşevik, adın nədir, Daşdəmir, yumşalısan, yumşalı (77, səh. 28).

Adın nədi Xaspolad, yumşalısan yumşalı (9, s.182).

**Adını batırmaq** – pis bir hərəkətlə xalq içində rüsvay olmaq.

Təzədən bir adını niyə batıraydı? (84, s.37).

**Adının qulu olmaq** – həmişə şərəflə yaşamaq.





Mənim balam bu dünyada

Ölənəcən hər kəs elə

Öz adının quludu (260, s.148).

**Adını tut, qulağını çək** – sözünün üstünə gəlib çıxan adama deyilir.

Adını tut, qulağını çək (335, s.280).

**Adı üstündə olmaq** -bir kişinin bir qadının əri olması.

Hər halda Əlizamanın adı onun üstündə idi (84, s.399).

**Adı var, özü yox** - adı dillərə düşsə də, əməli görünməyən adam.

Vəfa bu aşinalarda olubdur morğe-unqa tək,

Adı vardır, özü yoxdur bunu mütləq deyərlərmiş (347, s.269).

**Aftafaya laflafa demək** -əldən düşmüş, qocalmış.

**Ağa bəliçi** - hər sözə boyun əyən, yaltaq.

**Ağac ayaq** - arıq, ora- bura qaçan, yorulmayan.

**Ağac bar verəndə başını aşağı əyər** – ağıllı, düşüncəli adam başqalarına yuxarıdan aşağı baxmaz.

Ağac bar verəndə başını aşağı əyər (1, s.166).

**Ağac başında mum var -bizi tanımayan kim var** -bizim işimiz hər kəsə aydındır.

**Ağacda yatmaq** -çox tezdən durmaq.

**Ağacdələn** -quş adıdır, məcazi mənada çoxdanışan, baş aparan mənasındadır.

Dedim: Olar səninlə beş dəqiqə bahəm olaq,

Dedi: ağacdələnin yoxdu gülüstanə yolu (168, s.530).

**Ağacdələnə döndərmək** -çox danışdın, baş beynimizi apardın.

**Ağacı meyvəsi ilə tanıyarlar** –ata- ana övladı ilə tanınar.

**Ağacın birini itdə eləyib, birini məndə** - mənə gün vermir, göz verir, işıq vermir.

Ağacın birini itdə eləyib, birini məndə (129, c. I, s.429).

**Ağacının qabağına ağac uzatmaq** – sözünün qabağına söz demək.

Bu vaxtadək onun ağacının qabağına ağac uzadan olmamışdı (72, c.III, s.106).

**Ağac tutan baş yarandan çoxdur** - baş yaranların bir də ağac saxlayanları olur. Bu adamlar ağacı qəmənin qarşısına tuturlar ki, qəmə başa çox işləməsin.

Boş- bekar adam işləyəndən çoxdur.

**Ağac yaş ikən əyilər** -uşaq vaxtında tərbiyə olunmalıdır.

**Ağa deyir: sür dərəyə- sür dərəyə** - mənə böyüklər nə deyir, onu eləyirəm.

Mən buyruq quluyam, mənə buyurublar sür dərəyə, sür dərəyə (195, c.II, s.123).

Onu şahdan soruş, mənimki- ağa deyir sür dərəyə, sür dərəyədi (46, s.158).

Ağa deyir sür dərəyə, sür dərəyə (335, s.307).

**Ağ ağça qara gün üçün** – insan gərək yaman gün üçün ehtiyat görə.

Ağ ağça qara gün üçün (229, s.28).

**Ağa qəbrinin şam/ mum qapanıdır** -tələsik qaçan adama, tez bir yerə dəyib gedən adama deyilir.

**Ağalıq tövləsi** -bir-birinə qarışmış yer. Çox səs-küy olan yer.

Kəf çalan, fışqa vuran, kim atılan, kim oxuyan
Ağalıq tövləsini keçdi o gərmabeyi -xan (168).

**Ağamməd Bakıdan gəlir** -Bu məsəl Şamaxının Göylər kəndində Nəzakət xanım tərəfindən söylənmişdir. Bir nəfər Ağamməd adı kişi Bakıda yaşayan oğlunun yanına gedir. Kəndə qayıdanda həm üst başı, həm də ədası dəyişmiş olur. Bundan sonra adamlar az vaxt içində rəftarını, münasibətini dəyişən adamlara bu sözü deyirlər.

**Ağ at arpa yeməz?** – bu bizə haramdır?

Ağ at arpa yeməz? (129, I, s.146).

**Ağa yarıdıb haqq olmaq** -üz ağartmaq, baş ucalığı gətirmək.

Onsuz da özümüz-özümüzün haqsız-pulsuz nökəriyik, gedək, işləyək, ağa yarıdaq, haqq alaq (296, s.127).





**Ağ bir, qara iki dillənməmək** -təslim olmaq, susmaq.

Elə bil ki, Əbdüləzimi götürüb qaynar qazana basdın, ağ bir, qara iki dillənə bilmədi (14, s.193).

**Ağ-bozuna baxmayan** – heç bir işin qayda-qanununa baxmayan.

Qaz verib, baxmadı heç ağ-bozuna,
Çox dedik, saymadı əslən qozuna (168, səh. 578).

Başlayırlar ucdantutma ərə getməyə, daha ağına-bozuna baxmırlar (91, s.73).

Hər yerə onu çəkirsən, heç ağına-bozuna baxmırsan. (9, s.23).

**Ağciyər** - qorxaq, vətəni pula satan, düşmən qarşısında quyruq bulayan insanlar.

Bizim şəriətdə müdafiə məsələsi vacibdir. Ona görə də, qorxunu, ağ ciyərliyi qəlbinizə qoymayın (232, səh.55).

**Ağ gün** – xoş gün

Qara günlər arasından bəlkə bir ağ gün çıxa,
Ya çıxa qətlimə fərman, ya ölüm hökmün çıxa ( 260).
Gey ağ libasın, ağ günə çıx, ey günü qara ( 214, s. 41).

**Ağ günə çatmaq** - xoşbəxt olmaq.

Atı aparıram Toqatda verəm Həsən paşaya, bəlkə bu yolla bir ağ günə çatam (174, s.123).

**Ağı qaradan seçmək** -- pis yaxşını dərk etmək.

Bircə mənası var dedim hər sözün,
Mən seçə bilmədim qaradan ağı (328, s.335).

**Ağıldan mayıf** – gic, səfeh.

Fikir verınə, dedim də sənə, ağıldan mayıfdı, sözünü danış (9, s.145).

**Ağıllı olub camaat fikri çəkincə, dəli ol, qoy sənin fikrini çəksinlər** – camaatın dərdini çəkmək çox çətindir.

Ağıllı olub camaat fikri çəkincə, dəli ol qoy sənin fikrini çəksinlər - (129, c.I, s.301).

**Ağılsız başın zəhmətini ayaq çəkər** - biri fikir etmədən iş görsə, sonra gərək o yan- bu yana ayaq döyəsən.

**Ağıl yaşda olmaz, başda olar** -ağıl yaşla deyil.

**Ağır-ağır danışmaq** – yavaş-yavaş, təmkinlə danışmaq.

Ağır-ağır, düşünə- düşünə danışmağa başladı (144, s.43).

**Ağır daş batman döyər** -ağır başlı insanlar hər zaman sayğı görərlər.

**Ağır daşa yapışmaq** -qüdrəti gəlməyən bir işə əl vurmaq.

Sən zorunu sınamamış yapışma ağır daşa,
Sən ki ovsunkar deyilsən, mar ilən işin nədir? (331, s.27).

**Ağır xasiyyət** - hər adamla yola getməyən, tez inciyən.

**Ağır qazan gec qaynar** -xırda pulun səsi çıxar. Dünya görmüş adam istiyə, soyuğa düşmüş adamlar tez çığır-bağır salmazlar.

**Ağırlığın yer götürər, ruzusun allah yetirər** -bu deyim keçmiş zamanlara uyğun olsa da, illərdir ki, öz mənasını əldən verib. Uşağın sağlamlığını, onun tərbiyə və təhsilini nəzərdə tutan ata-analar heç vaxt bu sözləri dillərinə gətirə bilməzlər.

**Ağır otur, batman gəl** - özünü yüngül aparma, hörmətini itirmə, ələ gətirdiyin mövqeyi əldən vermə.

**Ağır söz** - qiymətli söz, təhqiramiz söz.

Yarın özünə qurban,
Ağır sözünə qurban,
Boyaqçıda boyanan
Qara gözünə qurban...

Sənə ağır söz deyərəm ha..

**Ağı səsi** -Azərbaycanın müstəqilliyinə qarşı çıxan rus imperiyası 20 yanvar 1990-cı ildə yaz ümidi ilə yaşayan gülləri payızın quduz yelləri ilə soldurdu. Camaat səhər yuxudan durub ağı səsini Azərbaycanın göylərinə bülənd etdi.

**Ağız açmaq** – bir şey xahiş etmək.

Elə bir şəxs sənə ağız açır ki, keçə bilmirsən, üz-üzdən utanır (1, c. II, s.351).

**Ağıza göz dikmək** - başqasının sözünə tabe olmaq. Özündə ixtiyarı olmayan adam.

**Ağız büzmək** - bəyənməmək, birini alçaltmaq üçün təhqir etmək.





**Ağızda dilin əsməsi** -həqq, ədalət adı altında yalan danışanda dil qorxudan, vicdan əzabından ağızda əsər.

Cənab Karter,
söylə görək düşündünmü Fələstində
Yalan dedin, bəs ağzında dil əsmədi,
Həqq, ədalət deyən zaman? (328).

**Ağızdan pərtov** – söyüş söyən, kobud danışan.

Bilirsən mən ağızdan bir az pərtovam (84, s.79).

**Ağız deyəni qulaq eşitmir** – şuluq, həddən artıq səsli olan yer.

**Ağız dolusu danışmaq** – bir kimsənin haqqında tərif etmək

Xanımlar Əhməd tacirin insanlığından ağız dolusu danışırdılar ( 182, səh. 162).

**Ağız əymək** – bəyənməmək.

Dalımca ağız əyənlər, şairlərin
Ehsanını yeyənlər (260, s.20).

**Ağız sındırmaq** -bəhanə gözləyənin əlinə bəhanə verməmək. Belə bir adamın əlini oxutmaq, rüsvay etmək.

Əgər İran inqilabçıları tezliklə məclisi-müəssisan şüarı buraxmasaydılar, indi yəqin ki, cümhuriyyət elan olunmuş, heç olmazsa mollalar ilə aristokratların ağzı sındırılmışdı (248).

**Ağızucu** – ürəksiz demək.

Fəxrəddin ağızucu dedi (234, s.13).

**Ağız yandıran aşı mən qaşıqda tanıram** -bir şeyin mahiyyətinə bələd olmaq.

**Ağ- qarasına baxmamaq** - şəxsi mənafedən ötrü heç bir inama bağlı olmamaq, yəni bir zadın yaxşı-pisini nəzərdə tutmamaq.

Rüşvətə satıblar şəriəti,
Baxmırlar „Quran"ın ağ-qarasına (97, səh 61).

**Ağ qoyunun qara quzusu olar** -çox yaxşı ata anadan pis uşaq da ola bilər. Oddan kül törər mənasındadır.

**Ağlama ölü üçün, ağlağıl dəli üçün** - ölən ölüb, dirinin ehtiyaclarını fikirləşmək lazımdır.

Ağlama ölü üçün, ağlağıl dəli üçün (229, s.22).

**Ağla batan söz-** ağıllı, məntiqi, əsaslı söz.

Deyir seyrəkləşib hicrana qarşı qovzanan səslər,
Əgər minbir fikir varsa, hələ ağlabatan yoxdur (292, s.166).

**Ağlabatan** – düzgün, ağla, məntiqə sığan bir iş.

Xalqların bir-birinə yaxınlaşması, yalnız hakim millətlə məhkum millətin hissiyyat və təfəkkür sahəsində bir-birinə uyğunlaşacağı halda ağlabatandır (232, səh. 289).

**Ağla qaranı seçmək** - oxumağı bacaran, yaxşı yamanı seçən.

Kərəm xan ordan keçdi, ağla qaranı seçdi.
Vəşlədə durdu çay içdi, gördü Qulam xanı Kərəm! (40, s.412).

Vəşlə Xoy yanında bir kəndin adıdır ki, Kərəm oradan evlənmişdi.

**Ağlar-gülər ayı** -Azərbaycanda nisan ayına-aprelə deyilir. Çünki hava çox dəyişkən olur. Məcazi mənada tez qəmlənən və şənlənən adam haqqında işlənir.

**Ağlayanımız olub kor Şəhrəbanu** – bizə o adamlar ürək yandırır ki, özləri də yazıqdırlar.

**Ağlayan uşaq baş yeyər** -mövhumi fikirlərə görə, bir uşaq çox ağlasa o evdə bir adam ölər.

**Ağlı kəsmək** – beyninə batmaq.

Yoxsa doğrusu sənin bu qarpız ölçündən də ağlım bir şey kəsmədi (195, c.II, s.126).

**Ağlı-qaralı adam** – heyvanlar nəzərdə tutulur.

Bollu dövlətim var, ağım, qaram var,
Bunlardan da əziz ciyərparam var (Nizami).

Aşiq yaralı qurban,
Ağlı, qaralı qurban,
Sənin təzə dərdinə
Köhnə yaralı qurban.

**Ağlı qarışıb poxuna** -həddən artıq gülmək.





**Ağlına batmamaq** - dərk etməmək; bir işin baş tutmasına inanmamaq

**Ağlına keçə yamayım** – ağlın çatmır.

Ağlına keçə yamayım ( (9, s.154).

**Ağlını başına yığmaq** - fikirləş.

Abbasa yazığın gəlmirsə, mənə yazığın gəlsin, ağlını yığ başına (195, c.II, s.150).

**Ağlın kəsməsi** – bir zadın qəbul olunması, düşüncə əsasında o nəzərə çatmaq.

Keçmişdir o günlər bala, keçmişdir uşaqlıq,
Ağlın kəsir artıq, qulaq as, söyləyim indi (348, səh 54).

**Ağlı topuğunda** - ağlı az, danışmağı bacarmayan.

Donbalan dedi: ay ağlı topuğunda
Mən məclislərdə gəzirəm kababla,
Bir yerdə otururam... (43, s.237).

**Ağ oldu** – həddi aşmaq.

Səhərdən axşamacan evdə simfon çalırlar, dedim yəni bu restoranda da simfon? Lap ağ oldu ki... (9, s.139).

**Ağ paltar geymək** - ağ günə, xoşbəxtliyə qovuşmaq.

Gey ağ libasın, ağ günə çıx, ey günü qara (214).

**Ağrılarda göz ağrısı, hər kəsənin /kişinin öz ağrısı**- başqasının dərdini heç kəs özününkü kimi hiss etməz.

**Ağrımaz başa saqqız salmaq, yaxud ağrımaz başına duz bağlamaq** -özünə boş yerdən problem yaratmaq.

Qorxulu başlar sə1amət qalmağın baş tapmadım,
Ağrımaz başə salıb saqqız, nə dığlatdın başı? (241, s.23).

Axı söz-söhbət olar sonra, ağrımayan başımızı niyə ağrıdaq axı.. *(9, s.101).*

**Ağ sapla tikilmiş yamaq** – tez gözə çarpan şey.

Kitabi «Dədə Qorqud»dakı müqəddiməni biz indiyəcən «ağ sapla tikilmiş yamaq sayırdıq. Doğrudan da, dastanın arxaik şifahi formaları üçün islam motivləri yamaq olmaya bilməzdi» (36, səh. 235).

**Ağu salmaq** - birinə göz dağı vermək, düşmənə fürsət verməmək.

Qarabağda bağ sallam
Bostan əkib, bağ sallam.
Bu yurda kəm baxanın
Gözlərinə ağ sallam (38, səh 32).

**Ağürək, ağciyər** -qorxaq, ikiüzlü.

Milçək tək şirəyə vızvız eləyən aşkara göründü nə ağürəkdir (304, s.53).

Ağciyər adamlar, yəni cəsarətsiz, ürəksiz qocalar, gənclər və oğlanlar təbii olaraq qorxaq bir ictimaiyyatı, qorxaq camaat və milləti təşkil edirlər (153, s 16).

**Ağ yel** – zərər vuran.

Cahanda ağ yel olma, əsməyindən güli-giyah ölsün (168, s.16).

Adam ol şəxsə deyərlər hamı rəngə boyana
Əsə ağ yel kimi gəhi bu yana, gah o yana(168, s.48).

**Ağ yuyub qara sərmək** – abrını almaq, təhqir etmək.

Yox, filankəs, yaramaz, çevirər boz üzünü, bozaranda adama elə bozarır ki, səni ağ yuyub qara sərir (9, s.23).

**Ağzı açıq** - düşmən, sözünü kobudcasına dilə gətirən, sirr saxlamayan.

**Ağzı acı olmaq** – həyatda şansı gətirməmək, yaman günə düşmək.

Neçə müddətdi olub bacıların ağzı acı
Satılıb sacı, olub bir çörəyin möhtacı (300, , səh. 195).

**Ağzı açıla qalmaq** -təəccüblənmək, heyrətlənmək.

Ağzı açıq namərdlərə
İgid sirrin açmaq olmaz (179, s.139).

**Ağzı ayrıq** – təəccüb etmək.

Küçəyə çıxanda qız-gəlinin ağzı ayrıq qalırdı (46, s.29). (103, s.68).

**Ağzıbir** – həbsxana.

Saldın axır öz əlinlə özünü ağzıbirə,
Vec bitirməz sənə, dönmə dəxi daşə, dəmirə (267, s.199).

**Ağzı bərk** - etibarlı, sirr saxlayan.

Onu da deyim ki, ÇEKA-nın adamları ağızdan bərk olurlar (1).





**Ağzı boz** - alçaq, yaltaq.

Xuba xub ol, gülə gül ol, xara xar,
Olma müxənnəs ağzı boz olma! (261, s.133).

**Ağzı boza vermək** - aldatmaq, kələk gəlmək.

Fars şovinistlərinin başında duran quldur Rza xan və onun oğlu Məhəmmədrza boğuntu salıb qorxaqların ağzını boza vermək arzusunu qəbrə apardılar. B.Həqqi

**Ağız- burunlu adam** - hesaba qoyulan, şəxsiyyətli.

**Ağzı deyil** - bacarmaz.

Ağzı deyil (5, s.87).

**Ağzı əyri** - sözünün üstündə durmamaq, düşmənçilik edən, arası pis olmaq.

Biz tanırıq ağzı əyrini uzaqdan,
Aslanmarıq qurd çürütmüş budaqdan ( 22).

**Ağzı elə bil karvansara qapısıdır** - ağzı həddən artıq yekə adam.

**Ağzı əzvay dadı verir** - çox əsəbidir, vəziyyəti ağırdır.

**Ağzı göyçək** – onun-bunun dalınca danışan, xalqın dalısınca danışanlar, xalqa söz qoşanlar, ağzının danışığını bilməyənlər.

Gör kimlər uğuruma çıxdı, o ağzı göyçək ki, mütrüflük məşqinə düşüb, bu qız da ki, ver yesin, ört, yatsın (259, s.185).

Axı niyə, elə iş görəsən ki, sabah ağzı göyçəyin biri sənə irad tuta bilsin? (9, s.61).

Mən bilmirəm bu xalqa nə düşüb ki, ağzıgöyçəklik eləyir (72, c. III, s.45).

«Ağzıgöyçək»lərin yanında çalış etmə öz sirrini faş, nəyə lazım? (264, səh 115).

Doğrudur, bir para ağzıgöyçəklər deyirlər ki, yol işdə olmayanda, başlayır dağılmağa. Çöl əhli tökür dəmir-dümürünü söküb aparır («Mozalan», səh 140).

Yox, ağzıgöyçəklərin gözətlədiyi sayaqda Cavahir xanım səsini qaldırmadı (253, s.510).

**Ağzı isti yerdədir** - özünün və başqalarının ictimai iqtisadi mövqeyinə fərq qoymayıb hökm vermək.

**Ağzı kalava** - ağzı həddindın artıq yekə olan adam. Azərbaycanın şimalında "cırım ağız" şəklində işlənir.

Biri boynu qısıq, göygöz əlavə,
Dodağı vərdənə, ağzı kəlavə (147).

**Ağzı kəsərli olmaq** - nüfuzlu olmaq, sözünün kəsəri olmaq.

**Ağzı küləkli** – sözü keçərli, düşmən, pis fikirli adam.

Gər ağzı küləkli kişilər püfləməseydi,
Bir şəm ki, asudə yanır, həm də yanardı (267, s.123).

**Ağzı qatıq kəsməyən-** dilsiz-ağızsız, sözü kəsərsiz.

- Yəni, ağzı qatıq kəsməyən gədəni? (253, s.314).

**Ağzı qatıqlı** – əlsiz-ayaqsız, çox vaxt düzgün adam.

Partiya məktəbinə ağzıqatıqlıları götürmürlər, qardaşoğlu! - Əmimdən xasiyyətnamə alacağam, elə o xasiyyətnamə ilə də ağzının qatığını silib, girəcəyəm partiya məktəbinə (142, səh. 18).

**Ağzıma daş torpaq, Allah eləməsin** - dediyim söz günah hesab olunmasın, həyata keşməsin.

**Ağzım vay** - qorxudan danışa bilməyən, əlsiz- ayaqsız.

**Ağzına alma** – ürəyinə gətirmə, ürəyinə alma, kədərli olma.

Başını aşağı sal, dərsini oxu. Belə sözləri ağzına alma, şahın bu boyda topxanası var, beş nəfər ayağı çarıqlı neyləyə bilər?(77, səh. 17).

**Ağzına dil qoymaq** - birini qızışdırmaq, pis yola çəkmək, birinin əleyhinə təhrik etmək.

**Ağzınacan dolmaq** - bir yerin həddindən artıq dolu olması.

Türklər Urmuyaya daxil olandan sonra türk dilində məktəblər açırlar. Qısa müddət ərzində məktəbin sinifləri, uşaqlar və şəhrin cavanları ilə ağzınacan doldu. (V.Mustafayev, s.70).

**Ağzına gələn** – söyüş, fikirləşmədən danışmaq.

Ağzına gələni yığıb doldurmuşsan oraya. Nə duzu var, nə mənası (72,c.III, s.75)





**Ağzına qovut alıb** - dinib danışmayan.

**Ağzına su almaq** - danışmamaq, susmaq.

Sumqayıt qırğınını rusların köməyi ilə ermənilərin özləri yaratdıqları halda rus havadarlarının fitvası ilə genosid adlandırırlar. Amma bizim ziyalılar, tarixçilər... nədənsə ağızlarına su alıb susurlar ( Mürsəl Həkimov).

Amma indi ağzına su alıb oturubdur. Nə dinir, nə danışır (72, c.III, s.82).

**Ağzına sümük atmaq** - başını qatmaq, ağzını yummaq.

**Ağzında əli qalmaq** - heyrət etdim, huyuxdum, əqləsıqmaz bir şey ya işlə üzbəüz olmaq.

Oğuz yolda gedərkən ağzında qaldı əli,
Çox böyük bir ev gördü, gümüşdən pəncərəli (228).

**Ağzındakı dişləri saymaq** - cürətini bilmək, hərtərəfli tanımaq.

Saymışam ağzındakı dəndanızı
Siz o deyirsiz vərəsiz canızı (300, s.12).

**Ağzında quş başı gətirmisən?** - hamıdan artıq, xüsusi bir iş görmüsən, niyə böyük şeylər tələb edirsən?

**Ağzından dürr tökülmək** – gözəl sözlər danışmaq.

Yeriyəndə kətan köynək dizindən,
Danışanda dürr tökülür sözündən (35, s.496).

**Ağzından horra tökülür** – fərsiz, əlsiz-ayaqsız.

Sən deyilsən, sənin kimi ağzından horra tökülənlər mənim quşumu gətirə bilməz (46, s.277).

**Ağzından külək aparsın** – qarğıyan, bəd söz danışan adama deyirlər.

Vaxsey, vaxsey, elə bil biabırçılıq olar ki, kiş, kiş, kiş ağzından külək aparsın (72, c.III, s.149).

**Ağzından qaçırtmaq** - istəmədən dilinə gətirmək.

Amma axı spexter söz arasında ağzından qaçırtdı ki, uşaqlar saldat olacaqlar. (195, c.II, s.123).

Özü də bilmədən Fuadın ağzından qaçdı (1, s.218).

**Ağzından qan iyi gəlmək** - çox təhlükəli söz danışmaq.

Usta Bədəl qışqırdı ki, ay aman, bunun ağzından qan iyi gəlir (17, s.49)

Sözündən qan iyi gələn şairin
Ağzından süd iyi gəlir, bilirəm (260, s.18).

**Ağzında noxud islanmaz** -söz saxlamayan, etibarsız.

**Ağzından od tökülmək** – mənfi və müsbət mənada işlənir. Sözü keçərli, haqq söz danışan, zalımcasına bir günahsız adam barəsində hökm verən.

Elə bil dəyişibsiz, qabaqkı ağzından od tökülən naçalnik deyilsiniz (1, s.351).

**Ağzından od yağmaq** -- vətənpərvər insanın və ya qan tökən bir insanın keçərli sözü

Bir intiqam atəşi ilə coşdu böyük Səttarxan,
Mən görmədim deyərlər ki, od yağardı ağzından (Mirzə).

**Ağzından süd qoxusu gəlmək** - cavan, təcrübəsiz.

Babaları dağdan ulu körpələr,
Ağızları süd qorxulu körpələr... (S.Rüstəm).
Ağzından süd qoxusu gəlir (195, c.II, s.30).

**Ağzını allah yoluna qoymaq** – ağzına gələni danışmaq.

**Ağzı boza vermək** – birini cahil saymaq.

İstəyir mənim ağzımı boza verə ki, mən heç zad bilməyəm (**danışıqdan**).

**Ağzıma daş-torpaq** – bu söz həyata keçməsin. Allah məni öldürsün, başıma bu fəlakət gəlməsin.

Ölülər yasarlıq tutmaz, gülüm,
Ağzuva qara torpaq, ölülər bizə nə? ( 330, səh. 9).

**Ağzını öpmək** - yəni tam mənada birini qəbul etmək, düzgün və ya yanlış surətdə birini qəbul etmək.

Bir model ki, rəssam görçək ürəyində nifrət doğsun.
Üzdə yoldaş, dalda düşmən,
Yoldaşının ağzın öpüb,
Daldan dönüb xəncər vursun (282, səh. 128).

**Ağzını yummaq** – boğuntu və qan tökməklə yoxsul insanları sükuta məcbur etmək.

Yıxdı evini, zülm ilə övladı-Romanın,
Yummuşdular 300 sənə ağzın füqəranın (149, səh 239).

**Ağzın əyilər** – pis söz danışanda deyirlər.

Firiştələr vursun, ağzın əyilsin,
Sənin bir dərdini bilən olmasın (12, s.44).

"Əşi, ağzını nə qoymusan allah yoluna, dilini dinc qoy, əksinqilabi söz danışma, tutub apararlar əlli-ayaqlı gedərsən"(1, s.189).

**Ağzını aramaq** – fikrini öyrənmək.

Tez-tez Məlhəmə adam göndərib Şeyxin ağzını arayır (144, s.49).

**Ağzını dağıtmaq** – ağzına gələni demək.

Bağır: ağzınızı çox dağıtmayın mən...(9, s.148).

**Ağzını göyə açmaq** - acından ölmək, iş görməkdənsə gözü yolda qalmaq, faydasız intizar çəkmək.

Amanın günüdür, ac qalarıq. Onda gərək ağzımızı göyə açaq (1, s.127).

Kasıb adamların qızını nə alan olur, nə də ki, işlədən.
Qız oturub, ağzını göyə açır,
Ver yeyim, ört yatım – deyir (82, səh.174).

**Ağzını göyşək mal kimi o yan bu yana tutmaq** – danışığını bacarmayan, saqqız çeynəyən adama deyilir.

Ağzını niyə göyşək mal kimi o yan- bu yana tutursan? (129, c.I, s.254).

**Ağzını dağıtmaq** - artıq-əskik danışmaq.

Vəzir də vəkil də bilirdi ki, şair heç kəsdən imdad istəməyəcək, ağzını dağıdıb acı sözlərlə bayramı böyük matəmə çevirəcək (288, s.149).

-Ağzını dağıtma, yekə kişisən! (296, s.285).

**Ağzını isti- isti qırmaq** - vaxtında gözünün odunu almaq deyimi ilə sinonimdir. İranda fars şovinizmi teorisini təbliğ edən xainlərin ağzını isti-isti qırmaq və orada yaşayan millətlərin arasında bərabər hüquqluluqdan, dostluqdan müdafiə etmək hər bir ziyalının, hər bir şərəfli borcudur.

**Ağzını möhr etmək** - səsini kəs, qıfılla.

Sındır qələmi, dur otənək, ağzını möhr et,

Bu hamı yalan məqalədən bir əl çək! (223, s.131).

**Ağzının astarı var** - hər şeyi, çayı, yeməyi olduqca isti yeyən adama deyilir.

**Ağzının aşı deyil** - sənlik deyil, bacarmazsan.

**Ağzının dadını bilmək** - özünə hər şeyin ən yaxşısını seçmək, dünya nemətlərindən həzz almaq.

Bu qoyan çay ona güvarə gəlir,
Hansı ki ağzının dadını bilmir (195, c.II, s.191).

**Ağzının içinə girmək** - birinin sözünü ağzında qoymaq, danışmağa haqq verməmək.

**Ağzının qaytanı yoxdur** - ürəyində sirr saxlayan deyil, yaxşını, pisi, şəraiti tanımadan hər şeyi açıb danışmaq.

**Ağzının qaytanı yoxdur** - sirr saxlamayan, etibarsız.

**Ağzının lılığı axmaq** - ağızdan su gəlmək, heyrətlənmək.

**Ağzının suyu açılıb** – həddən artıq heyran olmaq əlaməti.

Nə çox, dünyaya həsrətlə baxırsan,
Ona ağzın suyu kimi axırsan (147, səh. 124).

**Ağzının suyu axmaq** – tamahı düşmək, heyran olmaq.

Tülkünün ağzının suyu axmağa başladı (148, s.108).

**Ağzın oxumaq** - birinin ürəyindən keçəni oxumaq.

**Ağzın ovuşdurmaq** – gözünün odunu almaq.

Qəzetçi molla yazığın ağzını lap ovuşdurub,
İndi yazır əski qapı, əski dabanı birbəbir (72, c.III, s.231).

**Ağzı pərtov** - danışığını bilməyən, ədəbsiz danışan adam.

**Ağzı soyuq** – faydasız söz danışan, qanmaz.

Var idi qafilədə bir duzu yox,
Əngi boş, sözləri puç, ağzı soyuq (168, səh 579).

**Ağzını təmiz saxlamaq** - xalqın dalınca pis danışmamaq, söyüş söyməmək.

Xədicə: Ağzınızı təmiz saxlayın, yoldaş Qəmzəli! (9, s.137).

**Ağzın qan olsa, yerə tüpürmə** - ürəyindəki sirləri heç kəsə demə.

**Ağzı otlu** - dilsiz, ağızsız.





Allahın ağzı otlu heyvanı idi, hamı deyirdi mələsə, əti halaldır (129, c.I, s.438).

**Ağzı sulanmaq** - bir şeyə tamahı düşmək.

Bakı bağlarından gəlib keçəndə,
Gördü ağ şanını, ağzı sulandı (265).

**Ağzı suyla dolmaq** – tamahı düşmək.

Minijup qızları görcək, dolur ağzın suya, ay can (168, s.223).

**Ağzı yağlıdır** - çaxır içmiş adam.

Ağzı yağlı olanda deyir gülür, içməyəndə dəli olur.

**Ağzı yastı** - sözü keçməyən, nüfuzsuz, əlsiz-ayaqsız.

**Ağzı yaşıl** – qorxaq, qulurlara quyruq bulayan.

İnsan niyə gərək, özün bu həddə sadə və ağzı yaşıl tanıtsın ki, onu bu cürə və belənçilik bişməmiş və ələ salmalı düşünsünlər? (315, səh. 95).

**Ağzı yırtıq** -söz saxlaya bilməyən, etibarsiz.

Bizim yataqxanada bir yava kişi vardır, həm qorxaq, həm də ağzıyırtıqdır (92, səh 255).

**Ahang kimi açılmaq** - lap yorğun- arğın düşmək.

Qocalıq belədir, bir neçə addım yeriyəndən sonra evə gəlib ahang kimi açılı qalıram.

**Ah çəkib qan tüpürmək** - günü ah- vayla keçmək, gələcəyə heç bir ümidi olmamaq.

Ay arvad, az ah çək, qan tüpür, zəmanə həmişə elə belə qalmayacaq ki, fələyin beş keçisi var, hərəsini bir gün bir adamın qapısına ötürür (82, s.177).

Oğlunun olmaması yadına düşəndə ah çəkib qan tüpürərdi (46, s.83).

Yazıq Xeyrulla ah çəkib, qan tüpürürdü (82, səh. 178).

**Axan dəryanı bağlamaq** - faydasız işə əl vurmaq.

Məsəldir: kəndi düşən ağlamazdı,
Axan dəryayi kimsə bağlamazdı.

**Axar sular qurudu** - talehsizlik, işləri gətirməmək.

Avara, sərgərdan qalmış idim,
Axar sular mənim üçün qurumuşdu (281, səh.53).

**Axar sular tərsinə dönməz** - keçəni qaytarmaq olmaz.
Bundan artıq ürəyimi dağlama,
Axar sular baş yuxarı qayıtmaz,
Keçən günlər bizə sarı qayıtmaz (106, s.148).

**Axça siçanı** – xalqın malını, dövlətini mənimsəyənlər.

Bunlara sadə dildə axça siçanı deyirlər. Daxilənin qızıl-gümüşünü xaricə daşıyaraq, vətən övladını xaricə fəhləliyə getməyə məcbur etmişlər (65, səh. 10).

**Axı nə yatdım, nə yuxu görəm** - bir ailəyə təzə gəlmiş gəlin, kürəkən, iş yerinə təzə gəlmiş adam az vaxtda bu sahədə olduğunu bildirmək üçün işlədir.

**Axırına çıxmaq** - məhv eləmək, sonuna çatmaq.
Əfsus məni məngənə tək sıxdı Marağa,
Sıxdıqca mənim axırıma çıxdı Marağa! (168, s.23).

**Axmaq** - sərxoşluq.
İçmişəm çaxır, gözlərim axır.

**Axşam ağzından** – yəni qaş qaralan zaman, axşamın ilk çağları.
Axşam ağzından alıblar duyğular aramımı,
Şairin bağrındadır, dünyaya sığmaz bir ürək (56, səh. 14).

**Axşam vurmaq** - ingilislərin əli ilə hakimiyyətə gələn Rzaxandan qabaq ordu ümumiyyətlə, türklərin əlində idi. Buna görə orduda olan bütün sənədlər, rütbələr hamısı türkcə idi. Şamdan qabaq orduda hazır qayıb edib pərçəmi endirərdilər. Bu mərasimdən sonra şeypur vurmaqla ordunun yatmaq əmri verilərdi.

**Axta xoruzlar** – acız adama zor deyən, düşmənə boyun əyən.

Heyhat!...Qəhrəmanlar azlığından bizdə onların yerini axta xoruzlar tuturlar (156, səh.65).

**Axtardığı yar idi, yetirdi pərvərdigar-** istədiyi iş özü-özünə düzəldi.
Axtardığı yar idi, yetirdi pərvərdigar (129, c.I, s.120).

**Ax- tüf etmək** - ağız - burnun süyü sinədən gələn tüpürcək. Vəziyyətin pisliyindən şikayət etmək, nalə etmək.





Qocalmış öskürür ax-tuf tökər, iyrəndirər xalqı,
Boğa idi gər bunu, sörxək öpərdim asitanın mən (301).

**Alaca - bulaca görsənmək** - bir nəfərlə soyuq davrandıqda deyilir.

Birinin rəftarından, sözündən xoşu gəlməyən adam da bu ifadə ilə münasibətini bildirir.

**Alacağı bir piltədi, pambığın batmanını soruşur** – kiçik bir şey üçün böyük işləri araya gətirən, yekəxanalıq.
Alacağı bir piltədi, pambığın batmanını soruşur (103, s.69).

**Ala dağdan qara dağa, qara dağdan ala dağa** - nahaq yerə bəhanə etmək.

Görəsən elə hamı arvad beləmi olurlar, qaçar ala dağdan qara dağa, qara dağdan ala dağa (335, s.55).

**Ala dana göy dana, götün var çıx meydana** - hədə, münaqişəyə səsləmə.

**Alaşa** –hay- küy salan, həyasız qadınlar haqqında deyilir.

**Alatoran –** səhər açılmamış.
Gecəni sübh eləyibdir çıxıb evdən
Alatordan yazıq insan çox hərasan.

**Alayın şalayın** - qüssəsiz, şad.
Gədiklərdə qurtları tut boğgilən,
Qoy quzular ayın- şayın otlasın ( Şəhriyar).

**Al canımı qurtar** –həyatdan şikayətlənmək, ölüm istəmək.
Tez ver üzümün örtüyün, al canımı qurtar,
Ya rəb, üzə girmiş həyasız üzlər əlindən (338, s.118).

**Alçağa düşmək –** əvvəlkindən pis vəziyyətə düşmək.
El səni istəyib qabağa çəksə,
Ağır ol, alçağa düşmə dünyada (148, s.248).

**Alçaq** - şəxsiyyətsiz, xəyanətkar, məqam düşkünü.
Rəqsi təlim ediyor axsaqlar,
Əzəmət düşkünüdür alçaqlar (75).
Alçaq adam qarışdırar aranı,
Bayquş da adətdir sevər viranı (32, c.II, s.87).

**Alçaq eşşəyə hamı minər** -bir adam öz hörmətini gözləməsə, başqaları onu tapdalayar.

**Al da geysə yaraşır, şal da-** paltarı nə olursa olsun gözəl yaraşır.

-Al da geysə Nazıya yaraşır, şal da! (253, s.337).

**Aldatmaq** -tərəfi özünə çəkmək.

**Aldım qoz, satdım qoz, mənə qaldı şaxşaxı –** heç bir xeyir götürmədim.

Aldım qoz, satdım qoz, mənə qaldı şaxşaxı (1, c.II, s.123).

**Aldın payını, çağır dayını –** acı cavabı aldın, indi rahat ol.

Aldın payını, çağır dayını (118, s.236).

**Aleybani yaxasına taxılan təbənə kimi niyə yaxama taxılıbsan -** məndən niyə əl çəkmirsən?

**Al eyləmək** -işvə, naz eyləmək.

Al eylədi, fitnə qıldı eynin
Ol fitnəli eynü- alə təhsin (132, s.67).

**Aləm aləmlədir, kor qız da xalamnan** - bir nəfərin birinə həddindən artıq əhəmiyyət verməsi, birindən əl çəkməməsi.

**Aləm başıma dolandı –** mənə çox pis təsir etdi.

Sıxlaşdı göydəki seyrək buludlar,
Deyəsən başıma dolandı aləm (337, c.I, s.55)

**Aləmə it hürəndə bizə də Mazandaran çaqqalı hürər -** həmişə səfeh adamlar rast gəlir.

**Alıb yatmaq** –danlamaq.

İndi də kişini alıb yatırdı (84, s.129).

**Alıcı quş kimi** – od parçası, zirək.

Fədailər alıcı quş kimi pclislərin üstünə atılıb ölüm-dirim mübarizəsinə girişirlər (77, səh. 32).

**Allah alıb qucağına** - şansı gətirib, uğurla üzbəüz olub.

**Allah balam deyib** -bəxti gətirib, işləri uğurlu olub.

**Allah başını qoyub ayağına yaman daş salmasın –** bundan da pis günə düşməyə layiqsən.

İlahi, Sisgün qəbristanlığına zibil tökənlərin başını qoyub ayağına yaman daş vurma (80, c.II, s.95).





**Allahdan buyruq, ağzıma quyruq-** heç bir əziyyət çəkməyim hər şey düzəlsin.

**Allahdan döndün, kirvədən niyə döndün?** -oğlan uşağını müsəlman edərkən onu bir nəfər hörmət etdikləri, ailəyə yaxın yad adamın quçağına qoyurlar. Bu mərasim kiçik toy adlanır. Kirvəlik haqqı çox müqəddəs sayılır. Buna görə də kirvəyə hörmətsizlik edən adam Allaha hörmətsizlik edən adamdan artıq günahkar sayılır. "Filankəsin ətəyinə qan tökmüşəm" deyimi onun haqqının müqəddəs sayıldığına işarədir.

**Allahın istədiyi gündə yaranmaq** - xoşbəxt, ən uğurlu, gözəl gündə doğulmaq.

**Allah kişinin şalvarını iki eləməsin** – qafasız kişinin bir az maliyyə durumu yaxşı olursa, tezcə başqa arvad almaq fikrinə düşər.

**Allah kölgəsi** – mərhəmətli, ümidverici bir xəyali qüvvə.

Ey fəlakət rəmzi, Allah kölgəsi oldun haçan,
Biz sənin kölgəndə zillət gördük hər zaman (115, № 2, səh. 54).

**Allah qarğa deyil ki, vurub gözünü çıxartsın** -Allah gec eylər, güc eylər.

Dini inama görə, Allah insanlara öz əməllərini etmək, yollarını seçmək üçün fürsət verir. Allaha xas olan cəhətlərdən biri onun həddsiz səbridir. Səbr allahın adlarından biridir.

**Allah qonağı –** təsadüfən gələn qonaq.

Qarı nənə, Allah qonağı istəyirsənmi? (148, s.61).

**Allah sağ gözü sol gözə möhtac eləməsin** –Allah heç kəsə, heç ən yaxın adama da məni möhtac eyləməsin.

Biz dünya görmüşük, deyirəm Allah,
Sağ gözü etməsin sol gözə möhtac (328, s.317).
Allah sağ gözü sol gözü möhtac eyləməsün (229, s.19).

**Allah üzümün örtüyün versin** - Allah məni öldürsün.

Tez ver üzümün örtüyünü, al canımı qurtar,
Yarəb üzə girmiş həyasız üzlər əlindən (338, s..118).

**Allah vergisi –** çox istedadlı.

Maşallah, qəribə danışır, lap Allah vergisidir (195, II, s.36).

**Almaçı eşşəyi, hoş məətəli** -tənbəl adam bir bəhanə ilə aradan çıxmaq istəyir.

**Almaq** -rüşvət almaq.

Sən alan adama oxşamırsan (84, s.27).

**Almanı at göyə, yerə düşüncə ya nəsib, ya qismət/ sən saydığını say gör fələk nə sayır** -hər anın bir hökmü var (135, IV, s.29.

**Almaz** -balasını sevməyən, başqası ilə dil tapmayan.

**Al nənəsi qarğıyıb** -pinti, evi səliqəsiz adamlara işarədir.

**Alnı açıq** -başı uca, heç kimin qarşısında günahkar olmayan adam.

Məğrur dayan, alnı açıq, üzün ağ,
Tək allaha əyil, Ərkim, ay Ərkim!
Ordan başqa sən bir kəsə əyilmə,
Qarşında gör, əyilir kim, ay Ərkim! (349, s.24).
Şəhrinin mənliyi ay alnı açıq Eynalı dağım,
Söylə, aşiqlərinin odlu dilindən
Başı uca, şanlı elindən,
Tarixin Çənlibelindən (326, səh 35).

**Alnı dağlı** -ümumiyyətlə, islamı qılınc gücü ilə qəbul edən ölkələrdə bir qrup dindarlığa yalandan təzahür etmək üçün girdə bir şeyi, ümumiyyətlə taxta qaşığı qızdırıb alınlarına yapışdırarlar. Guya möhür onların alnında yer eləyib. Dəri yanıb qabıq qoyar, yeri göy qalar. O əlamət onlara çörək ağacı olub o vasitə ilə avam adamın başına börk qoyurlar.

Alnı dağlı abidin baxdım dəğəl kirdarına,
Zikri ehsanü- kərəm, amma kəramət görmədim.

**Alnı qaşqalı buzov olmaq** - məşhur, adlım olmaq.

**Altda qalanın canı çıxsın** – „mənə nə var"lar, şəxsi xoşbəxtliyi millətin xoşbəxtliyindən üstün tutanlar.

**Altdan geyinib üstdən qıfıllanmaq** – döyüşə gedən adama, yaxud qəşəng bəzənmiş qadına deyilir.





Qılınc götürdülər, altdan geyinib üstdən qıfıllandılar, üstdən geyinib altdan qıfıllandılar (148, s.181).

**Altıda alacağı yox, yeddidə verəcəyi** – dünyanın xeyir-şəri vecinə deyil.

**Altında qalmaq** -ağır işin öhdəsindən gəlməmək, borcu ödəyə bilməmək.

**Altını üstünə çevirmək** -viran qoymaq, torpağını torba ilə daşımaq.

Məstəli şah bu surətdə gərəkdir ki, devlərə əmr edim ki, Parisi xarab etsinlər, altını üstünə çevirsinlər (5, s.38).

Təhdidlər, hücum və qırğınlar səni parça-parça edib, altını üstünə çevirdi (149, səh. 97).

**Altı yırtıq aftafa** -heç nəyə yaramayan, nüfuzunu itirmiş adam.

Qohum, qonşu səni qoymaz hesaba,
Olarsan bir altı yırtıq aftabə (168, s.107).

**Altmış altıya bağlamaq** - mən o işi haçandır ki, altmış altıya bağlamışam. Yəni nəticəyə çatmışam.

**Altmışında öyrənən gorunda çalar** – bir vaxtın təfəkkürünə görə, insanların öyrənmək qabiliyyəti müəyyən bir dövrə bağlıdır.

Altmışında öyrənən gorunda çalar (84, s.134).

**Altundan dirəyi olmaq** – çox varlı – karlı.

Həvəsi yığmağadır, hər gərəki
Arzusu budur: altundan olaydı dirəyi (267, s.206).

**Aman-zaman** -yeganə övladı olan adam belə deyir.

Ay bala, aman-zaman gözümün ağı-qarası, bircə oğlum var (174, s.26).

Mənim aman-zaman bir oğlum vardı,
Onu da əlimdən ölüm apardı (328, s.319).

**Anadan əmdiyi süd burnundan gəlmək** – çox əzab-əziyyət çəkmək.

Onda onun başına bir oyun açaram ki, anasından əmdiyi süd burnundan gələr (46, s.264).

**Ana kimi yar olmaz, Bağdad kimi diyar**– "ana kimi yar, vətən kimi diyar olmaz" şəklində də işlənir. Bu ata sözü türklərin Orta Şərqdə hakimiyyəti, Bağdadın bir türk şəhəri olması zamanının yadigarıdır.

**Anam məni doğan gün bir qara daş doğaydı** – taleyindən narazılıq etmək. Taleyindən narazı, həyatı çətin keçən adamlar işlədirlər.

Anam məni doğan gün bir qara daş doğaydı (174, s.118).

**Anan sarımsaq, atan soğan, hardan oldun gülməşəkər, qurumsaq?** -özünü yekəxana aparan adam haqqında işlənir.

Anan sarımsaq, atan soğan, sən hardan oldun belə gülməşəkər, balam? (335, s.71).

**Anan yaxşı – baban yaxşı** – sözün nədir, problemin nədir axı? - mənasında işlədilir.

**Anası namaz üstündə idi** - təsadüfən bir xatadan qurtarmaq, yəni anasının namaz üstə etdiyi duanı Allah eşidib.

**Anasını ağlatmaq** – dağ çəkmək, zərbə vurmaq

Xəyanətin zəhərinə
bal qatmısan,
bu gülüşlə
anamızı ağlatmısan (328, s.58).

Aşıq Rəfi adamın anasını belə ağladar, bax! (84, s.378)

**Anasını gör, qızını al, qıyısını gör, bezini al** – ana gəzən ağacı bala budaq-budaq gəzər.

Anasını gör, qızını al, qıyısını gör, bezini al (229, s.33).

Uzunayaqlıya inanmaq olmaz (229, s.24).

**Anasının əmcəyin kəsəri** –qəddar.

Qadam Şah Abbasın da vəzirin, də vəkilin də ağzına, hamısı anasının əmcəyini kəsəndi (46, s.65).

**Anasının oğlu** – xurafatı və ya geriçi adamların düşüncəsi ilə dədəsi bəlli olmayan uşaqlar.

**Ana südündən halal** -halal zəhmətin nəticəsi, ləyaqətlə qazanılmış.

**Anaş toyuq** –yaşlı, bala verən və ayaqlarını basa-basa yeriyən qadın haqqında deyilir.





**Anbaan** - get -gedə, zamanın ən kiçik ölçüsü.

Bülbül ilə qarğanı gör salırlar bir qəfəsə,
Fərq qoyulmur bu dünyada məhəbbətlə həvəsə.
Təəssüf ki bu ömrümüz boşa gedir anbaanda... (A.Bakıxanov).

**Anbar şirindən qaçdı Kərbəla şirinə** - sözünün mənasını bilməmək, əlaqəsiz sözlər danışmaq.

**And- aman eləmək** -xahiş etmək, bir sözün həqiqiliyinə and içmək.

Yolda tutdum onu, and amanla mən,
Tərlədi gül üzü həya, şərmdən ( Məhsəti).

**Anqır tayını tap** - bir nəfər bir qızı ya oğlanı bəyənmədikdə deyər.

Tofiq məktubu cırıqlayıb suya atdı "anqır tayını tap"-dedi (84, s.171)

Anqır tayını tap (335, s.95).

**Anqırtısı gedir göyə** - hay- küy salır, ucadan ağlayır.

**Ara – dərə xəlvət, tülkü bəy** – vətəndə boğuntu və aclıq nəticəsində igid adamların sürgün olub və ya mühacirət etməsi nəticəsində alçaq adamların yüksək məsuliyyətlərdə oturması.

Onun bernosunun canı sağ olsun, pulu qurtulanda, özünü verir ucqar kəndlərin birinə. Ara xəlvət, tülkü bəy, bildiyin eləyir, tiryək pulunu çıxarır (77, səh. 6).

**Ara qızışdırmaq** - od qoymaq, birini qan tökməyə yönəltmək.

Qorbaçovun başçılığı ilə idarə olunan rus hakimiyyəti ermənilərin dabanını çəkib ara qızışdırmasaydı, Azərbaycanın yüz minlərlə şərafətlə yaşayan insanı bu günkü fəlakətlə üzbəüz olmazdı ( B.Həqqi).

**Aralarından su keçmir** – çox mehribandırlar.

Xoca Zığzığ: Amma yaman birləşiblər ha! Aralarından su keçmir (9, s.187).

**Aralıq atı, kor Fatı** –rüsvay adam, tanınmış bir düşüncəsiz adama işarədir.

**Aralı tutmaq** – fərq qoymamaq.

Yoxsulu, ərbabı, şahı, gədanı,
Tutmaz bir-birindən aralı dağlar (32, c.II, s.14).

**Aram atın yaman təpişi vardır** – sakit adam da onun haqqını tapdasan, özünü göstərər, etirazını bildirər, vursa pis vurar.

**Aramızdan qıl keçməz-aramızdan su keçməz** - həddindən artıq mehriban olmaq, yaxın olmaq

Qəbrimiz üstə ot bitər,
Yarpaq keçər aramızdan
Aramızdan su da keçmir,
Torpaq keçər aramızdan (271, s.39).

**Aranda tutdan/ xurmadan, yaylaqda qurutdan oldum** – hər şeydən olim çıxdı.

Aranda tutdan, yaylaqda qurutdan oldum (103, s.73).

**Aranı kəsmək** – münasibəti kəsmək.

Lənətullahi- ləin şeytani-iblis,
Nə dedi dost kəsdi, ay ara məndən (32, c.II, s.20).

**Aranı qarışdırmaq** – dava-dalaş salmaq, iki nəfəri biri-birinin canına salmaq.

Alçaq adam qarışdırar aranı,
Bayquş da adətdir sevər viranı (32, c.II, s.87).

**Aranın yat -yut olması** – sakitlik.

Xanımağa... ara yat-yut olduqdan sonra isə öz vətənimizə qayıtmağı məsləhət görürdü (197, s.94).

**Arası kök olmaq** - yaxşı münasibəti olmaq.

Hər adamın bir şeydən xoşu gəlir, o rəhmətliyin qəhrəmanlıq mövzusu ilə arası kök idi (118, c.II, s.203)

**Arasından qıl keçməmək** -ən yaxın sirdaş olmaq; bir-birinə güvənmək.

Bir zaman aralarından qıl keçməz Azərbaycan türkünün indi arasından Araz keçir.

**Arasını pozmaq** – münasibətləri pozmaq.

Əmir ilə Xəlifənin arasını pozmaq lazımdır (234, s.44).

**Ara vuran** - bədxah adam.





**Araz aşığından, Kür topuğundan** - dünya vecinə deyil, özündən güclü, düşüncəli adam tanımır.

Mənim Araz aşığımdandı, Kür topuğumdan, hər kim nə deyəcəksə, qoy desin (335, s.83).

Yandım töküldüm, cavan oğlan idim, Araz aşığımdan idi, Kür topuğumdan, heç nədən qorxmurdum (1, s.197).

**Arxac keçmək** - bir işdə birinin əli olmaq, birini başqasının əleyhinə qaldırmaq.

Camaatın hamısı da bildi ki, bu işi pozan pullu Məhərrəmdir, arxac ondan keçmişdi (13).

**Arxa çevirmək** – üz döndərmək, ara pozmaq, ara vuruşdurmaq.

Azərbaycan xalqı heç bir vaxt xaricdən gələn hücumlara arxa çevirməmiş (234, s.490).

**Arxalı köpək qurd basar** -bir insan nə qədər zəif olsa, da hər düşmənə qalib gələ bilər.

"Arxalı köpək qurd basar" misalını kişisinin yadına salırdı (253, s.361).

**Arxası dağa bənddi** - bir arxayın və güclü yerə başı bağlıdır.

**Arxasını yerə vurmaq** – məğlub etmək.

Bu gün axşam mənim və bizim vilayətin düşmənləri, necə deyərlər bizim arxamızı yerə vurmaq istəyir (9, s.29).

**Arxı atlamamış, özünü öymə** - bir işi görməmiş özünü tərifləmə. Bir işi görməmiş lovğalanma.

Arxı atlamamış özünü öymə (335, s.320).

Arxı tullan, sonra bərəkallah de ( 12, s.24).

**Arığın nə işi var ki, qoruqda vurub qıçın qıralar** - hər kəs özünə uyğun hərəkət etməlidir.

Arığın nə işi var qoruqda ki, vuralar qıçı sına (335, s.96).

**Arı kimi şan bağlamaq** – zəhmətlə, sevgi ilə özünə bir faydalı iş görmək, bir yuva qurmaq.

Arı kimi quru yerdə şan bağlar (203, səh. 58).

**Arıq it öz kəndinin şiridir** – yaxşı adam olmayan yerdə pis də yaxşı sayılır.

Arıq it öz kəndinin şiridir (103, s.71).

**Arıq tazı** - arıqlığına baxmayaraq çox zirək, bir yerdə dinc durmayan adama işarədir.

**Arım var, arım var eşşək arısı?** - dəyərsiz bir şeyi ağız dolusu tərifləyən adam.

**Arı pətəyi kimi** – çox get-gəli olan yer.

Arı pətəyi tək qaynayıb daşın,
"Məşrutə, məşrutə" deyib ağlaşın! (80, c.II, s.62).

**Arı yeyib, namusu quyruğuna taxmaq** – arsız, abırsız adam.

Bəxtəvər buynuzuna, arı yeyib namusu da bağlayıbsan quyruğuna (129, c.I, s.171).

**Arı yeyib namusu dalına atmaq** - arsız, məsuliyyətsiz.

Nə döyülməyi, nə söyülməyi vecinə almadı, arı yedi, namusu atdı dalına (335, s.63).

Abrını atıb həyanı bağlayıb belinə (347, s.211).

**Arı yuvasına çöp uzatmaq** -pis adamla iş görmək.

Bilməm arılar mənzilinə kim çöp uzatdı,
İllərcə təğafüldə yatan xəlqi oyatdı (267, s.39).

**Armud sapı** - bu deyim arıq insanlar, boynu nazik insanlar haqqında işlədilir.

Gərdəni armud sapı tək işkəlib (168, səh 309).

**Arnavut** -boynu yoğun, bəd qiyafə, çirkin adam.

**Arpa-buğda doğmaq** – növbə ilə bir oğlan, bir qız doğan qadına deyilir.

İbişli: Lap arpa buğda doğur ki...(9, s.134).

**Arpa çörəyi osduraqlı götə dəlildir** - bir işin səbəbini bilmədən onun barəsində səhv izah verən.

**Arpa əkdim, darı çıxdı** -işin nəticəsi yaxşı olmadı, zəhmətim hədər getdi.

**Arpa əkən buğda biçməz** - pis iş görən yaxşılıq gözləməz.

**Arpanı divara dırmaşdıran** - şarlatan, fırıldaqçı, avam adamlardan sui- istifadə edən.





Arpanın içini oyub ona civə qoyurdular. Belə arpa divara qoyulan zaman üstə sarı hərəkət edirdi. Bu işləri görən adam savadsız adamları aldatmaqla onların cibinə girirdi.

**Arpası artıq düşüb** -həddindən artıq şuluqluq edən, əlinə düşən imkandan xalqın əleyhinə, zərərinə istifadə edən.

Ya bunların artıq düşüb arpası
Düldül kimi badi-payi bəyənməz (32, c.II, s.62).

**Arpaya qatsan at yeməz, sümüyə qatsan it** -dəyərsiz adam, çirkin arvad

**Arsen Lopen** -Moris Loblanın əsərinin qəhrəmanı, börk qoyan, zirək.

**Arşın- arşın söz-** ürək dolusu dərd, yaxın qohum-qardaşın əlindən cana gəlmək. Həyatdan çox təcrübəsi olan ürəyi dərdli adam.

Arşın- arşın sözüm var, bir arşın mal alan yox (61, 1379).

**Arşın gətir bez apar, çuval gətir qoz apar-** birinin işi bərkə düşəndə nəzir deyir. Sonra yaddan çıxarır, yenə də çətinliyə düşəndə yadına nəzir etdiyi bir neçə çuval qozu və bir neçə arşın bezi yadına salıb deyir: arşın gətir bez apar, çuval gətir qoz apar.

**Artıq-əskik danışmaq** – danışığını bilməmək.

Anasına desin, bundan sonra mənim kişisi olmayan evə getməyim yaxşı deyil, artıq-əskik danışığa, qiybətə səbəb olar (1, s.164).

Utandığından bir kəlmə artıq-əskik danışa bilməyəcək (9, s.21).

Nə isə, çox artıq-əskik sözlər danışırdılar ( 253, s.114).

**Artıq tamah daş yarar, daş qayıdar, baş yarar** – tamahkarlıqdan əziyyət çəkərsən.

Dedim sənə, artıq tamah baş yarar, çox yemək adamı az yeməkdən də qoyar (9, s.142).

**Artıq tikə-** artıq var- dövlət.

Artıq tikə məgər baş yarar? Əvvələn malınız, pulunuz artar, ikincisi də ad-san çıxararsınız (5, s. 58).

**Arvada cahad haramdır** – fanatik islami düşüncə əsasında arvadların nə yaşam haqqı var, nə vətəni müdafiə etmək, cahad etmək haqqı. Bu deyimi, ümumiyyətlə, iki kişi bir-birini təhqir edəndə işlədərlər, yəni sən qorxaqsan, əlsiz-ayaqsızsan.

**Arvad hesabına yaşayan kişilər** – arvadın sadəliyindən, təvazökarlığından istifadə edən nankor kişilər.

Elə ki, kef çəkib sərvətin axırına daş atırdı, pul qurtarırdı, kişi xırda bir şey bəhanə tutub, evdən gedirdi (297, səh. 43).

**Arvadın dulu, ayrı düyünlər pulun** - dul arvad dünyagir olar, kişiyə ürək yandırmaz.

**Arvad şalonladır, kişi talonla** - bu deyim son illərdə Azərbaycanın şimalında Qarabağ müharibəsi və gənclərin Rusiyaya mühacirəti nəticəsində yaranmış kişi qıtlığı ilə bağlı işlənir.

**Arvad-uşaq basmaq** –çoxlu uşağı olmaq.

Bir də məni arvad uşaq basmayıb ki, onları dolandırmağın fikrini çəkim (1, s.335).

**Arzu ayağı uzanır** -adam gəzib dolandıqca, xüsusən cavanlarda dolanmaq, seyr etmək gücü daha da artır.

**Arzugöz qalmaq/ Arzusu gözündə qalmaq** — vətən üçün burnunun ücü göynəmək, arzusuna çatmamaq, ən böyük arzusunun hasil olmaması.

Arzugöz qalmış idim, öz ana yurdum vətənə,
Yandı-qındı verir indi, ata yurdum da mənə ( Şəhriyar).
Göylər pərisini görmək əməli
Gözümdə qalmışdır cocuqluğumdan (337, c.I, s.110).

**At deyil, eşşək deyil** - o qədər də bahalı bir zad deyil ki, razılığa gəlməyək.

**Asıb- kəsmək** - hədələmək, gəlin aparmaqdan bir gecə qabaq icra olunan bir dəbin adıdır.

O gecə kürəkənə kürəkən paltarı geyindirəndə bir cür edərlər ki, onun qolunun biri gir elər. Nəmər almayınca, onu boşlamazlar. O gecə həna qoymaq gecəsi olar, amma asdı-





basdının əsas dəbi kəndin meydanında gecə yarısı zurna, təbil çalaraq güləşməkdir.

**Aslan dişindən, kişi işindən tanınar** - adına görə iş gör, insana əməlinə görə qiymət verərlər.

**Aslan ürəkli** – qorxmaz, igid, cəsur.

Keçmiş zamanda bir obada aslan ürəkli igid bir cavan yaşayırdı (43, I cild, səh. 60).

**Asta qaçan namərddi** – var qüvvəsi ilə qaçmaq.

Keşiş evinə gəlib hamını yuxuya verdi, gecə yarı ağırdan-yüngüldən götürüb yola düşdü. Asta qaçan namərddi (35, s.556).

**Astarını yaxşı tanımaq** – birinin iç üzünü yaxşı tanımaq.

Əgər doktor əfşarlar «qızım sənə deyirəm, gəlinim, sən eşit» məqsədilə bizə aid olan sözləri əfəndilərə xitabən deyirlərsə, biz bu bəhanələrin astarını yaxşı tanırıq (246, səh.101).

**Astarı üzündən baha-** lazımsız bir şeyin qiyməti, əsl şeyin qiymətindən baha olur.

Yox bizimki tutmadı, bir az çox oldu, astarı özündən baha düşür (9, s.176).

**Astar üzünə çevirmək** –yoxlamaq.

Dostları çevirdim astar üzünə
Nə yaxşı ki,
Düşmən çıxan olmadı (260, s.21).

**Asta vur, rasta vur** – düz iş gör.

Asta vur, rasta vur( 103, s.70).

**Aşağıvı da görmüşük, yuxarıvı da** - sənin hər üzünü görmüşük, zahirini də, batinivi də

Bir dilənçi bir evə gedib yardım istəyir. Çox xəsis olan ev sahibəsi deyir: əgər aşağıda olsaydım, sənə sədəqə verərdim. Sonra bir dəfə də gedir, bu dəfə aşağı mərtəbədə olan arvad yenə deyir ki, yuxarı mərtəbədə olsaydım, sənə sədəqə verərdim. Dilənçi deyir: xanım, sənin aşağıvı da görmüşük, yuxarıvı da.

**Aş bişirib, üstündə bir qarış yağ** -birini yaman günə salmaq, uğursuzluğa düçar etmək.

Fələk bir aş bişirdi, bir qarış üstündə yağ durmuş,
Bu dünyada Nəsira, bir piyalə aşə tovlandım (241, s.79).
**Aş bişirmək** -birinə nəqşə çəkmək, əzaba salmaq.
Diri insanlara məndən bunu peyğam aparın,
Ki bilin odlu ocaqda, bizə pis aş pişilir (95, s.78).
İndi də əhli-Amrika olub oynaş sizə,
Yeyəcəksiz bişirib dəmdə qoyub aş sizə (80, c.II, s.110).

**Aşdan isti kasa** - fırıldaqçılıqla şəxsi mənafeyin üstün tutaraq, birinə zahirən ürək yandırmaq.

Madam ki, biz bu dil ilə danışırıq, gün məğribdən çıxmır, əgər bununla oxuyub yazsaq da, yerin kürəsi öz mədarından çıxmayacaqdır. Əl çəkib bizi öz yaralarımızı sağaltmağa buraxın. Bundan artıq inad etməyin. Bizə aşdan isti kasa olmayın. Biz öz dərdimizin çarəsini yaxşı bilirik (30, №39, 1324).

**Aşığın, ya saqqızın oğurlamaq** – ürəyinə girmək, sevgisini qazanmaq.

**Aşığı ovçu durub** - bəxti açılıb, işlər yaxşı olub.

Aşığın duruş halətlərindən börk, cik, tava, avçı, ombanın adını çəkmək olar. Avçı halətində duran aşıq hər cür duran aşığı udar.

**Aşıq atmaq** -qumar oynamaq, ümumiyyətlə, "get aşıq atmağının dalınca!" formasında işlənir. Bu iş sənlik deyil, başın çıxmır.

Get aşıq atmağıva, qeyrəti neylərsən oğul,
Hələ sən xırdacasan, övrəti neylərsən oğul? (168).

**Aşıq haya, molla vaya** - aşıq sevinc olan yerə molla isə yas yerinə can atar.

**Aşıq-qoz oynamaq** – hələ əlindən bir iş gəlməmək.

Qız deyir ki, hələ sən get aşıq-qoz oynamağının dalınca. Sənə evlənmək yaraşmaz (46, s.124).

**Aşıqsız saqqa** -yalqız, subay. Hamıdan uzaq gəzən erkək.

**Aşına ağı qatmaq** - qan qaraltmaq, həyata acı qatmaq.
Düşmən gəldi qarşımıza,
Ağı qatdı aşımıza,
Kül ələndi başımıza





Getdi əlimizdən getdi,
Sipəhsalarımız getdi.

Qacar zamanında Urmiyada Məhəmmədquluxan Əfşarın federal milli hökumət qurması ilə əlaqədar deyilib. Urmiyada ağıya "ovu" deyirlər.

**Aşına, aşına çıxdı ocaq başına** - göstərilən hörmətin qədrini bilməmək, sırtıqlıq etmək.

**Aşına soyuq su qatmaq** – işlərini korlamaq.
Bəy ilə molla və xan qatdı soyuq su aşıma,
Töküb İranın o xanzadələri kül başıma (80, c.II, s.111).

**Aşına zəhər qatmaq** -- birinə pislik etmək.
Bir arvadla gün keçir zəhər qatma aşına,
Kişi çox arvad alsa, yaramaz heç, yaramaz (80, c.II, s. 61).
Malı mala, canı cana qatdılar,
Aşımıza yaxşı zəhər qatdılar (80, c. II, s.141).
Başıma gələni söyləyim sənə,
Gör nə zəhər qatılıbdı aşıma? (35, s.504).

**Aşın bişib** - mənfi mənadadır. Etdiyi əmələ görə cəzasını alacaq.

Yazda arpa yeyən atın qışda aşı bişər.

**Aşının duzunu vermək** - dərsini vermək.

Çıxardaq onları qaçıb gizləndikləri siçan deşiklərindən gün işığına, aşlarının duzunu verək, çıxıb getsinlər (9, s.101).

**Aşna si..n** -tanıdığı, yaxın adama yadlardan qat- qat artıq əzab-əziyyət vermək.

**Ata-baba günü** – bütün elin-tayfanın bir yerə yığışıb, toy-düyün tutduğu gün- adam əlindən tərpəşə bilməyən gün.

**Ata çörəyi- meydan çörəyi, oğul çörəyi- zindan çörəyi** – ata hər zəhməti çəkər, övlad zəhmətini başa vurar.

Ata çörəyi-meydan çörəyi, oğul çörəyi- zindan çörəyi (103, s.69).

**Ata görən oğul meydan açar, nənə görən qız süfrə** - ata-ana tərbiyəsinin övladının tərbiyəsində rolu böyükdür. Qədim təsəvvürlərdə oğlanın ən böyük üstünlüyü döyüşkənliyi, qızın isə ən yüksək keyfiyyəti evdarlığı sayılırdı.

**At ağızlı** – böyük ağızlı. Gözəllik, igidlik mənasında işlənib.

At ağızlı bəy Uruz, ağsaqqal, əldə qopuz ( Səhənd).

**Atam evində balıq başı, ərim evində toyuq aşı** - bəzi yerlərdə balıq başı yemək yaxşı sayılmır. Bu məsəldə ər evində vəziyyətin ata evinə nisbətən yaxşı olduğuna işarədir.

**Atasından qabağa düşən tulanı qurd yeyər** - ehtiyatlı olmaq, vəziyyəti nəzərə almaq. Əslində isə tarixi inkişaf yeni nəslin özündən əvvəlki nəsildən mütləq irəlidə olmasını tələb edir.

**Atasını, anasını qəbirdən çıxarmaq** –söymək.

Həri, ağəz ey, belə lap bir-birinin atasını anasını qəbirdən çıxardıblar. Az qalıb ki, lap saçlaşsınlar (72, c.III, s.118).

**Atasına od vurmaq / Atasına od qoymaq** – çox sərt davranmaq.

Atama vurdu bir od, yaxşı bu dövran, dayıcan,
Axırı oldu işim, naləvü - əfqan dayıcan! (80, c.II, s.113).

Kimdi səni incidən, atasına od qoyaram (9, s.140).

**Atasını dalısına sarımaq** – söyüb biabır eləmək.

Onun atasını da dalısına sarımaq lazımdır (1, s.119).

**At atla savaşdı, arada eşşəyin qıçı sındı** - kiçik adamlar böyüklərin davalarının qurbanı oldular, günahsız adamın zərər görməsi.

**At minənindir, qılınc qurşananındır** – kim bacarıqlıdırsa hər şey ona çatır.

At binənindir, qılınc qurşananındır (229, s.24).

**At çapdırmaq / çapmaq**- zor demək, meydan sulamaq, xalqın avamlığından istifadə etmək, quldurluq, xarici düşmənlərin basqını.

Çapma atını, girmə bu meydana a molla,
Çox məsxərə sən yazma müsəlmana, a molla! (M.Ə.Sabir).

İnsafdırmı at çapa sinəndə əcnəbi?
Düşmən əlində çaki-giriban olan Vətən! (65, №1, 1917).

Heç kəs öymədi adımı





Çoxu çapanda atını (260, s.65).

Elin döşündə çap at, tut əlində Quranı (308).

**Atdan düşəndə addan düşmə** - hər şeyi itirsən də, təmiz adını itirmə.

Atdan düşəndə addan düşmə (103, s.68).

**Atdan düşən ölməz, eşşəkdən düşən ölər** – əcəl gələndə cavana, qocaya baxmaz.

Atdan düşən ölməz, eşşəkdən düşən ölər (229, s.26).

**Atdan düşüb eşşəyə minmək** - əvvəlkinə nisbətən daha əlverişsiz vəziyyət.

**Atdıra-atdıra gəlmək** - atdırmaq, hərzəlik etmək, başqaları ilə gəzmək və ya qəzəblə gəlmək.

**At əti, it əti** – faydasız ət.

Ətlər olmuş at əti, ya it əti.
Donmuş ətin iyi başı çatladır (338, s.126).

**Atəşə qalanmaq** –birinə aşiq olmaq.

Binürvətin atəşinə qalandım,
Bir soruşan yoxdu əhvalım mənim (32, c.II, s.18).

**At getdi, örkən apardı** – əlinə bəhanə düşdü.

At getdi, örkən apardı (129, c. I, s.39).

**At görəndə axsar, su görəndə susar** –hər zada göz dikən, tamah salan.

**At, göydə deyim** – yəni heç bir iş, heç bir məsuliyyət qanun və hesab- kitabla deyil.

**Atı daşlığa sürmək** - tartan-partan danışır.

**Atı dostun kimi bəslə, düşmənin kimi min** – minəndə at sürətlə getməlidir.

Atı dostun kibi bəslə, düşmənin kimi bin (229, s.32).

**Atın nalı gümüşdü** - özünü bəyənən, təkəbbürlü adam.

**Atılıb düşmək** - narazılığını bildirmək, əl-ayağını ölçmək.

Atılıb düşmə, cocuq, yırtma yalandan çulunu,
Biri öz oğlunu evləndirir, oğlan sənə nə? (168, s.238).

Hacı, yaxşı deyirsən, amma qorxuram Nazlı atılıb-düşə (195, c.II, s.49).

Deyirlər, içmə, gülmə, danışma,

Atılma, düşmə, zurna da çalma (301, səh. 92).

**Atım özündən, donum özündən, bəyə nökərəm** - heç bir haqq almadan biri mənə ağalıq edir.

**Atının quyquğunu düynıək** - meydan oxumaq.

Çün bu ərsədə çoxlar atının quyruğun düyüb,
Oynadıb çapıb (223, s.155).

**Atın qabağına ət, itin qabağına ot qoymaq** - uyğun olmayan iş görmək.

Zirvələrdə dayandıq,
Dənizlərdə at qovduq,
Çöllərdə yelkən açdıq,
Atlara sümük, itlərə arpa təklif etdik (207, s.36).

**Atışmaq** - sözləşmək, iki nəfərin acı-acı danışmaları. Azərbaycanda iki nəfərin birəlli güləşmələrinin adıdır.

**At ilxısı, köpək sürüsü** - çoxlu ailəyə, çoxlu uşağı olan yerə deyilir.

**At qacdı, palan düşdü** - hər şeyin bir birinə dəyməsi, aləmin qarışması.

Elə bu min aylar hərəsi şövqünü bir yana salar, bir-birini danar, özünü igid sanar, özgəni bilməm nə qanar. Bu arada amma iş yanar, baş yanar, baş qanar, hərə apardığı yüngül yükü salar, at qaçar, palan düşər (204).

**Atlar dəpişsə, arada eşşək ölər** – böyük adamlar dalaşanda arada kiçiklər tapdanar.

Atlar dəpişsə, arada eşşək ölər(229, s.28).

**Atlı qarışqa** - az vaxtda çox yeri dolaşan adam, çox gəzən.

**Atlını atdan salar** -ilanı yuvasından çıxarar. Şirin dilli, hiyləgər.

**Atlını atdan salmaq** -şirindillilik və həyasızlıq mənasında işlənir.

**Atmaralı** – yöndəmsiz.

Çopur Abdulla köpəkoğlu, atmaralı idi (1, s.227).

**Atma sözlər** - acı söz , birinə eyhamla toxunan, təhqiramiz bir söz demək.

Mənə yaman da desən, üzdə de, qəbulumdur,





Atma sözlər ilən sevgilim, söz atma mənə (304, s.82).

**At mənim altımda büdrəməsin** – arvad mənə vəfalı çıxsın.

**At minən** - bəxti gətirən, işləri yoluna düşən.

At minən atasını tanımadı ( Dərəgəz məsəli).

**At muraddır** -yuxuda at görən muradına çatar.

**Ata oğlundan ötəri mülkündən keçdi, oğul atadan ötəri kürkündən keçmədi** – ata-ana övladına təmənnasız zəhmət çəkər.

Ata oğlundan ötəri mülkündən keçdi, oğul atadan ötəri kürkündən keçmədi (103, s.71).

**At olan yerdə ot olmur, ot olan yerdə at** – hər şey yerli-yerində olmur.

At olan yerdə ot olmur, ot olan yerdə at (103, s.73)

**At oynatmaq** - birlik və milli şüur olan yerdə düşmən at oynada bilməz.

Bu günkü kimi siyasi mübarizə meydanında hər hansı bir mənsəbpərəst və fürsət gözləyən adam öz atını oynada bilmirdi (6, 1324).

**At ölüb itin bayramıdır** - birinin uğursuzluğundan o birinin istifadə etməsi.

**At sürmək** – hakimlik edən.

Filosoflar, siyasətçilər və ədiblər meydanında at sürən Qızıl Arslanlar mənim müəmmalarımı həll edə bilməz (234, s.515).

**At təpiyinə at dözər** - həyatın ağır zərbələrinə hər adam dözə bilməz. Yaman günə dözmək hər adamın işi deyil.

**At ucuz, dayça baha** -yaşlı nəslə layiqincə ehtiram göstərilmədiyi, onların övladırına çox ehtiram göstərildiyi yerdə işlənir.

**Atı uduzub çuluna güvənir** - faydalı, böyük şeyləri əldən verib kiçik bir şeylə özünü aldatmaq.

**Atüstü gəlmək** - tələm- tələsik, baş vurub keçən.

**At vurdu dizimə, indi gəldim özümə** - böyük bir fəlakətdən sonra özünə gəlmək.

**Avam aşı** -yoxsul və cahil insanların mollalara və yalançı din xadimlərinə etdiyi haqsız xidmətlər və uşaqlarının boğazından kəsib onlara verdiyi pula işarədir.

Molla əmi, az ye avam aşını
Tulla fırıldaqçılığın daşını.

**Aya baxma, gəlib düşsün ayağına** -məğrur ol, hörmətini saxla, tamahkar olma.

**Aya deyir sən çıxma, mən çıxım** - çox gözəl qız. Türk folklorunda Ay gözəllik simvoludur.

Vallah bu elə bir gözəldir ki, aya deyir sən çıxma, mən çıxım, suya deyir, sən axma, mən axım (174, s.47).

Tanrı Xoca Hidayətə bir oğlan inayət etdi ki, aya deyir sən çıxma, mən çıxım, günə deyir sən çıxma, mən çıxım (209, s.25).

**Aya-günə dönmək** – az-az görünmək.

A kişi, hardasan, gəl çıx da, aya-günə dönmüsən (9, s.166).

**Ayağa baş salmaq** -qurban olmaq. Ürəkdən birisinə vurulmaq.

Ayağına başın kim ki saldı əz səri sidq,
Qəbuli həzrəti- eşq oldu eybilən hünəri (132).

**Ayağı düşmək** – xurafatı düşüncələr əsasında əgər bir körpə uşaq 40 günə qədər çığır-bağır etsə, yəni bu mənadadır ki, yanına murdar adam, ağır nəfəsli adam gəlib.

Dəyər tapmaq, qiymətə minmək, bahalanmaq.

Bir ildə yeralmaya ayaq düşdü zamanda,
Müstəzəfi saymırdı, yatırdı Cəmərəndə (168, s.171).

Cəməran özünü müstəzəflər tərəfdarı kimi tanıdan Xomeyninin sarayı

**Ayağa salmaq** -dəyərdən salmaq, puç etmək.

Göydə ahım yeli söndürdü, çırağın günəşin,
Yerdə əşkim ayağa saldı dürri-qəltanı (120, s.91).
Dustan, saldı ayaqdan məni hicran ələmi (149, s.22).

**Ayağa vermək** – birini alçaltmaq.

Amma di gəl, bərk ayaqda ayağa verməz (9, s.164).

**Ayağı altında ot bitmək** -çoxlu gözləmək, dözmək.





**Ayağı altında oturmaq** -birini düz yoldan çıxartmaq. Pis yola çəkmək.

**Ayağı bağlı** -birinə aşiq olmaq.

Kimin didəsi bağlı, bağrı dağlı,
Başı qaralı, ayağı bağlı (120, s.96).

**Ayağı götvərən qəbrinə girmək** -bir ağır günahda ittiham olunmaq, işin pis gəlməsi

**Ayağı qarnındadır** -ilan kimidir, zahiri yaxşı olsa da, fürsət ələ gələn kimi pislik edər. Təhlükəli adam

**Ayağın altını qaşımaq** -birinə quyu qazmaq.

**Ayağım yerə yapışdı** -*heyrətdə qaldım, mat qaldım.*

**Ayağına getmək** -hörmət qoymaq, alçaq könüllülük etmək.

**Ayağına sabun çəkmək** -birini xatalı işə göndərmək, var-dövlətini əlindən çıxartmaq

**Ayağında əkdi, başında sovurdu** -hər şeyi bir-birinə qatmaq.

**Ayağını götürüb yerinə sən qoymusan** – eyni onun kimisən.

Deyəsən Qüdrət dayı "Yaxşı igid dayısına oxşayar" "ayağını götürüb sən qoymusan" (109, s.138).

**Ayağının altına daş qoymaq** - qızışdırmaq, birinin əleyhinə qaldırmaq.

**Ayağının altını qazmaq** – quyu qazmaq, pislik etmək.

Balağa kimi çörəyi dizinin üstündə olanlar ayağımızın altını qazırlar (1, s.161)

**Ayağını yerə basanda başı göyə minnət edir** -iddialı, təkəbbürlü adam

Ayağını yorğanına görə uzat (129, I, s.492).

**Ayağını öz yorğanına görə uzatmaq** – yəni ictimai, iqtisadi vəziyyəti nəzərə alaraq, bir işə əl vurmaq.

Adam ayağını yorğanına görə uzadar (84, s.119).

Mazan əmi, ayağını yorğanına görə uzat deyiblər, bizi niyə qoz qabığına soxursan? (1. s.269).

Lakin biz heç vaxt icazə vermək istəmirik ki, o, ayağını öz yorğanından kənara çıxararaq, bu qanuni hüquq ilə tanış olsun (248, səh 53).

**Ayağı sayalı olmaq -** Atam deyir: Quruluq ili idi. Sən olduğun gün birdən göy qurıldayıb, yağış yağmağa başladı. Onda elin ağsaqqalları dedi: «Uşağın ayağı sayalıdır», yəni uğurludur, düşərlidir.

**Ayağı sürüşkən -**əxlaqsız qadın.

Ayağı sürüşkənin, gözü dağınığın biridir, odur ki, alan yoxdur da (9, s.143).

-O Nazı ayaqdan sürüşkənin, quşqundan boşun birisidir (253, s.325).

**Ayağı yanan it -**təcrübəsi olan, bir yerdə dayanmayan, həmişə gəzib dolanan, avara, didərgin düşmüş

**Ayağı yer almaq** –qudurmaq, bir şeydən istifadə edib haqsızlıq etmək.

Mən sənnən yavaş danışıram, yoxsa ayağın yer alır? (335, s.73).

Gedərdim Çomağataya, amma ayağın yer alacaqdı (84, s.72).

**Aya hürmək –** boş söz danışmaq.

İt olub hürmədik aya,
Yıxdı bizi abır-həya (260, s.83).

**Ayaq açmaq** – hücum etmək, bir vətənin torpağını işğal etmək anlamında.

Yağılar yurdumuzu başsız görüb, üstümüzə ayaq açmasınlar (173).

**Ayaq ayağa sürtmək -**nigaran, avara qalmaq.

**Ayaq çulu** – hörmət qoyulmayan, adam yerinə qoyulmayan.

Qız idim sultan idim,
Nişanlandım xan oldum,
Gəlin oldum qul oldum,
Ayaqlara çul oldum.

**Ayaq döymək -**bir işin arxasınca çox gedib- gəlmək.





Düz bir həftə idi ki, rayon maarif şöbəsi ilə baş mühasib Şeydayevin idarəsi arasında ayaq döyməkdən yorulmuşdum (310, s.84).

**Ayaqdan düşmək -**əldən düşmək, yorulmaq, pis günə qalmaq, yaşlanmaq, qocalmaq, ağır vəziyyətdə, pis durumda olmaq.

Ayaqdan düşmüşəm saqi, əlimdən tut ayaq ilən,
Əlində sağəri zərrin, görüm həmvarə var olsun ( Xazin).
Salmış məni zəmanə ayaqdan, dəxilüvəm,
Qovza ayağımı məni salma ayağa, gəl (147, səh. 42).
Ali-Qacarı fələk salsa ayaqdan, cana,
Görəsən milləti-İran, genə yuxlar, ya yox (80, c.II, s.79).

**Ayaqdan salma -**yormaq, zərərə salmaq.

Məhparələrin fikri səni salmış ayaqdan,
Ağzın sulanır busə üçün, qönçə dodaqdan (282, səh. 193).
Bir gün ki əlində var idi qüdrəti imkan,
Bədbəxt edəyib çoxlarını saldı ayaqdan (168, s.445).

**Ayaq daşı -**çopur, utanmaz adama deyilir.

Qasid ayağına o qədər sürtüb ağladım,
Mərmər yüzüm qoturlaşıb oldu ayaq daşı (168, s.530).

**Ayaq ilə gəlib, baş ilə gedəcəksən -**gəlin köçən qıza deyirlər. Yəni ölənə qədər bu evdə qalacaqsan.

Bizdə olan ənənələrə görə, ölən adamı evdə tabuta qoyandan sonra başı tərəfdən evdən çıxardarlar. İslam hakimiyyəti dövründə uzun illər zindanların məsulu olan Əsədullah Lacəvərdi deyirdi: Zindana gələn ayaq üstə gələr, başı üstə çıxar.

**Ayaqqabımı geyə bilərsən, amma yerişimi yeriyə bilməzsən -**biri özünü başqasına bənzətsə də ona bənzəyə bilməz.

**Ayaqlar baş oldu, başlar ayaq -**vəziyyətin tərsinə dəyişməsi.

Maddi və mənəvi mənada yoxsulların, əskik adamların yüksək məqamda oturması və böyük adamların öz məqamını itirməsi.

**Ayaqlarım Fransa yazırdı** – Qacar dövründə Azərbaycanda xarici dil Fransa dili idi. Bu deyimdən hədəf budur ki, elə sərxoş idim ki, bilmirdim nə cür yeriyəm.

**Ayaq ortaya qoymaq -**araçılıq etmək, bir işin həllində vasitəçilik etmək.

**Ayaq tozu** -sənin kiçiyinəm, müqayisədə çox kiçik olmaq, dəyərsiz, qul, kəniz.

Mən ayaq tozunam, sən başım tacı,
Çün mənim xalqımın söz memarısan.

**Ayazımış üz** - üzün həddən artıq qansızlıq nəticəsində ağarması.

Sanki qəfil ayrılığın təşvişindən kişinin üzü ayazımışdı (325, səh. 48).

**Aydan arı, sudan duru**- türk mifologiyasında ay və su təmizlik, duruluq, saflıq simvolu kimi müqəddəs sayılmışdır. Buna görə də mənəviyyatca ən təmiz adamlar ay və su ilə müqayisə edilmişlər.

Pis qız deyil, gül kimi təmiz uşaqdır, aydan arı, sudan duru (9, s.172).

**Aydan gəlmisən** -bu dünyanın adamı deyilsən?

Ey sən də bilmirəm Aydan gəlmisən, ya Marsdan, başa düşmürsən nə deyir? (84, s.114).

**Ay daş atan bəxtəvər, daşın da öz vaxtı var**- bu iş üçün bu vaxt uyğun deyil, hər işin öz vaxtı var.

**Ayağı yer almaq** -yerini möhkəm, etibarlı görmək, təklif olunan işə razı olsa da, zahurdə özünü narazı göstərmək.

O ad sənə halal olsun, doğrudan da dediklərinə görə varsanmış, pulunu götür, bu dəfə Aşıq Ələskərin ayağı yer aldı: "Yox götürməyəcəyəm, atımı özümə verin, bəsdir"(13, s.241).

**Ay durəcənab** -yumşaq surətdə danışanı yalançılıqda ittiham etmək. Təxminən "üzdən iraq" mənasında.

**Ay gedən it, gəl məni qap** -başqalarına səbəbsiz öcəşən adam.

**Ayğır** -dinc oturmayan, qaynayan qız haqqında işlənir.

**Ayı balası** –güclü.

**Ayıbını qara yer örtsün** -xəcalət çək, utan.

**Ayı çezir, qaban oynur**- heç kim heç kimin kitabını oxumur.





**Ayı çıxmaq** -çətinliklə üzbəüz olmaq. Boynuna agır bir iş düşdü, yenə bir xərc çıxmaq, çətinliklə üzbəüz olmaq, bədbəxtliyin başlanğıcı.

Gəlirim gediri ev kirasına,
Ay başa çatınca çıxırdı ayım (338, s.143).
Adı batmış əcəl gələndə bizə,
Mənim ayım çıxdı, gün də batmışdı (306, səh 180).

**Ayıdan dönmə** -məhəbbətə, sevgiyə biganə olan.

Bacı- qardaş deməz, ata- anasın bilməz,
Deginən bir ayı, ya bir səhra, səhra... (223, s.9).

**Ayı dostluğu** -mövqeyyətə, şəraitə uyğun olmayan sözləri dilə gətirmək, zarafat eləmək, cahil adam, cahil dost.

Mümkündür ittifaq düşsün ki, tək-tək adamlar musadirə olunan mallardan istifadə etmiş olsunlar. Lakin bu çox nadirdir. Onların dostluğu ayı dostluğudur. Bizə düşmənlikdir (305, səh 85).

**Ayı ilə bir çuvala girmək** -hesabsız, ağılsız bir işə əl qoymaq, qanmaz adamla bir yerdə yaşamağa məcbur olmaq, müştərək iş görmək.

**Ayı meşədən küsüb, meşənin xəbəri yoxdur** -birisinin özünü haqlı sayaraq başqasına naz etməsi.

**Ayın neçəsindən danışırsan?** – heç nədən xəbərin yoxdur. Danışdığın faydasız və dərdə dəyməyəndir. Mətləbə dəxli yoxdur.

**Ayı nədi, oynamaq nədi?** – bu sənə nə yaraşır?

Ayı nədi, oynamaq nədi? (103, s.73).

**Ayını əvvəl öldür, sonra dərisinə qiymət qoy/ Ayını öldürməmiş dərisini satma** - dəryada balıq sövdası eyləmə. İş görmək əvəzinə boş danışan adam.

Məsxərə ilə dedi, söylə mənə,
Gəldi ayı, bir nə danışdı sənə?
Verdi Ekost böylə cavab durmadan:
Satmayın heç vaxt dərini soymadan (80, c.II, s.202).

**Ayının min bir-iki oyunu var, bir armudun başında** – biri quldurluq, soyğunçuluq etmək istər, səbəbinə amma bir bəhanə gətirər.

**Ayın-şayın** – şən, sevincək.

Mən burda hər bir zadı ayın-şayın görürəm (195, c.II, s.51).

**Ayı yuvası, asma üzüm-** ayı üzümü çox sevər. Bir adam ayının yuvasında üzüm saxlamaq istəsə, səhv edir.

**Aynan- günnən görünmək** – gec-gec görünmək.

O vaxtdan ki, yazığı işdən çıxardılar, aynan-günnən görünürsən (72, c.III, s.49).

**Ayna qabağında durub özünə dərəcə vermək** -özünü bəyənən, yekəxana, özündən müştəbeh.

**Aynanın kaslanması** -Azərbaycanda olan qədim ənənəyə görə, uğursuzluq əlamətidir.

**Aynası açılmaq** - kefi açılmaq.

İzin ver Məlikməhəmmədi də aparaq, aynası açılsın (46, s.297).

**Aynası hovdan düşmək.** – ölmək.

Əjdaha tək nəfəsindən belə ki, püskürür od,

Nəfəsi gizlənəcək aynası hovdan düşəcək (338, s.91).

**Ayranı dağılmış qarı** -deyingən adam, hər zadı əldən vermiş adam.

**Ayrı düyünləmək** -sədaqətsiz, gizli özünə pul- para yığan, özünü düşünən.

**Ayrı pəstəha-** başına oyun açmaq.

Millət dedi ki, almaq mümkün dəgil bahadır,

Timsar dedi: bəs onda bu ayrı pəstəhadır (69).

**Ay şaqqılar, şaqqılar -it vaqqılar-** bir balaca işarəyə bənddir. Kiçik bir çətinlikdən səsi çıxar.

**Aza dedilər hara gedirsən? Dedi çoxun yanına** – hamı varlı tərəfə can atır.

Aza dedilər hara gedirsən? Dedi çoxun yanına (103, s.71).

**Azarı satın almaq** – soyuqda nazik paltar geyinən adama deyilir.

Ay bala, yel əsir, bir köynəklə balkonda nə qədər dayanmaq olar. Azarı satın alırsan? (1, s.209).





**Az aşım, ağrımaz başım** -aza qane olmaq, tamahkar olmamaq, minnət götürməmək.

Səhər çayım, nahar nanü- pənir, axşam bozbaşım,

Dəxi dərdim nədir aya? Az aşım, ağrımaz başım,

Nə düşmüşdür mənə çokim el qayğısın, millət qəmin ("İqbal", 1914, 12 fevral).

**Az aşın duzu deyil** – çoxbilmiş, hiyləgər, bacarıqlı.

Sən qocaman da bu çal çağında heç də azacıq aşın duzu deyilsən ( 253, s.191).

**Azca arıca** -qazanılan bir şey az olsa da təmiz, halal zəhmətlə qazanılsın.

Arı türkdilli xalqlarda təmiz və saf mənasında işlənilir.

**Azdan az gedər, çoxdan çox** – hər kəsdən damarına görə qan alarlar.

Azdan az gedər, çoxdan çox (103, s.71).

**Az getdi, üz getdi** – nağıllarda işlənir.

Az gedib üz gedib dərə təpə düz gedib bir quyuya rast gəldilər(148, s.56).

**Az idi arıq uruq, biri də gəldi dabanı cırıq** – xoşa gəlməyən bir adamın yersiz müdaxiləsinə etirazdır.

Al öz uşağını, az idi arıq yırıq, biri də gəldi dabanı cırıq (72, c.III, s.124).

**Az qalıb boğaza yığılam** – səbr kasam dolub artıq.

Az qalıb boğaza yığım onları (3, səh. 50).

**Az ye özünə hambal tut** –öz işini özün gör.

Mən çəkəcəyəm sənin yerinə, az ye özünə bir hambal tut! (9, s.126).

# -B-

**Babalın it götürməz** -günahı çoxdur, çox pis adam, rəhmsiz.

**Babalın yumaq** -bilmədən bir nəfərin arxasınca danışmaq.

**Babı –** Babın başçılıq etdiyi mütərəqqi dini təriqətin tərəfdarlarına babı deyilir.

Bu babi oğlu babi dünən küçədə hamını başına yığıb həzrətin tuman bağına lağ eləyir (195, c II, s.116).

**Bacadan düşən kimi qismətin üstünə düşmək** - gözlənilmədən xoşbəxtliyə qovuşmaq.

Deyəsən, elə bacadan düşən kimi qismətin üstünə düşmüşdü (174, s.26).

**Bacadan quyruq yağmaq** –başından ruzi tökülmək.

Mən də sənin kimi xoşbəxt deyiləm, gəlib hazır üstünə çıxam, sənin bacandan quyruq yağır (129, c.I, s.145).

**Bacarana baş qurban** - bacarlıqlı adama nə etsən halaldır, hər kəs bacardığı kimi yaşayır.

Deyirdi: görünür, bu dünyada bacarana baş qurbandır (253, s.373).

**Badalaq vurmaq** -bir işin qabağını almaq, manеə törətmək.

Dedim bəlkə mənə badalaq vurmaq istəyir (288, s.113).

Əli, ədə nömrə, mənə badalaq gəlirsən ? (9, s.143).

**Bağa bax üzüm olsun, yeməyə üzün olsun** -əziyyət çəkmək lazımdır ki səfasını görəsən, utanmayasan.

**Bağ-bağ olmaq** -kef çəkmək, bir yaxşı olaydan, xoş xəbərdən xoşhal olmaq, bir zada valeh olmaq, fərəh hiss etmək.

Yaşayırsan el ilə birgə, el ilə görünürsən,
Baxaraq Təbrizə bağ-bağ açılırsan, sevinirsən (Bulut).
Sənin kimi bir gül hər bağ bəsləyə bilməz.
Səni görən kimi ruhum açılır bağbağ (241, səh. 157).

**Bağban bağsız olmaz, dəvə sarvansız** -hər evin böyük-kiçiyi olar.





**Bağ belə, bostan belə** -yalandan boy demək, özünü şişirtmək.

Qardaşoğlu, çox geriyik, döşümüzə döyürük, bağ belə, bostan belə. Amma adicə sanitariya qaydalarına riayət etmirik (142, səh. 72).

**Bağda ərik var idi, salam- əleyk var idi -bağdan ərik qurtardı, salaməleyk qurtardı** – işi düşəndə yaltaqlanan, işi düşməyəndə üz çevirən adam.

Dədəmi ki çıxartdılar, Fərəc də mənimlə haqqı-salamı kəsdi, bağda ərik var idi, salam məlik var idi (9, s.140).

Bağda ərik var idi, salam meleyk var idi, bağdan ərik qurtardı, salam məleyk qurtardı( 129, c.I, s.92).

**Bağa qınından çıxdı, qınını bəyənmədi** - əslini-kökünü danan adama deyilir.

Cavab verərlər ki, "bağa qınından çıxdı, qınını bəyənmədi!" (253, s.450).

**Bağda gülə baxarlar** -gözəl qıza, gəlinə baxdıqda etiraz edən zaman işlənir.

**Bağırsağı düyün düşüb** -karıxmaq, özünü itirmək.

**Bağırsağı tərsə düşüb** -nigarançılıqdan, qorxudan əl-ayağını itirib.

**Bağırsaqları acından quruldayır** -ən dəhşətli aclığın əlamətidir.

Baxıb gördü ürək durmaz, pırıldar,
Bağırsaqlar acından hey quruldar ( 147).

**Bağıvı dolu vurub?** -dəryada gəmilərin qərq olub?

Almaçı eşşəyi tək salladı tez qaşqabağın,
Elə pərt oldu, deyirdin dolu vurmuşdu bağın (168, s.259).

**Bağla dilimə** -bu işin günahı mənim sözümdədir.

Birisi getdi bir kəndə qəzadan,
Xəyal etdi keçə ol xoş fəzadan.
Biri səsləndi getmə gəl qonaq ol,
Sərəfraz et bizi, zeybe-visaq ol.
Eşitcək düşdü atdan mərde- novrəs,
Dedi bu atı harda bağlayım bəs,

Nişan ver tez, cilov qaldı əlimdə,
Dedi: durma gətir bağla dilimdə (83).
**Bağlı boğça** – bir sirr.
- Bağlı boğça elə bir lotu üçün açılmasa, bizim bazarımız bağlanar, xanım! (253, s.331).
**Bağlı olmaq** -bir zada hədsiz sevgi.
Ağsu sənə,
Kim deyər ağ su sənə?
Ölüncə səndən keçməm,
Bağlıyam Ağsu sənə (171).
**Bağrı ayazlanmaq** – bir şeydən ötrü çox darıxmaq.
Çoxdan nağıl eşitməmişəm, bağrım ayazlanıb, könlüm dayazlanıb (203, s.12).
**Bağrıbadaş** -hər şeydə bəhs eləmək.
Gəlib yanında iznsiz əyləşəcək, guya səninlə min ildir bağrıbadaşdır (129, c.I, s.113).
**Bağrı bişmək** –darıxmaq.
Ah çəkməkdən bağrım bişib
Bircə yada salan yoxdu (174, s.73).
**Bağrı çatlamaq** - yaman günə düşmək, nəhayət dərəcədə darıxmaq.
Qaldıqca bu Təbrizdə, lap çatladı bağrım (58, səh, 116).
**Bağrı dəlmək** –əziyyət vermək.
Al canımı, ya canıma bir can verirsən ver,
Dəl bağrımı, ya dərdimə dərman yazıbsan yaz! (347, s.86).
**Bağrı daş olmaq** – mərhəmətsiz.
Abbas ağlar arsız-arsız,
Dünya olub etibarsız,
Deyirdin dözərəm yarsız,
Döz bağrı daş olan könlüm!(12, s.63).
**Bağrı kabab olmaq** – çox dərd çəkmək.
Gül yüzün görməklə çox bağrıkababları bən kibi,
Qəlbə bin didarın üçün yüz təmənna qoydular (354, S.152).
**Bağrı qana dönmək** – kədərlənmək.





Yandı bağrım döndü qana.
Aman gülüm, gülüm, gülüm! (148, s.33).
**Bağrı qan etmək** – birini ağır vəziyyətə salmaq, çıxılmaz vəziyyətdə qoymaq.
Çillə gəlib, Xoyda fəğan etməyə,
Xoyluların bağrını qan etməyə (243, s.68).
**Bağrı qan olmaq** -çox narahat olmaq, kədərlənmək.
Səngəkin övzai xalqın bağrını qan eylədi,
Bir görün nüstövi zülmündə nə tüğyan eylədi (30, №8).
**Bağrı qara** -həddindən artıq qüssələnmək, kədərlənmək.
*Firqətindən qara bağrım olub su,*
Alıbdır qərarım o! zülfü geysu ( Məhəmməd bəy Aşiq).
**Bağrım sökülür** -kədərlənmək, qəm- qüssəyə qərq olmaq.
Gözdən tökülən qətrə dənizdir qucağımda
Dalğası sökür bağrımı peykan ilə sənsiz (Rahimi Paşazadə).
**Bağrına dağ çəkmək** –ürəyinə dəymək.
Ki, bu zəmanə onun bağrına çəkib dağlar,
Zəmanənin sitəmindən o ney kimi, inlər ( 80, c.II, s. 172).
**Bağrına xal düşmək** -ürəyi qırılmaq, ən ağır kədər.
Çərx altında elə bir gün görmədim,
Yandı qara bağrım, xala yetişdi (97, s.114).
**Bağrın başını əzmək** – ürəyə dəymək.
Seyraqıbla aşna olub,
Bağrım başın əzən gözəl (32, c.II, s.7).
**Bağrın dəlinməsi**-kədərdən, qüssədən könlün açılmaması.
Dəlindi qüssədən bağrım, sən etmə ürəgim parə (225, s.54).
**Bağrı parçalanmaq** – çox kədərlənmək.
Didib parçaladı bağrımı bu qəm,
Üzümə boylandı əlimdə qələm (337, c.I, s.125).
**Bağrı yandırmaq** - yaman günə salmaq, dağ çəkmək.
Yandırdı eşqin bağrımı səndən mana dərman gərək,

Gərçi yolunda aşiqin canü-dili suzan gərək (225).

**Bağrı yarılmaq** -nəhayət əzaba düşmək, ölümlə üzbəüz olmaq.

Bülbül gərək hicran oxuna bağrı yarılsın (214, s.41).

**Bağ vaxtı bağbanın qulağı ağır eşidər** -biri imkanat ələ gətirən zaman başqalarını unudar, birinə kömək eləməz.

**Bahar buludu** - həmişə gözü yaşlı olmaq. Göz yaşının ələnməsi, bir qələmə tökülməsi

Bahar buluduydu sanki gözləri (54, s.132).

**Bahar buludu kimi açılır, tutulur** -dəyişkən adam, gah gülən, gah ağlayan.

**Bahar havası, ər arvadın davası** - bahar havası tez-tez dəyişdiyi kimi, ər-arvadın da davası tez keçər.

**Baharı xəzan olmaq** – xoşbəxt günləri bədbəxtliyin əvəz etməsi, cavan ikən solmaq.

Eşqi var idi Şəhriyarın güllü-çiçəkdi,
Əfsus ki, qəza vurdu, xəzan oldu baharı (80, c.II, s. 252).

**Bax mənim gözümə, mən də baxım sənin üzünə** - dərdimiz birdir, üzümüzdən bəllidir ki, içimizdə nələr keçir, danışmağa ehtiyac yoxdur.

**Baxta daş atmaq** - təklif olunan işə, düşən şansa arxa çevirmək.

**Baxtı açılmaq** – işləri düzəlmək.

Baxtımız açılan deyil,
Qapımızı açan olsun (260, s.102).

**Baxtı bağlanmaq** – işlərin nəhs gətirməsi.

Bağlanıb, baxtın bağlanıb,
Qırmızı bantın bağlanıb (260, s.83).

**Baxtını qara yazmaq** – uğursuz taleli.

Məni ağlar qoyduz cavan vaxtımda,
Qaralar yazdınız mənim baxtımda? (35, s.566).

**Baxtın üzü dönmək** – taleyi nəhs gətirmək.

Dönüb baxtın üzü bizdən,
Kim qurtarar bizi bizdən (260, s.91).





**Baxtı yatmaq** – işləri irəli getməmək, qapıların üzünə bağlanması.

Yerisən, yüyürsən çata bilməzsən,
Görürsən ki, baxtın yatdı, sən də yat (32, c.II, s.13).
Başımdan keçəni söylədim bir-bir,
Sücaət, yatıbdı baxtın dedilər (294, s.42).

**Baxtının qapısı bağlı olmaq** - işləri irəli getməmək, qapıların üzünə bağlanması.

Baxtımın qapısın bağlı qoyubsan,
Çəkib sinəm üstə dağlar qoyubsan (32, c.II, s.81).

**Bakka qoymaq** - banka qoymaq. Uşağı, böyüyü bir növ öpməyə deyilir.

Xalq arasında banka qoymaqla soyuqdəyməni aradan qaldırırlar. Elə öpürlər ki, öpüşün səsi həmin bankanın qopardanda çıxardığı səsə oxşayır.

**Baqaja qoymaq** – satmaq, ələ vermək, pis vəziyyətə salmaq.

Xaspoladov bircə günün içində o boyda kişini qoydu baqaja (9, s.178).

**Balaca stəkanda böyük çay içmək** -kiçik yerdə çox adam üçün *qonaqlıq vermək.*

**Bala qazan tez daşar** -savadsız adam, səviyyəsiz adam tez hirslənər.

**Balalarının başına çevir** – bağışla, günahımdan keç!

Bizə bir çarə elə, o uşaqların fikri ğözgədir, bizi çövür balalarının başına (195, c.II, s.16).

**Balalı qarğa pox yeməz** - bu deyim "qızın oldu qırmızı donunu soyun" deyimi ilə sinonimdir. Ata- ana üçün əsas övladların sağlamlığı və tərbiyəsidir.

**Balası ölən dəvə** -insanlar özlərini bəzən məşğul olduqları heyvanlara bənzədirlər. Qol qanadı sınmış, ağır kədərlə, dərdlə yaşayan, gözləri yaşlı.

**Balığı at dəryaya, balıq bilməsə xalıq bilər** – yaxşılıq etməkdən zərər gəlməz.

Bir misal qız bilirdi keçmişdən: yaxşılıq eylə at suya onu sən (80, c.II, s.203).

**Balıq başdan qoxuyar** -ailədə, cəmiyyətdə bütün bəlaların səbəbi yuxarıdan gəlir.

**Balıq dənizdən çıxdı, öldü** -elindən, doğma mühitindən ayrı düşən insan rahat yaşaya bilməz.

**Balı olan bal yeməz** - yaxud kuzəkar sınıq kuzədə su içər. Ağır vəziyyət elə bir şərait yaradır ki, insanlar əllərində olan vasitələrdən özləri istifadə edə bilmirlər.

**Baltaçının hin deyəni** -bu deyim "ələkçinin qıl verəni" deyimi ilə sinonimdir. Yəni heç bir rolu olmadığı halda özünü böyük bir işə şərik bilən. Azərbaycanın şimalında, xüsusən Qarabağda ara qızışdıran adamlara belə deyilir.

**Balta kəsməz bığ** -boynu yoğun, qoçu.

**Balta kəsməz** - qüdrətli, güclü, dözülməz.

Bəxtimin bədbəxtliyindən şəkkər əksəm, duz olu,
Yay günü həmmamə getsəm, balta kəsməz, buz olu.

**Baltanın sapı ağac olmasa, kəsə bilməz** -adamı özününkü satar, ağacı qurd içindən yeyər.

Balta ağacı kəsməzdi, sapı ağac olmasaydı (284).

**Balta vurmaq**- bir şeyin kökünü kəsmək; birinə ağır zərbə vurmaq.

Onların öz əlləri ilə öz vətənlərinin məhv olmağını, rişəsinə balta vurduran bir heyəte-zalimanənin məhv olmağını Allahdan istəyirdik (65, №2, s.2).

**Bal üstə arı çox yığılar** – xeyir gələn yerə çox adam can atar.

Bal üstə arı çox yığılar (335, s.292).

**Balvan** – küt.

Olsaydım əgər müslüm olardım, yekə balvan,
Heyvandır- özün yaxşı bilirsən ki müsəlman (72, c.III, s.264).

**Bambılı** – yüngül, ləyaqətsiz.

Həmin bu mərəzin bərəkətindəndir ki, mən bu bambılı Əhmədin yanında olmuşam bir balaca uşaq və ağlayıb atamdan





kişmiş istəyən kimi gündə bir dəfə utana-utana deyirəm: Şeyx Əhməd, mənə kişmiş (195, c.II, s.39).

**Bambılı bəy** - ərdəmsiz, ləyaqətsiz, bacarıqsız.

**Bambılı bucağı** -Güneyin şərq tərəflərində, o cümlədən Şəbüstərdə yaz, payız vaxtında yağış və qarın yağıb-yağmayacağını bilmək üçün, adi xalq məntəqənin cənubi-qərb üfüqlərinə baxar, o səmtin üfüqləri və səması buludlu olursa, «bambılı bucağı» tutuqdur, yağacaq və yaxud, «bambılı bucağı açıqdır» - yağmayacaqdır – deyərlər (122, səh. 13).

**Banlamaq** – xürafi müsəlmanlar arasında inama görə, banlamağa bənzəyən səs çıxaran toyuğu seyidə vermək lazımdır. Səsini qaldırmaq, vaxtsız söz danışan, özünü nahaq yerə ortaya atmaq.

Eylə bilirdim ki, dəxi sübh olub,
Morği-səhər tək bir ağız banladım.
Səng şikəst eylədi balü-pərim,
Banlamağın hasilini anladım (267, s.42).

Banlasan bir də bu evdə, səni verrəm seyidə,
Seyidə kim gedə, fikir eyləmə salim qeyidə (168, s.520).

Molla Turab banladı,
Kim bildi, kim anladı(168).

Rəsmiyyəti vardır, atanı danlamaz oğlan,
Hər yerdə ata dinməsə, tez banlamaz oğlan (168).

**Baratası itmək** -heç bir nişanı qalmamaq.

Oğlu itkin getdi, dedilər cani doktorlardan biri inqilab günlərinin şuluqluğunda onun böyrək- ürəyini çıxarıb satmağa görə onu yox elədilər. Bir barata da tapılmadı.

**Barmağa dolanmaq** - ələ salmaq.

Dəxi sən bizi dolama barmağına çoban! (62).

**Barmağı dişləmək-** yadına düşmək, təəssüflənmək.

Eyb etmə əgər barmağımı dişləyər olsam,
Mən də yata qaldım bir uzun qəflət içində ("Çöl quşu", s.44).

**Barmağım bala batdı, səninki də bəhməzə batar** –mən çox xeyir gördüm ki, sən də xeyir görəsən?

Ağıllı iş görürlər, içmirləı, içənlərin barmaqları bala batıb? (1, c II, s.61).

**Barmağına dolamaq** -ələ salmaq, oynatmaq

Yoldaş Mirzə Camal! Mən əgər şüşəni sındırmışam. Sən də teatrı dolamısan barmağına (73, s.135).

**Barmağını dişləmək** – heyrətdə qalmaq.

Mən o saat barmağımı dişlədim, amma iş-işdən keçmişdi (46, s.323).

Sözüm çoxdur, ancaq söyləyə bilmədiyim üçün vaxt-bivaxt, öz barmağımı dişləməyə məcbur oluram (313).

Zülmünü yada salıb dişlədi barmağını,

Quşlar da eşidibdir zülmünün sorağını (100, s.6).

Cənab Xatisov aşkar dedi ki, bu daşnaksütyun Rusiyanın böyük şəxslərinin, generallarının və hətta Qafqaz canişini həzrətlərinin fikir və əqidəsinə qulluq edir. Və 15 ildir ki, təşkil olunub və onun qoşunu, xəzinəsi, saldatı da vardır. Biz müsəlman vəkilləri bunu eşidəndə təəccüb və heyrət barmağımızı dişimizə tutub öz-özümüzə fikir etdik: biz ancaq özümüz öz əlacımızı edək və bizim də gərək təkmil müsəlləh hizblərimiz olsun (232, s.134).

**Barmağının kirin sormaq** – çox fəlakətdə, yoxsul yaşamaq.

Görürsənmi bizim Hacı Pirini,

Qonşu sorur barmağının kirini (267, s.267).

**Barmağın hansın kəssən, qanı çıxar** - ana-ata üçün, bacı-qardaş üçün hər bir əzizini əldən vermək ağrılıdır.

**Barmağı olmaq** - bir işdə iştirakçı olmaq.

Mirzəmməd: - Sizin də o jurnalda barmağınız varmı?

Cəlil M. – Hə, arabir yazıram ( Cəlil M., «Xatirələrim», səh. 32).

**Barmaq arası baxmaq** -əlacsızlıqdan boyun əymək, ciddi qəbul etməmək.

Ruhanilər padşahları "imamın iti" adlandırmaqla onların özlərinə "zalım" və məmurlarına "zələmə" ləqəbi vermişlər.





Padşahlar isə bu təhqirə heç də etina etməyib həmin məsələyə barmaqarası baxırlar (5, s.232).

**Barmaq ilə oynatmaq** -ələ salmaq, taleyi ilə oynamaq.

**Barmaqları qızıla tutulmalıdır** - əlindən iş gəldiyinə görə yüksək dəyər verilməlidir.

Ovcunun içi puçur-puçur qabar,

Qızıla tutulası barmaqları var, amma qabar-qabar (48, səh.51).

**Barmaqlıq dalısı kimi** –dustaqxana.

Barmaqlığın dalında, dustaq tək dolanmayır (M.Rahim).

**Barmaq ilə göstərilən** -yaxşı və ya pis əməlinə görə məşhur olan. Həm mənfi, həm də müsbət mənada işlənir.

Ələştər maliklərinin içində barmaqla göstərilən adam idi, hamı ondan hesab apparardı (281, s.94-95).

Barmaq ilə göstərərlər kün, çün üzündür qibləgah (225, s.47).

**Barmaq qatlamaq** –saymaq. Mənə nə yaxşılıq eləmisən barmağını qatla.

**Barmaq yeri** -Bir zadı bəhanə edib yalan sözlər yaymaq.

Dil məsələsi ilə yüzdə yüz tərəfdarlıq edib məclis intixabatını ayrı mənada təfsir edib özü üçün barmaq yeri qoyur və qulaq asanların fikrini zəhərləməyə çalışır(30, 1945).

**Bar verən ağacı kəsməzlər** -yaxşı övladı, xeyir verən bir işi əldən verməzlər.

**Basabas salmaq** -bir zadı ələ gətirmək üçün həddindən artıq meyl göstərmək, hücum etmək, aranı qarışdırmaq.

Basabas salma dadaş, cinsi firavan görürəm,

Əldə dolar dayanıb Amrika, alman görürəm (319).

**Basaratı bağlanmaq** – bir iş görə bilməmək, əli-qolu, gözü bağlanmaq.

Sanki basaratım bağlanmışdı (1, s.180).

**Basıb kəsmək** - çapovulçuluq etmək. Xalqın var-yoxunu talan etmək, öldürmək, zor demək, quldurluq.

İndi ki hamı basır, hamı yeyir, hamı kəsir,

Ömər, Osman da sənin çeşmin oyur, Məmmədəli! (301, s.149).

Dayının bas-kəsinə baxmayın, amandır, qorxmayın (344, səh. 54).

**Basmaq** – qalib gəlmək.

Mən əhd eləmişəm ki, hər kim məni bassa, onunla dost-qardaş olam (174, s.18).

**Başa almaq** -özünə nəzarəti itirmək, hay-küy salmaq, qışqır-bağır etmək.

Səsi alıb dağ-dərəni başına,
Xəyal edir heç kəs eşitmir sözün (95, I cild, səh. 167).

**Başa atılan alma** -toyda gəlinə alma atarlar, yerə düşəndən sonra çox dəyərdən düşür.

Fəvvarə ucaldıqca gələr başı aşağı,
Başı atılan alma düşər bir gün aşağı (168, s.748).

**Baş-ayaq qan** – dava-dalaş salan adam.

Molla demə, məsxərə cünbandı bu,
Dur qaçaq, oğlum, baş-ayaq qandı bu (267, s.188).

**Başa çalmaq** -qaxınc etmək, başına qaxmaq.

Əzizim başa çalı,
Çalmanı başa çalı,
Yemə namərd çörəyin
Qayıdar başa çalı.

**Başa çarqat örtmək** -utanmaq, qorxaqlıqdan qıpçınmaq.

Dəvəçi qadınları Səttarxana bir məktubla bir bağlama içərisində qadın çarqatı göndərirlər. O zaman "Həqiqət" əncümənində bu əhvalatın şahidi olanlar danışırlar ki, Səttarxan çarqatı görən kimi ciddi vəziyyət alaraq dedi: Bunu da göndəriblər ki, onları azad edə bilməsək, başımıza örtək (3, s.70).

**Baş açmaq** – dərk etmək, fürsət tapmaq.

Mənim balam bu nə işdi,
Baxdım, baş aça bilmədim (260, s.146).
Baş açmaq çətindi fələk felindən,
Az ağla, gözün də gedər əlindən (294, s.42).





**Başa dəyirman daşı keçirtmək** -başına nə qədər oyun gətirdilərsə, xəbəri olmadı.

**Başa əngəl olmaq** -yaxşılıq edilən bir adamın bəlaya çevrilməsi, cəhalətdən, şəxsi mənafeyi üstün tutmaq üzündən öz millətinə xəyanət edən adamlar haqqında deyilir.

Əslafımıza çünki həqiqi xələfiz biz,
Öz qövmümüzün başına əngəl-kələfiz biz (267).

**Başağrısı vermək** – narahatlıq vermək.

Ay bacı, çəkil get, şeyxə başağrısı vermə (195, c.II, s.37).

**Başa qoymaq** -hörmət etmək, çox dəyər vermək.

**Baş alıb getmək** – bir söz demədən vətəni tərk etmək.

Dəvələr düzdə qaldı,
Yükü Təbrizdə qaldı.
Balam baş aldı getdi,
Balası bizdə qaldı (238, səh 46).

**Baş altına qoymaq** -birinin ehtiyat var-dövlət yığması, bir nəfəri ehtiyatda saxlamaq.

**Baş aparmaq** - tələsmək.

**Başa soyuq dəymək** -başı işləmir, yaramaz işlər görür.

Get bala, get, əğlinə yazdır dua,
Başıva biçarə dəyibdir soyuq.

**Başa torba keçirmək** - milləti aldatmaq, eşşək yerinə qoymaq.

Axır yenə də hökmran oldu bizə xanlar,
Keçdi başına torba, daha millət ayılmaz (69).

**Başa torba vurmaq** - birini aldatmaq, var-dövlətini əlindən çıxartmaq, havayı işlətmək.

Keçdi başına torba, daha millət ayılmaz,
Qəm çəkmə, əmoğlu, hələ bu millət ayılmaz (69).

**Baş- ayaq vurmaq** -həqiqətdən yayınmaq, mətləbin üstündən keçmək.

Bax, nəm-nüm eləmə, baş-ayaq vurma, sənə qurban olum (84, s.19).

Yalanlar ardınca getsə sənətkar,
Əyri pərdə kimi baş ayaq çalar (Nizami).

**Başa yorğan çəkmək** - dünyadan xəbərsiz, öz şəxsi mənafeyini qoruyan.

Dolanar, soruşar xalqının halın
Başa yorğan çəkib yatmaz Əmoğlu (15).

**Baş-başa qoymaq** -qanmaz adamla mübahisə etmək.

Ağıllı nadanla baş-başa qoymur,
O bu keşməkeşdə bilir, sınacaq ( Mirzə Şəfi Vazeh, s.7).

**Baş-beynini aparmaq** – çox, mənasız danışmaq.

Axmaq-axmaq ağlayıb baş- beynimizi aparma (148, s.109).

**Başbilən** – böyük, təcrübəli.

Bir gün vəzir, vəkil başbilənlər yığışıb padşahın yanına gəldilər, dedilər (46, s.29).

Yenə də bizə başbilənik eləsin ( 253, s.272).

**Baş bir yastığa qoymaq** –ər-arvadın bir yerdə yatmağı.

Heç dayana bilmirəm, gərək mənlə başbir yastığza qoyasan (46, s.29).

**Başdan almanlıdır, götdən Livanlı** -Livan Səhənd dağlarının ətəyində bir kəndin adıdır. İranın hər yerində, eləcə də dünyada məşhur olan Liqvan pendiri bu kəndin adı ilə bağlıdır.

Geyimində, zahiri görünüşündə təzad, uyğunsuzluq olan adam haqqında işlənir. Deyimdə Alman Qərbin, sivilizasiyanın, son dəbin, Livan isə geyimdə mühafizəkarlığın simvoludur.

**Başdan girib ayaqdan çıxmaq** – yaltaqlanmaq, aldığı pulun yetərincə olması.

Ayda 25 manat məvacibim var, başımdan girib ayağımdan çıxar.

**Başdan salmaq** -əl çəkmək, əziyyət verməmək, vəfa etmək.

Başın istirsən bu baş, gəl al,
Bu əmri-xeyri sal başdan, görüm baş getsə axər,
Əl çəkər bu dərdi-sər məndən (289, s.62).

**Baş deyil, daşdır** -təfəkkürü olmayan, zamanla ayaqlaşa bilməyən.

Bu mane kəndə daş, ölkədə başdır,





İşə mane olan baş eyni daşdır.

**Baş-göz adam** – ağılsız, anlamaz adam.

Nə bilsin məni hər bir başü - gözlər? (150).

**Baş gözlü göra getmək** –dava-dalaşdan uzaq olmaq, dini, xürafati baxışlara görə orucunu yeyən adamlar başlı gözlü gora getməzlər.

Başlı, gözlü gora getmək olsa əgər muradın,
Nə qərbə çevir üz, nə meyl eylə şimalə (106).

**Başı aşağı, saçı yuxarı** – adi, normal adam. İstehza ilə işlənir.

Yaxşı oğlanlardan biri idi, başı ağağı, saçı yuxarı (9, s.102).

**Başı alovlu - dərd** içində, ağlını itirmiş.

Vətənimdə ikən "vətənsiz deyib" Təbrizdən çıxmağa məcbur etdilər. Başı alovlu ordan çıxdım (281, s.100).

Arvad başı alovlu keşişin yanına xəbərə getməkdə olsun, otaqda Əsli ilə Kərəm tək qaldılar (35, s.545).

**Başı aşağı** -Sakit, dilsiz-ağızsız; üzü qara, xəcalətli.

Və bir dəfə də olmayıb ki, mən dövlət yanında başı aşağı olum (195, c.II, s.122).

**Başı ayazımaq** – vaxt tapmaq, bir az özünə gəlmək.

Elə ki, saqi bir baş məclisi dolandı, keflər durulldu, başlar ayazıdı (174, s.110).

**Başı başlara qatmaq** -Özünü böyüklərə tay tutmaq.

Bu gecə mən ki yata bilməyirəm
Başı başlara qata bilməyirəm (306, 110).

**Başı batmış** – qarğışdır.

Ər döyüb öldürür məni, rəhm et amandı, ay ana,
Bu başı batmış ər deyil, əfi ilandır, ay ana (80, c.II, s. 117).

**Başı bədəninə ağırlıq etmək** - başından yekə məsuliyyətsiz söz danışanda hədə qorxu mənasında işlənir.

**Başı böyük- dövlət, ayağı böyük-nəhlət** – Xürafata görə yekəbaş adam dövlətli, ayağı yekə adam uğursuz olar.

Başı böyük- dövlət, ayağı böyük-nəhlət (103, s.72).

**Başı bulanmaq** - yuxusu gəlmək.

Həcər xanım o qədər darışdı ki, baxdı gördü oğlanın başı bulanır (14, s.191).

**Başı çəkmək** – başına gəlmək.

Nələr çəkmiş başın sənin,
Bilinməyir yaşın sənin! (337, c.I, s.25).
Nə çəkirsə başım çəkir,
Bəs niyə qorxur ayağım? (260, s.78).

**Başı çuvaldan deyil** -hər şeyin hesab-kitabı, qayda-qanunu var.

**Başı daşa dəyən ayılar** - dəfələrlə zərbə görən adamlar təcrübəli olar. (Ə.Saraçlı).

**Başı daşa döymək** - səhv eləmək. Faydasız keçən günlərə heyfslənmək.

Əbəs yerlərdə xərc etdim yaşım bən.
Yeridir daşlara döysəm başım bən ("Əhməd Hərami Dastanı").

**Başı daşlı** – günü pis, ağır vəziyyətdə yaşayan, əlindən bir iş gəlməyən.

Ay yazıq, ay başı daşlı, sən nəyə inanırsan ki, buna da inanasan? (195, c.II, s.30).

**Başı göra titrəmək** - yaşı keçmiş, bir ayağı bu dünyada, bir ayağı o dünyada olan adam.

Günüm keçib, başım göra titrəyir (35, s.239).

...Başı göra titrəyən qocalara və qorxudan ağrı çəkən boylu zənənlərə qədər at döşündə bu tonqalların işığına gətirilmişdi (144).

Çəkməz dəxi el xor-xor,
Hitler gələ bilməz.
Vallah başı titrir gora,
Hitler gələ bilməz (69, s.101).
Bel bükülüb yetmişə yetmiş yaşın,
Diş tökülübdür, göra titrər başın (168).

**Başı götünə ağırlıq eləyən** -acı dilinə, özünü aparmağına görə başı kəsməlidir.

**Başı küllü** – bədbəxt, yazıq.





Yəni mən başı küllü bilirdim ki, axırı belə olacaq (195, c.II, s.23).

**Başı qalda olmaq** - həmişə bəlalar çəkmək.

Görürəm başınız yaman qaldadır,
Daşını atmasan bu heçin, puçun (69, s.129).

**Başı qapazlı** - həmişə təhqir olunan, təzyiq altında olan.

"Gop- gop" kimi bifaidə əhli-qələm olma,
ol "başı qapazlı", vəli "bidərdü-qəm" olma (267, s.25).

- Elə sən də çox yamanca başı qapazlısan, Pirqulu! (253, s.255).

**Başı qarışmaq** – vaxtı olmamaq, işi çox olmaq.

Son zamanlarda başım çox qarışıq (75, c.IV, s.78).

**Başı qarpıza dönmək** - çox narahatçılıqdan özünü itirmək, çox yorulmaq.

Budur ha, başım şişib qarpıza dönübdür (335, s.86).

**Başı qatmaq** - yəni nə iləsə məşğul olmaq, fikirləşməyə fürsət verməmək.

Başımı eylə qatıbdır bu elin qəm-kədəri,
Hətta yoxdur macalım, başımı bir an qaşıyam (338, səh.40).

**Başı qoltuq altına almaq** - ölümün gözünə dik baxmaq, qorxmazcasına düşmənə sinə gərmək.

**Başı lovlu** – hövlnak, tələsik.

Başı lovlu özünü yetirir mollanın qapısına (103, s.27).

**Başıma Şam şəbehi gəldi** - gözlənilmədən qeyri-adi əhvalatlarla, faciələrlə üzləşmək.

Bu deyim "Başıma imam Hüseyn müsibəti gətirdi" şəklində də işlənir.

Bir adamı həddindən çox incitmək, əzab-əziyyət vermək.

**Başıma elə bil dolça su tökdülər** - gözlənilməyən bir xəbər aldıqda, gözlənilməz bir vəziyyət qarşıya çıxdıqda, təəccüb doğuran məqamlarda işlənir.

**Başımı yarırsan, ətəyimə qoz tökürsən ki, baxan desin qoz yarıb** – birinə pislik edə-edə zahirdə üzünə gülmək.

Başımı yarırsan, ətəyimə qoz tökürsən ki, baxan desin qoz yarıb (103, s.71).

**Başımız min Kərbəla çəkdi** - çoxlu acı faciələrlə, fəlakətlərlə üzbəüz olduq.

**Başına and içmək** - çox hörmət qoymaq, çox inanmaq.

Bir yoldaş ki,
dost yolunda candan keçər,
ondan məgər keçmək olar!
O yoldaşın
Bir müqəddəs abidə tək,
Başına and içmək olar (291, s.83).

**Başına at təpib / vurub?** - ağlını itirmisən?

Başına at təpib? (84, s.27).

Dədəm vay, ədə, bunların başına at təpib nədir? (9, s.188).

Sizin bilmirəm başınıza at vurub, topuğunuza at vurub, onların heç biri məsələnin künhünü anlamırlar (72, c.III, s.36).

**Başına çevirmək** – bağışlamaq

Afərin olsun nigarın zülfü ilə qaşına,
Gər macal bulsam, həbibin çevriləydim başına (225, s.50).

**Başına çıxartmaq** - böyük mənsəb sahibi olsa da, bacıoğlusun caamatın başına çıxartmır (9, s.164).

**Başına çırpmaq** – elədiyi yaxşılığı, yaxud birinin eybini başına qaxmaq.

Lazım gəlsə, tez onu qabaqlayıb Çopur Abdullanın başına çırpmaq çox vaxt aparmasın (1, s.294).

**Başına daş düşmək** – bir bədbəxtliklə üzbəüz olmaq.

Düşdü daş başıma yıxıldı evim,
Heç rəvadırmı mən bu yaşda ölüm? (195, c.II, s.179).

**Başına nə daş salsın?** –neyləsin? Nə çarə qılsın?

Öz başına nə daş salsın bu ölüm,
Qoca- qoca qarıları qaytarıb (260, s.109).
Kimlər gəlib səni viran eylədi,
Fələk niyə daşın saldı başına (35, s.505).

**Başına dönmək** – qurban olmaq, nazını çəkmək.

Ələ almış güzgünü,





Gözəl neylər güzgünü,
Canım başına dönsün,
Qış gecəsi, yaz günü (33, s.75-76).

**Başına gələn başmaqçı olar-** təcrübəli adam həyatın hadisələrini adi qəbul edər

Eşidin və bilin: mən qorxaqlara nifrət edirəm, onlar gözümün düşmənidirlər, başına gələn başmaqçı olar deyiblər (1, s.374).

Başına gələn başmaqçı olar, bilməsəm deməərəm (9, s.52).

Kəmalım indilər çox yaxşı olmuş,
Ki başına gələn başmaqçı olmuş (147).

**Başına götürmək** – səs-küy salmaq, həddindən artıq şuluqluq eləmək.

İstərəm "gizlənpaç" oynayım yenə,
Başıma götürüb çölü-çəməni (328, s.150).

**Başına-gözünə döymək** – ağlaya-ağlaya özünü döymək.

Yenə dərzi başına, gözünə döyə-döyə geri qayıtdı (148, s.64).

**Başına gün dəymək** - ağlı başında deyil,

Mirzə Cəlilin köhnə dostu İskəndər Qəffari- "İskəndər xan" "Molla Nəsrəddin" jurnalında "Dılğır" imzası ilə məqalə yazırdı. Həmin gün 1919-cu ilin şəhrivərin 16-sında görüşə gəldi (197).

**Başına gətirmək** – rəva bilmək.

Qarşımızda nə qaldı,
Nə qovqadı, nə qaldı,
Fələk mənim başıma
Gətirməmiş nə qaldı? (33, s.131).

**Başına ip salıb oynatmaq** – istədiyi kimi rəftar etmək.

Qırışmal, adam tapmırsan başına ip salıb oynatmağa? (129, c.I, s.35).

**Başına it oyunu açmaq / gətirmək** –başına müsibət gətirmək, çox əziyyət vermək, abrını aparmaq.

Əlac onun sən söyləyən kilkansaç başında tərs dəyirman işlədib pırpız başına it oyunu açmqdır (253, s.148).

**Başına iş gəlmək** – pis bir olayla üzləşmək.

Sualını cavabsız qoymasından hiss eləmişdi ki, anasının başına nəsə gəlib (1, s.328).

**Başına hava gəlmək** - dəli olmaq.

Qorxma bircə bu var ki, sənin başına hava gəlib (195, c.II, s.51).

**Başına qaxınc olmaq** – pis bir əməli, çatışmamazığı üzünə vurulmaq.

Bu qız məni yıxsa, bütün el içində başı qaxınc olaram (148, s.132).

**Başına qaxmaq** – yaxşılığı, bir eybi birinin başına qaxmaq.

Dünənki məqamı əlindən çıxan,
Dünəni bu günün qaxır başına (328, s.305).

**Başına qalmaq** - sahibsiz qalmaq.

Bu saat Buzbulaqda torpaq başına qalıb (118, s 281).

**Başına noxta salmaq** –oynatmaq, qul kimi rəftar etmək.

Getdi bir həyasız arvad aldı, öz başına bir noxta salıb ipini verdi arvadının əlinə (46, s.137).

**Başına oyun gətirmək/ Başına oyun açmaq** - birinə quyu qazmaq, çətinliyə salmaq, birinə təcavüz etmək.

İsfahan lotuları bizim başımıza gətirəni sizin də başınıza gətirib (195, c.II, s.59).

Doğrudur, öldürür, itirir dünya,
Başına yüz oyun gətirir dünya (80,c.II, s.275).

**Başına pis iş gətirmək** – təcavüz etmək.

Harada hansı bir mollanınsa uşaqların başına pis iş gətirdiyini eşidəndə Şeyx Bərəkənin rəsmi fitvası ilə dərhal axtalatdırırdı (144, s.107).

**Başına silindr qoyanlar** -Avropadan gələn papaq növü yeniliyin rəmzi idi, ziyalıların qoyduğu papaq ənənəyə, dinə düşmənçilik kimi qəbul edilirdi. Bir qrup da bunu özlərini ziyalı göstərmək üçün geyirdilər.





Hər başa silindr qoyan əhli hünər olmaz.
Hər oğru özün öyməklə mötəbər olmaz ( Sijimqulu – Əli Nəzmi Kefsiz).

**Başına söz qəhətdi** - niyə bu cür danışırsan, başqa söz danışmaq olmaz ki.

Mollaya dedilər: almaq ilə necəsən? Dedi: alıcı quş kimi. Vermək ilə necəsən? Dedi: Başına söz qəhətdir.

**Başına tərs dəyirman çevirmək** - başına oyun açmaq.

Əgər bu halda kişi gələ, başında tərs dəyirman işlədərəm (335, s.66).

**Başına toy tutmaq** – çoxlu əzab-əziyyət vermək.

Mən onların başına bir toy tutum ki, ta nə qədər sənin canın sağdır, olar Bərgüşad kəndinə ayaq basmasınlar (195, c.II, s.9).

**Başına vurmaq** – başına qaxmaq.

Bir ay süfrənin qırıq-quruğundan yemişik, onu niyə dilinə gətirib başımıza vurursan? (174, s.122).

**Başın boş tutmaq** -ciddi yanaşmamaq, çətin tutmamaq.

**Başında dəlləklik öyrənmək** – naşı adamın bir sənəti öyrənmək istəməsi.

-Dayın da gərək dəlləkliyi elə bizim başımızda öyrənəydi (9, s.186).

**Başında əkib ayağında biçmək/ başında quş tutmaq** - başına müsibət gətirmək, gününü qara etmək, saymamaq, zülm eləmək, adam yerinə qoymamaq.

**Başında qaranlıq olmaq** – xətər olmaq.

Yoxsa uşağın başında qaranlıq var? (142, səh. 346).

**Başında qoz sındırmaq** - adam yerinə qoymamaq, zülm eləmək, başına min oyun gətirmək.

Bax, məsələ açılsa, tərs Tahirlə at Balaxanım bu qozları bizim başımızda sındıracaqlar (9, s.185).

**Başından basmaq** -inkişafına, uğur qazanmasına mane olmaq.

**Başından bir çuval darı töksən, biri yerə düşməz** – bərk çopur adam, çiçək xəstəliyi nəticəsində üzündə deşiklər əmələ gəlmiş adam.

Elə çopur idi ki, başından bir çuval darı töksəydin, biri də yerə düşməzdi (46, s.128).

**Başından bir tük əskik olmasın** -pis heç nə arzulamamaq, birini qorumaq, müdafiə etmək üçün hədə kimi də işlənir.

Başından bir tük də əskik olmasın,
Hər gün bizi yada salan Səhəndin (264, s.80).

**Başından tüstü qalxmaq** – qəzəbləndim, qanım qaraldı.

Başımdan tüstülər, dumanlar qalxır (337).

**Başında tərs dəyirman işlətmək** – göz verib işıq verməmək.

Əlac onun sən söyləyən kilkansaç başında tərs dəyirman işlədib pırpız başına it oyunu açmaqdır (253, s.148).

**Başında turp əkmək** – olmazın əziyyət vermək.

Balaxanım: turp əkəcək.
-Harada?
-Müdir İbişlinin başında (9, s.159-160).

Başında turp əkdi o qaynananın,
O, gəlin olmadı, o günü oldu (328, s.309)
Paşanın başında gəlin turp əkək,
Şahın çırağını söndürək, hoydu! (148, s.185).

**Başını ağrıtmaq** – uzun və faydasız söhbətlə birini narahat etmək, yormaq.

Ağrıtma əbəs başını, meyl etmə ülumə
Yox vəqt qoyan elmə, kəmalata, rüsumə (267, s.30).

**Başını basmaq** - xəyanət etmək, daldan xəncər vurmaq.

**Başını batırmaq** – öldürmək.

Elə tutaq ki, elə dəvəçilər bizim qabağımıza durdular. Biz onların başını batırdıq. Kim nə bilir ki, bizik (195, c.II, s.11-12).

**Başını bəlaya salmaq** – birini xataya salmaq.

Başıma salmışam bunca bəlanı
Məni öldürməli, döyməli deyin (35, s.503).





**Başını dik tutmaq** – məğrur olmaq, yaxşı əməlinə görə qürur duymaq.

Əyilməz başımı dik tuturam mən,
Nə yaxşı oldu ki, sən belə gəldin (80, c.II, s. 163).

**Başını əcəm bərbərə verənin cibində pambıq gərək** - yadla iş görən gərək ehtiyatlı ola.

**Başını əkmək** - öldürmək, aradan götürmək, azdırmaq.

**Başı əlhət daşına dəymək** -təcrübə qazanmaq, iş-işdən keçdiyini bilmək.

**Başı itirmək/ adını yadından çıxartmaq** - cəhalətdən, xurafatdan, vaqeətləri başa düşməmək, ağır faciədən normal mühakimə yürüdə bilməmək.

Başımı itirmişəm, öz adım yadımdan çıxıb (9, s.181).

Mirzə Cəlil başını itirmişdi. Nə edəcəyini bilmirdi (197, səh. 148).

**Başını keçəl etmək** - çox danışmaq, bir şeyi çox təkrar etmək, israr etmək.

**Başını kəsmək** - bir millətin dilini, kulturunu, tarixi danmaq.

Atan gorbagor iki baş kəsmişdi. Demokratları vətəndən didərgin salmaqla bütün Azərbaycanın başını kəsibsiniz siz o tayda (142, səh 214).

**Başını quru-quru qırxmaq** - kələk gəlmək.

**Başının altına yastıq qoymaq** - birini arxayın etmək.

**Başının milçəyini qorumaq** – bir təhər gününü keçirmək.

Deyir başımın milçəyini qoruyuram, ha, ha , ha! (129, c.I, s.427).

**Başının tükü salama gəlmək** -minlərlə əzab, əziyyət görmək.

**Başımın tükü, ya başımın tükü sanı** – yəni həddən artıq.

Başımın sanı belə şeylər görmüşəm bu tərs, avand dünyada (142, səh. 58).

**Başının üstünü almaq** – birini bir işə məcbur eləmək.

Gör necə yatmışam ki, başımın üstünü alıblar oyanmamışam (1,'s.263).

Birdən pəhləvan başının üstünü alıb onu da vurub öldürdü (46, s.252).

**Başını öz qınına soxmaq** -başqaları ilə işi olmayan; dünyadan xəbərsiz.

**Başını paçasının arasına soxmaq** – utanmaq.

Ölüm!
başını paçasının arasında saxlayan
və ömrü yumurta kimi laxlayan
tok atlı çərçilərə (337, I, s.50).

**Başını saxlamaq** - öz mənafeyini qoruyan.

Başını saxlamaq istəyi ilə düşmənlərə bəli deyən adamlara əvvəldən firqəyə yol verməyin ( S.C.Pişəvəri).

**Başını sındırıb ətəyinə qoz tökmək** -ikiüzlülük, yaxşı - pisi qanmamaq.

Çağrılmamış qonaqlar şəhrimizin başını sındırıb ətəyinə göz yummaq fikrindən göz yumsunlar (30, 1945, №75).

Dostlar cərgəsindən ömürlük pozaq,
Baş yarıb ətəyə qoz tökənləri (264, s.159).

**Başını şir başına oxşatmaq** -bir adamı yalandan tərifləyib böyük adam kimi qələmə vermək, birinin qoltuqlarına qarpız qoymaq, yalandan şişirtmək.

Başımı şah başına, şir başına oxşatdılar,
Mən də başsız başına bir ömür oxşatdım başı (241, s.23).
Başlarımızı şir başına oxşadan halda,
Yüklər çəkilir kərgədan ilə filimizdən (338, səh. 31).

**Başını top eləmək** - risq eləmək, xətərdən qorxmamaq.

Başını top eyləgil, gir vəhdətin meydanına
Ey könül, müştaq isən gər zülfünün çovkanına (225).

**Başını uca eləmək** – yaxşı əməllə başqasının üzünü ağ eləmək.

O, xanın başını uca eləmək üçün səhər tezdən durdu, dayları tutub xalxalda bağladı (174, s.5).

**Başını yerə qoymaq** - ölmək, yaxud ağır xəstələnmək.

Sən yerə qoydun başıvı, mən başıma nə daş salım (Şəhriyar).





**Başın yerə soxmaq** – pis əməllə birinin başını aşağı eləmək.

-Üzün ağ olsun, soxdun başımızı yerə, camaatın arasında xəcil olduq (1, s.15).

**Başını yola-yola** – tələsik, çox həyəcanla, hay-küylə.

Bağban başını yola –yola gedib xana xəbər verdi (148, s.104).

**Başısoyuq** – məsuliyyətsiz, etinasız, hər işi yarımçıq qoyan.

O zaman mən başısoyuqluq elədim, məmə, günahım böyükdür (1, s.220).

Böyüyün sözünə baxmayan böyürə-böyürə qalar (1, s.220).

Öz aramızdır, sən elə qədimdən başı soyuq adam idin ha.. Hər işi yarımçıq qoyardın ( Mənsur Xanlu, s.62).

Uçurtdum qara tavuq
Qondu Ərbilə yavuq.
Hamı gedəndə döndü,
Dönmədi başı savuq (238, səh. 31-32).

**Başı şişib qazana dönmək** –çox işdən, bir şeyin təkrarından bərk yorulmaq.

İbişli: başım lap şişib qazana dönüb (9, s.181).

**Başı yerə atmaq** -yatmaq, yuxuya getmək.

**Başı yerə qoymaq** - dünyasını dəyişmək, ölmək.

Ya tez, ya gec yerə qoysan başını (264, səh. 90).

**Baş ilə top oynayan** –1908-ci ildə asoruların bir qəbiləsi Marşimon adlı rəhbərlərinin başçılığı ilə Türkiyədən qaçaraq Azərbaycana girib çoxlu faciələr törədirlər. Sayı 25 mindən artıq olan bu üsyançılar Urmuda insanların kəsilmiş başları ilə top oynamağa başlayırlar. Bu deyim asoruların bir qolu olan cilovların 1287-ci hicriu şəmsidə törətdiyi cinayətlərdən doğulmuşdur.

**Baş kas eləmək** -baş ağrısı verən sözlərə pərdə çəkmək, şarlatan.

Durun bu zahidi burdan qovun, bu xanəxarab

Qüsuri - hur sözü ilən başımı kas eylər (147, s.27).

**Baş kəsilib qanı gedir işinə** - fəlakət içində yaşayır.

Millətin başı kəsilib, qanı gedir içinə.

**Başqa hava çalmaq** - simasızlıq etmək, fikrini dəyişmək, əvvəl dediyindən yayınmaq, sözünün altına vurmaq, aldatmaq.

Kişini yüz həştad dərəcə döndərdim üzü bəriyə. Bu saat tamam başqa hava çalır-and olsun allaha! (118, s.206).

İngilislər Azərbaycana dəvət olunmamışdan qabaq onların əleyhinə danışan Cəlil Naim əfəndi ingilislər gələndən sonra isə tamam dəyişmiş başqa havalar çalmağa başlamışdı (254, s.9).

**Baş qaşımağa vaxtım yoxdur** - iş yaman çoxdur.

Baş qaşımağa macal yoxdur (145, səh. 16).

**Baş qırxmaq** -oğurluq etmək, şovinistlərin əli ilə bir ölkənin talan edilməsi, fərhənginin aradan aparılması.

Tehran hakimiyyəti hər gün bir oğru ustandar, fərmandar ünvanı altında əlinə böyük bir çamadan verib üstümüzə göndərir. Tazə və iti bir ülgüc ilə min dəfələrlə qırxılmış başlarımızı qırxmaqdan utanmırlar (30, 1945).

**Baş qoşmamaq** – fikir verməmək.

İçki pis olduğu üçün, Allaha şükür, bu şeytani işə baş qoşmamışıq (80, c.II, s.308

Balağa məni Çopur Abdullaya baş qoşmağa qoymamaqda düz iş görmədi (1, s.206).

Oğul, sən uşaqsan deyin o sənə baş qoşmadı (174, s.41).

**Baş qulağı bir abbasıya dəyməyən** -səfeh, düşüncəsiz.

**Baş qulağın getməsi** - bir səsdən bezar olmaq.

**Baş qulaqlı adam** -düşüncəli savadlı, danışığını bacaran.

**Başları yarpız kimi biçmək** -- döyüşdə düşməni qırmaq.

Axtararam düşmənləri seçərəm
Başlarını yarpız kimi biçərəm (174, s.54).

**Başlı-başına** – sahibsiz.

Üləma başlı-başına qaldığı üçün tez-tez Məlhəmə adam göndərib Şeyxin ağzını arayıb (143, s.49).

**Başlı başın saxlasın** - özbaşınalıq, hər kəs öz mənafeyini qorusun.





Hər kəs öz başını saxlamaq üçün yaşasaydı, dünyada böyük simalar, fədakar, öz canlarını vətən və millət yolunda fəda edən rəşid insanlar tapılmazdı ("21 Azər" S.C.Pişəvəri, s.92).

**Başlı-birli yox olmaq** -- bir adamın qəflətən yox olması.

Qızın başlı-birli yox olması lap əvvəldən onda şübhə doğurmuşdu (46, s.133).

**Baş mənim- baş onun** - gözlənilmədən bir adamla üzbəüz gəlmək.

**Baş sındırmaq** - bir məsələnin üzərində həddən artıq baş sındırmaq, düşünmək.

Lap Leonardo De Vinçi də gəlsə həll edə bilməz. Neçə gündü baş sındırıram bir şey çıxmır (269, s.233).

O gün bir saat başımı sındırmışam, yadıma sala bilməmişəm (9, s.182).

**Başsız / başsız qalmaq** -sahibsiz, təşkilatsız, rəhbərsiz.

Qoy dünya bilsin ki, bizim ölkəmiz sahibsiz və millətimiz başsız deyildir (30, №120).

Başsız qalıb ayaqlara üftan olan cocuq,
Ey dərbədər gozib ürəyi qan olan cocuq! (267, s.110).

**Başyeyən** -uşaq anadan olanda, evə təzə gəlin gələndə ailədə bir nəfər ölərsə onda həmin uşağa, yaxud gəlinə başyeyən, yaxud qaradaban deyilər.

İndi də sənin başını yeyəcək, tədbir tök (46, s.30).

İgidlərin başın yeyən,
Qocalar bozbaşın yeyən,
Qəbirlərin daşın yeyən
Özü yenə qalan dünya (306, s.219).

**Baş yoldaşı azdır, aş yoldaşı çox** – çətin gündə dost olan azdır.

Baş yoldaşı azdır, aş yoldaşı çox ( 103, s.68).

**Başyuxarı üzmək** - axara qarşı üzmək, təslim olmamaq, yeni fikir, yeni həyat dalısınca qaçmaq.

Başyuxarı üzənlərdən, cavanlardan yazacağam (299, səh. 83).

**Batan günəm** - ömrümün çoxunu yaşamışam, yaxşı çağlarım artıq keçib. Son günlərimdir.

Oğlum, mən bir batan günəm. Gündüzdən gündüzə kölgələri uzadıram. Ölsəm də, qoy elə öz torpağımda quylanım (204, səh. 25).

**Batman adam** -ağır, hörmətli, etibarlı, dünyagörmüş.

**Batman qazan hamıda olmaz** -hamının imkanı bir deyil. Varlı adamlarda olan imkandan başqalarının da faydalanması gərəkdir.

**Bayquş cəhcəh vurur** -ölkə qara geyib. Xaraba qalıb.

Bülbül öldü, gülüstanda
Bayquş cəh -cəh vuran oldu (15, s.85).

**Bayquşlar məkanı** -Türklərin əski zamanda müqəddəs totemlərindən olan bayquş islamın gəlişindən sonra bədbəxtlik gətirən quşa çevrilir. Onun səsi və məkanı əza və xaraba məkanı kimi tanınır.

Məni beş ay öz qoynunda bəsləyən,
Bu məkanı bir daha unutmaram.
Bayquşlar məkanı adlandıran,
Xanimanı bir daha unutmaram (269, s.281).

**Bayquş təkin qu vurmaq** - tək, yalqız qalmaq, nəfəs tökmək, uğursuzluq gətirmək.

**Bayramı qara gəlmək** – bayram zamanı başına bir bədbəxtlik gəlmək, əzizini əldən vermək.

Əzizim hara gəlsin,
Zülfünü dara gəlsin,
Mənsiz bayram eyləsən
Bayramın qara gəlsin (33, s.177).

**Bayram sümüyü ilə köpək kökəlməz** - yaxşı yaşamaq üçün onun bunun sədəqəsi yetərli deyil.

**Baytalın biri baytal** - özünü bacarıqlı göstərmək istəyən savadsız adama deyilir.

Dedim əhsən sənin fərasətinə,
Tanırsan şair ilə baytarı (168, s.561).

**Bazar dili** - aldadıcı, şarlatan, sadə dil.





Etimad: Ağayi Biriya, Səməd Vurğun bazar əhli deyil ki, o boyda şairlə mən bazar dilində danışam (55, s.113).

**Bazar oğlu** - alçaq, fırıldaqçı, yalançı.

**Bazara girdin gözü qıpıq, sən də ol gözü qıpıq** – heç kəsdən fərqlənmə, palaza bürün, ellə sürün.

Bazara girdin gözü qıpıq, sən də ol gözü qıpıq (335, s.63).

**Bazar eləmək** - aradan götürmək, öldürmək.

İlqarından dönən yarı,
Tanrı tezbazar eyləsin (12).

**Bazarı bağlanmaq** – gəliri kəsilmək, işinin üstü açılmaq.

- Bağlı boğça elə bir lotu üçün açılmasa, bizim bazarımız bağlanar, xanım! (253, s.331).

**Bazarın gözünü çıxartmaq** - ümumiyyətlə, mənfi mənada işlənir. Bəzən müsbət mənada da işlənir.

Alış- verişdə, evlənmədə uğursuz seçim edən adama deyilir.

Ey gözəl var, gözlərində külli dünyanın gözü,
Sənsən aləmdə nigara, cümlə xubanın gözü ( Xazin Təbrizi).

**Bazarın kor olması** – alış- verişin qəti şəkildə kəsilməsi, pisləşməsi.

**Bazar şeytan yuvasıdır** - tacirlər, bazar adamları həmişə öz xeyrini fikirləşməyə görə başqalarının da başına börk qoyurlar.

**Beçə tək banlamaq** – böyüklərun işinə qarışmaq, füzulluq etmək. Müsbət mənada da işlənir. Köhnə fikirli adamlar yeni fikirli cavanların sözlərinə belə deyirlər.

Siz sərv kimi sərkeş olub böylə boy atdız,
İllik beçə tək banlayaraq xəlqi oyatdız (267, s.36).

**Bedanqa tüfəng** - Berdanka ilk vaxtlarda işlənən tüfəng növüdür. Bu deyim Təbrizdə həddindən artıq işlənir. Bir növ tüfəngin adı olsa da bəzi insanların xüsusiyyətini nəzərə alaraq onlara da "bedanqa" ləqəbi verilir. Misal üçün Selab məhəlləsində Rəhman Bedanqa və Xiyaban məhəlləsində yaşayan Rəhmətulla Daşatani bedanqa... (B.Həqqi).

Bu tüfəng çaş- baş vurduğuna, hədəfi düz vurmadığına görə adamların haqqında işlənir ki, onlar ictimai siyasi həyatlarında çaş- baş vurub xəyanət belə edirlər.

Azərbaycanın Milli Hökumət zamanında hər gün bir dona girən adamlar özlərini ona tərəfdar göstərsələr də, Amerika və ingilisin göstərişi ilə Azərbaycanı qanda boğan ordu və mürtəcelərin Təbrizə girməsi zamanı əsl mahiyyətlərini aşkara çıxardırlar. Bunlardan biri də Rəhmətulla Daşatani idi. Xiyabanın Aştökən qəbristanında öz tüfəngini firqənin fədailərinə çevirib onları öldürmüşdü.

**Bel bağlamaq** - güvənmək, inanmaq, etibar etmək.

Mənim adım Həsəndi,
Mənzilim Başçiləndi,
Fələyə bel bağlama
Fələk zəncir kəsəndi (33, s.54).
Bilsəydim vəfan budur,
Sənə bel bağlamazdım (33).
Canana can dedim, uzağa düşdüm,
Dosta bel bağladım, tuzağa düşdüm ( 7, s.75).
Sevdasına bel bağlamış, həm göz qarartmış bəndinə (225, s.53).
Heç kimsəylə yola getmirsə bir kəs,
Ona bel bağlayıb bir iş görülməz (Nizami).
Gəl köçmə vətəndən, yada bel bağlama qardaş,
Dövran belə getməz ( Sahir).
İşim düşdü divana, axır gəldim mən cana.
Heç vaxt bel bağlama, bir ilana, bir xana (38, səh. 142).

**Belə alışıb yansan, tez kül olarsan** - çox hissiyyatlı, həssas adamlar tez ruhdan düşər

**Belə gəldi, belə getdi** - tərif etmək, bəhanə gətirmək.

Belə gəldi, belə getdi demə çox, dur qaç gəl (223, səh 148).

**Belə ki Xanbacım çezir, çətin ki tuman dözə** - belə böyük, yalançı iddiaların qarşısında bu adamla ayaqlaşmaq, yola getmək çətindir.





**Belə malın var apar Cəfərabad bazarına** - Səfəvilər zamanında Qəzvində böyük türklər burada böyük saraylar, ticarət üçün bazarlar, hücrələr bina edirlər. Cəfərabad həmin ticarət mərkəzinin adıdır. Malı çox tərifləyəndə, baha verəndə belə deyərlər.

Belə malın var apar Cəfərabad bazarına (20, s.112).

**Belə övladı çay aşağı axıdım, çay yuxarı axtarım** - fərsiz, şuluq, bacarıqsız.

**Belə ürəklisən - get topçu ol** - bir balaca səsdən diksinən. Bir balaca səsdən əl-ayağını itirən adama işarədir.

**Belinə palan basmaq** - aldatmaq, qoltuqlarına qarpız vermək, başına börk qoymaq.

Hey palan basdı şairin belinə,
Qıymadı yüz tümən qoya əlinə (168, s.518).

**Belibağlı olmaq** -yəni arxayın olmaq.

Son sarıdan belim bağlı olsaydı, bəlkə də söz tutardı dilim (142, səh. 58).

**Beli bükülmək** – yaman günə düşmək, qocalmaq.

Özünü əskik sayan, görübsən harda,
Elin dilin kəsən, beli bükülər.

**Beli sınmaq** - böyük zərbə almaq. Hər şeyini əldən vermək.

Xəstə düşdüm, indi belim qırıldı,
Qürbətdə bir xəstə gördüm deyərsiz (35, s.529).
Baydaqları bürc üstündə qurdular,
Tifil uşaqları hamı qırdılar,
O zaman ki, Cavad xanı vurdular,
Sanasan qırıldı beli Gəncənin (Arazoğlu).

1804-cü ildə ruslarla Gəncə xanı Cavad xanın döyüşü nəticəsində Cavad xan və oğlu şəhid oldu. Şer bu münasibətlə deyilib.

**Beş barmağı kimi tanımaq** – yaxşı tanımaq.

Dorə Düzov həyatı beş barmağı kimi bilirdi desək düz olmaz (9 ,s.27).

**Beş barmağın beşi də bir deyil** - adətən bir ailədə olan uşaqlar barəsində deyilir, onların xarakterindəki, dünyagörüşündəki fərqlər nəzərə alınır. Yəni dörd divarın arasında böyüyən bacı-qardaşın hərəsi bir cür xasiyyətli olur.

**Beş barmağını bal elə, sox boğazına, yenə da bilməz.** - nankor, yaxşılıq bilməyən.

**Beş eşşəkli xoca kimi** - qayğısız, rahat.

İndi, belə beşeşşəkli xoca kimi qəşəng, qıçımı qıçlarımın üstündən aşırıb behiştdə kef edərdim (129, c.I, s.256).

**Beş barmaq boyunda** - ən kiçik və körpə uşağın rəmzidir.

Deyirəm ki, məsləhətinə qurban olum, bu məsum uşağı niyə dünyaya gətirdin və apardın. Beş barmaq boyundan həmişə təklik və bədbəxtlik çəkdi (115, № 1, s.56).

**Beşə altı çıxartmaq** - birinə qalib gəlmək, öhdəsindən gəlmək.

Vay o gündən ki, o da altı çıxarda beşimə (Haşım Tərlan, s.30).

**Beş günlük dünya** - dünya qısadır.

Dünya evinin səltənəti beş gün imiş çün,
Bünyadını yıx, ərkimi zirü-zəbər eylə (225, s.57).

**Bu dünya beş gündü beşi də qara** – heç xoş gün görməyən adamların fikridir.

Bu dünya beş gündü, beşi də qara,
Pərişan zülfünü sübhdən dara,
Çıx sinəm üstünə quşlarcan əzəl
Havada quşları dindirən gözəl... S.Vurğun

**Beş özündən deyəndə, on beş bizdən de** – bir özünü tərifləyəndə beş bizi təriflə.

Qoy indi beş özündən deyəndə on beş də bizdən desin (174, s.137).

**Beş şahılıq eşşəyin üç şahılıq qoduğu olar** - uşağın şəxsiyyəti valideynlərin təsiri altında formalaşır.

**Beş vədə yeyənlər** - riyakar dinçilər, bir kimsəyə yardım etməyən.

Özü qurd, amma qoyun paltarı xəlq içrə geyənlər,





Qonşusu ac yatıban beş vədə yeyənlər.
Sonra göz dağı verənlər (113, s.52).

**Beton divara dəymişik** - keçilməyən bir maneə ilə üzləşmişik. Hazırda İslam Cümhuriyyəti haqqında İranda belə deyirlər.

**Beyində fırlanmaq** - gecə-gündüz bir şeyin fikrində olmaq.

Yenə də deyirəm ki, belə bir təklif, Heydər Əliyev adı ilə bağlı ədəbiyyata, mədəniyyətə yardım üçün bir fond açmaq üç-dörd ildir meydana gəlibdir, bu mənim də beynimdə fırlanır (52, s.59).

**Beyni dumanlanmaq** – əsəbləri pozulmaq.

Dumanlanan beynində indi bundan başqa bir fikir yoxdu (144, s.93).

**Beyni qandır** - gözü qızıb, əsəbidir, dəliqanlıdır.

Divanə kimi qızıbdır eynim,
Qan ilə məgər dolubdur məgər? (Şükuhi).

**Beyninə batmaq** - bir şeyi qəbul etmək.

Bu axmaq söz padşahın beyninə batdı (46, s.31).

**Beyninə batmamaq** - bir sözü qəbul edə bilməmək.

Bilmirəm aya nədəndir girmir söz beyninə,
Başıvı sal aşağı, fikrivi gey əyninə (300, s.73).

**Beynini doldurmaq** - yoldan çıxartmaq, birinə bir fikri təbliğ etməklə inandırmaq.

Ondan ötrü ki, şeyx Nəsrullah sizə tələ qurmaqdan ötrü beyninizi doldurub ki, ölüləri dirildə bilər (195, c.II, s.51).

**Beynini gəmirmək** – bir fikirdən çox narahat olmaq.

Gəmirir beynimi min dürlü xəyal,
Qaradır gördüyüm əlvan əşya (75, IV, s.93).

**Beynini qarğa aparmış** – ağılsız, düşüncəsiz.

Əhsən, əhsən a kişilər, bəzi beyinlərini qarğa aparmışlar deyirlər ki, yüz arvadın ağlı bir serçənin ağlından azdır (46, s.213).

**Beyinin qaralması** – bir şeyi çox fikirləşməkdən başın ağrıması.

Bəs fikr elədim qaraldı beynim,
Yandım bu qızın əlində neynim? (345, s.24).

**Beyninin qurdu tərpənmək** – dəliliyi tutmaq.

Birisi də necə deyərlər, beyninin qurdu gülüş məclisində tərpənir. Elə söz deyir ki, gülüşlər quruyub dodaqlara yapışır, gözdən yaş şoralanır, yasa batırsan (109, s.350).

**Bezin qırağın çəkmək** - ölmək.

Mən quyunu əmələ gətirincə Minnət qarı bezin qırağını çəkəcək (84, s.174).

**Bəd ayaq** – çətin gün.

İnsan bəd ayaqda hər şeyi anlar,
Qılınc kəsə bilir bəzən qında da (328, s.335).

**Bənd-bərələrdən** - hər bacadan, mümkün olan hər yerdən.

Qəm sel tək aşıb- daşdı bütün bənd-bərələrdən,
Saldı bahalıq aləmə tufan, şəbi -çillə (168, s.22).

**Bəd əz xərabeyi Bəsrə** - hicri qərninin birinci yarısında müsəlmanlar İraqı ələ keçirib orada hərbi əhəmiyyətli üç mühüm şəhər - Bəsrə, Kufə və Vasit düzəltdilər. Bəsrə "qara daş" mənasındadır. Hicrətdən 17 il sonra Ömər ibn Xəttabın əmri ilə düzəldilmişdi. 36 hicridə Cəməl savaşı başladı. Bu döyüşdə Zübeyr və Təlhə öldü, Həzrət Əli qalib gəldi. Abbasi xəlifələri zamanında da savaşlarda Bəsrə çox viran oldu. 257 hicridə də özünün Əlinin nəslindən olduğunu bildirən bir nəfərin rəhbərliyi ilə başlanan savaşda sərbazlar üç gün şəhəri qarət edib onu xaraba qoydular. 311 hicridə də qərmətilər baş qaldırıb 17 gün Bəsrədə qan töküb qarət etdilər.

Deyilənlərə görə, zəngilərin zamanında Əli ibn Məhəmməd Ələvinin ətrafına yığışanlar da Bəsrəni torpaqla bir elədilər. Amma bunlar sonra peşiman olub özlərini rahatsız göstərirdilər. Ona görə bu deyim meydana gəlib dillərə düşdü.

Gəliblər bir parə noxət uşaqlar ərsə,
Verirlər qır mənə, bəd əz xərabeyi Bəsrə (250).

**Bəhanə qutusu** - dəxli olmayan bir şeyi səbəb kimi gətirmək.





**Bəh-bəhinən plov olmaz - yağilən düyü gərək** - boş sözlərlə məqsədə nail olmaq olmaz, iş görmək lazımdır.

**Bəxt aynası** - ən təmiz güzgü, real surətdə əks etdirən təmiz ürək. Toyda gəlinin qarşısında tutulan güzgü.

Bəxt aynası tək sil ürəgindən kədəri,
Ta sədaqət baxışından coşa meyxanə kimi (113, s.40).

**Bəxti çəmbər** - şanssız, talesiz, bəxtsiz. Çənbər uzun, ağ təhər xiyara deyilir. Bəxtsiz, taleyi gətirməyən.

Nə evdə dilxoşam mən bəxti çənbər,
Nə bazaridə, Allahü-əkbər! (115, №1, s.19).

**Bəxti dönmüş** – qara baxt.

Sən bəxti dönmüş, mən halı-pərişan,
Ruzun göz yaşıdır, ruzim isə qan (80, c.II, s.273).

**Bəxtimiz oğlan imiş** – bəxti gətirmək.

Oğlumuz ay Xansənəm, bir yekə pəlvan imiş,
Bəxtəvər olsun başın, bəxtimiz oğlan imiş (267, s.126).

**Bəxtin yar olması** – işləri gətirmək.

Bəxtin mənim öz yarıma yar olsa, nə dərdim,
Söylərdim o vaxt, könlümün öz güzgüsüyəm mən (328, s.74).

**Bəxti yatmaq** –uğursuzluq.

Dilbərin dilbər gözü tək gör necə bəxtim yatıb,
Yarımın bəxti oyaqdır, çeşmi-bidarım kimi (345, s.87).

**Bəlalı baş** -başından qəzavü- qədər əskik olmamaq.

**Bəlbəşurluq** -Rusiyada çarizmlə mübarizə edən partiya iki hissəyə bölünüb biri bolşevizm, biri menşevizim adlanır. Bolşevizmə bəlbəşurluq deyilir. Mənası hərc-mərclik, qanunsuzluq anlamına gəlir.

Eşitdiyimə görə, mürtəcelər bizi bolşevik adlandırmaqla müttəhim etmək istəyirlər. Bolşevizm ingiltərə imperializminin Şərqdən ixracını tələb edirsə, əgər bolşeviklik məzlum Şərqi azad edəcəksə, birinci bolşevik də mənəm ("Kommunist" qəzeti, 1924).

**Bəlbəşurluq salmaq** -qarışıqlıq salmaq.

And olsun Bakı möhtəkirləri, Tiflis restorançıları, Gəncə tacirləri, Qarabağ bəyləri, Lənkəran millətçiləri, Səlyan ambardarlarının təqib etdikləri məsləki-millətpərvəranə və əqideyi-vətənpərəstanəyə ki, bolşevizmi yer üzündən götürəcək.. hələ bu başlanğıcıdır (141, 1919, №52).

**Bənayın** -ölünün üstünə qoyulan böyük, saf daş. Qanı soyuq və qanmaz adama deyərlər.

**Bənd-bərəni axtarmaq** -hər yeri axtarmaq.

Gəzdim Əhrabun bəndin-bərəsin,
Atam evini tapa bilmədim (277, s.14).

**Bəndi, bərəni bağlamaq** -ölkənin həssas yerləri.

Səttarxan geyib qərəni,
Bağlayıb bəndi, bərəni,
Bərəkallah, qallac oğlan,
Məşrutəyə fərrac oğlan!

Unutmayın Təbriz, Göyçə, Dərbəndi,
Birlik olsun qoy arzumuz, kamımız.
Bərk bağlayın hər bərəni, hər bəndi,
Lazım gəlsə, şəhid olaq hamımız (274, s.39)

**Bəndə vurmaq** -əsir tutmaq, dilimizdən bəndə düşmək.

Daim yaşayış oldu bizə bir qara dustaq,
Əl - qol yerinə bəndə vurulduq yerimizdən ( Savalan).

**Bəndi suya vermək, gönü suya vermək** - xəta etmək, iş-işdən keçmək.

**Bərat oldu** -işlər düzəldi, çətinliklər aradan qalxdı, gələcəyin uğurlu olması mənə əyan oldu.

Dur ki, düyün açıldı, bərat oldu, həvalə gəldi o canano (223, s.54).

**Bərəni suya vermək** - səhv etmək, məsuliyyəti hiss etməyib zərər görmək.

Birinin ki, suya getdi bərəsi,
Qarışar bir-birinə ağ -qarası (168, s.776).

**Bərkdə boşda – çətinlik və xoş gün.**

Qonaq gedəm uzaq elə, obaya,





Ellər məni bərkdə- boşda sınaya (273, s.9).

**Bərkə-boşa düşmək** – çətinliyə düşmək və xoş gün.

Ancaq hələ tezdir, dava-dalaş görməyib, bərkə-boşa düşməyib (174, s.55).

**Bərkiməmiş qatıq** -nəzərdə tutulan kimi olmayan hal.

Azərbaycanda bir məsəl var, deyir, bərkiməmiş qatıq, qatıq çalanda bir var ki, gərək o tutsun, bir də vardı ki, bərkisin (52, s.57).

**Bər qəba, bəndər qəba** -iynə salmağa yer olmayan, adamların çox gur olduğu yer.

**Bəy balası kimi dolanmaq** -əli-ayağı quru, ürəyi istəyən kimi ömür sürmək.

Get mollalığa, bəy balası kimi dolan, Allahnan da işin yoxdur, inanırsan inan, inanmırsan inanma (84, s.117).

**Bəy durmaq** - bir yerdə tərpənmədən durmaq.

Hey soyuqdan quruyub bəy dururam,
Kimdi yengə, müşata, bilməyirəm (306, s.111).

**-Bəyəm bizim pulumuzun sikkəsini Ömər vurmuş? Və ya bəyəm bizim pulumuzun şiri qancıqdır** – mənim pulum pul deyil, adicə kağızdırmı?

**Bəyəm dəyirman içində idin?** - niyə dünyadan bixəbərsən?

**Bəy ilə bostan əkənin tağı çiynində bitər** - bəylərin, hakimlərin ədalətsizliyinə, haqsızlığına işarədir.

El deyib ki, bostan əkmə bəy ilən,
Yalan olmur el adından deyilən (328, s.89).

**Bəy verən atın dişini saymazlar** -hədiyyənin yaxşı-pisinə baxmazlar.

**Bıcaq bəndə dayanıb** -can boğaza yığılıb, səbr qurtarıb.

Dağ olsa da səbrim, bütün talandı,
Ürək susdu, bıçaq bəndə dayandı (349, s.82).

Ağayi-siqqətül islam və möhtərəm ağalar! Mən firqəmiz tərəfindən çox iftixar edirəm ki, bışaq bəndə dayanan gün siz bizi bu məclisə dəvət etmisiz (30, 1945, №66-69).

Dayanıbdır bəndə bıçaq, yorulmuşam, gedəmmirəm (224, s.10).

Nə üçün bu qədər öz həyatınıza bağlanmışsınız. Bayrağı qaldırın, kütlə sizin arxanızca gələcək. Bıçaq sümüyə çatıbdır (248, s.504).

**Bıçaq intizarında olan qoyun kimi** - ölümünü gözləyən, əlindən bir iş gəlməyən adam.

Bıçaq intizarında duran qoyun kimi gözlərimi döyürəm (234, s.493).

**Bıçaq olmaq** – düşmən olmaq.

Xalxı xalx aldadır, yad tora salır,
Mənə özümünkü bıçaq olubdu (294, s.47).

**Bıçaq sümüyə keçib** – can boğaza yığılıb.

Bıçaq keçib sümüyə, bir nəfər soruşmaz ki,
Hüdudu yoxmu bəlanın, bu nə zəlalətdir (80, c.II, s. 211).

**Bıçaq vursan, qanı çıxmaz** -çox əsəbi olmaq.

**Bığaltı qımışmaq** -- birinə məsxərə etmək.

Pis yaşamırdı deyəsən
Bığaltı qımışırdı (260, s.116).

**Bığ altından gülmək** -gülümsünmək, birinə məsxərə etmək, təhqirlə gülmək.

Ümumiyyətlə, belə gülməyi düşmənə və düşmənin baltasına sap olan adamlara nisbət verirlər.

Əgər milli varlığı talan olan millətin aydınları birləşmək yerinə şəxsi mənafeləri əsasında pərən-pərən olub və ya başqa dövlətlərin quyruğu olsalar, onda bu deyimi işlədirlər. Bu iş bais oldu, düşmən bizə bığ altından gülsün.

**Bığ burmaq** -zor demək.

Kim qaldı ki, bizə bığın burmadı.
Atdan altdan bizə kələk qurmadı (306, s.56).

**Bığı bəy** -bir vaxt SSRİ-yə başçılıq etmiş İ V.Stalinə el arasında belə deyilirmiş.

Güneydə oturub - durmağını bacarmayan adamlara deyilir.

Get xidmət elə, qoy bığı bəy yaxşı kökəlsin,
Versin tüməni bir qrana, adı yekəlsin (168, s.80).





**Bığı burma** -cavan, sağlam, güclü, naməhrəmə də deyilir.

Burnun gözümü dəldi, çəkil burda oturma,
Atmışdı səsin başa vəli bir bığı burma (168, s.254).

Xan çobanı, adı Nəbati, özü bir üzü qırxıq, bığı burma imiş (223, s.64).

**Bığı burmaq** -dayanmaq, sinə gərmək.

Mənim atam ölən zaman düşmənlərin qabağında bığlarını bur, deyibdir (299)

**Bığı qırxıq** -Dinsiz, dovranın hakim dini ənənələrinə qarşı çıxan adam

Keçmişdə mövhumatların və mürtəcelərin artistlərə verdiyi təhqiramiz ləqəb (Azərbaycan dilinin izahlı lüğəti).

**Bığın altına çəkmək** -təhqir, ələ salmaq.

Gəlmişdi gecə şairi Əzrayıl aparsın,
Çəkdim bığının altına, əl çəkdi sovuşdu (338, s.90).

**Bığının altından keçmək** -rüşvət vermək.

- Onları necə görmək olar, bığlarının altından necə keçmək olar? (253, s.111).

**Bığlarını oynatmaq** -təkəbbür göstərmək.

Serçə çalağanla barışa, eyləmə bavor,
Çox bığların oynatma get, ey mürtədü-kafər (168, s.873).

**Bığ yağı almaq** -rüşvət almaq, haqsız yerə pul almaq.

Aldı bığ yağı axırda, paşa pasaportu verdi,
Yolladıq Təbrizə, qol çəkdi iki şahbəndər (301, s.58).

**Bığ yerləri təzəcə tərləmək** -təzə cavan olmaq, yeniyetməlik yaşına, həddi- büluğa çatmaq.

Olanda Kərimxani giti -füruz
Dəgildir mənim bığ yerim tər hənuz (M.M.Şükuhi).

Bığ yerləri təzəcə cücərən, səsləri yenicə dəyişib kallaşan bu uşaqlardan ilk eşq macərasına qoşulanlardan birincisi də elə Valeh oldu (110).

Bir nazlı xanıma çevrilən kimi,
Bir gözəl qız ölür mənim balam.
Bığ yeri tərləyən kimi,
Bir dəcəl uşaq ölür, mənim balam (260, s.151).

**Bibər də kiçikdir, amma yandırar** - adi, kiçik bir adamın sözü də adamı yandırar.

**Bicəllağı** - dələduz, çox şuluq.

**Bic toxum** -dini baxışla atası bəlli olmayan.

Yaxşı insanların arasına bic toxum kimi düşmüş tək-tükləri, düyünlü kötükləri, azmanazları deyirdik ( "Qızılgül olmayaydı").

**Bildirçinin bəyliyi darı sovuluncadı** -yəni bu imkan müvəqqətidir, adam gərək müvəqqəti imkana arxalanıb hörmətini itirməyə.

Bildirçinin bəyliyi darı sovuluncadır (129, c.1, s.419).

**Bildiyin qədər çəkəsən** - qarğışdır, çox hiyləgər, ara vuran, oxu atıb yayını gizlədən adamlar haqqında işlənir.

**Bilirəm nə yuvanın quşusan** -mənfi mənada işlənir, yəni səni yaxşı tanıyıram..

**Bilmir harda bişir, harda düşür** - müftəxor, məsuliyyətsiz, ailənin necə yaşamasından xəbəri olmayan.

**Bir ağız oxumaq** – bir mahnı oxumaq.

Aşıq, gəl bizim üçün bir ağız oxu (35, s.489).

**Bir aləm kef etmək** - yəni çoxlu kefdə olmaq, ləzzət aparmaq.

Yarnan soruşdum gül ayağından

Bir aləm kef edim, mey dodağından (261, səh. 321).

**Bir arxa su gəlsə, güman var yenə gələ** -naümid olmamaq.

**Bir atımlıq barıtı var** - bir atım qədim tüfənglləri doldurmaq üçün yetərli miqdardır. Hay- küyünə baxmayaraq tez hirsi soyuyan

**Bir barmaq qatıqdan ötrü tuluğun götünü yırtmaq** - tamahkar, öz mənafeyini nəzərdə tutaraq ümumi işlərə ziyan vuran.

**Br barmaq** -kiçik, azyaşlı.

**Bir barmaq kağız** -məktub.

Münəvvər- Oğul, bəs adam deməz ki, evinizə bir barmaq kağız yazın (77, s.16).





**Bir başı, min oynaşı olmaq** -əlində min dənə qarpız tutan, hər işə baş qoşan.

**Bir başı var, min bir sevdası** - problemi çox olmaq.

Ey Nəsimi, xubların bir başı vardır, min dili,

Eşq ilə bel bağlama, bu əhdü- peymansızlara (225, Səh. 48).

**Bir bezin qırağı** - eyni cür.

Bir bezin qırağısınız hamınız. Çobana bax, adı çobandı onun özü demoqoqdu (84, s.366).

**Bir budağa çıxıb, min budağı silkələmə** - biri ilə sözün olub, hamını pisləmə.

**Bir can deyib min can eşitmək** - çox mehriban olmaq.

Özü mehriban idi, bir can deyırdin, min can eşidərdin (203).

**Bircə de, tərcə de** - təzə bir söz danış, təsiredici söz de.

**Bircə daban süzmək** -bir dövrə oynayıb çıxmaq.

Qardaşımın toyunda bircə daban süzəydim ("Kələybər", s.18).

**Bir çeynəm saqqızın var -çeynə yaspışdır alnına-** bu pis işivi və ya elin, ailənin abrını aparan sözü hamıya bildirmə.

**Bir çiçəklə bahar olmaz** - Azərbaycan xalqının xoşbəxtliyi üçün neft və ya geopolitik mövqeyyəti bəs deyil. Gərək bütün millətdə milli şüur inkişaf tapa.

**Bir çimdik/ çeynəm saqqız** - kiçik bir səhvi böyük bir rüsvayçılığa çevirmə.

**Bir çolaq qurd gecədə əlli ərxəş dolanı** - bir igid adam nə qədər işi ağıra düşsə də yenə nicat yolu tapar.

**Bir çörək ye, birini Allah yolunda ver** - sevin, şükür elə.

Solmaz bir əppək yesin, birini də Allah yolu versin ki, sənin təki oğlan onu istəyir (84, s.201).

**Bir dana bir naxırın adını batırar** - bir millətdən, bir nəsildən bir nəfər naxələf adam çıxırsa, o həmin millət, nəsil, ailə üçün ləkəyə çevrilir.

**Bir daş altda, bir daş üstdə** - gördüyünü heç kimə demə.

Sən bu "Quran", bir daş alda, bir daş üstdə, kimsə eşitməsin (1, s.168).

**Bir dəli quyuya daş atdı, 40 ağıllı çıxarda bilmədi** - cahil bir adamın gördüyü iş eli, milləti çıxılmaz vəziyyətə salar.

Qabağa salsan naşını,
Döydürər öz yoldaşını.

**Bir dəri, bir sümük** - çox arıq, cansız, cılız. Qarabağda belə adamlara "ağac ayaq" da deyirlər.

Nərbala gözaltı anasına baxıb gördü ki, arvad qocalıb, arıqlayıb, bir dəri, bir sümük qalıb (148, s.86).

Birisi kök, deyərsən pərvəridir,
Birisi bir sümükdür, bir dəridir (147, səh.15).

**Bir dodaq gülmək** - gülümsəmək.

Qəm yemə ki, bizimkidir gələcək,
Bir dodaq gül, bəlkə hicran usana (215, səh. 31).

**Bir eşşəyə minib, əllisin döyəşdəmə** - öz sözünü danış.

Sən öz sözünü danış, bir eşşəyi minib əllisini döyəşləmə (72, c.III, s.82).

**Bir əldə iki qarpız tutmaq** - eyni vaxtda imkan olmadan iki iş görmək.

Əzizinəm atmaram,
Yarı yada satmaram,
Bir əldə iki qarpız,
Tutmamışam, tutmaram (39, s.672).

**Bir əlin nəsi var, iki əlin səsi** -qüvvət birlikdədir.

**Birənin qanını aldın, ya canını aldın** – birinin əlindəki hər imkanı alandan sonra öldürsən yaxşıdır.

- Elə beləcə mən deyən kimi, birənin qanını aldınmı, canını aldın ( 253, s.264).

**Bir ət, bir piti** -Azərbaycanda ət, piti, bozbaş bir milli yeməyin adıdır. Deyim o satıcıların haqqında işlənir ki, satdığı şeyləri ikiqat hesablayır.

**Birgözlülər ölkəsi -Bir gözlülər şəhrindən gəlməmişik ki...** - biz bu yerə, buranın qanununa tanışıq.

Yer altında bir ölkə var, birgözlülər ölkəsidir.





Gündüzümüz birgözlünün gecəsidir (284, s.498).

**Bir gözü çaya, bir gözü aya baxmaq** - bir niyyətin arxasınca getməyən.

**Bir güllə ilə iki nişan vurmaq** - bir neçə niyyəti, arzunu bir dəfəyə ələ gətirmək.

Məhəmmədrza atasının quldurluqla sahib olduğu barlı bərəkətli torpaqları "islahat ərzi" adı ilə satıb milyardlarla dolları xarici banklara keçirdi. O, həm millətin boynuna minnət qoydu və həm saysız - hesabsız kəndləri satıb nəqd etdi. Bir güllə ilə iki nişan almış oldu.

**Bir həsir, bir Məmmədnəsir** -çox kasıb, subay.

O nədir ki, bir həsirdir, dörc divar,
O nədir ki, bir qapıdır, bir açar (72, c.III, s.319).

**Bir xızan** – çoxlu.

Hərəmxanada bir xızan gözəl var, hamısını padşah zorla gətirib (46, s.155).

**Bir xoruza yük eləmək** -müflis eləmək.

Gəlmişəm görüm səni də bir xoruza yükləyə bilərəmmi? (129, I, s.61).

**Bir- birinə gülər ki, top saqqalı olsun** - keçən zamanlarda saqallı adam dünyagörmüş adam sayılırdı. Sənin ki təcrübən yoxdu, başqalarını niyə bəyənmirsən?

**Biri körpü tapmır keçə, biri su tapmır içə** - biri çox zəngin, biri kasıb yaşayır.

Biri körpü tapmır keçə, biri su tapmır içə (103, s.73).

**Birinə könül vermək** – birini sevmək, birinə vurulmaq.

İncik olub ulusundan, elindən,
Ənkəbud tək can asılır telindən (Aşıq Ələskər).

**Birinin ağzını bərkidirsən, o birisinin ağzı yarpaq dolması istəyir** -sözə diqqət etməyən, məsləhətə qulaq asmayan.

**Birinin başmaqlarını cütləmək** -evdən qovmaq.

Anam gündə bizə gəlib başqa qonşulardan söz dolandıran qonşumuzun başmaqlarını cütləyib, birdəfəlik evdən qovdu.

**Birinin ətəyinə çörək qoymaq** -birini xataya salmaq, yaman günə qoymaq.

**Birinin üzünə ağ olmaq** – üzünə durmaq, hörmətsizlik eləmək.

Var idi xalqın arasında küdurətlə nifaq,
Cümləsi olmuş idi bir birinin üzünə ağ ( S.Mümtaz).

**Biri ölməsə, biri dirilməz** -birinin məhvi, vəzifədən getməsi, müflisləşməsi başqasının dirçəlməsinə, yüksəlməsinə səbəb olur.

Necə deyər, "biri ölməsə, biri dirilməz" kimi bir şey olmuşdu ( 253, s.318).

**Bir işdə barmağı olmaq** – iştirakı olmaq.

Mən bilirəm, bu kimin işidir, bilirəm kimin barmağı var burda (9, s.112).

**Biri üçün ip toxumaq** -birinin ölümünə nəqşə çəkmək, birinə quyu qazmaq.

**Bir iynə ucu** -ən az, lap az.

Bir iynə uzunca, bir ləhzə heç zad düşünmürsən (203, s.10).

**Bir kitab/ bir "Quran" söz danışmaq** – bir sözü çox təkrar etmək, çox öyüd-nəsihət vermək.

Alə, Həmid bayaqdan səninlə bir kitab söz danışmışıq, işə bir bax (1, s.67).

**Bir könüldən min könülə aşiq olmaq** –vurulmaq.

Görcək yüzünü min canü-dildən
Güləfrux sevdi anı min könüldən ( "Əhməd Hərami dastanı").

**Bir köynək yaxın olmaq** - başqalarına nisbətən yaxın münasibətdə olmaq.

**Bir qalaq, bir "Quran" yalan demək** - çox böyük, həddindən artıq yalan söyləmək.

Hər səfər bir qalaq yalan gətirər,
Kim alar bağban, çoban, rəncbər... (301).

**Bir qana min qan etmək** -intiqam, qisas almaq.

Qarı düşmənlərdən qisas almağa,
And içib bir qana min qan demişəm (77, s.33).

**Bir qapılı yer** -çıxış yeri olmayan bir bina, dustaqxana.

Oğul, çalış birqapılı evə getmə ( El deyimi).

**Bir qaşıq qanından qorxmaq** - düşmənə boyun əymək, şərəfli ölümdən qorxmaq.

Rahi- müsibətdə keçmişəm candan,
Müxənnətdir qorxan bir qaşıq qandan ( Q.Zakir, s.126).

Bir qaşıq qanından qorxub niyə belə ah çəkirsən? (174, s.18).

**Bir qrana güllə atmaq** - çox kasıb olmaq.

**Birlik harda var, orda dirlik var** - bir hədəf üçün hamının əlbir olması gərəkdir.

Qurut göz yaşın, Kərkük,
Altundur daşın, Kərkük,
Birləş qardaşlarınla,
Yüksələr başın Kərkük. .....

**Bir mıx bir nalı, bir nal bir atı, bir at bir iyidi, bir iyid də bir eli saxlar** – hər şeyin yaxşı olması üçün vacib şeylər var.

Bir mıx bir nalı, bir nal bir atı, bir at bir iyidi, bir iyid də bir eli saxlar (103, s.68).

**Bir naxır** - çox uşaqlı ailə, ədəbsiz və uşaqları tərbiyəsiz ailə haqqında işlənir.

**Biro- biro zamanı idi** - qoluzorluların zamanı idi, sözü keçən zaman.

**Bir oğlan adını bir qıza qoymaq** - qızı bir oğlana nişanlamaq.

**Bir oxla iki dovşan vurmaq** – iki istəyi birdən ələ gətirmək istəmək.

Demək, bir oxla iki dovşan vurmaq olar! (253, s.335).

**Bir panabada dəyməz** - dəyərsiz, pis adam.

"Panabad" Pənahabad kəlməsinin təhrif edilmişidir. Bu gün erməni işğalçılarının əlində olan Şuşanın Pənahəli xan tərəfindən əsası qoyulmuş, şəhər onun şərəfinə Pənahabad adlandırılmışdı. O zaman İran pulu ilə on şahı dəyəri olan "Pənahabad" adlı bir gümüş sikkə vurdurmuşdu ki, onun adı indi

on şahının üstündə qalıbdır və el arasında təhrif edilərək panabad şəklində işlənirdi.

**Bir sapda duran balta deyil** - dinc duran, sözünün üstündə duran deyil, tez-tez simasını dəyişən.

**Bir səkkə ilə iki aşıq vurmaq** – "bir güllə ilə iki quş vurmaq" deyimi ilə eyni anlamdadır. Uzaqgörənliklə iki məqsədə eyni zamanda çatmağa cəhd etmək.

**Bir sicilləmə söz demək** - uzun-uzun danışmaq.

**Bir soğana baş kəsən** -ən kiçik şəxsi mənfəətindən ötrü baş kəsməyə hazır olmaq.

**Bir söz deyəndə körpü qalır suyun o tayında** - haqq sözə etiraz etmək, boyun əyməmək.

**Bir söz deyərəm, dəymişin dura-dura kalın tökülər** – elə söz deyərəm utanarsan, rüsvay olarsan.

Bir gəliş gələrəm anlamaz dosta,
Dəyməmiş tökülər kalı, Məhəmməd! (A. əl, s.70).

**Bir sözünü iki eləməmək** – hər sözü ilə razılaşmaq.

Balaxanımla çaldı, daha Bağır boyda kişinin sözünü iki eləməyəcəklər ki..(9, s.165).

Nigarın dəlilər arasında o qədər hörməti var idi ki, bir sözünü iki eləməzdilər (174, s.127).

**Bir suyu ona oxşayır** - bəzi oxşarlığı var.

**Bir şahını bəyənməyən abbası çıxardar** – azı bəyənməyən çox çıxardar.

Bir şahını bəyənməyən abbası çıxardar, əlindən gəlirsə, irəli dur (84, s.180).

**Bir şahiya güllə atmaq** - Hər bir qran 20 şahı və hər şahı 50 bisti olardı. Şahı kiçik pul vahidi sayıldığına görə bu deyim ən kasıb, yoxsul adamlar haqqında işlənir.

**Bir şer deyib qafiyəsində qalmaq** - bir işi başlamaq yox, onu sona çatdırmaq mühümdür.

Miri adlı bir nəfər eşidir ki, şərab içməklə şer yazmaq olar. Bir şüşə şərab içdikdən sonra kağızın üzərində yazır: dünya fəxr eləyir öz Pirisiylə.





Nə qədər şərab içsə də, qafiyənin ardını tapa bilmir və sərxoş vəziyyətdə uzanıb yatır. Gəlib oğlunu bu vəziyyətdə görən atası əhvalatı öyrənir və vərəqdə həmin qafiyənin ardınca yazır: "Miri qələt eləyir həm ölüsü, həm dirisiynən".

**Bir teldən asılı qalmaq** - həyatı heç nəyə bağlı olmamaq, son ümid.

**Bir telə bağlı olmaq** - heçə bənd olmaq.

Qorxuruq küləkdən, qorxuruq yeldən
Ruzimiz asılmış incə bir teldən (M.S.Ordubadi).

**Bir tərəfin boş burax** – çox israr etmə, bir az göz ört.

-Bir tərəfini boş burax, Ramizi bir də çağır danla (1, s.351).

**Bir üskük** - çox kiçik ölçü vahidi, lap kiçik.

Gəzirəm günlərin taxça- buxçasın,
Bir üskük sevinc yox, hər şey havadır ( Urmulu).

**Bir üzü qız, bir üzü gəlin** - lap təzə ərə getmiş gəlinə deyilir, tez dul qalan gəlin.

Bir üzü qız, bir üzü gəlin qalacaqsan bu damın altında (129, c.I, s.537).

**Bir yalançı dost min düşməndən qorxuludur** – dostun hiyləgərliyi düşməndən min dəfə təhlükəlidir.

Bir yalançı dost min düşməndən qorxuludur (37).

**Bir yastığa baş qoymaq** - ər -arvad olmaq, intim münasibətdə olmaq.

Sevişdiyim, bir yastığa baş qoyuban əmişdiyim (284, s.91).

**Bir yekə məbləğ pulu atdın çölə** - nahaq yerə pul xərcləmək, zərərə düşmək.

Xalq ox atır bir şahıya, tənbələ (168, s.17).

**Bir yeyib ayrı sıç...q** - həmişə bir yerdə olmaq.

**Bismillah** - başlanğıcda müsəlmanların dilə gətirdiyi söz- "Allahın adı ilə" deməkdir. Yemək başlananda "buyurun" mənasında işlənir. Təəccüb, qorxu əlaməti kimi də işlənir.

Bakıxanovun 1907-ci ildə "Füyuzat" məcmuəsinin 28-ci nömrəsində çap olunmuş "Bismillah" rədifli müxəmməsi heç

yerdə dini məfhum olmayıb, bəlkə "buyur", "iqdam et", "qədəm qoy" kimi mənaları ifadə etmişdir.

Durubdur ol büti-sərməst, tiği-abdar ilə,
Sözün gər doğrudur, ey aşiqi-biçarə, bismillah!

**Bismillah eləmək** – işə başlamaq, yeməyə əl uzatmaq.

Hələ heç kəs bismillah eləməmiş o, nimçəni boşaldıb qabağından o tərəfə itələdi (46, s.20).

**Bismillahsız toxum** - islami baxışa görə, müsəlman hər bir işdə, o cümlədən qadını ilə cinsi əlaqədə olan zaman "bismillah" deməlidir. Uşaqlar həddindən artıq dəcəl olduqda, bunun səbəbini anlamayan adamlar onu belə adlandırırlar.

**Bistini vurmaq** – Bisti qədim zamanlarda işlənən misdən pul vahididir. İki mənada işlənir. Kefim bistini vurur- hər şeyin yaxşı olması, bir də bu mənada işlənir ki, bistiyə güllə atır. Yəni kasıbdır, yoxsuldur.

Türk sülaləsindən olan Şah Səfinin qanununa görə İranda alış-veriş bisti, abbasi, altun ilə aparılırdı. Bu qanun əsasında xarici pullar xərclənmirdi. Bu sikkələrin üstündə "Lailəha illəlah, əliyyun vəliyüllah" və o biri tərəfində Şah Abbasın, Şah Səfinin adları basılırdı. Misdən olan bisti pulların üstündə yalnız pulun basıldığı şəhərin adı olurdu. Bəzilərinin haşiyəsində "Lailahə illəllah" da yazılırdı. "Zərbi fi Təbriz", "Zərbi fi Tiflis" və s.

**Bişincən gözləyən düşüncən də gözləyər** – ağır vəziyyətə dözən adam yenə də gözləyər.

Bişincən gözləyən düşüncən də gözləyər (103, s.67).

**Bişirmək** – birini yoldan çıxartmaq.

Dedim ay dadi-bidad, Balağa mənim qorxumdan yazıq Həmidi bişirib aradan çıxarıb ki öz meydanı gen olsun (1, s.169).

**Bişmiş toyuğun gülməyi gəlir** - yalan, inanılmaz sözlər danışan zaman işlənir.

Marağada rəisi-cümhur namizəd göstərmək 888 nömrəli xəfiyyə namindən ölü toyuğu güldürə bilən iftiralarla hətta Tehranın gözübağlı bitərəflərini iğfal etmək mümkün degildir (30, №12).





Elə şey soruşursan ki bişmiş toyuğun da gülməyi gəlir (118, c.II, s.197).

**Bit- billit** - heç dayanmadan danışan.

**Bitib-bərkimək** – möhkəmlənmək, qol-qanad.

Qaya torpaqda bitib bərkiyən kimi Teymur da atın belində bərkimişdi (144, s.98).

**Bitin götünə birə yazmaq** - özündən söz çıxatmaq, sözü böyütmək.

**Bitli cücə** - sısqa, ölümcül, dinməz uşaq.

**Bitməmiş yovşan dibindən doğulmamış dovşan axtarır** - duyğu aləmində yaşayan adam, dəryada balıq sovdası edən adam, xam xəyal edən. Atı almamış mıxın çalır.

Boş xəyallarla yaşayan adam.

**Bizdən yeylər** -bu deyim avam adamlar üçün cin deməkdir. Mövhumata görə, "cin" sözünü gecə dilə gətirmək onun görünməyinə səbəb olar. Buna görə də "cin" sözü yerinə "bizdən yeylər" deyirlər.

Bu sözü bir buna görə işlədirlər ki, cinlərin məhəbbətini qazanmaqla onların vurduğu ziyanın qarşısını alsınlar. Bir də bizdən yeylər deyimi partibazlıq olan ölkələrdə sözləri keçənlər üçün işlənir.

**Bizdə olmasa, heç kəsdə olmaz** – biri istədiyi şeyi başqasından ala bilmədikdə işlənir.

**Bizi bir də atamız əkməyəcək, anamız doğmayacaq** – biz bu dünyaya bir də gəlməyəcəyik.

Bizi bir də atamız əkməyəcək, anamız doğmayacaq (1, s.293).

**Bizim başımızda salmanilik öyrəşmə** -bizi ələ salma, oynatma, naşılığını başımızda yoxlama.

**Bizim halalımız ayrıdır** -həddindən artıq yaxınıq, hər sirrimiz birdi.

**Bizimki zəlzələdən, vəlvələdən keçib** – iş-işdən keçib.

Dünya yenə zəlzələdir,
Dünya yenə vəlvələdir (V.Püstəmzadə).

**Bizim pulun şiri qancıqdı?** -İranda türklərin basdığı əskinaslarda və dövlət bayrağında adətən şir rəsmi basılardı. Deyim həmin pulların dövriyyədə olduğu illərin yadigarıdır. Satıcı müştərilər arasında fərq qoyduqda, birinə satmaq istəmədikdə işlənir.

**Biz qail olduq qaza, qaz özün qoydu naza** - həddindən artıq naz edən adama deyilir. Əlacsızlıqdan adam bir zada razı olsa da qarşı tərəf bunu qəbul etmək istəmir.

**Bizləmək** - israr eləmək, bir sözü ara vermədən təkrar etmək, tələsdirmək, baş-beyinini aparmaq.

Tez üstünə düş, bəlkə bu günlərdə düzəlsin,
Get validəni bizlə, tez olsun başa çatsın (M.M.Etimad).

**Boğaza qədər borca girmək** - həddindən artıq borc altına girmək.

**Boğaza yığılmaq** – bıçaq bəndə dayanmaq, səbr kasasının dolması.

Qapıdan rədd eyləyib qoymaz o əsla içəri,
Yetiribdir boğaza, canımı bu zülmləri (80, c.II, s. 198).

**Boğazda qalmaq** - yemək zamanı acı bir xəbərdən, xoşagəlməz sözdən iştahanın küsməsi və ya birinin malını yemək istəyən adamın niyyətinin baş tutmaması.

**Boğazdan çıxartmaq** - haqsız yığılan var-dövləti soyğunçuların əlindən çıxardıb haqlılara çatdırmaq.

Məşrutiyyət zamanında xanlar, ərbablar belə fikir edirdilər ki, yoxsul insanların əlinin zəhmətini həmişə yemək olar. Heydər Əmoğlu Bakıdan gəlib onların boğazından çıxartdı.

**Boğazdan kəsmək** – yeməyindən kəsib başqa şeyə sərf etmək.

Heç kəs boğazından kəsib itə atmazdı (1, s.326).

**Boğazdan yuxarı** – ürəksiz, könülsüz danışmaq.

Sən mənə boğazdan yuxarı "yaşasın" deyən bu xalqın içərisində bir nəfər də olsa xoşbəxt olan adam göstərə bilərsənmi? (234, s.8).

**Boğazda tikan göyərmək** - danışmağa qadir olmamaq .





Sözümü kəsdi, amma danışa bilmədi, bir-birimizi qucaqladıq, boğazımızda tikan göyərmişdi (61, №1, s.98).

**Boğazı daşı dəlir** - hər nə versən yeyər.

**Boğazı qurumaq** – susuzluqdan, həyəcandan boğazın quruması.

Qorxudan hamının boğazı qurumuşdu (46, s.28).

**Boğazıma keçmək** – birinin boynuna düşmək.

Qorxuram bəla olub gələcəkdə keçsin mənim boğazıma (46, s.87).

**Boğazına saxlamaq** – ancaq yeməyini verib evində saxlamaq.

Qaçaq Nəbinin atası Alo kişi çox yoxsul bir adam idi, naəlac qalıb balaca uşaqlarını nökər vermişdi. Varlılar Alo kişinin uşaqlarını boğazına saxlayırdılar (30, №37, s.3).

**Boğazında başmaq tayı qalıb** – səsi tutulmaq.

Biqəm: deyəsən yazığın boğazında başmaq tayı qaldı (9, s.156).

**Boğazından yarlığını qoparmaq** – imkanlarını əlindən almaq.

Əgər Bahadır əmrə əməl etməsəydi, hökmdar onun boğazından yarlığını qoparıb varidatdan məhrum edə bilərdi (144, 92).

**Boğazın düyünlənməsi** - sirri, dərdi, milli varlığı müdafiə etmək arzusunu dilə gətirə bilməmək.

Dözülməz dərddən doldu o dövran ki qana gözlər
Boğazlarda düyünləndi ürəklərdə qalan sözlər (57).

**Boğazını cücə boğazı kimi üzmək** - öldürməklə hədələmək.

Şah sağ olsun, qolum qüvvətli, qılıncım kəskin. Kimi istəyirsən, boğazını cücə boğazı kimi üzüm (11, s.96).

**Boğazının gen yerinə salmaq** - yeyib üstündən su içmək.

**Boğazı yaşlamaq** - şərab içməyə başlamaq, çaxır qəbul etmək.

**Boğazlamaq** -öldürmək, məhv etmək.

Kəşf olunur hər gün zəhərli qazlar,

Yarın bilmir, kim kimi boğazlar (75, səh. 146).

**Bomba kimi səslənmək** - bir hadisənin baş verməsi, hamıda təsir qoyması.

Tehranda isə müraciətnaməmiz bomba kimi səslənmişdir. Çox yeyin bir surətdə xalqın nəzərini cəlb etmişdir (161, səh. 89).

**Borclu borclunun sağlığını istər** – mən ölsəm, sənə pul verən olmaz.

Borclu borclunun sağlığını istər (9, s.143).

**Bostançı poxu kimi şişmə** - öz yerini tanı, başından yekə danışma.

**Bostançıya kalah satmazlar** - bir adama ehtiyacı olmayan şeyi təklif eləməzlər.

**Bostan əkmək** - biri ilə iş görmək.

İkincisi qalan yerdə mən kimlə bostan əkdiyimi yaxşı başa düşürəm. Qorxma, de (174, s.28).

**Bostanına daş atmaq** - haqsız olaraq birinə sataşmaq, birini incitmək.

Əlizamanı kim tanımırdı ki, o, bu kənddə kimin bostanına daş atmamışdı ki? (84, s.434).

**Bostanı vər saxlar, arvadı ər** – - hər bir qadını ər segi ilə qayğı ilə əhatə etməsə, o xoşbəxt ola bilməz.

Bostanı vər saxlar arvadı ər (168, s.336).

**Bostan olmaq** - bədənin üzvlərinin təbii haldan çıxmasına, gözün barmaqların şişməsinə, göyərməsinə işarədir.

Mən bilmirəm, fəqət bostan olmuşam.
Göz görməyir, ürək döyünür, həm batıbdı səs (Kazımi Azərşəhrli, s.459).

**Bostan pozandır** – yaxşı- pis qanmayan. Hər zadı töküb dağıdan.

Həqiqi mənada şaxtalar düşməmiş qovun-qarpızın qalanını yığışdırıb evə gətirmək mənasındadır.

Bostan pozub gətirirdik aşağı,
Doldururduq evdə, taxta tabağı.

**Boşbeyin** - ağılsız, düşüncəsiz.





Boşbeyin adamlar dəgilmiş şəksiz,
Bu yolda baş verib canın qoyanlar (Səhənd, s.435).

**Boşboğaz** -danışığını bilməyən, çox danışan.

Bir neçə boşboğaz, özün oynadan
Gahdan tapılıbdır sənə xor baxan ( Yekan kəhrizindən Firidun).

Boşboğazlıqdan, o qapı, bu qapıda veyl-veyl gəzməkdən başqa əlindən bir iş gəlməzdi (298, s.19).

Əski dostuz, burax da seyr edəlim,
Sən bilirsən ki, boşboğaz deyilim (75, c.IV, s.107).

**Boş çuval küncdə qalar** – yoxsul adamı heç kəs saymaz.

Boş çuval küncdə qalar (103, s.73).

**Boş damarından tutmaq** -dilini tapmaq, xasiyyətinə bələd olmaq.

**Boş danışıq** – mənasız sözlər.

Boş danışıqdan nə çıxar, ay balam,
Qış günü siz çılpaq olarsız tamam (267, s.406).

**Boş xəyal** - həyata keçməsi mümkün olmayan bir arzu.

Baxma özgələrin boş xəyalına,
Səbrli, dözümlü, mətanətli ol! (209, s.72).

**Boy demək** - yalandan özünü şişirtmək, özünü tərifləmək, güclü gələmə vermək.

Kim görüb ki, mən özümdən boy deyəm,
sınamamış bir şənliyə toy deyəm? (Sönməz).

**Boylu** - hamilə.

**Boynu çiynində** -yazıq, məyus.

Nəzərində cahan olub zindan,
Boynu çiynində qoltuğunda əli (72, c.III, s.164).

**Boynu əllaf xoruzuna dönmək** - çox kökəlmək.

Yeməkdən də ki, boynum əllaf xoruzunun boynuna dönüb (129, I, s.97).

**Boynum qıldan incədir** - sənin hər sözün mənim üçün qanundur.

Qıl deyiləm hər iynədən keçəm mən,
Bir çinaram doğra məni, kəs məni ( Haşım Tərlan).

**Boynu qıldan incə olmaq** - hər sözü qəbul edən, məzlum bir insan.

Gündüz işıqda cürlüsən, boynu yoğunların işin,
Boynu da qıl kimilərin işlərinə şəbanə bax (338, səh. 22).

**Boynum tükdən nazikdir** - mənim də yanınızda boynum tükdən nazikdir (9, s.189).

**Boynuna düşmək** - bir şeyi qəbul etməkdən boyun qaçırır, qəbul edə bilmir.

**Boynunun ardı çuxurdur** - yalançı, pis adam mənasında, yalançıdır, etibarsızdır.

**Boynunun ardını görər** -- yəni bunu görə bilməz.

Xeyr, siz boynunuzun ardını görərsiniz, onu görəndə (72, c.III, s.101).

**Boyuna biçilmək** – düz ölçüsündə olmaq.

Bir torpaq parçası qaçar dalımca,
Elə bil boyuma biçilib mənim (260, s.32).

**Boynunu şax tutmaq** - vüqarla dayanmaq, qorxmamaq.

Sil gözünün yaşını, boynunu şax tut,
Qüssəni, kədəri büsbütün unut (213, səh 5).

**Boyun burmaq** - məlul-məlul baxmaq, fağır dayanmaq, birindən asılı olmaq, həsrət, intizar çəkmək, məzlumluq etmək, əl-qolu sınmaq.

Dərdli Kərəm gəlib durar,
Qul kimi boynunu burar (35, s.520).
Qapıda durub yetimlər kimi,
Boynunu burma, göz yaşı tökmə (94, səh.20).
Dağlar həsrət çəkir bəyaz qar üçün,
Bağlar boyun burur şirin nar üçün ( M.Rahim).
Yetim tək boynunu burma, Təbrizim,
Məlul-məlul baxıb, durma Təbrizim (264).

**Boynu boyunduruqlu** - əsir kimi yaşayan, təslim olan.

Al boynuna boyunduruğu, baxma zəhmətə,
Əy başını öküz kimi, döz dərdə, möhnətə ( Ə.Nəzmi, s.383).

**Boynuna almaq** – etiraf etmək.





Niyə boynuna almırsan, ay köpəkoğlu? (84, s.79).

**Boynunda qalmaq** – məsuliyyəti birinin üstündə qalmaq.

Bu ləkə həmişəlik bizim boynumuzda qalar (234, s.443).

**Boynunu sabunlanmış ipə keçirmək** –özünü ölümə atmaq.

Hüsaməddinin boynunu Fəxrəddinin sabunlanmış ipinə keçirmək tarixi bir xəyanətdir (234, s.443).

**Boynunu şax tutmaq** -vüqarlı, məğrur dayanmaq.

Sil gözün yaşını, boynunu şax tut,
Qüssəni, kədəri büsbütün unut! (213, s.5).

**Boyunduruq yoldaşı** - ağır günlərin dözümlü sirdaşı, ayrılmaz yoldaşı.

O, mənə sadə bir qadın deyil, xoş günlərimin dadı olduğu kimi, ağır və dözülməz keçmişimin vəfalı boyunduruq yoldaşı da olmuşdur (281, s.109).

**Boyun əti** - qərib, avara, didərgin düşmüş insan.

Yurdu bəlli olmayan boyun əti (29, s.42).

**Boyun əymək** -təslim olmaq, əyilmək.

Xoşdur ölümün nakəsə baş əyməkdən
Namərd qabağında boyun əyməkdən (A.Nazir).

**Boyun qoymaq** - qol çəkmək, razı olmaq.

İndi sizi bura yığmaqdan mənim muradım budur ki, deyəsiniz görüm bu işə kim boyun qoya bilər (174, s.114).

**Boyun olmaq** - söz vermək.

İt əlindən qayıdıb, qurda da bir zad boyun olduq,
İt ilə qolboyun olduq (306, s.162).

**Boz- boz baxmaq** - tərs-tərs, acıqlı baxmaq, əyri-əyri baxmaq.

Nigar də mənə boz-boz baxır, uzaqda gəzir (168).
Qız budu bax, falçılara söz qoşan,
Fatimə Sultan mənə boz-boz baxır (168, s.202).

**Boz üz** –pis üz.

Yox, filankəs yaramaz, çevirər boz üzünü, bozaranda adama elə bozarır ki, səni ağ yuyub qara sərir (9, s.23).

**Börk qapmaq** - aldatmaq, kələk gəlmək.

Biləxərə kələkbaz və hiyləli insanlar həmişə düzgün və şərafətli insanların börkünü qapıb qaçırlar (117, s.188).

**Börk qoymaq, börk qapmaq** - aldatmaq, kələkbazlıq ilə bir malı çox baha satmaq.

Oğurluqda hamı millət başarammaz biz ilə,
Tərəfin börkünü başdan qaparıq qaş- göz ilə (168, s.828).

**Börkü qabağına qoyub fikirləşmək** – bir məsələni ətraflı, dərindən götür-qoy etmək.

Ax, gözəl Azərbaycan vətənim, harda qalmısan... Gəlin biz də bir dəfə oturaq və keçə papağımızı qabağımıza qoyub fikirləşək (334, №119-122).

**Börkü qazi eləmək** - etdiyi işləri nəzərdən keçirmək, düşünmək.

Durun başladığınız oyunun axırını düşünüb börküzü qazi edin, bu işin dalı yaxşı olmaz (Pişəvəri, Tehran toplantısı).

**Börkümü məscidə atsalar, ora getmərəm** - məscidə, məsciddə olan haqsızlıqlara olan etirazdır.

Məscidlərə getmə, vaizin tərkin qıl,
Nə ricətə ver qulaq, nə miad istə (223, s.127).

**Börkümüz tərsə düşər** - yəni aramız dəyər, münasibətimiz pisləşər.

**Börkünü əyri qoymaq** – qayğısı olmamaq, dünya vecinə olmamaq.

Qoy börkünü kəc, qaşının üstündə fırılda,
Kəndin kimi bir lotu meydanını görcək (267, s.31).

**Börküvü qoy altında, otur üstündə** - yəni öz yaxud ətrafında olan adamların etdiyi pis işlərə görə utan.

**Börküvü yanqılıcı qoy** -bunun məcazi mənası bir adamın özünün və ya yaxın adamlarının pis iş görməsi zamanı işlədirlər. Papağın uca olsun şəklində də işlənir.

**Börkü yan qoymaq** - müxtəlif mənalarda işlənir. Özünü böyük saymaq, quldurluq etmək.

İndi çoxlar börkün bizə yan qoyur,
Zəhr içirdir, onun adın şan qoyur (86, s.5).





**Böyrək yağında bəsləmək** - hərtərəfli qorumaq, rahat yaşamaq.

Bir "Volqa"sı solunda, bir "Volqa"sı sağında,
Ailəsi bəslənir sanki böyrək yağında.

**Böyrü üstə yıxılmaq** - yoxsul olmaq, var dövləti əldən vermək.

**Böyükağanı səslir** - çaxır içən adamın və ya xəstənin qusması zamanı deyirlər.

**Böyük tikəsini qulağı boyda etmək** - böyük hədə, qorxutmaq.

Xalça karxanasının fəhləsi İsməlini bütün şəhər basdırıb onun qatillərinin hər bir tikəsini qulağı boyda eləyiblər (302, s.27).

**Böyürdən çıxmaq** - tüfeyli, nəzərdə tutulmayan bir yerdən zərər yetişmək, xərc çıxmaq.

**Böyüsə, başından çıxar** - bir adam özünü dərk etdikcə, pis adətləri əldən verər.

Bir ağa o biri ağanı görüb onun kədərli olmasının səbəbini soruşur. Ağa oğlunun əxlaqsızlığından, yalan danışmasından şikayət edir. O birisi ağa cavab verir: bizim ağazadə də belə idi, böyüdü, başından çıxdı.

**Böyürdən çıxmaq** -tüfeyli, nəzərdə tutulmayan yerdə özünü ortaya otmaq.

Gözlənilməyən bir xərcə düşmək.

**Börküvü göyə at** -sevinmək, şad olmaq əlamətidir.

**Bu da eşşəyini sürür ki, mən də mamağanlıyam** - Mamağan Azərbaycanda Təbrizə yaxın bir yerin adıdır. Qacarların qanununa görə, məmaliki-məhrusənin hər bir məmləkəti və ya məntəqəsi gərək əhalisinin sayına görə ordu üçün əskər versin. Əlsiz- ayaqsız adamın özünü cəsarətli adlandırması və dəxli olmayan bir işə müdaxilə zamanı işlənir.

Kərkükdə bu deyim "topal eşşəyi ilə bu da özünü karvana qatır" şəklində işlənir (26, s.76).

**Bu da təzə bir rəngdir?** - bu da təzə hiylədir, kələkdir, fırıldaqdır?

Tamam rənglər qurtulub, bu gecə bu rəngnən gəlib.

**Bu dərə mənim, o dərə sənin** – çölü, düzü gəzib dolanmaq.

Pirqeyib kişi, hər gün o başdan durur, minərdi eşşəyinə, "bu dərə sənin, o təpə sənin" deyib düşərdi çöllərin canına (103, s.147).

**Bugünkü sərçə dünənkinə "cik-cik" öyrədir** – qocalar tərəfindən gənclər haqqında biri kələk gəlmək istəyəndə, birini aldatmaq istəyəndə işlənir.

Bugünkü sərçə dünənkinə "cik-cik" öyrədir (335, s.302).

**Buğda bazarına qoymaq** - biri özünü çox böyük adam bilir, malını əğlısığmaz qiymətə satmaq istədikdə işlənir.

**Buğda bazarında özünü görmək** - özünü çox dəyərli adam saymaq.

Qan tuturdu bazara, yük gətirəndə gözüvü,
Elə bil buğda bazarında görürdün özünü (168, s.555).

**Buğda çörəyinin buynuzu olar** -adam xoş saatının qədrini bilməz. Birinə yaxşılıq edib çörək versən, sənə təpik atar.

Ağır vəziyyətdə olan adam xoş gün görəndə qudurar.

Buğda çörəyi qarın deşən olur (129, c.I, s.29).

Xoş günlərin qədrini bilməyən çətinliklərə düşər (201, s.63).

**Buğda yeyib cənnətdən çıxmaq** - heç bir qayğısı olmamaq, heç nəyin dərdini çəkməmək.

Sən yat dedi, sənə nə var ki, buğda yeyib cənnətdən çıxmısan (84, s.122).

**Bu xına o xınadan deyil** - vəziyyət dəyişib, bu hərəkətin əvvəlkilərə bənzəməz.

Ağacan, sənə deyirəm, öz hörmətini saxla, yoxsa bu xına o xınalara bənzəməz (Makulu).

**Bu ilki sərçə bildirki sərçəyə cik-cik öyrədir** – təcrübəsiz bir adam təcrübəli, ağıllı adama ağıl öyrədir.

Bu ilki sərçə bildirki sərçəyə cib-cib öyrədir (328, s.302).





Bu ilki sərçə bildirki sərçəyə cik-cik öyrədir (72, c.III, s.100).

**Bu ki, həngamədir** -uzun işdir, qarışıqlıq.

**Bu imamzadədən möcüzə gözləmək olmaz** – xalqa xidmət etiyini güman etdiyimiz şey belə deyildi.

Təbriz tərhini ki, Saidi ilə mən qayıdana kamilləşdirdik və güman edirdik ki, «təhqiqati-ictimai» imamzadəsindən hələ də möcüzə gözləmək olar (115, № 2, səh. 19).

**Bu qapı mənim, o qapı sənin** -qapıları gəzmək.

Vəzir kişidən razılıq eləyib düşdü yola, bu qapı mənim, o qapı sənin, axtara-axtara o biri qardaşının evini tapdı (46, s.97).

**Bulaq gərək sərçeşmədən bulaq olsun** -el arasında deyilir ki, varlı olmaq üçün əldə gərək sərvət olsun. Bir adam bu günkü təlim-tərbiyəni inkar edib hər şeyi nəslə nəcabətə bağlayır.

**Bulud kimi dolmaq** - doluxsunmaq, kövrəlmək.

Saralmışam, solmuşam, yarım,
Bulud kimi dolmuşam, yarım,
Ağlamayım, neyləyim, yarım,
Mən səndən ayrılmışam, yarım.

**Bu meydan, bu da şeytan** - yəni cəsarətini, qabiliyyətini göstərə bilərsən.

Biz Tehranda hay-küy salan ağalara deyirik: əgər doğrudan Azərbaycana ürəyiniz yanırsa, buyurun bu quy bu meydan (S.P.Pişəvəri).

**Bundan Fatıya tuman çıxmaz** - keçmişdə Azərbaycan qadınları 40 taxta tuman geyərdilər ki, buna çoxlu parça sərf olunardı. Əldə olan pulun, vəsaitin nəzərdə tutulan işi görməyə çatmayacağına işarədir.

**Bunun mənə yemən- tüməni nədir? Bunun mənə punza siyyəsi nədir?** –bunun mənə nə xeyri var. Mənə xeyri-zərəri nədir? Mən bu sözü sənin xeyrinə görə deyirəm.

**Bunu sırğa elə, qulağından as** – unutma.

Onda sırğa elə, as qulağından, dediklərimi (142, s.59).

**Bura quş gəlsə, qanad salar, qatır gəlsə, dırnaq salar** – çox uca zirvə, təhlükəli yer.

Bura quş gəlsə, qanad salar, qatır gəlsə dırnaq salar. Sən nə cürət'ə gəlib bu məkana çıxıbsan? (46, s.237).

**Burcutmaq** - mətləbin üstündən keçmək, sözünün altından çıxmaq.

**Burda ala qarğa bala çıxartmaz** - çox bərəkətsiz yer.

**Burda mənəm, Bağdadda kor xəlifə** – burada məndən zorlusu yoxdur, mən nə istəsəm, onu da edə bilərəm. Özünü olduğundan çox böyük, güclü bilmək, xalqa zülm etmək.

Bir cinaha rəy salmaqdı vəzifə,
Burda mənəm, Bağdadda kor xəlifə (75, s.83).

Xəlifə Məhəmmədin vəkili bütün müsəlmanların başçısı hesab olunurdu. Bunlar sonralar işğalçı müharibələr nəticəsində həm dünyəvi, həm də dini hakimiyyətə malik olmuşdular. Babək bu işğalçılara qarşı yüksələn üsyanların ordəmli başçısı olmuşdur.

**Burnu ağzını şirin etmək** - rüşvət vermək.

**Burnu havalanmaq** - qudurmaq, özünü yekəxana aparmaq.

Təşrifat ağırlaşdı, burunlar havalandı.
İndi hamının zahiri saz, vəzi yamandır (168, s.928).

**Burnu ilə pox eşmək** - çox əzab- əziyyətlə dolanmaq, ağır işdə çalışmaq.

**Burnu ilə yer eşir** - donuz ac olan zaman yeri burnu ilə eşir, ot-ələfin kökünü çıxardıb yeyir. Hirslənmək, qəzəbli olmaq mənasındadır.

**Burnuna barıt iyi dəyməyib** - çətinlik, müharibə, döyüş görməyib.

**Burnuna duzlu su qoymaq** -qanını qaraltmaq, həyatına zəhər qatmaq.

**Burnundan gəlmək** - yaxşı günlərin, xoşbəxt anların tərsinə əzaba, əziyyətə çevrilməsi.

Ay mənim, gün də mənim,
Boynumda kündə mənim,
Burnumdan yaman gəldi
Gördüyüm gün də mənim.

Təliqeyi-mübarəkə ziyarət olundu, xeyli şad oldum. Çəkdiyiz keflər burnuzdan gəlsin (300).

**Burnundan tüstü çıxmaq** – bərk qəzəblənmək.

Əsəd şah Reyhan xanımın adını eşidəndə burnunun deşiklərindən tüstü çıxdı (46, s.161).

**Burnun havalanması** - hirslənmək, qudurmaq, yekəxanalıq etmək.

Təşrifat ağırlaşdı, burunlar havalandı (168, s.23).

**Burnunu hər yerə soxmaq** - hər bilmədiyin işə qarışma.

**Burnunu ovmaq** - sıxışdırmaq, dərs vermək, yerində oturtmaq, diz çökdürmək.

Düşmənlərin axır burnun ovarıq (214, s.100).

Zülm eləyən şahları biz qovmuşuq,
Burnunu şahzadələrin ovmuşuq (193, s.98).

**Burnun tutsan, canı çıxar** - çox arıq, zəif, gücsüz.

**Burnunun ucu göynəmək** -həddindən artıq darıxmaq, həsrət çəkmək.

Bu çadırın sirli sərinliyi üçün burnunun ucu göynəyirdi (288, s.143).

Mənimsə burnumun ucu göynəyir,
Təbrizli qardaşım Şəhriyar üçün (M.Rahim).

**Burnunu sallamaq** – incimək, küsmək.

**Burnu şişib** - küsüb, inciyib.

**Burnu yellənmək** - dəli olmaq, qudurmaq, qəzəblənmək.

Lənət ol badi xəzana ki Nizami bağının bir yava gülbəsərin
Qoymadı ta güllənsin.
İddiası boşalan təbl-töhi porbadın
Neyləmək, zurnaçının burnu da qoy yellənsin ( Şəhriyar).

Səmədxanın yelli burnun ovdular,
Quduz qurdu bu ölkədən qovdular (326).

**Burnu yelli** - qudurğan, təcrübəsiz, göynən gedən.

**Burnunu yerə sürtmək** - diz çökdürmək, qürurunu sındırmaq.

**Buro-buro deyən dövrü** – göynən gedən dövrü.

Çoxdan ayrılmışıq öz- özümüzdən.

Bürö-buro deyən günlərim vardı (328, s.315).

**Buruğu dönmək** - aradan çıxmaq, gizlənmək.

Elə bilir bu da qabaqkılardır ki, məni qura, ötürə qabağa, özü yavaşdan buruğu dönə. Amma tülkü suvaqlı bağa girməz ("Kənd uşağı").

**Burun buruna gəlmək** - üzləşmək, mübarizə etmək.

**Burun deyil, elə bil şeypurdur** - böyük ölçülü burun.

Nəsrəddin şahın zamanında bir dəllək var idi, burnu ilə elə şeypur səsini təqlid edərdi ki, insanları heyrətə salardı (169, səh. 32).

**Burun qulaq başın sədəqəsidir** - müəyyən dövrlərin hakim təfəkkürünə görə, qulaq burun kəsmək adi bir vəziyyət idi. Böyük şeyləri qruyub saxlamaq üçün kiçik şeylərdən keçmək olar.

**Burnun ucu göynəmək** - həddindən artıq darıxmaq, həsrət çəkmək.

**Burun poxu, göz yaşı ilə iş görmək** - çox ağır vəziyyətdə uşaq böyütmək, bir işi başa çatdırmaq.

**Burun tovu vermək** - qaramal qaçmasın, əldən çıxmasın deyə onun burnuna buruntov keçirdirlər. Birini hədsiz dərəcədə incitmək mənasındadır.

**Bu sözə bir bağ souzu/ kəvər verməzlər** - dəyərsiz sözdü, mənasızdı, yersizdi.

**Bu sözləri kilim altına qoy** -danışma, bildiyin sirri açma.

**Butulkanın dibinə girmək** - həddən artıq sərxoşluq eləmək.

**Bu tüstü bir bizim bacamızdan çıxmır, hamının bacasından çıxır** – bu iş hamının başına gələr.

Bu tüstü bir bizim bacamızdan çıxmır, hamının bacasından çıxır (129, c.I, s.439).





**Buynuzsuz qoçun qisasını buynuzlu qoçda qoymazlar** – yazığa zülm edən axırda cəzasını alar.

Buynuzsuz qoçun qisasını buynuzlu qoçda qoymazlar (129, c.I, s.114).

**Buyruq qulu** – tapşırılan işi yerinə yetirən adam.

Mən buyruq quluyam, mənə buyurublar sür dərəyə, sür dərəyə (195, c.II, s.123).

**Buyurursuz bitməz işə, adımı qoyursuz yarıtmaz** – elə bir işə göndərirsən ki, düzələn deyil, amma məni günahkar bilirsən.

Buyurursuz bitməz işə, adımı qoyursuz yarıtmaz (335, s.124).

**Buz baltası** -sağlam, qorxmaz, şərafətlə çörək qazanan.

Rübabə bacı, Həmid, maşallah, b... baltası kimidir, ona nə olacaq? (1, s.122).

Buz balta kimi cəmərd igidlər divarlar dibində portağal satır (284, s.303).

**Buz kimi donmaq** - məəttəl qalmaq.

Gözlərin göyçək görüb dondum yerində buz kimi ( Sabiri, s.64).

Farsı dilin tuti tək deyib güləndə
Bu dağdan bu dağa qonursan gülüm.
Bəs neçin öz ana dilin gələndə
Dilin topuq vurur, donursan gülüm (H.Torlan).

**Buzlu su içməyə getmək** - dustağa düşmək (Dərəgəz deyimlərindəndir).

**Buzlu su vermək** -əsəbi adamı sakitləşdirmək.

Pozularsa dilimiz mənliyimiz də itəcək,
Acığın gəldi sözümdən? Gətirim, buzlu su iç! (200, s.73).

**Buzovunu qoyaram qabağına, səsi çıxmaz** - bir insanın eybini üzünə demək, pis işlərin üstünü açmaq.

**Buz sındı** - pis vəziyyətin nisbətən düzəlməsi, münasibətlərin istiləşməsi.

**Buz üstünün daşı etmək** - hörmətsiz, etibarsız etmək.

**Buz üstünün öküzü** - sakit və aram adam

**Bülbül kimi oxumaq** - gözəl səsli olmaq, düşmənə yaltaqlıq etmək.

Göyə bulud gələn kimi, düşmənə quyruq bulayıb, bülbül kimi oxuyub, hər zadı düşmənə dedi.





## -C-

**Calanmış yağı məscidə nəzir deyir** - faydasız söz danışır, olmayan bir şeydən danışır, xəsisdir.

**Camaatın gözünə kül səpmək** - yəni xalqın heç bir istək- arzusuna əməl etməmək.

**Can almaq** – çox əziyyət vermək, vurulmaq.

Ala gözlər girib qəsdə,
İstər canım ala, Maral! (32, c. II, s.8).

**Can atmaq** - bir istək və arzudan ötrü nəhayət dərəcədə çalışmaq.

**Canavar kimi oxumaq** - güclü, gözəl səslə oxumaq.

**Can bostanda bitməz** - insan sağlamlığını əldən verəndən sonra onu ələ gətirmək çətindir. İnsan ikinci dəfə doğula bilməz.

**Can can bağlı olmaq** - hər bir insanın ağrısının, problemlərinin başqaları ilə bağlı olması.

Can cana bağlıdır, can da cahana bağlıdır (142, s.222).

**Can cana qatmaq** - ərlə arvadın cinsi əlaqəsi.

Yatcaq balalar arvada ər qaş -göz atardı,
Can- can deyibən bir-birə, can-canə qatardı.

**Can cızlığından ummaq** - ən nəhayət qəddarlıq, rəhmsizlik, amansız gözün yuman ayrılıq.

Can cızlığından uman ayrılıq! ( Şəhriyar).

**Can çürütmək** - zəhmət çəkmək, ömrün qoymaq.

Yazıq onun üstündə 20 il can çürüdüb (72, c.III, s.78).

Mən sənin qapında can çürütdüm (174, s.6-7).

**Candərdi** – könülsüz.

Candərdi gəlir mollanın yanına, cibindən bir manat çıxardıb deyir (103, s.27)

**Can dərmanı** - bir ölkənin, bir evin zəngin olmasına işarədir.

Əzizinəm Qarabağdan,
Ağ bağdan, qara bağdan,

Can dərmanı istəsən,
Taparsan Qarabağdan (38, s.32).

**Canı boğaza yığmaq** – bıçağın bəndə dayanması, məzlumun üsyan hala gəlməsi .

Yığmış boğaza canımı, salmış oda toylar,
Həç vermir aman, cümlə qohumla yada toylar (48, səh. 230).

**Canı daş** – canı bərk.

Ovladıq daşdı canı,
Tərlanın daşdıcanı,
Qoy dərdin aşıq çəksin,
Desinlər daşdı canı (33, s.82).

**Canı qurtarmaq** – xilas olmaq.

Bizə torpaq ver, ordu ver, mühafizə qayğılarından canımız qurtarsın, işimizlə məşğul olaq (144, s.162).

**Canına asi olmaq** – ağrıdan, ya çox zəhmətdən canından bezmək, ölüm istəmək.

Yazıq o qədər canından asi olub ki, srağagün deyir, lap istəyirəm, o kağızları da yandıram (72, c.III, s.50).

**Canına qor salmaq** – birində eşq doğurmaq.

Mən beşikdə ikən telli sazınla
Canıma qor saldın, ay Mirzə dayı (16).

**Canına od salmaq** – eşqə düşmək.

Dağlar başın qar alı,
Duman çiskin, qar, alı,
Canıma bir od saldı,
Nə yanar, nə qaralı (33, S.92).

**Canın gicişməsi** - ümumiyyətlə, bu deyim kötək istəmək mənasında işlənir.

**Canını boğazına yığmaq** - əziyyət vermək.

Yığmış boğaza canımı,
Salmış oda toylar (48, s. 230).

**Canını ovcuna qoymaq** - bu yolda hər şeydən, canından belə keçməyə hazırdır.





**Canın üzülməsi** -- həsrətdən, sevgidən bir dəri, bir sümük olmaq.

Gözlərin süzüldü, canım üzüldü,
Məni qoyub yaslı-yaralı getmə (230, s.73).

**Canı sulu** - hələ iş, təfəkkür qüdrəti olan adam.

Deyirsən yəni o qədər qocalmışam ki, üç kilo şeyə də gücüm çatmır. Ver bura, mənim canım hələ suludur (269, s.270).

**Can yandıran** - qayğısına qalan, birinin haqqında fədakarlıq edən

**Can yonqarı** – doğma adam.

Qardaş can yonqarıdır
Oğul göz qarasıdır (33, s.114).

**Carçı kirəçidən baha gəlir** - astarı üzündən baha başa gəlir, əlavə iş əsas işdən baha başa gəlir

**Cavan gözü duman olar** - cavan adam həyatda təcrübəsi olmamağa görə hər zadın zahirini görər, tez aldanar.

**Cazlamaq** - bir növ oğurluq.

Dedi bu pulları qardaş, kişidən cazlamışam.
Satmışam yağ, düyü, qənd,
Çay ərimin yox xəbəri (168, səh.7).

**Ceyran belinə çıxmaq /ceyran dağına çıxmaq** - lazım olan şeyin tapılmaması, həddən artıq bahalaşması.

Taxıl isə necə deyərlər ceyran belinə çıxmış idi (Ə.Vəliyev).

**Cəddimin suda əli yoxdur-** bu çətin və qorxulu işi mən görə bilmərəm. Bu istədiyin iş mənim əlimdən gəlməz.

**Cəfaya qatlanmaq** – əziyyət çəkmək.

Bir dəm olur hər cəfaya qatlanır,
Birdəm zəhərdən də acı olur könül (35, s.517).

**Cəhənnəm qarışığı** - islami baxışa görə, erməni ilə yəhudidən olan uşağa cəhənnəm qarışığı deyilir.

**Cəhənnəm üstündə körpü qurmaq** - aqibəti xalqın xeyrinə olmayan işlərə əl vurmaq, yaramaz bir işə əl bulamaq.

Biz həqqin yüzünə sillə vurmuşduq,
Vicdanın əmrinə qarşı durmuşduq

Cəhənnəm üstündə körpü qurmuşduq,
Namər körpüsünü sel aldı getdi (165, s.174).

**Cəhrə daşı** – ağır, vüqarlı, dözümlü adamı cəhrə daşına oxşadarlar. Dözüm və səbr əlamətidir.

**Cələ qurmaq** - birinə qarşı hiylə toru qurmaq.

Üç nəfər mərd, sahibi-iman
Üçü bir yerdə etdilər peyman.
İstəyib salsın özgəsin cələyə,
Düşdülər özləri həmin tələyə ( Ə.Qəmküsar).

**Cəncələ salmaq –** xataya salmaq.

Axır bilirəm Siz məni bir cəncələ salacaqsınız (72, c.III, s.37).

**Cəngəldə ot tez bitər –** baxımsız yerdə faydasız ot bitər.

Cəngəldə ot tez bitər (335, s.309).

**Cəngi məğlubə** - şahın özünün də iştirak etdiyi mühüm bir dava, qarma-qarışıq yer.

Vəqti ki cəngi məğlubə olur, Qızılbaş ordusundan bir azı Şah İsmayılın sərkərdəliyi ilə özlərindən igidlik və şücaət nişan verirlər ( "Tarixi Bəydili", s.483).

**Cərcənək olmaq** - bir ağır yükün altında əzilmək, pis vəziyyətə qalmaq.

Omba sümüklərini birləşdirən buğum, çünki tələsərsən, cərcənək olarsan (156.

**Cəzə-fəzə** - ah- nalə etmək.

Oğul, cəzə-fəzə eləməkdən bir şey çıxmaz, keçənə güzəşt deyərlər (174, s.14)

**Cıbddız** - balaca boy, çoxbilən, şuluq.

**Cıdır atı** - bir zaman Qarabağın cıdır atı dünyanın ən gözəl və yeyin qaçışlı atlarından sayılırdı.

Hadisələr bir-birini cıdır atı qaçışı ilə qovurdu (62, səh. 792).

**Cınğından cin hürkür** - çox kasıbdı, yoxsuldu.

Pişəvərini mən otuz ildir tanıram, ayağı yalın bir fələni cındırından cin hürkən bir kəndlini inan ki, atasından da çox istəyir (302, s.33).





Nəvəmin əyunində bir paltarı var ki, cındırından cin hürkür (46, s.235).

**Cırığım çıxıb** - həddən artıq yorulmuşam, taqətdən düşmüşəm.

**Cırrıt deyib aradan çıxmaq –** aradan çıxmaq.

Yoxsa sənin başıva bir oyun gətirərlər ki, iki gündə özün cırrıt eləyib qaçarsan (72, c.III, s.12).

**Cırtdan** - ən kiçik, Azərbaycan nağıllarında hamıdan sonra yatan uşaq.

**Cırtqoz** - tez hirslənən, tez özündən çıxan.

Bax, atandan soruşdum, məni başa saldı, amma sən cırtqoz kimi atılırsan ortalığa (84, s.113).

İzn ver cırtqoz uşaqlar kimi, damdan- bacadan,
Boylanıb gizlicə oğrunca tamaşaya gəlim (291, s.12).

**Cızdaq çıxardan söz** - yandırıb-yaxan söz.

**Cızığından çıxmaq** - qudurmaq, qanuna, zamanın normalarına, ənənəyə qarşı çıxmaq.

Öz cızığından atlayıb çıxdı kənara kargər,
Dincəli çorladıb məni soxsa məzara kargər (69, s.113)

**Cızma-qara** - mənasız, dəyərsiz yazı-pozu.

Bu cürə cızma-qaralar içərisində Feliks Ağayanın yazdıqlarını qeyd etmək lazımdır. Bu xatirələr məşrutə hərəkatından senator olmaq və sərvət toplamaq məqsədi güdən bir pul hərisinin əli ilə yazılmış və 1910-cu ildə Tehranda Səttarxana qarşı atışmalarda iştirak edən daşnakların məlumatına əsaslanmışdır (3, s.14)

**Cibə daş salmaq** - keçmişdə qızlar ər evinə köçən zaman ata-anası cibinə bir qara daş salardılar. Yəni, bu daş dinsə, sən dinmə. Qaynananın, qaynatanın sözünün qabağına söz demə.

**Cibə qoymaq** - təhqir, başqasını gücsüz bilmək, əlsiz-ayaqsız bilmək

İngilislərin əlində oynaq olan Rza Mirpənc və oğlu Məhəmmədrza Azərbaycanı talan edib yüz mindən artıq vətənpərvər türkü xəzəl kimi qırıb tökdülər yerə, ta hamı bilsin ki, xainlər cibə qoymalı deyillər.

**Cibim dolu, qarnım ac** - ömür boyu zəhmət nəticəsində ələ gələn pul mənim xoşbəxtliyimi təmin edə bilmir.

Göz baxdıqca hey maşındır, hey qaraj,
Amma dibdə cibim dolu, qarnım ac.

**Cibinə qoymaq** - məğlub etmək.

Əgər Gülər bizim hamımızı bu gecə cibinə qoymasa... Gülər deyil, xalis oddur od (72, c.III, s.13).

**Cibinin ağzını buzov çatısı ilə bağlamaq** - çox xəsislik eləmək.

Xub, səbəb nədir ki, mirzəyə gələndə cibinin ağzını buzov çatısı ilə bağlayırsan, bir beş-on manat da bizə vermirsən? (129, s.67).

**Cibivin söküyünü tikmirəm ki** - səbət götündən gilas tökülmür ki...

Dediyim sözlərə niyə əhəmiyyət vermirsən?

**Ciblərində yel əsmək** – yəni heç bir pulu olmamaq

Neçə vaxtdan bəri könlümə çilo- kabab düşmüşdü, amma fələyin evi yıxılsın, cibində yel əsirdi (201, səh. 209).

**Cici- bacı** - iki qızın həddən artıq dost olması.

**Ciciban** - gözəl, əyninə yaraşan paltar geyinən adam.

Yoxsamı sən istəyirdin
Varıb gedib bir Ciciban qız alasan (284, s.199).

**Cicimini sudan çıxaran** - özünü birtəhər idarə eləyən.

**Cidanı çuvalda gizlətmək olmaz** -böyük bir məsələni, böyük istedadı uzun müddət gizli saxlamaq olmaz.

Cidanı çuvalda gizləmək olmaz. İran hakimiyyət orqanları almanın üstünə göndərmək üçün 40 təyyarə və dövlət büdcəsindən bir milyon 250 min tümən pul ayırmışdı (262, s.188).

Həmidin məşhur adam olduğunu bilən Mazan şaşırdı: «Qardaş, bunu bizdən niyə gizlədirsən? Cidanı çuval altında gizlətmək olmaz» (1, səh. 273).

Cidanı çuvalda gizləmək olmaz (148, s.121).

**Cidov adam** - həlləm- qəlləm, fırıldaqçı.





Hər nə isə Hacı, çox cidov adam imişsən, rəhmətliyin oğlu, pul alıbsan, dörd aydı ver, daha sözün nədir? (129, s.50).

**Cikini- bikini bilmək** –hər şeyini bilmək.

Cikini də bilirəm, bikini də. Gündüz nə eləyirsən, onu da bilirəm, gecə harda yatırsan, onu da bilirəm. (9, s.129).

**Cilov gəmirmək** - əlindən qəzəblənmək, özünü oda- közə vurmaq.

Dondu kirpiklərdə yağan qar qırov,
Hicranın kökləri gəmirdi cilov ( Bozalqanlı İslam).

-Ay Həsən, nə var yenə də cilov gəmirirsən?

-Ay Gülməmməd axı adam neyləsin, mən daşıyan yükü eşşəyin dalına qoysan, beli sınar (201, s.142-143).

**Cilovluq ili deyil** - ermənilərin müsəlmanlara qarşı qanlı soyqırım 1905-1920-yə qədər Azərbaycanın şimal və cənub qismətlərində davam edib ki buna cilovluq deyilir. Cilov Asorilərin bir qolunun adıdır ki, soyqırımında ermənilərlə bərabər iştirak etmişlər.

**Cilovsuz at** - başsız, qorxusuz, əxlaqsız arvad.

Qız bihicab, oğul hipi, arvad cilovsuz at
Ev gahi sinema, gahi bəzmü-qumar olur (168, s.915).

**Cinahbazlıq** - dostəbazlıq, islam hakimiyyətindən sonra yaranan deyimlərdəndir. Siyasi mənada islamın daxilində olan qruplaşmalar deməkdir.

Heydərbaba, cinahbazlıq mod olub,
Cinah var ki, bir yandıran od olub (306. s.82).

**Cin atına minmək** – çox əsəbləşmək.

Bax, sən allah mənə eşqnamə oxuyur, dızıx burdan çaqqal, mindirmə məni cin atına (9, s.175).

**Cinbaş, cinfikirli** - hər zadı tez başa düşən, hüşlü-başlı uşaq.

**Cin beyninə vurmaq** - bərk hirslənmək, özündən çıxmaq.

Hüsənin dili dolaşmış, cin vurmuşdu təpəsinə (84, s.77).

**Cin bismillahdan qorxan kimi** - çox bərk birindən qorxmaq.

Cin bismillahdan Tehranın polis idarəsi zəhmətkeşdən qorxduğu qədər qorxmur (10, s.15).

**Cin dəyişəyi** - çox eybəcər, cansız, cılız.

**Cinə börk tikmək** – aldatmaq, çox bic olmaq, həddən artıq zirək, başqalarına börk qoyan, çox hüllükbaz adam.

Buna bax ki, bu pəxməliyi ilə istir mənə papaq tikə. Day demir ki, mən özüm cinə börk tikib təpəsini də dəlik qoyuram. ("Keyhan", "Yol").

Cinə papış tikir tülküsifətlər,
Viranə axtarar bayqu seyrətlər (88, s.50).

**Cinə dəmir göstərmək** - inama görə, cin dəmiri görən kimi qorxub qaçar. Biri bir yerə gələndə orada birini görən kimi yox olur.

**Cin fikirli** - çox zirək uşaq.

Kiçik Mirzə (Kərəm) 5 yaşında məktəbə gedirdi. Sofi adında cinfikirli bir uşaq ilə arxadaş olmuş idi (117, səh. 11).

**Cini quyudan çıxaran Fatma** - hamıya əziyyət verən adam.

Adətən qızlar, qadınlar haqqında işlənir.

**Cinin bismillahdan qorxması** – cin bismillahdan, Tehran polis idarəsinin zəhmətkeşdən qorxduğu qədər qorxmur (10, səh. 15).

**Cinləri dağılmaq** – hirsi soyumaq.

Bizə altunmu verərlər, şaşqın,
Dağılıb cinləri xaqanımızın (75, c.IV, S. 88).

**Cinli cüvə əlindən qurtarmaz** - çox ayıq-sayıqdır, zirəkdir.

**Cinsi-lətif** - qadın cinsi nəzərdə tutulur.

Hər kuçədə bir cinsi lətifi ki, görürsən,
Ac qurd kimi ardınca düşüb hey sürünürsən (168, s.196).

**Ciyəri dağlamaq** – böyük bir dərdə salmaq.

Bahar fəsli irmaq kimi çağlayıb.
Eşq oduna ciyərimi dağlayıb (32, c.II, s.72).

**Ciyəri dağlı xalq** – əzabkeş, ürəyi dərdli xalq.





Azərbaycan xalqı deyilən bu ciyəri xalqın oğluyuq biz. Və belə hesab edirik ki, Bakı ilə Təbrizin arasında sədd çəkmək, ata ilə oğul arasında sədd çəkmək kimi bir şeydir (142, səh.11).

**Ciyəri doğranmaq** – bir şeydən çox ağrı çəkmək.

Ah, aman, doğranıb durur ciyərim! (75, c.IV, S.104).

**Ciyəri kabab olmaq** – həsrət, dərd çəkmək.

Sən də ayrılsan, ciyərim kabab olar (144, s.127-128).

**Ciyəri qan olmaq** – hicrandan yanmaq.

Şəha, könlüm pərişan oldu sənsiz,
Cigərim dopdolu qan oldu sənsiz! (144, s.82).

**Ciyərini sökmək** – dərd çəkmək.

Ah çəkibən ciyərimi sökməkdən
Yaş yerinə gözlərim qan tökməkdən (32, c.II, s.57).

**Ciyərin yanması** – susuzluq.

Eşqdən, hicrandan, əziz adamını itirməkdən olan yanğı
Dad eylərəm haray naşı əlindən
Yandı ciyər eşq atəşi əlindən (Aşıq Pəri, s.7).

**Cocuq sanmaq** – uşaq bilmək, səfeh yerinə qoymaq.

Aç! Cocuq sanma həmvilayətini (75, c.IV, S.107).

**Culfa kəfənsiz ölər** - culfa Azərbaycan türkcəsində sulu tarlaya və parça toxuyan adama deyilir. Bu deyim: "kuzəkar sınıq kuzədə su içər" mənasındadır.

**Culfa olmamış kələf oğurlayır** - siçan olmamış çuval dibi dəlir. Bir şey yoxkən özünü göstərir.

**Cübütləmək** - gizlincə bir zadı oğurlamaq.

**Cücə basdırmaq** - xürafata görə, bəzilərinə turşu qoymaq, cücə basdırmaq... düşməz. Burada sənin təklif etdiyin işə boyun qoya bilmərəm.

**Cücə həmişə səbət altında qalmaz** - bu günkü əlsiz-ayaqsız adam, yaman günə düşən bir kimsə sabah böyüyüb təzə imkan ələ gətirər.

**Cücəkeşlik** - farscadır, burada çox doğan qadın mənasında işlənir.

Hər iki ildə doğur arvad ekiz,
Cücəkeşi daim olub tərtəmiz (168, s.310).

**Cücə maşını olmaq** - bir adamın çoxlu uşağı olduqda deyilir.

**Cöcəmə bəzəmək** - oyun çıxartma, şarlatanlıq etmə, aldadıcı işlərə əl vurma.

Azərbaycanda quş ovçuluğu müxtəlif surətdə olur. Kəkliyi tutmaq üçün müxtəlif oyun və kələklərə əl vururlar. Onlardan biri də cöcəmə bəzəməkdir. Əvvəlcə kəklik olan yerlərdə adam yerləşən, oyan bu yana çəkməyi asan olan balaca ağaclardan çardaq düzəlir ki, ona püri deyirlər. Bunun üzərinə ot-ələf tökürlər. Sonra onun üstünə balaca balaca rəngbərəng parçalardan düzəlmiş bir örtük salırlar. Bu püridə balaca bir baca açıq qoyurlar ki, ordan kəklikləri görüb güllə ilə, yaxud aldanıb yaxına gələnləri əlləri ilə tutsunlar. Cöcəmə bəzəmə deyimi indi də Azərbaycanda, o cümlədən Miyanada hər gün bir dona girən, xalqa quyu qazan adamlar haqqında işlənir.

**Cücəni payızda sayarlar** - işin nəticəsinə görə qiymət verərlər.

Eybi yoxdur, əğil yaşda deyil, başdadır, cücəni payızda sayarlar (11, s.26).

Amma biz işə sözdən artıq əhəmiyyət verdiyimiz üçün yazdıqlarınızı oxuyub saqqallarınıza güldükdən sonra başladığımız böyük işi təqib edirik. Sizə deyəcək sözümüzü Azərbaycan kişilərinin bu məsələində xülasə edirik: "Cücəni payızda sayarlar" (30, №21, 1945).

**Cülbəndin fikrində olmaq** - şəxsi mənafeyi, millətin, ailənin, dostun taleyindən üstün tutmaq.

Kim bu bədbəxt ümmətin zikrindədir,
Hər kəs öz cülbəndinin fikrindədir (168, s.189).

**Cürüldəşmək** - iki nəfərin bir-biri ilə gizlicə qərar qoymaları.

**Cüyut** - yəhudilərə deyilir. Burada həddən artıq pul sevən, qan soran, alış-verişdə bacarıqlı adama işarədir.

O savadsız idi, ancaq ticarəti çox yaxşı bilən adam idi. Ona görə də həmkarları ona Cüyut İbrahim deyərdilər (55, s.202).





## - Ç -

**Çadra altından boğma çıxartmaq** – üz-üzə danışmaq cürəti olmamaq.

"Ayəndə" məcəlləsinin 9-10- cu şümarəsi çapdan çıxıb satışa buraxılmışdı, nə səbəbdənsə doktor Əfşarın köhnə əfkarı təzələnib iyirmi beş il bundan qabaq hansı əfəndinin isə ona nə dediyini yadına salıb bəd əz xərabeyi bəsrə çadra altından boğma çıxartmağa başlamışdı (30, №22, 1945).

**Çadrasızlıqdan evdə qalmaq** - şərait, mühit yaranan kimi başqa adamlar görən işi ondan da görmək olar.

**Çağır gəlsin dən Koroğlu!** - bir işi boynuna götürdünsə, gərək onun bütün çətinliklərinə dözəsən.

**Çağırılmamış qonaq** - siyasi mənada bir ölkəyə təcavüz etmək, işğal etmək.

Başımıza atəş və pul ilə göndərilən çağırılmamış təzə qonaqların çoxunu biz tanırıq. İmtahan olunan bir işi daha imtahan edənlər peşimanlıqdan başqa bir nəticə əldə edə bilməzlər (246, s.159).

Gülsabah- biz çağırılmamış qonağıq, desəniz də gələcəyik, deməsəniz də (72, c.III, s.88).

**Çağırılmış bayatı** - dəfələrlə təkrar olunmuş söz.

Şura Azərbaycanının Elmlər Akademiyasının 1945-ci ildə Təbrizdə çıxan "Azərbaycan dili"ndə belə yazır: "Guya azərbaycanlıların monqol istilasından sonra türkləşdikləri haqqındakı boş boğazlıqları da təzə bir şey deyildi, bu çağırılmış bayatıdır".

**Çaxırı çaqqalın boğazına töksən, canavarı basar** –içən adam özünü əldaha bilər, ağlını itirər.

Çaxırı çaqqalın boğazına töksən, canavarı basar (9, s.14).

**Çaxnaşmaq** - qarışıqlıq, bir-birinə dəymək.

Siyasi iqtisadi narazılıqlar nəticəsində kütləvi etirazları bu sözlə ifadə edirlər.

Büzür xan: Yenə də bu şəhrə çaxnaşma düşüb, küçələrdən keçmək qeyri-mümkündür, saat qabağı, alaqapı meydanı, hər yer nümayişçilərlə doludur (302, s.19).

**Çaqçuq eləmək –** birtəhər dolanmaq, baş girləmək.

Onlardan mən də çaq- çuq eləyirəm axı (9, s.147).

**Çaqqaldan çox çarıq aparan olmaz, yenə ayaqları yalındır -** özgənin pulu, əməyi ilə xoşbəxt yaşamaq olmaz.

**Çaqqal tülküdən betərdi -** tula itdən murdar.

Nəzərə aciz gələn adam daha təhlükəli olur.

**Çaqqal var baş qoparır, qurdun adı bednamdır -** zahirdə yazıq görünən adam bəzən çox təhlükəli görünən adamdan da təhlükəli ola bilir.

**Çalağan quş -** zirək, əlli ayaqlı adam.

**Çalıb çağırmaq -** dil tapmaq, sakit danışmaq.

**Çalı bəzəmək -**yazın gəlməsinə ağac bəzəmək və burada oyunbazlıq mənasında işlənir.

İlin axır çərşənbəsi və bayram günləri evləri bəzəməkdən ötrü kövşəndə qışda qurumuş çalıları (gildik budağının qurusu) evlərə gətirib onlardan müxtəlif quru meyvələr asıb (məsihilərin küknar ağacını bəzəməsi kimi) bəzəyərlər ( 123, s.89).

**Çalı tikanı -** dili acı, başqalarına əziyyət verən

**Çanağından çıxmaq -** tısbağa qınından çıxdı, qınını bəyənmədi. Əslini-kökünü danmaq, ata-anasını, çıxdığı ocağı bəyənməmək.

Üç ay o yanlarda oxudun deyə,
Nə tez çanağından çıxmısan çölə? (265).

**Çanaq başında çatdamaq / sınmaq –** günahı mənim boynuma salma.

Axırda bizim başımıza vurdu çanağı,
Su başdan aşdı ( 267, s.17).

Ara yerdə çanaq o yazığın başında çatladı (72, c.III, s.49).

**Çanaq bizim başımızda sınmasın –** xata- bala bizim boynumuza düşməsin.

**Çapçı** - yalan danışan.

**Çar-çək qalmaq -** əlacsız, naçar qalmaq.





Nikolay zülm eylədi, buldu cəzasın aqibət,
Gör necə zindanda qalmış çarü-çək, ey Vilhelm! (301).

**Çardərədə fit vurmaq -** hoqqabazlıq etmək, fürsətdən sui-istifadə etmək.

**Çarığın əsirgəməyən patavasını da qoyar üstünə -** bir zadını verən hər zadından keçər.

Çarığın əsirgəməyən patavasını da qoyar üstünə (103, s.68).

**Çarıqlını mən bəyənmirəm, çəkməli də məni bəyənmir —** bir qız gələn elçilərə getmək istəmədikdə belə deyir, yəni məni almaq istəyənləri mən bəyənmirəm, mənim bəyəndiklərim isə məni bəyənmirlər.

**Çarşab corab etmək –** hazırlaşmaq.

**Çarvadar ev olmaz, qonşunu dərd öldürər-** paxıl qonşu elə bilər hər gedən gələnin başından pul yağar, əslində elə deyil. (Fərəh)

**Çaş-baş -** özünü itirmək, hadisələrdən baş çıxarmamaq.

Mirzə Cəlil çaş-baş qalmışdı, ona elə gəlirdi ki, atlı zarafat eləyir ( 301, №110, s.9).

Yüz illərlə ermənilərdən "Allah saxlasın!" eşidən müsəlmanlar bu açıq, birdən-birə söyüş, irz-namusa toxunan əməlləri eşitdikdə, və yaxud illər uzunu evlərində mehman olduqları erməni kirvələrindən qarət və qətl görüncə çaş-baş qalmışdılar (232, s.90).

**Çatını boynuna salmaq -** girə salmaq; əsir etmək.

Əlli il sinəmiz üstə çapıbdır atını,
İndi amadədir el, boynuna salsın çatını ( H.Tərlan, s.27).

**Çaya susuz aparıb susuz gətirmək –** birini səfeh yerinə qoymaq.

- Onları suya aparıb susuz gətiriblər (9, s.37).

**Çaydan keçəndə ağla qara bəlli olar -** əməl vaxtı, işə gələndə kimin nəyə qadir olduğu bilinər.

Çaydan keçəndə bəllənəcək qarəsi, ağı (168, s.35).

**Çaydan keçəndə böyür böyürə dəymək -** uzaq qohum.

**Çay görməmiş çırmalanma -** boş yerə əl-ayağa düşmə.

Çırmanırıq keçməyə çay gəlməmiş,
Başlayırıq qızmağa yay gəlməmiş (267, s.224).

**Çay quşu çay daşı ilə vurular** - ağacı öz içindən qurd yeyər. Ailəni, ya bir milləti onun öz içindəki xainlərin əli ilə sarsıtmaq olar.

**Çay pəhləvanı** - keçmiş həyatdan təkcə çay xatirəsini diriltməyə çalışan kəndlilər.

Kənddən qaçanların keçmişlərdən təkcə bir dəryan çayı yadlarında qalıbdır. Çay pəhləvanları ( 203).

**Çay pulu** - hər bir vətəndaşda vətən sevgisini öldürən bir xəstəlik; Bu xəstəlik müxtəlif zamanlarda "bığ yağı", "görmək", "rüşvət", "hörmət" və "çay pulu" adları ilə özünü göstərmişdir.

Məmur tutanda səni, ver rişvə xilas ol,
Ver çay pulu, qurtul! (168, s.305).

**Çeşni çıxartmaq** – yalandan təzə bir şey icad eləmək, oynamaq.

- Çeşni çıxarmaqlıq xeyli pis əlamətdir, əzizim! ( 253, s.7).

**Çezmək** - ölmək, uğursuzluğa düçar olmaq, rüsvay olmaq, siyasi mənada xalqın ayağa qalxması nəticəsində yenilmək.

İftixar eyləyə şah gərək bizə,
Eşşəklər düşünsə, şah gərək çezə! (Nəccaroğlu, Dördüncü dəftər, s.17).

Təbrizdə Hitler Almaniyası tərəfdarlarından biri var idi, onun "alman çezdi" sözü ən həssas yeri idi. Bu sözü dilinə gətirən adamı öldürməyə belə hazır idi.

**Çək-çevir** – sınamaq.

O taydan qəbir şəkli gətirdik, bu tayda kommunist Sultan Əmirlini, Mədəd Əmirlini çək-çevirə salırıq (142, s.11).

Canım bir qızın özündən soruşsanız, bu işi çək-çevirə nəçin salmışsınız?( 46).

**Çəkiş bərkiş etmək** - bir zadın üstündə israr etmək; bihudə vaxt tələf eləmək.

Tapdalanmışlar çəkiş-bərkişlərin məğlubudur.
İndi yoxsulluq zaman böhranlarından aslanır (231).





**Çək qəmişin** - məndən əl çək, faydasız işdən, sözdən əl çək.

Ver nişan millətə, İranda əgər vardır işin,
İndi ki, yoxdur işin eyləmə zor, çək qəmişin! (301, s.71).

**Çəmbər bığlı** - yekə bığ.

İndi artıq heç bir şübhə yeri qalmadı, o çəmbər bığlı gənc Validən başqa kim ola bilərdi? (M.Hüseyn).

**Çəm-xəm etmək** -nazlanmaq, başqalarını öz gözlərini süzdürmək və yerişi ilə yandırıb yaxmaq.

Bəsdir, öldürməyəcəksən gözəlim dünyanı,
Hər üzü göyçək olan da bu qədər çəm-xəm elər?

Eyləyir çəm-xəm,
İşləri mübhəm (72, c.III, s.308).
Bundan irəli, tüksüz uşaq nazə qoyurdu,
Səqqəllilərin çəm-xəmi də təzə çıxıbdır (250, s.63).

**Çənə atmaq** -çox danışmaq, can vermək.

**Çənəbazar** - sözləşmək, bəhs etmək, hakim mövqedən danışmaq.

Bura sənin dükanın deyil, çənə bazarına çıxasan (129).

**Çənə-boğaz** - uzun müddət mübahisə etmək.

Çox çənə-boğazdan sonra axırda Alı kişi ustanı razı elədi ki, daşı zindan üstünə qoyub döysün (174, s.14).

Kəndlilər ilə çənə-boğazdadır (72, c.III, s.38).

**Çənədən saz** – çox danışan.

Maşallah, deyəsən bu da çənədən sazdır (9, s.157).

**Çənədən saz, ağıldan az** - düşünmədən, boş - boşuna çox danışan adam.

**Çənə işlətmək** – çox danışmaq.

Erməni-müsəlman davasının qızğın zamanında din və millət düşmənlərinə qarşı, ingilislərin əleyhinə qabaq Quba meydanında, Kömürçü bazarında o Cəlil Naim əfəndi düz saat yarım çənə işlətmiş və bütün bazar camaatının qəlbində böyük bir həyəcan törətmişdi (254, s.9).

**Çənəmin çüyü çıxıb** - çox demişəm, çox təkrarlamışam.

İclaslarda danışmaqdan çənəmin çüyü çıxıb (84, s.182).

**Çənəsi qızmaq** - həddən artıq danışmaq, başqalarına da imkan verməmək.

**Çənəsini boş qoymaq** - ağlına gələni danışmaq.

**Çənəsinin altına salmaq** – öyrətmək.

Çopur Abdulla onu salmışdı çənəsinin altına (1, s.290).

**Çənə yormaq** - boş-boş danışmaq, ağılsız adamı nəsihətlə yola gətirməyə çalışmaq.

**Çərçi** – xırdaçı.

Ə, sən nə çərçisənmiş, ə? (9, s.167).

**Çənginə almaq** – əlinə keçirmək.

Almış idim məmləkəti çəngimə,
Şahsevənin yol kəsənim hay, hay! (80, c.II, s.105).

**Çərxi çönmək** – işləri nəhs gətirmək.

Dağlar alır, nərə salır, nahaq kəsir dilləri,
Dəfi dönən, çərxi çönən çağı gözlə, gözlə son! (32, c.II, s.29).

Qurban deyər bəndəsindən bir xalıq üz döndərə,
Qurğusunu yana əyə, çərxini tez döndərə (32, c.II, s.54).

Mən nə deyim çərxi dönmüş fələyə,
Axır saldı məni olmaz kələyə (35, s.541).

**Çərlətmək** – vərəmlətmək, boğaza yığmaq.

Bilməm nə çarə eyləyim, ay Molla Nəsrəddin,
Çərlətdi lap məni bizim övrət, gavur qızı (267, s.136).

**Çərşənbə bazarı** - qarma- qarışıqlıq; lazım olan hər şeyin tapıldığı yer.

**Çərtmək** - sözü uzatmaq.

**Çətini eşşəyi körpüdən keçincədi** - öz işini aşırandan sonra heç kəsi saymaz.

Yekə şeytan əlinə noxtavı verdin, gördüm
Körpünü eşşəyi keçsə, bişirər yağlı bir aş (224, s.13).

**Çığırmağa dəyirman, öyünməyə yad ellər** – yad yerdə özünü öyən adam.

Çığırmağa dəyirman, öyünməyə yad ellər (335, s.91).





**Çıxıb ceyran dağına** - çox çətin olub, ələ düşmür , pul əldə etmək üçün də işləmək lazım idi.

Lakin iş hanı, iş çıxıb ceyran dağına ( 82).

**Çıxmayan cana nə qülvüllah** – bir iş sona çatmamış onun nəticəsindən danışmaq.

Çıxmayan cana nə qülvüllah (84, s.39).

**Çıxmaz ayın son çərşənbəsi- partlayan ayın on dördü** - qeyri-müəyyən bir zaman.

**Çırağını yandırmaq** -- bir adamın övladı olmaq, birinə yardım etmək.

Yəni məndən sonra heç kim dünyada,
Mənim çırağımı yandırmayacaq? (328, s.319).

**Çırağı sönmək** - xoş günlərini əldən vermək, yaman günə düşmək.

**Çıraq kimi yanır** - ümumiyyətlə, fərşə, xalıya gözəlliyini, rənglərinin aydınlığını bildirmək üçün deyərlər.

**Çıraq / mum öz dibinə işıq verməz** - bəzi adamlar öz yaxınlarına, öz ailəsinə yox, tanımadığı adamlara köməklik edərlər.

İşıq verməz heç bir zaman dibinə,
Şəmə ellər üçün yanar demişlər (Moci).
Çıraq hərgiz işıq verməz dibinə,
Bu vazeh, şah, pul qoymaz cibinə (147).

**Çıraq vermək** - işarə vermək; bir işə razılıq bildirmək, birinə şərait yaratmaq.

Əkinçiyə torpaq verdi, çörək verdi, çıraq verdi ( Sahirin çap olunmamış şeri).

**Çıraq yandırmaq** - insanın son nəfəslərində bir neçə anlıq canlanıb sonra ölməsi.

**Çırtıq vursan, qanı çıxmaz** – çox əsəbiləşib.

Şahzadənin sifəti qapqara olmuşdu, çırtıq vursaydın, qanı çıxardı (46, s.133).

**Çırtılmaq** - həqsiz olaraq məcbur qalıb bir quldura və ya dövlət adamlarına pul vermək.

**Çırtma vursan, qan damar** - çox əsəbi olmaq, dağda yaşayanların özü.

Eldar dünən bir halda gəlmişdi ki, çırtma vursaydın, qan damardı (84, s.121).

**Çırt-pırt** – boş, faydasız şey.

İndi hər nə teatra çırt oldu, pırt oldu, yaz, tök, camaatın qabağına (72, c.III, s.133).

**Çiban başı** - hər bir pis işin əsl səbəbi.

**Çiçəyi burnunda** - təzə gəlin, təzə evlənənlər. Ümumiyyətlə, gülü başında lap təzə dərilmiş xiyara deyilir.

**Çıçəyi çırtlamaq** - sevinmək.

**Çilik maça** - bir dəri, bir sümük.

**Çil toyuğun tək yumurtası** - əlindən bir iş gəlməyən adamın kiçik bir işi şişirtməsi.

Bütün toyuqlar yumurtlayır, səsləri çıxmır, amma çil toyuq bir yumurta yumurtlayanda qaqqıltısı aləmə yayılır (52, s.231).

**Çimirini almaq** – mürgüləmək.

Amma mən gözümün çimirini ala bilmirəm (9, s.82).

**Çinar** - çinar Azərbaycan ədəbiyyatında gözəllik, məğrurluq rəmzidir.

Bu gələn yaya bənzər,
Boyu çinara bənzər (24, s.154).

**Çinçavat** - çox təmizliyə diqqət edən, bir növ vasvası adam.

Qədim türklərdən olan bir tayfanın adıdır. Azərbaycanın cənubunda bu elin özündən ad qalmasa da deyim həmin adın nişanəsidir.

Türkiyənin İqdır bölgəsində bu adda bir köy var. Bu köyün adı Qıpçaq saka boylarından Çinçavat boyunun adından alınmadır. Özbəklərin mənşə əfsanələrində Həzrəti Nuhun oğlu Yafəsin oğullarından birinin adı Çinçavatdır (236, s.384).

**Çin divarı** - böyük maneə, tarixin hərəkətinin qarşısını almaq üçün hər işə əl vurmaq.

Rzaxanın meydana atılması ilə bizim döyüş cərəyanımız başqa yola düşdü, mətbuat fəaliyyətimizi Avropaya köçürdük.





Bu zaman müxtəlif yollarla qəzet və jurnallarımızı Rzaxan polisinin İran sərhədlərinə çəkdiyi Çin divarından keçirərək ölkənin daxilinə çatdırdıq (6, 15 Azər, 1322).

**Çinədanı boş** - düşüncəsiz, əlindən iş gəlməyən, biliksiz.

**Çinədanına yığmaq** - ürəkdə yığıb sözləri saxlamaq; söz ehtiyatı çox olan adam.

Anladım banlamağından,
Çinədanında nə var? (168, s.358).

Amma hər şeyi yığır çinədanına, hərdənbir dəftərinə də yazır (9, s.150).

**Çini qab yerə düşsə, sınmasa da səslənər** –ürək incimәsi iki dostun, yaxud ər arvadın ayrılığına səbəb olmasa da təsirsiz olmaz.

**Çiyin çəkmək** – boyun qaçırmaq.

Hökumətdən də soruşduq, hökumət də çiyin çəkdi (296, s.150).

**Çiyni başından uca durub** - Azərbaycanda soyuq olan zaman birinin paltarı az olanda təbii olaraq çiyinlərini yuxarı qaldırar. Üşümək mənasındadır.

**Çiynindən yük götürülmək** – bir məsuliyyətli işi sona çatdırmaq.

Həmid Hazıyevin yanından sakit gedirdi, ancaq elə bil çiyinlərindən ağır yük götürülüb, ürəyinin üstünə qoymuşdular (1, s.162).

**Çiy söz** – düşünülməmiş söz.

Çiy söz söyləyənləri çiy adam çağırın ( "Elimizin söz sərvəti").

**Çiy süd əmmək** - insanın etibarsızlığına işarədir.

**Çoban çox olanda qoyunu qurd yeyər** - iş bir adama etibar olunanda onun məsuliyyəti də çox olar.

**Çoban -çoluq** - yoxsul, kasıb, savadsız, zəhmətkeş. Təhqir mənasında işlənir.

Çoban -çoluq yardımı mənə gərəkməz. (M. Rzaquluzadə).

Vəzir, çoban çoluq məclisidir bu? (S.Vurğun).

Erməni və müsəlmanlar burasını bilməlidirlər ki, hər səmtdə lənətə layiq görülmüş bir sıra çoban-çoluq vuruşması, şəxsi-qərəzi ya.. naminə baş vermiş oğurluq və cinayət əməllərinə bu əsərdə qətiyyən yer verilməmişdir (232, s.6).

**Çobanın sovqatı bir dəsmal mırçalıqdır** - mırçalıq fındıq boyda dağ şalğamıdır. Yarpaqları pəncə kimi, rəngi də tusidir. Boş torpaq yerdə yazın əvvəlində olur. Üstündə qəhveyi qabığı var, onu çiy yeyirlər. Hər kəs öz gücü qədər birinə yaxçılıq edə bilər.

**Çox arpa atı çatladar** - bir adam həddindən artıq yesə, zərərini çəkər.

**Çox bilən çox çəkər** - qarğış kimi "bildiyin qədər çəkəsən" kimi işlənir.

Bir düşünən adam, başqalarına boyun əyməyib çətinliklərlə üzbəüz olar, ikinci mənası hiyləgər, başqalarına dolaşan adam qisas görər.

**Çox çaylardan keçmək** - başına çox iş gəlmək, həyatın isti-soyuğunu görmək.

**Çox deyib, az eşitmək** –sözü saymamaq

Ana çox dedi, oğul az eşitdi (148, s.117).

**Çox gülmə, güldanın atar** - cavanlar içində vaxtsız gülən adama belə deyərlər

**Çox hürən köpək qapınaz** - iş görən adam danışmaqla, çənə-boğaz olmaqla vaxtını keçirməz.

**Çox kötük üstə çox şiv doğranır / Çox küplər yanında çox küzələr sınıb / yatan ölməz yetən ölər**- cavan adam da qoca adam qala-qala vaxtsız ölə bilər. Burada kötük, küpə yaşlı adama, kuzə və şiv isə cavan adama işarədir.

Ağacda budaq quru,
Budananlar höyüşdü (328, s.81).

Çox kötüklər üstə çırpılar doğrayıblar (129, I, s.61).

**Çox yekə sıçıb, başından da dişlir** - günah eləməyi bəs deyil, qabaqdan gəlmişlik də eləyir.





**Çox yemək adamı az yeməkdən də qoyar / artıq tamah daş yarar, daş qayıdar, baş yarar– tamahkarın saqqalı müflisin götündə olar** -- tamahkarlıqdan zərər gələr.

Çox yemək adamı az yeməkdən də qoyar (9, s.48).

**Çolaq koru görəndə öz halına şükr edər** - insanlar özlərindən ağır vəziyyətdə olan adama baxıb təsəlli tapırlar.

**Çomaq-çoluya rast gəlmək** - yoxsulun yoxsula, yazığın yazığa rast gəlməsi

Keçəl başın nə dəvamı,
Şüşək salan doluya,
Qədim məsəldir: vəli,
Tuş gəlir çomaq-çoluya (168, s.444).

**Çöl dovşanı** - xoşagəlməz, qəddi-qaməti eybəcər.

Gəlin demə, çöl dovşanı,
Boyu quşbaz, koloşanı (quşbazların əllərində götürdüyü nazik, uzun ağac)(168, s.237).

**Çöl quşu, biyaban daşı** - pul qazanmaq, ailəni dolandırmaqla məşğul olan kişilərə aiddir.

Söz-sözə gələndə adına anam
Deyirdi: çöl quşu, biyaban quşu.

**Çöllərə salmaq** -- birinə aşiq olmaq, birini evsiz-eşiksiz qoymaq.

Çəkirəm həsrətini, mən yazıq bimara baxın,
Axır məni çölə salıb, eyləyib avarə, baxın. (32, c.1[, s32).

**Çöllərində ilan mələr** - quruluq, susuz yer.

**Çölüm özgəni yandırır, içim özümü** – baxan mənə həsəd çəkir, amma dərdim özümü yandırır.

Çölüm özgəni yandırır, içim özümü (9, s.171).

**Çömbəlməyincə hürəmmir** - qocalmaq, gücdən düşmək.

Kənddə daha bir hampalıq sürən yox,
İtlərdə də bir çömbəlib hürən yox.

**Çömçə qazandan istidir** – anadan mehriban dayə anlamındadır.

Çömçə isti olub indi qazandan
el ağzı-

Fal ağzı
Yaxşı deyirlər (328, s.301).

**Çöp altında dəyirman tikmək** – birinə quyu qazmaq, gizli iş görmək.

Sənə nə düşüb ay mürtəd oğlu mürtəd, girmisən meydana, çöp altında dəyirman tikirsən? (335, s.125).

**Çöp çöpə dəyəndə** - hər cırt başı, pişik asqırması.

Neçə il Həmədanda qalan bir adam çöp-çöpə dəyəndə deyirdi: Mən Həmədanda olanda yeddi kərdini birdən atılardım. Bir bilici adam dedi: Həmədan uzaq, kərdisi yavuq, buyur atlan, görək necə atılırdın (272, s.11).

**Çöpə dəyməz** - dəyərsiz.

Mülk ilə malü-səltənət, bir çöpə saymaz, ey sənəm,
Kim ki dilər vüsalını, ya tələbi camal edər (225, s.228).

**Çöpə dönmək** - arıqlamaq, zəifləmək.

Deyirəm ey ana, sən deyən olsa,
Onda mən indi bəs lap çöp olmuşam (Ə.Miyanalı).
Millət qəmi olsa, bu cocuqlar çöpə dönməz (306, s.68).
O gördü bir çöpə dönmüş bədəni,
Yaralı ürəyim yorğundur mənim (146).

**Çör-çöp kimi olmaq** - dəyərdən düşmək.

Qismətimizi çör-çöp kimi tullar üzə daim,
Murdarını qəlbində vəli gizlədər ümman (115, №5, s.64).

**Çörək atlıdır, o piyada /Özü yayan, əkmək atlı** - nə qədər çalışsa da, pul qazanmağın yolunu tapa bilmir.

**Çörək ağacı** - yaşamağı, güzəranı təmin edən bir peşə.

Mədən müdiri: axı mədən sizin çörək ağacınızdır (M.Hüseyn).

Şerdən becərməz çörək ağacı
Bitsə də şerdən bağçalı bağlar! (113).

**Çörəkdə duz yoxdu, qorxma** - duz müqəddəs sayıldığı üçün nankor adama deyilir.

**Çörək itirən** – haqq- salamı, yaxşılığı tapdalayan.

Bəs nə üçün kor oldun, bu qədər nankor oldun,
Çörək itirən oldun ( 265).





**Çörəkli** -çörəklidir, qacar clıdır, varlı-karlı və əli açıq adamdır.

Əlində qara təsbeh, mal üstə çörək qoyub
Çörəkli diyənlər kimi bir-birinə düyünləyirdin.
Bəlkə bitsin bu sövda, gün xərcinə çalışırdın (94).

Bəzi fırıldaqçı adamlar satdıqları şeyin üzərində çörək qoyaraq onun qazanc gətirən, "çörəkli" olduğuna müştərini inandırmaq məqsədilə: "Əbülfəz haqqı, bu satdığımın çörəyi var" deyib and içərdilər.

**Çörək quru, ayran duru** – kasıb süfrəsi.

**Çörək yeyəndə pişiyin gözünü bağlayır** - çox xəsisdi.

**Çörəyə bağlanmaq** –yediyi çörəkdən utanmaq.

Sonra çörəyə bağlanarıq, aradan iş çıxar ( 295, s.140).

**Çörəyi basmaq** – nankorluq.

Səni nə vadar etdi ki, mənim verdiyim çörəyi basıb Fəzlüllaha uydun?(144, s.117).

**Çörəyi baş altındadır** - xəsis, varlı- karlı, şanslı adam.

**Çörəyi burnuna yeməmək** – mənim də təcrübəm var.

Burnumuza biz də yemirik çörək,
Hər nə deyirsən deginən tez görək (9, s.124).

**Çörəyi daşdan çıxmaq** - çox çətinliklə çörək qazanmaq.

Bağışla çiçəyim mənim,
Ömrüm, əməyim mənim,
Neyləyim çıxır daşdan
Bir tikə çörəyim mənim ("Muğan").

**Çörəyi diz üstədir** – haqq - say itirəndir, xəsisdir.

Balağa kimi çörəyi dizinin üstündə olanlar ayağımızın altını qazırlar (1, s.161).

**Çörəyi qulağımıza yemirik ki?!**- biz də çox şey bilirik, məni səfeh yerinə qoyma

Biz qağa, çörəyi qulağımıza yemirik, ağzımıza yeyirik...(84, s.84).

**Çörəyin ağızda böyüməsi** - iştahasızlıqdan və ya xəstəlikdən çörəyi yeyə bilməyən, çörəyi uda bilməyən.

**Çötkə çıxarda bilməyən hesab** - hədsiz sərvət, sümürgəçilik və yoxsulların varını mənimsəməklə toplanan sərvət.

Bir iddə olub naz ilə nemətlərə sahib,

Çötkə çıxadammır, bu qədər nemət olarmı? (95, c.III, s.648).

**Çubuğuvu çəkəcəklər** - sənin də hesabına yetişəcəklər.

**Çul-çapıq** – indi "çul –mul" formasında işlənir.

Bərkə qoyduq çul-çapığı soyuna,

Çit arxalıq yaraşırdı boynuna (Ağdabanlı Qurban).

**Çulunu sudan çıxartmaq** - özünü idarə etmək, müstəqil yaşaya bilmək.

Mən öz çulumu sudan çıxara bilmirəm, gedib Moskva teatrı ilə kəlləbəkəllə gələcəyəm? (72, c.III, s.106).

**Çulu yırtmaq** -- qışqır- bağır salmaq, atılıb düşmək.

Atılıb-düşmə cocuq, yırtma yalandan çuluvu,

Biri öz oğlunu evləndirir, oğlan sonə nə? (168, s.258).

**Çünki oldun dəyirmançı çağır gəlsin dən Koroğlu** – bir işə əl vurdun, gərək arxasınca gedəsən.

Bu məcburi zarafatı yarımçıq qoymaq olmazdı "çünki oldun dəyirmançı, çağır gəlsin dən Koroğlu"(84, s.183).

**Çürük çarıq** - dərdə doymoyən.

**Çürükçü** – xırdaçı, bir şeyi dönə-dönə təkrar edən.

Biqəm- Çürükçü oğlu çürükçü. Elə oğlu da özü kimi xostərəngiyə oxşayır (9, s.166).

**Çürümək** – ömrü boşuna puç olmaq.

Düşmənləri ömürləri boyu Bağdad zindanında çürüyəcəklər (144, s.162).





# -D-

**Dabana qüvvət** - var qüvvə ilə bir xətərli yerdən qaçmaq, bir işin dalınca getmək, aradan çıxmaq.

Tələbkarı görəndə dabana qüvvət gərək ( 340, s.13).

**Daban almaq** - yola düşmək.

Abbas daban aldı Tufarqana yol elədi (11, s.54).

Elə ki, onlar yuxuya getdilər, qoruqçu daban aldı Aslan paşanın yanına ki..(174, s.95).

**Dabanbasma** – dalbadal, təqib edərək.

Qədim ənənəyə görə, türklər başçı seçmək üçün bir inək öldürüb bir yerdə şərab, bir tərəfdə isə çörək qoyar, çörəyi şəraba batırıb and içər, ayaqlarını inəyin dərisinə basmaqla bir məsələdə həmfikir olduqlarını bildirərdilər. Buna dabanbasma deyərdilər. Cavidanın ölümündən sonra Babək bu ənənənin icrası ilə başçı seçilmişdi.

Arxasınca dabanbasma çaparaq Ərəb Reyhan Koroğlunu izləyir (174).

**Daban əlli altı** - tez aradan çıxan.

**Dabanı çəkik** - lotu, qabağından yeməyən.

Təbriz şəhəri məşrutiyyət dövründə 18 məhəlləyə bölünmüşdü. Məşrutədən qabaq hər məhəllənin lotusu, təbrizlilərin dilincə, dabanı çəkiyi o biriləri ilə düşmənçilik edərdi.

**Dabanı qızmaq** - şənliyə, oynamağa amadə olmaq.

Hacı Hüseynin elə qızdı dabanı

Olmadı zərb çalıb aftafanı (168, s.532).

**Dabanına tüpürmək** – qaçmaq.

Bu adam dabanına tüpürüb aslanla Arifgilə getdi (46, s.193).

**Dabanı yağlamaq** - uzaq bir səfər üçün hazırlaşmaq, yürümək.

**Dabanqırma/ dabançəkmə gəlmək** - tələsik bir yerə getmək.

**Daban seyrinə çıxmaq** - Bir yeri dolanmağa çıxmaq, gəzmək.

Ruzun yetişmiş olsa, bəli deyib dükanı bağlardın, birlikdə qələeyi-Müzəffərin Ələştər ətrafına daban seyrinə çıxardıq (Gəncəli Səbahi).

**Dadanmısan dolmaya, o da bir gün olmaya** - rahat yaşamağa, gəlirə öyrəşmisən., olmasa neyləyəcəksən.

Axşamlar restoranımızda orkestr çalır və müğənni "Dadanmısan dolmaya, o da bir gün olmaya" mahnısını məharətlə ifa edir (9, s.48).

**Dağ adamı** -vəhşi, şəhərin qayda-qanununa boyun əyməyən, zəhmətkeş, mənəvi cəhətdən saf.

Əzizim dağ adamı,
Yandırır yağ adamı,
Olasan aran iti,
Olmayasan dağ adamı.

**Dağa-daşa düşmək** – avara düşmək, lazım olan adamı, şeyi qoyub avara gəzmək.

Gülyanaqovu qoyub dağa-daşa niyə düşmüsüz? (9, s.23).

**Dağa- daşa salmaq** - mətləbdən yayındırmaq, incitmək.

Mən ölüm, əgər burda düzələnsə, bizi dağa-daşa salma (84, s.33).

**Dağ anası** - çox iri və xoşheykəl qadın.

**Dağarcığını boşaltmaq** - ürək sözlərini danışmaq.

**Dağarcığın siçana sarı yeriməsi** – qat-qat güclü bir adama zəifin meydan oxuması.

-Səfərəli: Siçan dağarcığa doğru yeriməkdən, dağarcıq siçana doğru yeriyir (122, s.40)

**Dağa vurmaq** - hakimlərin, quldur məmurlarının qorxusundan dağlarda yaşamağa məcbur olan adam.

**Dağ başına qış gələr, igid başına iş** – hər cür çətinlik, fəlakət də insan üçündür.

Dağ başına qış gələr, igid başına iş (148, s.72).

**Dağ boyda** - ən böyük, ən ağır, ən dəhşətli-həm mənfi, həm müsbət mənada işlənir.





Dağların dağ boyda dərin yası var,
Gülü açılmamış solan yazı var.

**Dağ çəkmək** – yara vurmaq.

Aşiqəm köhnə dağı,
Gəzirəm köhnə dağı,
Təzədən bir dağ çəkdin,
Unutdun köhnə dağı (59, s.122).

**Dağ dağa rast gəlməz, adam adama rast gələr** – dünya elə böyük deyil, adam itirdiyini tapar, arzusuna çatar.

İnşallah, bəlkə yenə görüşdük, babalar yaxşı deyib: dağ dağa rast gəlməz, adam adama rast gələr (9, s.76).

**Dağ-dağ eləmək** - yandırmaq, od vurmaq.

Aşıq dağ dağadımı,
Dügün daş dağadımı,
Sənin zarı baxışın
Eylər dağ-dağ adamı (59, s.111).

**Dağ da mənə qaldı Şeydayi, bağ da mənə qaldı Şeydayi** - ürəkdə həsrətin qalması; bir iş yolunda çalışmalarım hədərə getdi (Mirzə Fəzləli ağa Təbrizi, s.30).

**Dağ gövdəli** - cüssəli, qədd-qamətli.

Dağ gövdəli hansı igid, hər savaşın sonunda
Babək kimi, Koroğlu tək bığlarını eşmədi? (264, s.76).

**Dağı dağ üstə qoymaq** - böyük işlər görmək.

Guya ayrı günlər dağı dağ üstə qoyurlar (84, s 101).

Çox başı aşağı yoldaşdır, amma işdə də od-alovdur, zalım oğlu dağı dağ üstə qoyur (9, s.161).

**Dağı-daşı yandırmaq** – nalədən, ahdan hamıya təsir qoymaq.

Qızıl yüzüyün qaşı,
Yandı bağrımın başı,
Mən deyən yar olmasa,
Yandırram dağı daşı (59, s.166-167).

**Dağ kimi dalında dayanmaq** – birinə var qüvvəsi ilə arxa durmaq.

Dağ kimi dayanmışıq dalında, get Həzrət Əli sənə kömək olsun (1, s.21).

**Dağlar sultanı –** canavar.

Çillənin süd gecəsində dağlar sultanının yerikli dişlərindən necə qaçsın insan?

**Dağlar ucalıb, ya filankəs qocalıb** - biri qocalığını boynuna almaq istəmədikdə işlənir.

**Dalağım sancdı** - bir şeyin ürəyə damması, hiss eləmək

Düzü, burdaca dalağım sancdı, gördüm ki söhbətə qıraqdan qulaq verən möhtərəm Mirzə Cəlilin də ovqatı təlx oldu (253, s.14).

**Dalaşanda barışmağa üz saxla** – acıqlananda ürəyivin zəhərini tökmə, bir gün barışa bilərsən.

**Dal ayağı ilə qulağını qaşıyır** -asan yolu qoyub dolayı yolla iş görür.

**Dalbadal, dabanqırma –** bir adamla dalbadal getmək.

Bir-birinin ardınca qatarın hər bir ta-ta-ta səsindən elə bil qaranlıq qapı açılırdı. Sonra o birisi, sonra o birisi, dalbadal, dalbadal, dabanqırma (203, s.4).

**Daldan atılan daş topuğa dəyər** - sonrakı peşimançılıq fayda verməz. Vaxtında deyilməyən sözün, görülməyən işin faydası yoxdur.

Tehran eşitdiyimizə görə əyalət və vilayət əncümənlərinin intixabatına başlamağa təşəbbüs edir. Bu çox gecdir. Artıq əncümən bizi təmin edə bilməz. Bu daldan atılan daş kimidir (246).

**Daldan xəncər vurmaq** -xəyanət etmək.

Etdi Sədat xəyanət, öz ərəb qardaşına,
Vurdu xəncər dalıdan, əhli-Fələstin başına (319, s.64).

**Dal gün** - gələcək üçün.

Dedi: bilirəm bunu, dal gün üçün nəyimiz var (264, s.61).

**Dalıdan xəncər vuran** -ikiüzlü, xain, zahirdə dost, əslində düşmən.

**Dalı qabağına keçməli deyil** - yaxşılığa, yamanlığa dəyər verən adam deyil.





**Dalınca qara goduş atmaq** - İran türklərinin mifik təfəkkürünə, inamına görə hər kəsin dalısınca əski goduş, saxsıdan düzəlmiş qab atsalar, o adam bir də o evə qayıtmaz. Və xoşu gəlməmək mənasındadır.

**Dalı qayımdı** - arxası möhkəmdi, güclü adamlara arxalanır.

**Dalına baxmadan qaçmaq** - ən ağır vəziyyətə düşmək.

Səhənd əsəri "Sargun"lara bac, İskəndərə isə torpağına ayaq basmağa yol verməmişdir. Onlar zorla azəri igidlərinin oxundan can qurtararaq dalısına baxmadan qaçıb canını qurtarmışdır (326, s.22).

**Dalına əl çalmaq** - birinə haqsız olaraq dayaq durmaq.

Hər ana ki, dalına çala biçarə qızın,
Aqibət evdən, uşaqdan edər avarə qızın (168, s.502).
Cavanlıq əlimdən gedəndən sonra,
Əl çalıb dalımca gülür bu dünya! (63, s.131).

**Dalınca qara daş –** qarğışdı. Bir adamın gəlməsini istəmədikdə deyilir.

Əcnəbi getdi qabaq, ay qəzetçi mənlik nə var?
Qoy gedir bir daş dalınca, bizlərə vardır nə ar? (72, c.III, s.230).

**Dalın qızması** -soyuqda şaxtada, boranda qalın paltar geyməklə, özünü günə verməklə özünü qızdırmaq. Arxayın olmaq, birinə arxalanmaq.

Karvançılardan biri soyuqdan amana gəlmiş idi. Heç bir iş görə bilmirdi. Sarvan deyər: Təbrizə yetişən kimi sənə bir qəba alacağam, indiki dalın qızdı, get işivin dalını tut ( Əli Əmirxizinin əlyazmaları).

**Dalıya qalan, doluya qalar** – bir adam vaxtında işini görməsə, daha ağır vəziyyətə düşər.

Dalıya qalan, doluya qalar (103, s.68).

**Damağın çağ olması/ damağı saz –** kefi kök olmaq.

Əhvalımı pozmayın,
Damağım çağ olanda (264, 132).
Keflər duruldu, damaqlar sazaldı (174, s.55).

**Damaq olmaq-** kefi pozulmaq.
Qara unun xəngəlindən qonağın,
Biri yeyib, onu damaq olubdur (275, 2-ci cild, s.334).
**Damara batmaq** - qəbul eləmək, xoşlamaq.
**Damarı boş** - yola tez gələn, dilini tapmaq.
Boş damarından tutdum-ürəyini ələ gətirdim.
**Damarına düşmək-** cin atına minmək, sözünü geri götürməmək.
**Damarına görə qan almaq** – hər kəsdən imkanına görə ummaq.
Axı qurban sənə, hacı Ağa, bircə mətləb burasındadır ki, hərənin öz damarına görə qan alırlar (195, c.II, s.145).
**Damarları yoğunlamaq** – çox vaxt işləməyib müftə yemək nəticəsində hər işə boyun əyməyən, tənbəl.
**Dambıraqçı** - Azərbaycan musiqisində balaban və ya zurnaçalanın yanında durub musiqinin ahənginə baxmadan ağzı ilə nazik bir səs çıxardana züy tutan, yaxud dambıraqçı deyirlər.
Belə nəzərə gəlir ki, Təbrizdə işlənən dızqıraqçı deyimi bu züytutanla bir məna daşıyır. Xalq arasında yekəxana, boş yerə özünü öyən mənasında işlənir.
**Dam dirəyi** - yekəpər, uca.
**Darana almaq** – bac almaq.
Qaranlıqdan alır darana telin,
Çaylıya xoş gəlir darana telin (88, s.56).
**Danabaş** - qanmaz, geriçi, mövhumatçı.
Danabaş, boynuyoğun vəsləli, pişanı öküz,
Hamının söhbətini bir-birə həzyan gördüm (H.Ç.Xəmseyi).
İşləri yaşdı qoymayın,
Lap danabaşdı, qoymayın (267, s.50).
**Danışıq dananı qurda verər** – çox boş danışmağın faydası yoxdur.
-Mən getdim, ay Fuad, danışıq dananı qurda verər, burda xeyli ləngidim (1, s.379).
**Danqazlanmaq** - özündən böyük danışmaq, böyük adamın hörmətini saxlamamaq.





Çəkmə yüzə, bəlkə çıxaq bayrama,
Bu yerə batmış görürsən danqadır (168, s.35).
Danqaz qayaları dibdən qoparaq.
**Danzelinə deyil** - vecinə deyil.
**Danzelinə sarımaq** - ələ salmaq, heç nəyə əhəmiyyət verməmək.
Başqa sözlə, Kazım sillə ilə üz qızardır, amma sənin nə danzelinədir, öz əlindir, öz qarnın, başardıqca daraş kababa (259, s.225).
**Dara çəkmək** – öldürmək.
Ala gözlərinə mail olmuşam,
Günahkaram, çəkir dara zülflərin (32, c.II, s.11).
**Dar ayaq** - çətin gün.
Vədə çatdı, fəqət yenə dar ayaqda (V.Rüstəmzadə).
Zənnimdə yanılmıramsa, dar ayaqda Fatmanın da köməyi dəyər (144, s.158).
**Dar-düdük** - həddən artıq dar.
**Dargöz** - xəsis, qıtmır, dünya malına bağlı olan.
Saqın alçaq dilək, dargözlərə ey xacə, yalvarma,
Niyazın nazəninlərdən dilə, möhtaca yalvarma! (231, S.29).
**Dargöz ələkdən keçmək** - sınaqlardan çıxmaq, ağır vəziyyətlərə dözmək.
Keçmişəm ağ un kimi dargöz ələkdən, zahida
Dini pakə etmişəm iman, zahida (69, s.50).
**Dar gün** – ağır gün.
Zikr eylə dilində mərdlərin pirin,
Qorxma dar günündə yar olacaqdır (32, c.II, s.19).
**Dar günün ömrü az olar** - yaman günün ömrü az olar.
Dar günün ömrü az olar, acısı çox (145, s.168).
**Darğan günü** - Azərbaycanda darğan günü toy-düyün və şadlıq günü deməkdir. Qışın son günü və mübarək yazın gəlməsi Zərdüştə inananların gəhanbar bayramlarından biri sayılırdı.
Bu kiçik çilləni darğan gününün sübhü boyunca,
Sənə bir toy tutaq ancaq gülüşək, yazlı toyunca.

Çapdıraq qaşqa, yəhərli atı meydanda doyunca ( "Muğan", s.23).

**Darıya da qabı var** - çox əskik surətdə xalqı talayan, rüşvətxor.

**Dar köynəkdən qurtulmaq** - hamilə qadının azad olması ( Tahirə Səbbağ).

**Darvazanı bağlamaq olar, xalqın ağzını bağlamaq olmaz** - qədimi şəhərlərdə darvazanı bağlamaq çox çətin imiş, xalqın ağzını bağlamaq ondan da çətin sayılır

Şeyx Bəhaəddin Şah Abbas dövrünün məşhur filosofu və memarı idi. Allahverdixan vəzirlə də çox yaxın dost idi.

Səfəvi türkləri İsfahanı paytaxt edəndən sonra orada böyük bu günə qədər qaklan abidələrin çoxunu yaratmışlar. Şah məscidinin layihəsini Şeyx Bəhaəddin çəkib və özü də orada bənnalıq edibdir. Günlərin bir günündə Şah məscidini düzəldən zaman oradan bir fanatik arvad keçir, məscidin minarələrinin tikilməsinə dayanıb baxır, baxır görür ki, şagird kərpic atır. Şagirdi çağırır, deyir ki, bu nədir əyri allah evi tikirsiz? Bənna şagird narahat olub deyir, kəs haramzadanın biri, bu minarədir, nə əyrisi. Arvad yenə deyir ki, bu əyridir. O deyir bu deyir, axırda ustanı çağırmalı olurlar. Usta gəlir, baxan kimi arvadın çerigöz (çəpgöz- B.H.) olduğunu görür, deyir niyə minarə niyə əyridir? Şagirdinə bir şapalaq vurur ki, arvad deyir minarə əyridir, niyə mənə demədin? Arvadı danışdıra-danışdıra onun yerini dəyişir ki, gəl bu minarəni itələyək düzəlsin. Soruşur ki, düzəldi ya yox, arvad deyir, hə düzəldi. Arvad bunlara dua edə-edə gedir. Sonra şagirdindən şillə vurmağa görə üzr istəyir və deyir ki, belə etməsəydim, bu məscidin adı şah məscidi, yox, bəlkə əyri məscid qalardı. Çün darvazanı bağlamaq olar, elin ağzını bağlamaq olmaz (prof. Ə.Minayi).

**Dastan demək** - yalan-palan demək, boş sözlər.

Dedi tez yıxdırın Ərkin qalasın,
O şahlar qondaran zülmün binasın.
Əgər səngər olubdur bir zamanlar,
-Bizə mərbut deyil bu dastanlar.





Teatra ümmətin yoxdur niyazı,
Behişt almaq gərək yıx, qıl namazı (Dəmirçi).

**Daşa çalmaq** – arzusu gözündə qalmaq, aradan aparmaq, yoxa çıxartmaq.

Bağrım başın fələk nə çaldı daşa
Yazılanlar gəlir bu qərib başa (35, s.537).
Əşyaimi mayasına satdım,
Bir qədrinə balü-qaymaq aldım,
Sərmayəni yəni, daşə çaldım (Şükuhi).

**Daşa dəyib başa çıxmaq** - bir həyatın, bir varın, dövlətin yoxa çıxması, əldən getməsi.

Adamı danlayan yollar da tapılar,
Yaxşılıq bir içiboş yuxu təkin yoxa çıxar
Adamlıq daşa dəyib, başa çıxar (203 ).

**Daşa dönmək** - qarğışdır və türk əsatirində çox zaman insan daşdan yaranır və daşa dönür. Məcazi mənada daşa dönmək dünyasını dəyişməkdir. Dilsiz-ağızsız tərpənmədən bir yerdə durmaq. Ürəyində mərhəmət olmamaq, hissiyyatını əldən vermək, tərpənməmək, bir yerdə lal-kar oturmaq, insana məxsus insafı, sevgini əldən vermək.

Dünən nəfəsilə səni isidən
Bu gün buza dönüb, daşa dönübdür (328).
Bu dağlar meşə dağlar,
Gülü bənövşə dağlar,
İstirsən bir ah çəkəm,
Dönəsən daşa dağlar! (59, S.147).
Oxumaqçın nə qədər dadü -fəqan etdimsə,
Omadı zərrə əsərbəxş şu istimdadım.
Dağa dersən eşidir, sonra verir əks-səda,
Daşa dönmüşlərə əks eyləmədi fəryadım (Məhəmməd Hadi).

**Daş ağırlığı var** - səndə də günah var.

**Daş at, qolun açılsın** - əlindən gələni əsirgəmə, işi olmayan adama tənə kimi deyilir.

**Daş atmaq** – birinə sataşmaq, yükünü çiynindən atmaq, öcəşmək, haqsiz olaraq ilişmək.

Çiynindən atma daşımı,
Dizinə qoyum başımı,
Bir daş ilə göz yaşımı
Gözlə, silib gələcəyəm (V.Səmədoğlu).
Biz bir ömr məst eylədik bir məscidə daş atmadıq,
Ta ki, fürsət tapdı zahid, bağladı meyxanəni.

Hər dərədə min dev düşmən oldu mənə, nahaq, nacins deyib daş atdılar, ruhumu əzməyə çalışdılar (144, s.75).

**Daş çatlasın** - ən yuxarısı, nə qədər də olsa.

Mollalardan qabaq hər zadı dükançılar daş çatlasın iki bərabərinə satardılar. İndiki islam məmləkəti olub rəhmsizcəsinə hər şeyi yüz bərabər qiymətinə satırlar.

**Daşdan səs çıxdı, ondan səs çıxmadı** - qorxudan, utancaqlıqdan səsini çıxarmamaq, susmaq.

**Daşdan yaranmaq** – kimsəsi olmamaq.

Aşiqəm aşdan mən,
Sən kiprikdən, qaşdan mən,
Nə atam yox, nə anam
Yaranmışam daşdan mən (59, S.177).

**Daş-daşa söykənmək** - toqquşmaq, üz-üzə gəlmək.

Çaylar daş olmasa daş-daşa söykənməyib çağraq yaratmasa, çağraq lili, palçığı udmasa, sular durulmaz (142, s.335).

**Daş dığırlatmaq** - birinə maneə törətmək, inkişafının, işlərinin qabağını almaq.

Bədxahlar yoluna daş dığırladı
Daşları fırlanıb başına dəydi ( 190, s.113).

**Daş döyər** - ayaqqabı haqqında onun möhkəmliyinə işarə kimi işlənir.

Bu dağlar, daş döyər,
Ağlar gözü yaş döyər.
Dağçı, dağa çıxanda,
Bir çarıq gey, daş döyər ( S.Çaylı).





**Daş düşdüyü yerdə ağır olar** - adam adət etdiyi yerdə, yaxşı bildiyi işdə hörmətli olar.

Çağır, Qaracoğlan çağır,
Daş düşdüyü yerdə ağır.
Gözəl sevmək günah deyil,
Dörd kitabda yerin gördüm (179).

**Daşı daş üstə yığmaq** - yaratmaq, düzəltmək, nizama salmaq.

Asandırsa başqasının evini yıxmaq,
Çox çətindir amma daşı daş üstə qoymaq ( Vazeh, s.60).

**Daşı daş üstündə qalmamaq** - viran olmaq, alt-üst olmaq.

Hər kəs öz iddiasını həqiqət sayarsa, onda heç bir daş daş üstdə qalmaz (246, s.17).

İnqilab istəyirəm, müqəddəs bir inqilab,
Sovrulsun ümmanlara gövdə, bacaq, bilək-baş,
Yerə keçsin Kremlin, qalmasın daş üstə daş ( 7, s.14).

"Ölülər" komediyasında müəllif yalnız mövhumat və cəhaləti deyil, köhnə cəmiyyətin sarsılmaqda olan ictimai əsaslarını, çürük əxlaq normalarını baltalayır. Bir sözlə, daşı daş üstə qoymayır ( A.Zamanov).

**Daşı dilə gətirmək** – çox qəmli mahnı, çalğı səsi, ağlamaq.

Ayrı nəşəsi var bəzən qəmi var,
Musiqi daşları gətirir dilə (337, c.I,s.32).

**Daşı ətəyindən tökmək** - bu yoldan, bu işdən əl götür.

Sən bu daşı ətəyindən tök, qız ağacı, qoz ağacı,
Çaldılar, çapdılar daha geri qaytarmaq olmaz (11, s.63).

O necə deyərlər, day həvəsdi bəsdi. Gəl bu daşı ətəyindən tök (148, s.183).

**Daşımı başına tökmək** - arxasınca danışmaq.

**Daşını atmaq** – ürəkdən silmək.

Atdı camaat daşını, Mirhaşim,
Durma götür, qaç başını, Mirhaşım! (267, s.161).

**Daşını qoymaq** - təməlini qoymaq, bir ictimai hərəkatın öncülü olmaq

Onlar (məşrutə inqilabı iştirakçıları) bizim bu günkü demokratik hərəkatımızın və bu gün tikmək istədiyimiz böyük azadlıq binasının bünövrə daşını qoymuşlar.

**Daşını tullamaq, daşını atmaq** - buraxmaq, əl çəkmək, yadından çıxartmaq.

Molla əmi, az ye avam aşını,
Tulla fırıldaqçılığın daşını ( Şəhrək).
Atdı camaat daşını, Mir Haşım,
Durma götür qaç başını, Mirhaşım.
Yardımı Səttar başını, Mir Haşım? ( Sabir).

**Daş qapıdan baş qapıyadak** - hər yer, hamı.

Tökülüb daş qapıdan baş qapıya əcrü –savab,
Yıgan istir görə hinqami-qənimətdir, oğul! (168, s.320).

**Daş qazan** - gec qızıb gec soyuyan. Siyasi mənada uzun bir prosesdə mübarizədən yorulmayıb devrimə əl vurmaq, öldü var döndü yoxdu demək.

Azərbaycan bir daş qazana bənzər ki, gec qızar, gec də soyuyar (Səttarxan).

**Daş qızlar bağrına** - qəm-qüssəli.

Atalar yaxşı deyib: daş qızlar bağrına
Hər gecə yalqız yatar (77, s.8).

**Daşlı yol** - çətin yol, ölümə gedən yol.

Ey könül, sidq ilə hər kim şah ilən yoldaş ola
Yüz gərək döndərməyə, hər necə kim yol daş ola (150, s.34).

**Daş səbirli** – səbri çox, dözümlü.

Dindirərik susar min-min diliylə
Dünyanın daş səbri kimi səbir yox (260, s.140).

**Daş...ında qovut gətirmək** - elə bil xarüqüladə bir iş görüb.

**Daş..ı şişmək** - kişilər haqqında işlənir. İncimək, yaxud, haqsız olaraq birindən küsmək.

**Daş ürək** – mərhəmətsiz.

Mənim daş ürəyim, yoxdur bir soran,
Analıq hissinə bəs necə qıydın? (328, s.298).





**Daş üstə daş qoymaq** - bir iş görmək.

Yaşının otuzu qalıb arxada,
Hələ bir daş üstə daş qoymamısan. (285).

**Daş vursan toz çıxar - nə var sənin evində** - sənin evində nə var? Heç nə yoxdu.

Daş vursan toz çıxar, nə var sənin evində? (21, s.624).

**Davaçı əl çəkib, araçı əl çəkmir** - ara qızışdıran adamlar haqqında işlənir

**Dayısının yanında işləyir** -şahlıq zamanında ölkəni işsizlik fəlakəti viranə qoyduğu zaman bu deyim yaranmışdır. Harda işləyirsən? -Dayımın yanında!

-Dayın nə iş görür?
-Xiyabanları ölçür, yəni işsizdi.

**Dedi götün ağırdır, dedi bu daş, bu da tərəzi** - biri-birinə eyb çıxardanda deyər ki, sübut elə.

**Dedi-qodu** - başqalarının dalınca danışmaq.

Bura sakitlikdir, mən də uşaqlar da, dedi-qodu, qanqaralıq nə olduğunu bilmirik (197, s.150).

**Dev** - seçilmiş adam, nəhəng şəxsiyyət. İslam hakimiyyəti dövründə başqa dini inancı olanlara da dev deyilirdi.

Dedim ulu Nazim, mavi gözlü dev.

**Devin canı şüşədədir** – hər bir qüdrətli adamın bir zəif yeri var.

Ey cavan, o taxçada bir şüşə var, bu divin canı o şüşədədir (148, s.58).

**Dev qulağına qurğuşun** -göz dəyməsin.

Əmin bir müddət idi axşam olan kimi yatırdı və deyirdi çırağı söndürmə, mən də işıqda yata bilmirdim, dev qulağına qurğuşun. İndi o işi görmür (Əgdəs Haqverdi).

**Deyən altına sıçan uşaqdır** - səsi çıxmır, günah iş görmüş kimi sakit dayanıb.

**Deyən baş xəbəri gətirib** - Məşhəd türkləri arasında bu deyim öz sözünün üstündə durmaq, düzlüyündə israr etmək mənasındadır.

**Deyən toyu küllükdə çalınıb** - çox tələsir.

**Deyəsən sənə qarğa beyni yedirdiblər?** - ağlın çatmır?

Deyəsən sənə qarğa beyni yedirdiblər? (129, c. I, s.406).

**Deyərsən quş lələyi üstündə yeriyir** – çox yavaş, ehtiyatla yerimək.

Deyərsən quş lələyi üstündə yeriyir (84, s129).

**Deyikli** – kiçik yaşından evlənməsi nəzərdə tutulan uşaqlar.

Oğul, qəm yemə, o sənin deyiklindir, günü sabah əminin yanına gedərəm, icazə alaram, toyunu edərik (46, s.96).

**Deyilən söz gələr başa** –elin sözü axır-əvvəl düz olur (Ə.Saraçlı).

**Deyirəm xala, deyir ana** -özünü tez itirən adama deyirlər.

**Dədələrinin qanı qiyməti**- həddindən artıq baha. Keçmişdə, elə bu gün də İranda bir adam kiminsə qohumunu öldürəndə böyük məbləğdə pul-qan pulu verməklə barışır və cinayət məsuliyyətindən azad olur. Buna görə qan qiyməti çox baha deməkdir.

Ya da bir at filan qədərə kirayə eyləyib pul verəcəksən. Dədələrinin qanı qiyməti (203).

**Dədənin borcuna vermək** - birini təhlükəli vəziyyətdə qoyub qaçmaq, bir yola, bir ideologiyaya imanı olmadan başqalarının dabanını çəkib ölümə vermək.

**Dədəm mənə kor deyib, gələn gedəni vur deyib** – kor burada, ümumiyyətlə türk mifolojisində pəhləvan, yaxud yer Allahı mənasındadır. Heç kəsdən qorxmayan, heç kəslə hesablaşmayan, camaata əziyyət verən. Mənfi çaları da var.

**Dədəsini dalına sarımaq/ Dədəsini dalına şəlləmək** – atasını yandıraram.

Lap dədəsini dalına şəlləyərəm onun (9, s.191

**Dədəsinin köhnə borcuna vermək** - birini təhlükəli işə sövq etmək, xətərli iş dalısınca göndərmək.

Bir dənə Hitler çıxar ki, 20 milyon adamı verər dədəsinin köhnə borcuna.

**Dədə yağı bəlləsi** - ən böyük bəllə, (çörəyə pendir, yağ sürtərlər ki, ona bəllə deyərlər.)





Vəl sürənə ver dədə yağ bəlləsin,
Doxtur Abbas mərizlərin əlləsin ("Anamız Qaradağ", s.15).

**Dəfi dönmək** – taleyi dönmək.

Dağlar alır, nərə salır, nahaq kəsir dilləri
Dəfi dönən, çərxi çönən çağı gözlə gözlə sən (32, c.II, s.29).

**Dəftəri qara gündə yazılmaq** – talesiz.

Tənhayi qara gündə,
Oxuram qara gündə,
Mənim əvvəl dəftərim,
Yazılmış qara gündə (59, S.69).

**Dəxil düşmək** - bir müqəddəs sayılan yerə, yaxud bir adama sığınmaq, pənah aparmaq.

Bir kötükdür nə bərgi var, nə qolu,
Səddü-məbər edib kəsibdir yolu.
Dedilər bu çinarı sanma zəlil,
Bu imamzadəyə düşübdür dəxil (168, s.355).

**Dələduz** - fırıldaqçı, oğru, əli əyri, hər şeyə göz dikən.

Allah və din adından hökm verən bu müqəddəs dələduzlar zəhmətkeş insanları cənnət vədəsi, cəhənnəm qorxusu ilə aldadaraq onları düşünmək, dərk etmək iqtudarından məhrum edib diri ölülərə çevirmişlər ( A.Zamanov).

**Dəli damarı tutmaq** - inadkarlıq etmək, bir qələt sözün üstündə durmaq.

**Dəli-dəlini görəndə çomağını gizlədər** – iki eyni xasiyyətli adam yola gedər.

**Dəli dolu**- əli açıq, xeyirxah, gücsüzləri müdafiə edən, hirsi soyuyandan sonra yenə xeyirxahlıq edən

**Dəli inək balasını ayaqlayan kimi** – çox qəzəblə, şüursuzcasına.

Molla gördü bu hır-zır qanmır, bir az da oyan-buyan danışsa, dəli inək balasını ayaqlayan kimi onu ayaqlayacaq (35, s.240).

**Dəlikli daş** – Araz qırağında Çayhərzən, Miyab, Böbrə və Vərzığanın Əmrabad kəndində olan dəlikli daşlardan ad

aparmaq olar. Köçəri ellərimizdə və tibb xidmətindən məhrum kəndlərimizdə göy öskürək, boğaz ağrısı, ürək bulanması olan uşaqları, sonsuz qadınları dəlikli daşlara aparıb şəfa istəyərmişlər.

Dəlikli daş qədimdə günahkar və ya məzlum adamların pənahgahı sayılırdı. Aşıq Cünun öz yerlərinə getmək üçün Koroğludan 40 gün icazə istəyir. Koroğlu qəbul edir. Amma 40 gün qurtarır, Aşıq Cünun qayıtmır, Koroğlu : Aşıq Cünun hayandasa, tapın gətirin, o dəlikli daşa da girsə, Çənlibelə gətirilməlidir-deyir ( 87, s.6-9).

**Dəlikli muncuq yerdə qalmaz** - ləyaqətli, ərdəmli, bacarıqlı adam sahibsiz qalmaz.

**Dəlinin nə toyu olsun, nə yası** - nə əyləncədə, nə də çətin gündə özünü aparmağı bilmir.

**Dəlini oynadarlar: yamanından ötəri** - birini təhqir edib əziyyət versələr söyüşünə də gərək tablaşasan.

**Dəliyə hel ver, əlinə bel ver** - düşünməz adama həqsiz dayaq dursan, dünyanı xaraba qoyar.

**Dəli şeytan deyir** - qəflətən bir fikrin ağıla gəlməsi.

Bir gecə də dəli şeytan,
Yurdumuza matəm qatdı ( 353).

**Dəli yadına daş salmaq** - təsadüfən ağılsız bir adamın əlinə bəhanə vermək.

**Dəmir ələ yapışır** - nəhayət soyuq, şaxta.

**Dəmir əsa qılcan ola, dəmir çarıq nalcan ola** - nəzərə gəlməyən zaman keçə.

**Dəmirin gedib, ya kömürün** -bir zadı həddindən artıq baha satanda belə deyirlər.

**Dəmir ləbləbi**- türklərin bir hissəsi qovrulmuş noxuda ləbləbi deyirlər.

Dəmir ləbləbi həmin noxudların içində olan diş sındıran noxudlara deyilir. Dərdə dəyməyən adam.

**Dəm vurmaq** - yekə-yekə danışmaq, boy demək.

Sən bizə azadəlikdən dəm vurub dil tökmə heç,





Çünki biz cənnət cəhənnəm qorxusundan uzağıq (43, s.26).

**Dəni dənlərdən, suyu göllərdən** - başqalarının hesabına hər şeyi havayı gələn.

Özü heç bir əziyyət çəkmədən dolanmaq.

**Dənizə düşən ilana dolaşar** - zor durumda qalan adam nicat tapmaq üçün hər şeyə əl atar.

**Dəngəsər** – bezdirmək, boğaza yığmaq.

Mən demədimmi sənə etmə bizi dəngəsər
Cəmləşib xalq hamı başını birdən əzər?(72, c.III, s.224).

**Dənləmək** -öldürmək; güllələmək, tutub dustaq etmək.

Azərbaycanın ağır yuxudan diksinib ayılan aycınlarının fədakarlığı ilə indi bir neçə türk dilində ruznamə, yaxud kitab çıxmağına baxmayaraq, hakimiyyətin başında yer salan panfarsistlər fürsət axtarırlar ki, bu türk aydınlarını dənləsinlər.

**Dərd alıb qəm satmaq** – günü ah-vayla keçmək.

Ah vayınan günüm keçib dünyada,
Dərd alıb qəm satıb nəf eyləmişəm (32, c.II, s.9).

**Dərdə düşmək** - gecə-gündüz fikir çəkmək, əlacsız bir vəziyyətə düşmək; xəstələnmək.

Su gəlir bəndər-bəndər,
Dağlardan qarı əndər.
Dərmansız dərdə düşdüm,
Al dərmanı, tez göndər (59, s.180).
Qateq daşar, Kür daşar,
Çıxıb körpüdən aşar,
Bən dərdimi danışsam,
Dağlar, daşlar ağlaşar (59, S.181).

**Dərd əymək** - pis günə qoymaq.

Dərd əydi,
Dərman əydi, dərd əydi
Dərmana gedən təbib,
Gəl, xəstəmi dərd əydi (59, S.67).

**Dərdə salmaq** – eşqə düşmək, xəstəliyə düşmək.

Yaralı yaram nədir,

Qəm ilə aram nədir,
Bu dərdə sən salıbsan,
Çəkməsəm çarəm nədir? (59, s..65).

**Dərdi dərdə qatmaq** - dərdli adamın dərdini bir adama danışması, ürəyini boşaltması.

Yaralıyam yatmaram,
Hərfə qələt qatmaram,
Mənim dərdim özgədir,
Heç dərdlərə qatmaram (59, s.137).

**Dərdinə dərd qatmaq** – dərdini artırmaq.

Kərəm deyər: qəmə batam,
Bir dərdimə yüz dərd qatam (35, s.558).

**Dərdini dəftərə yazmaq** – dərdim çoxdur.

Yazıram yadigar qala dünyada,
Dərdimi dəftərə yaz indən belə.
Əldə qələm yazan oğlan,
O dəftərə məni də yaz!

**Dərədən təpədən danışmaq** - hər yerdən danışmaq.

Qış mövsümü axşam çağı idi, ilk dəfə Oxtay Əlirza Nabdil ilə tanış oldum. O məndən lirik şerlər kitabımı istədi. Üç gün sonra gün batana yaxın bizə gəldi, oturub çay içdik, dərədən, təpədən danışdıq (353)..

**Dərə xəlvət tülkü bəy / dərə xəlvət tülkü şah**- siyasi mənada da işlənir. Bacarıqlı, ləyaqətli adamları aradan çıxarıb onların yerində ləyaqətsiz, bacarıqsız adamların ağalıq etməsi.

Məsəl vardır ki, dərə xəlvət oldu, tülkü şah olar. Seyid Ziyaəddin də vəziyyətin xarablığını və böhranın davam tapmasını görüb məmləkəti xəlvət nəzərə gətirib səltənət fikrinə düşüb ( S.C.Pişəvəri, "Həqiqət" qəzeti, 1922, №96).

**Dərgah qapısı açıq olanda köpəyin yuxusu gələr** – kasıbın bəxti olmaz.

Dərgah qapısı açıq olanda köpəyin yuxusu gələr (335, s.186).

**Dəridən-boğazdan çıxmaq** - əlindən gələn hər şeyi etmək; öz mənafeyi üçün hər bir əskikliyə dözmək.





Qurbanəli bəy nahaq yerə yaltaqlıq etmir, öz şəxsi mənafeyi üçün dərisindən çıxır.

**Dəridən, qabıqdan çıxmaq** - əlindən gələn hər şeyi eləmək.

Milli azadlığın düşməni olan boşboğaz paniranistlər dəridən-qabıqdan çıxırlar ki, türklərin soy-kökünü bir gün monqollara, bir gün də guya farsın bir ləhcəsi olan azəri dilinə bağlasınlar.

**Dəridir, dürüdür, ərimdir** - hər nə nöqsanı da olsa, mənim ömür-gün yoldaşımdır.

Dəridir, dürüdür ərimdir,
Əyridir, üyrüdür, ərimdir.

**Dərin adam** - düşüncəli, dözümlü.

Sən məndən ürəklisən,
Sən məndən bir az dərin.

**Dərin çay səssiz axar** -savadlı, dərin düşüncəli adam qışqır-bağır salmaz

**Dərisi/ gönü qalın**- anlamaz.

Biz ağ yalanlara çox uymuşuq, çox,
Deməyin dərisi qalına vay-vay (328, s.366).

**Dərisi üstündə yanmaq** - bir dəri, bir sümük olmaq.

**Dəriyə saman təpmək** – keçmişdə cəza növü olub. İndi də hədə ilə ağır hədə-qorxu mənasında işlənir.

Sən ölsən, dərinə saman təpərəm (148, s.116).

Prokopyüsun əsərlərində qeyd olunmuşdur ki, neçə dəfə Xosrovun( paniranist və panfarsistlər tərəfindən yazılan tarixdə Ənuşirəvani-Adil adlanır-B.H.) əmri ilə günahkarların dərisini soyub saman təpərdilər (346, s.604).

Əmr edib dedi, bu saat dərvişin dərisinə saman təpin (46, s.205).

Birdən gələr məni burada görər, dərimə saman təpər (129, c.I, s.40).

**Dərisinə sığmamaq**- çox kökəlmək, özünü çəkmək.

Piyləndikcə göbəklərindəki qatlar,
Dərisinə sığmayan bürokratlar (337, c.I, s.114).

Hər görən: bunlara nə veribsən ki dərilərinə sığmırlar deyirdi (298, s.33).

**Dərisini boğazından çıxartmaq** – ağır cəzalandırmaq.

Olsa qurnaz nə qədər bir tülkü
Boğazından çıxacaqdır dərisi(75, c.IV, s.85).

**Dərviş** - alçaq könül; dünyanın mal-dövlətinə aldanmayan, kiçiyə-böyüyə hörmət qoyan.

Qoyun kimi qabaqda gedən hər bir fırıldaqçı, dınçi və ya başqa təfəkkürdə olan adamın qulu olmaq.

**Dəryada daşa dəymək** – uğursuzluq.

Dəryada gəmim dəydi daşa, sındı, dağıldı
Üzdüm yenidən doğma gözəl sahilə düşdüm (30, №24).

**Dəstbədəst olmaq** – əlbəəl, tez tələb etmək.

Əgər şairsən, gəl eyləmə bəhs,
Bir sözünə min söz deyim dəstbədəst ( Ələsgər).

**Dəstəlatsız** - əlsiz-ayaqsız.

Deyərlər quşlar içrə dəstəlatsız hacıleyləkdir.
Bu acizlikdə neylirsən, ilan udmaqda zirəkdir (168, s.323).

Nə bədəndə su qalıb işləməyə,
Dəstəlat yox gedə bazarə, bağa (168, s.29).

**Dəryada balıq sovdası** - bir işə hazırlaşmamış onun nəticələrindən danışmaq.

Mən aşıq dəmə qoymuş,
Dəm əhli dəmə qoymuş
Düyüsünü bulmamış,
Çilovu dəmə qoymuş (59, S.196).

O, dəryada balıq sövdasına oxşayır (1, s.227).

**Dəryada boğulan saman çöpündən yapışar** – bir adam yaman günə düşsə, hər kiçik imkandan istifadə edər.

Dəryada boğulan saman çöpündən yapışar (77, s. 20).

**Dəryaya daş atmaq** - faydasız bir iş görmək.

İstir bulanıq sudan balıq tutsun, amma bilmir hər suyu bulandırmaq olmaz (21, s.63).

**Dəyənək** - quru, kobud, heykəlli adam.





**Dəymişin dura-dura kalın tökülər** – ağır, gözlənilməz söz deyərəm.

İbişli: Sənə də bir gəliş gələrəm ki, dəymişin dura-dura kalın tökülər (9, s.155).

**Dəvəçi ilə dost olanın darvazası gen gərək** - ağır işə girənin böyük səbri gərək ola.

Böyük ailə ilə dost olanın gərək böyük xərclərə də davamı ola.

**Dəvəçi məhəlləsi yaxşı yerdi, amma ipəkçilər gedib inəkçilər qalıb - yaxşı kişilər yaxşı atlara minib getdilər** – ipəkdən mənzur kültürlü, düşüncəli adam və inəkçidən mənzur geriçi və kültürsüz adamdır.

**Dəvəçiyə it hürməsi** - it hürər, karvan keçər.

Buna dəvəçiyə it hürməsi deyirlər (129, c.I, s.491).

**Dövə (dəvə)dama çıxmaz** - hər kəs gərək öz yerini bilə.

**Dəvə dəllalı** – "daylaq" sözü assimilyasiya üzündən dəllal sözünə çevrilmişdir. Ümumiyyətlə, yekəpər, uzun yöndəmsiz adama deyilir. Əslində dəvə daylağı, yəni dəvənin bir illik balası deməkdir.

**Dəvə dəlləklik edər, köhnə hamam içində** - dərə xəlvət , tülkü bəy.

Dəvə dəlləklik edər, köhnə hamam içində (148, S.32).

**Dəvə dəlləyi** - bədqafiyə, həddindən artıq uca.

**Dəvədən yıxılıb höt-hötünü yerə qoymur**- özünü sındırmır.

Dəvədən yıxılıb genə höt-hötündən qalmır (103, **s.7).**

**Dəvə dəvədən başlamaq** -hər şeyin ən bahasından yapışmaq (Tərtər).

**Dəvə gördün görmədin- dəvə gördün, qığın da görmədim** - heç nə görməmişəm, hər nə bildim, bilmirəm desən yaxşıdır.

Tacir sağ ol ki, məni ölümdən qurtardın, ancaq dəvə gördüm, qığın görmədim (46, s.276).

Birinci sərhəng yalvarmağa başlayır: "Ey cavanlar, bizim günahımız yoxdur, çamadandakı bu pullar da sizin olsun, dəvə gördün, görmədim, bir daş altda bir daş üstdə" (77, s.22).

**Dəvə handa, xəlbir handa** - bir şeyi inkar eləmək, əli ilə aldığı borcu danmaq.

Molla bir arvaddan yüz manat əl borcu alır, il tamamında arvad gəlib molladan pulunu istəyir. Molla deyir: dəvə handa, xəlbir handa (43, s.429-430).

**Dəvə kimi dalıya işəmək** - işlərində tərəqqi olmayan, böyüdükcə düşüncə səviyyəsi aşağı düşən.

**Dəvəni çömçə ilə suvarmaq** - çox yeyimcil və ya susuz olan adama balaca bir qabda yemək və ya su verən zaman bu deyimi işlədirlər. Böyük bir tələbatın qabağında az şey vermək.

-Elə bir şüşə? Dəvəni çömçə ilə suvarırsan? (298, s.44).

**Dəvəni satan köşək ala bilməz** - vəziyyət olduqca pisdir, hər zad günbəgün bahalaşır.

**Dəvəni yükü ilə sarvanı s..i ilə yeyən adam** – nəhayət dərəcədə utanmaz, tamahkar, alıb verməyən.

**Dəvəsi ölmüş ərəb** - hər şeyini əldən vermiş adam.

**Dəvəyə şüşəki nə edər?** - qanmaz və gönü qalın adam hər təhqiri qəbul edər.

Dəvəyə şüşəki nə edər? (21, s.79).

**Dəvə/ fil qulağında yatıb** - dünyadan xəbəri yoxdu.

Ədə, get ədə, özünü də elə key yerinə qoyur guya, dəvə qulağında yatıb, dünyadan xəbəri yoxdur (9, s.186).

**Dəvənin quyruğu yerə dəyəndə** - heç vaxt.

Gözlə dəvənin quyruğu yerə dəyincəyə qədər, daş göyərənə qədər (103, s.8).

**Dəvənin ölüsü sarvana bir yükdür** - dəvə bir zamanlar çox böyük dəyərə malik idi, bununla belə ölü dəvə karvan üçün arzuolunmaz bir yük idi. Dirisi də, ölüsü də sarvan üçün böyük bir faciədir.

**Dəvə öldü, eşşək zülümə düşdü** – böyük bir adamın yükünün kiçik bir adamın boynuna düşməsi

Dəvə öldü, eşşək zülümə düşdü (103, s.73).





**Dəvəyə dedilər boynun əyridir, dedi haram düzdür ki** - çoxlu eybi olan adama bir eybini deyəndə bununla cavab verir.

**Dəyib keçmək** -keçmişdə ağır vəziyyətə rast gəlsə də, indi onun əsəri qalıb.

**Dəyirman** – boş ev.

Çalış, ək biç, aparsın bəy, evin qalsın dəyirman tək,

Ayılma həqqi qanma, xəbərdar olma insan tək (267, s.245).

**Dəyirman xoruzu** - kefi saz, güclü, deyib gülən, müftəxor, dava axtaran.

Abaçı oğlu bir gün minbərdə məşrubun zərərindən danışaraq deyir: Məlunlar içirlər şərabı, yeyirlər kababı, dönürlər dəyirman xoruzuna (205, s.103).

**Dəyirmanı su işlədər** - bədənin sağlu olması və cinsi gücə sahib olmaq.

Dedim: zəruridir ustad, bir əyal alasan,

Dedi: oğul bala, su işlədər dəyirmanı (168, s.770).

**Dəyirman kimi üyütmək** – çox danışmaq.

Bayaqdan qulağım onlardadır, dəyirman kimi üyüdürlər (1, s.117).

**Dəyirman öz işindədi, çax-çax baş ağrıdar**- it hürər, karvan keçər, yel qayadan nə aparar?

Çax-çax başın ağrıtdı, kefin çəkdi dəyirman,

İş həcvə düzüldü (267, s.17).

**Dəymə düşər** - tez küsən, inciyən.

Anaxanım- sən Allah bəsdir, ay Ceyran, bu xanımlar yaman dəymədüşər olurlar (77, s.12).

**Dığ olmaq** – boğaza yığılmaq.

Xədicə, ey da dığ olduq, gah deyir yaz, gah deyir poz (9, s.136).

**Dılqır** -dəyərsiz adam, həyatın həqiqi mənasını bilməyən-təhqir mənasındadır.

Mənim də müəllimim mənə nəsihət edərdi ki, bala səy elə dərslərini yaxşı öyrən, alim ol. Amma bu dılqırların heç birindən eşitnmədim ki, desin: bala adam ol! (Ölülər").

İkiyüz mənim kimi, dılğır adam incisin bizim kənddən, bununla belə bizim kəndə genə pis kənd demək olmaz ("Danabaş kəndinin əhvalatları).

**Dılqırlanmaq** - ədəbsizlik etmək.

**Dınbılı ələk dınbılı sac, əlim xəmir qarnım ac** - əlimdə olan sərmayənin azlığına görə, nə qədər çalışsam da yoxsulam.

**Dırnaq dırnağa çalmaq** - amiyanə təfəkkür əsasında dırnaq dırnağa dəyərsə, dava düşər.

Nə bilim bəlkə də şeytan yenə dırnağını dırnağına çaldı,
Nifaqın bəzlini əkdi, hicranın tərhini tökdü (113, s.116).

**Dırnaqsız** - qəddar, zalım, fürsətdən namərdliklə istifadə edən.

Dov düşüb, dırnaqsız namərd əlinə,
Dişi batan yerin ətin qoparır ( Səhənd, s.305).

**Dızqıraqçı** - yekəxana, özünü əl-ayaqlı sayan.

**Dibinə getmək** - bir məsələni sona qədər araşdırmaq, ifrat dərəcədə bir yola bağlı olmaq.

**Dibinə noxud əkmək/ dibinə daş atmaq** – bir yeməyi yeyib qurtarmaq.

**Dibi suda olmamaq** - hər şeyin sonu var, hər şey qurtulandır.

Yəni dibi dəryadadır! Heç qurtarası deyil! (253, s.110).

**Dikbaş** - söz çəkməyən, qabağından yeməyən, söz götürməyən, çox məğrur.

Sözün düzü bir az dikbaşam, qabağımdan yeyən oğlan deyiləm (82, s.194).

Bir dirhəm verənə inci ataram,
Dikbaşlıq eləmə, qürur sataram ( Nizami, s.304).

Xanım, siz ki, bacılarınız kimi dikbaş, baş-qulaqlarını ələ salan, özünü hamıdan uca tutan deyilsiniz (148, s.77).

**Dik danışmaq** - kobud danışmaq, haqlı sözə acı cavab vermək.

**Dil-ağız etmək / dil-ağız tökmək**– birinin ürəyini ələ gətirməyə çalışmaq.





Molla çıxır, bunu qapıda görcək, başlayır dil-ağız eyləməyə (148, s.128).

Qəssab Alı nə qədər dil-ağız tökdüsə, gördü ki, yox müştəri heç ipə-sapa yatan deyil (174, s.82).

**Dil basmaq** - şirin dil tökmək, yaltaqlıq, gop basmaq.

Bu gələn müəllimə bir az dil basıb odun yükləyərsən, əvəzi çıxar (254, s.30).

**Dil bəlası** – dilinin oduna düşmək.

Həqqu olan nişaneyi tire-cəfa imiş,
Yansın dilim öz başıma bir bəla imiş ( Məhəmmədəli Səfvət).

**Dilbilməz** –söz anlamaz.

Puç eylədin övrət, bu gözəl sadə cavanı,
Dilbilməz oğul vay (267, s.8).

**Dil boğaza qoymamaq** – hey təkrar etmək.

Moldayı salmadı el dil boğaza,
Eybi yox, gərçi qoyulduqü loğaza (267, s.190).

**Dil boranısı yemək** - çox danışan adama deyərlər.

**Dildə-ağızda olmaq** – sözü hər yerdə danışılmaq.

Dildə, ağızda nağıl kimi, əfsanə kimi dünyanı dolaşıb, nəhayət, bir də burada Şamaxının yaxınlığındakı dağ döşündə ərnələ gəlmişdi (144, s.47).

**Dildə-dişdə olmaq** - hər yerdə sözü danışılmaq.

Sultan onsuz da dildə-dişdədir (142, s.59).

**Dildə tük bitmək** - bir şeyi çox təkrar etmək.

Tük bitdi dilimdə bu sözü xalqa deməkdən,
And içmə yalan Allaha, üz istir utansın (338, s.94).

**Dil- dil ötmək** - yorulmadan danışmaq, ara vermədən bir mövzuda danışmaq.

Sənin arvadın tutu quşu cinsindəndir, dil-dil ötmək, yalan danışmaq peşəsidir.

**Dil dönmək** – deyə bilməmək.

Bəlkə bu möhnətü-qəmdən bizi azad eləsin,
Dil dolanmır ki, qəmü - möhnətü tedad eləsin! (72, c.III, s.276).

**Dilə almaq** - ürəyinə gətirməmək.

Alma dilə,
Bağbandan alma dilə,
Dost sənə zəhər versə,
Ud onu, alma dilə (154, s.47).

**Dilə-dişə düşmək** – məşhur olmaq, rüsvay olmaq.

Xaspoladovu kozır kimi zapas saxlayırmış ki, dilə-dişə düşməsin (9, s.169).

Bilirsinizmi, arvad yığıncağında dilə-dişə düşmək nə deməkdir?! ( 253, s.113).

**Dilə tutmaq** – yola gətirməyə çalışmaq.

Mən sənin qızının öhdəsindən gələ bilmərəm, sən özün bəlkə onu dilə tutasan (195, c.II, s.52).

**Dili ağırlaşmaq** - ən ağır xəstəliyə düşən və həyatının son günlərini yaşayan adamın dili ağırlaşar, danışa bilməz.

**Dili ağzına sığmamaq** - özünü öymək.

Beş-on qoyun sağıb, nehrə çalxalayıb yağ-pendir tutub, dili ağzına sığmır (298, s.20).

**Dili ilanı yuvasından çıxardır** - hiyləgər, şirindil.

Atalar deyiblər ki, tacir- tüccar dili ilanı yuvasından çıxardar (174, s.97).

**Dili iti** - hazırcavab, düşünmədən bir məsələ haqqında danışmaq.

Dildən iti olduq, düşüncədən küt,
Ay da tutulanda döydük mis qaba (113, s.90).

**Dili qapalı** – danışmaq hüququ alınmaq.

Bizləri sarsıdır bu qayda qərar,
Səfəvi dövründən qalan yadigar.
İşimiz, gücümüz oldu ahü-zar,
Qapanmış dilinə qurban olduğum (273, s.22).

**Dilin topuq vurması** - qorxudan, utanmaqdan özünü itirməkdən çaşmaq, qorxudan və ya həyəcandan normal danışa bilməmək.

Sən nəçin öz ana dilin gələndə,
Dilin topuq vurur, donursan gülüm? (320, s.8).





**Dili olmayanın dini də olmaz** - bir millət ana dilində danışmaqdan məhrum edilsə, bütün milli-mənəvi dəyərlərini itirər.

Qoy bilsinlər dilsiz dinsə nə qopar? (219).

**Dili topuq atmaq** - deyilməsi lazım olmayan sözü dilə gətirmək.

**Dilim-ağzım qurusun** – dediyim olmasın.

Sonra həman gurladı bir əjdaha,
Ah..dilim-ağzım qurusun, söyləməm (75, c.IV, s.69).

**Dilimdə tük bitdi** -həddindən artıq bir sözü təkrar etməyə görə yorulmaq.

**Dilim-dilim olasan dilim** - dediyi sözün peşimançılığını çəkmək, dilin başın bəlasına çevrilməsi.

Yanıq könlüm qəmdən dilim dilimdi (339).

**Dilin ağızda böyüməsi** - dilin ağızda qıfıllanması. Qorxudan danışa bilməmək və ya bir xəyaldan, fikirdən susmaq.

Neçə dəqiqə əslən danışa bilmədin, dilin ağzında böyüdü (203).

**Dilin çirkaba bulanması** - birinə məddahlıq eləmək.

Əvvəllər şahı mədh etdiyim üçün,
Dilim bulanmışdı çırkaba bütün ( Xaqani).

**Dilinin altından çıxartmaq** - onu tanımaq, ürəyinin dərdini bilmək.

Əvvəlcə çalışıram ki, onu dilinin altından çıxaram, görəm kimdi, nəçidir, nə sayaq adamdır. Sonra ürəyimi açam ona (109, s.362).

**Dilinə yox, əlinə güc ver** – boş sözdən bir şey çıxmaz.

Atalar deyiblər adam əli ilə iş görə bilmədi, güc verər dilinə.

**Dilini əymək** - assimilyasiya nəticəsində öz milli varlığından üz çevirib ana dilində danışmağı əskik saymaq.

Hələ modun dəyişib heç,
Yazıq dilin də əyib.
Deyir mən əhli-Kərəc,
"Türki mən nə midani" (168, s.774).

**Dilini farağat qoymaq** - rus ordusunda "Faraqat!" əmri sakit, bir vəziyyətdə əlləri yanda düzlənmək deməkdir. Bu deyimdə "heç nə danışma, sakit dayan" anlamındadır.

Belə xəta burasındadır ki, bu məlun oğlu məlun dilini faraqat qoymur. Qoymur, qardaş qoymur (195, c.II, s.155).

**Dilini kəsmək** - danışmağa, sözünü deməyə imkan verməmək.

Apardılar gülümü,
Eylədilər zülümü,
Nə qoydular danışam,
Nə kəsdilər dilimi (59, s.134).

**Dil kəsmək** - söz yarışmasında birinə qalib gəlmək.

Qoşaram atı ilən atımı dil kəsməkdən,
Əhdi qıldım, düşə gər raizi dövran əlimə.

Dil **qəfəsə qoymamaq** - çox danışmaq, xəstəlikdən, rahatsızıqdan yatmamaq.

**Dillə desəm, dilim yanar** – çox böyük dərddi, deyə bilmərəm.

Paşa sağ olsun, mən ki Koroğlunu elə görmüşəm, onun sifətlərini dil ilə desəm, dilim od tutub yanar (174, s.49).

**Dilli dibək** - ümumiyyətlə uşağa, gözəl danışan, xoşsöhbət uşağa deyilir.

Dil-ağızdan düşmür, dil boğaza salmır.

**Dil otu yemək** – çox danışmaq, dilli-başlı olmaq, hazırcavab olmaq.

Elə bil dilotu yemişəm, o qədər danışdım, oğlan yorulub yatdı (1, s.182).

- Siz lap dil otu yemişsiniz! (253, s.443).

Gülüşürük dilotu yemiş bu qızcığazın sözünə (145, s.266).

**Dilsizlik** – sükut.

Mənə danışmaqdan uğursuzluq gəldiyindən dil yerinə dilsizliyi seçəcəyəm ( 163, s.554).

**Dil tapmaq** – yola getmək, bir-birini anlamaq.

Ana-qız aralarında dil taparlar (1, s.181).

Ürəklər dil tapsa, birgə döyünsə,





Ortada kin olmaz, küdurət olmaz (264, s.34).

**Dil tökmək** – yalvarıb- yaxarmaq, dil-ağız etmək.

Padişahın zülmünü gör, yetər qəm-qüssə çəkmə ( Nizami, s.56).

**Dil vermək** – öyrətmək, arxasında durmaq.

Sən bu sözləri Ruhulla bəyin özünə de, qoy qulaqları ilə eşitsin, burda bir-iki nəfər araqarışdıran, camaata dil verən, yoldan çıxaran var (1, s.291).

***Dinar minib dovşan belinə*** - *pul qazanmaq çox çətindir.* Çörək daşdan çıxır.

Dinar minib dovşan belinə (335, s.297).

**Dinc durmamaq** - öcəşmək, dava-dalaş salmaq.

**Ding-ding dingildəmək** - bir yerdə dayanmamaq, çox gümrah olmaq.

Saçları xurmayı, gözləri ala idi, özü də ding-ding dingildəyirdi (84, s.275).

**Dingildətmək** – qudurtmaq.

Tərpədir, dingildədir ya bu məni,
Ya mən öldürrəm bunu, ya bu məni ( Zünuzlu Teymur Siyahpuş).

**Dingildəmək** - çalıb oynamaq, kefi sazlıq əlaməti.

Həvəsdən anlamazdı daş-torpaq,
Qaçardı gah, dingildərdi qıvraq ( Xalxali).

**Dinməyənin dinəni var** - zalımlardan heyfi alan tapılar.

**Dimdikləşmək** - bir nəzərə gəlmək üçün yavaşdan danışmaq, təsmim tutmağa çalışmaq.

Qırx namərdlər bunu duydu,
Nə etməli deyə onlar dimdikləşdi.

**Dimdiyinə dəymək** - sözdən, bir hərəkətdən incimək.

**Dimdiyin sallamaq** - qaş-qabağın sallamaq, küsmək.

**Dirigözlü ölmək** – qorxudan, həyəcandan ayaq üstə dayana bilməmək.

Şeyx ayaq üstə dirigözlü ölmüşdü (144, s.96).

**Dirək olmaq** - dayaq olmaq, ailənin, toplumun qayğıkeşi olmaq, igidi olmaq.

Qızıl qübbə çadırımın sütunusan, dirəyisən (284, s.82).

**Diri gözlü ayrılmaq** - baxa-baxa, sağ ikən ananı baladan, sevgilini sevdiyindən ayırmaq.

Diri gözlü balamdan ayırdız, ölü gözlü balanızdan ayrılasınız ( *danışıqdan).*

**Diri gözlü bəlaya düşmək** - baxa-baxa bəlaya düşmək, taleyi qaralmaq, uğursuzluğa düçar olmaq.

Bir-birindən cida düşdük,
Diri gözlü oda düşdük (266).

**Dirsək çevirmək** - mübarizə etmək, hər şeyini əlindən alıb sonra üz çevirmək

Azərbaycanlılar 1945-ci ildə milli hüquqlara hörmət qoymayan Tehran hökumətinə dirsək çevirdilər.

**Diş dəyişmək** - təzə arvad alanda, təzə yemək yeyəndə işlənir.

Olanda əvəliklə, pencərlə dəyişirik dişimizi,
Olmayanda elə əriştədi, ki əriştə (142, s.53).

**Diş-dişə çalmaq** - öz yaxşılığını başqalarının üzünə çəkmək, yaxşılığı üzə vurmaq.

**Diş dişə dəyməsi** - dözülməz həddə soyuqdan üşümək.

Şərab ver, məni qızdır, dəyir dişim-dişimə (147, s.40).

**Diş- dişə qalmaq** – ac.

**Dişə vurmaq** - sınamaq, yaxşı tanımaq, təcrübə etmək, ağır-yüngül etmək.

**Dişi bağırsağını kəsmək** –hirslənmək, qəzəblənmək.

Hüsənin dişi bağırsağını kəsirdi. Dağa daşa salmaq, mətləbdən yayındırmaq, incitmək.

Mən ölüm, əgər burda düzələnsə, bizi dağa-daşa salma (84, s.33).

**Dişi batmamaq** - mənə gücü çatmaz.

Pəhləvilər dişi hardan batar el qüvvəsinə? (168, s.924).

**Dişi çəkilmiş** – daha təhlükəli deyil, gücü yoxdur.

Yıxın getsin, o Təbrizə yaraşmaz,
Çəkilmiş dişləri, Təbriz dalaşmaz (308, s.12).





**Dişi düşmüş zirnaçı** - birinin bir işi görməməyi istək əsasında deyil, o işi görə bilməməyi səbəbindəndir.

Səy elə tövbənin qapısın mövqeyində çal,
Diş düşdü, qoydu zırnanı, zırnaçalan yerə (168, s.755).

**Dişinə vurmaq** - təcrübə eləmək, sınaqdan keçirmək.

**Dişinin dibində qalmaq** - çox az, yemək istədiyindən çox az.

Əyə, bu heç mənim dişimin dibində qalmaz (174, s.134).

**Dişinin dibindən çıxanı demək** - çox əsəbi halda ağzına gələni demək.

Təbriz polisi dedi: "Molla Nəsrəddin" jurnalı vali tərəfindən qadağan edilmişdir. Bu sözdən qəzəbləndim, onlara dişimin dibindən çıxanı dedim (197, s.123).

**Dişinin kirini sorandır** - çox yoxsuldur, çox xəsisdir.

**Dişlərini qıcırtmaq** – bir şeyə tamah salmaq, hədə-qorxu gəlmək, birinin malına göz dikmək.

Qoy gəlməsin, gələndə bizə diş qıcadırsa,
Gəlsin kamal timsalı müdrik bir qocadırsa (167, s.102).
Diş qıcırdır, qan-qan deyir
Qan içdikcə qan istəyir ( Səhənd, s.512).
Anlamaz oğlu, həqqimizə qıcıtma diş,
Sakit otur, danışma çox, qoyma bu millətə qəmiş (30, №25).
Harda bir nur görərsək ona qarşı olarıq,
Bəzinə diş qıcıdıb, bəzinə quyruq bularıq (267, s.237).

**Diş qurtlamağa bir quruşu yoxdur** – çox kasıbdı, heç nəyi yoxdu.

Mənim özümdə də diş qurtlamağa bir quruş tapılmaz (129, c.I, s.282).

**Diş sındıran cavab** - tutarlı cavab.

Vəilla şairlərimizin yazdıqları fars şerləri, məxsusən Saib Təbrizi, Nizaminin şerlərini onların farslığına dəlil göstərənlərə deməli söz və diş sındıran cavablarımız çoxdur ( Pişəvəri, 1945).

**Dişin sınıq olması** - yoxsulluq, ya birinin yaratdığı ağır şəraitə görə gün çörəyinə möhtac olmaq.

Bir neçə il dişim sınıq idi, iki çörək alçaqların daşı ilə (163, s.101).

**Dişi tülkü kimi gülmək** - çox xoşa gəlməyən surətdə gülmək.

**Dişlərinin dibinə kimi saralmaq** – qorxmaqdan, aclıqdan saralmaq.

Sən öləsən yazıq, dişlərinin dibinə kimi saraldı. Lap ürəyim yandı (72, c.III, s.143).

**Dişsiz ilan** - zahirdə özünü məzlum, yaxşı adam göstərməyinə baxmayaraq gizlicə quldurların baltasına sap olmaq.

**Diş yox ikən dodaq vardı** - kiçik olmayan vaxt böyük, təzə olmayan vaxt köhnə var idi.

Bir deyən olmadı, a canı yanmış,
Axı diş yox ikən dodaq ki vardı (328, s.304).

**Divan sənindir** - fürsət sənindir.

Qəhrəman söylədi: nə bilsən elə cəllad,
Dövran sənindir, divan sənindir (104, s.22).

**Divan tutmaq** – cəzalandırmaq.

Tapşırılıb ki, cəmi Şirvanda müridlərimizə divan tutsunlar (144, s. 143).

**Divara qısnamaq / Divara sıxışdırmaq** - ağır vəziyyətdə qoymaq; nəfəs çəkməyə imkan verməmək.

Ay Namaz, buna adamı divara qısnamaq deyərlər (129, c.I, s.416).

Burda gəlinim mənim günümü düyünləyib göy əskiyə, soxub qoz qabığına, orda da qaynatası qaynatası qızımı sıxışdırıb divara göz verir, işıq vermir (205, s.28).

**Divar çatlağına gülmək** - yersiz bir şeyə gülmək.

**Divardan səs çıxdı ondan nıx çıxmadı** - pis iş gördüyünə görə, xəcalətindən bir söz demədi.

**Divarı alçaq** -himayəsiz, qərib, yoxsul.

İki yerə parçalanmış bədəndəki bir ürək,
Heç igidin divarını alçaq etməsin fələk (30, №17).





**Divarın bir üzünü yıxsalar da, bir üzünü yıxmazlar** - işin əsl sahibi razılaşsa da ara adam, ikinci dərəcəli adam razılaşmır.

**Dizbədiz olmaq** - çiyin çiyinə olmaq; bir olmaq.

Rasta küçə bizik, bizik,
Ellər ilə dizbədizik.

**Diz çökmək** - təslim olmaq, boyun əymək, yaltaqlıq etmək.

Azərbaycanlı nə diz çökmüş və nə də iltimas etmişdir. Bu nəngə Azərbaycanlı heç vaxt təhəmmül etməyib və etməyəcəkdir (248, s. 188).

**Diz-dizə durmaq** – üzbəüz durmaq.

Gəl duraq diz-dizə günləri bir-bir
Sayıb hesablayaq yaşımızı biz (337, c.I,s.58).

**Dizəcən** - həddən artıq yaşıllıq, kef dizəcən, xoşluq nəhayət dərəcədədir.

Burdan Təbrizə kimi,
Gül qalxıb dizə kimi (158, s.76).

**Dizə çırpmaq** - təəssüf etmək, peşiman olmaq.

**Dizi ilə yer eşmək** – əzab-əziyyət çəkmək.

Çayları su alır gözüm yaşından.
İynə ilə gör eşə-eşə
Dizimlə yer eşə eşə (260, s.19).

**Dizi qucaqlamaq** - qəm dəryasına qərq olmaq, bir işin reallaşmasına çalışmamaq.

Dizi qucaqlayıb oturma heyhat, nicat sahilinə üzəsən gərək ( Həbib Fərşbaf, s.253).

Əzəl gündən hər nə dedim düz dedim,
Ellərimə şirin-şirin söz dedim.
Məzlumlara "qucaqlama diz" dedim ("Ömür aynası", s.51).

**Dizin əsməsi** - qorxmaq, titrəmək.

Bilirəm əsməyib heç vaxt dizlərin,
Danış mənə ilham verir sözlərin (16).
Ölüm ayağında təhlükələrdə
Titrəmir arzunun, ümidin dizi (Saplaq).

Ananı fikir aldı, ananın əsdi dizi,
Ana müqəssir etdi tramvayı, dənizi (167, s.103).
**Dizinə vurmaq** - heyfslənmək.
O biri əlilə burdu dizinə,
O da dizlərinə vurub ağladı (328, s.299).

**Diz yeri** - Azərbaycan ən qəddar rəhmsiz feodalizmin mərkəzi olmuşdur. Təzə radio alıb kəndə gətirən zaman təzə radionu görmək istəyən kəndlilərdən bir qoyun alırdılar və ya özləri ilə bir otaqda kəndlinin oturmağına icazə vermək üçün iki qoyun alırdılar ki, buna diz yeri, diz haqqı deyirdilər.

Sultanabadın viranə qalmış bir kəndində yoxsul qarıdan iki qoyun istədiklərinə görə bir şer qalıb:
Ey şahi- xudabəndə,
İki qoyun bir kəndə-
Onun da biri məndə.

**Dodağı büzmək** -qaş-qabaq sallamaq, incikliyi bildirmək.
Gəlib gördüm Tükəz püflür ocağı,
Dönüb baxdı mənə, büzdü dodağı (300, s..14).
**Dodağı qaçmaq** – gülümsəmək.
Yüz təlxək oynaya üzü güləmməz
Qaçmaz dodaqları, yalandan belə (260, s.22).
**Dodağı sallanmaq** - küsmək, incimək.
Vardır bir iddə əcamir, hər evə getsə qonaq,
Görəsən öz dediyi olmasa, sallandı dodaq (168, s.226).
**Dodağın ucu qaçmaq** - gülümsəmək.

Yaralı adam elə bil dincələr, dinc bir yuxuya gedər, yuxuda gülümsünər, dodağının ucu qaçar (203).

**Dodurğayi** - dodurqa keçən zamanlarda bir güclü türrk qəbiləsinin adı olmuşdur. İndi Güney Azərbaycanda nə o tayfanın adı var, nə də söz əsl mənasını daşıyır. İndi işlərini nəzm - intizamsız görən, heç bir qayda-qanuna tabe olmayanlar haqqında işlənir. Dodurqayinin mənası dövlətçilik və ölkəni idarə ilə bağlıdır. "İqdır tarixi" adlı kitabda dodurqa anlamını ölkə almaq və xanlıq yapmaq kimi izah ediblər (90, s.124).

**Doğru yola getmək** – düz yaşamaq.





Doğru yola getmədin, nə hasil?
Bir mənzilə yetmədin, nə hasil? (Füzuli, s.18).

**Doğulmamış qızına don biçmək** - ortaya çıxmamış bir şeyə hazırlaşmaq

**Doqquz gəlmək - sənin səkkizinə doqquz gətirir** - cür gəlməmək, əziyyət vermək.
Göydən bir ulduz gəlir,
Şami şəbəfrüz gəlir,
Yadı işıqlandırır,
Tanışa doqquz gəlir (340, s.26).
**Doqquz qoymaq** - aldatmaq, başına börk qoymaq.
Mömin aləmdə gərək zirək ola, sən də osan,
Bəndələr səhldir, Allaha da doqquz qoyasan (168).

Ədə, mənim qabağıma doqquz qoymaq istəyirsən. Kimə kişiliyini göstərirsən, mənə? (9, s. 148).

**Doqquz yorğan yırtmaq** - çox yaşamaq, ömür sürmək.

**Dolamaq** - ələ salmaq, məsxərə etmək.

**Dolanan ayağa daş dəyər** - xoşbəxtlik dalınca olan adam gərək gecə-gündüz bir yerdə durmaya.

**Doldurmaq** - birini birinin əleyhinə təhrik etmək.

**Dolmaq/ doluxsunmaq** - ağlamağa hazır olmaq, ürəyi dolmaq.

**Dolu adam** - bilikli, təcrübəli adam, kök adam, danışmazdan əvvəl sözü ağzında bişirib çıxaran adam.

Dolunun ağzı ürəyindədir (203).

**Dolu birini qorxuzar, boş ikisini** - silah nəzərdə tutulur, dolu olsa bir tərəf qorxar, boş olsa həm əlində silah əlində olan qorxar, həm o biri tərəf.

-Atan tərəfmi, ya atılan tərəfimi? –Necə deyər : "Dolu birini qorxuzar, boş ikisini"( 253, s.271).

**Dolu gözlü –** kövrəlmiş, gözü yaşla dolu.
Dənizdə ləpələr ayılan zaman,
Durnalar keçəndə bağlar üstündən,
Çıxardı eyvana taqətsiz ana.
Dolu gözlər ilə haray çəkərdi (219).

**Donquldanmaq** - dodaqaltı deyinmək, narazılıq eləmək.

Bəyin anası Aşıq Ələsgərgilin tez gəlməsindən bir az donquldandı. Kəndin qanan adamları aşıqları evlərinə apardılar (13, s.339).

Dəlilər tək deme öz başıma donquldanıram,
Başıram işlərivə, od tuturam, odlanıram (168, s.57).

**Donluq** - aylıq maaş.

Oxuyub gəlib gözlərini donluğa tikincə, oturarsan kəndində sən əkərsən, biçərsən pul başından yağış kimi yağar (129, c.I, s.125).

**Donu açılmaq** - özünə gəlmək, məclisə isinişmək, öyrəşmək.

Dinsən dil açarıq, ey dilə ilk söz,
Yağsan solmarıq, donumuz açılar
Solğun şəhərlərə axsan sən (219, s.92).

**Donuzdan bir tük çəkmək qənimətdir** – xəsisdən nə qopartsan, bir şeydi.

Donuzdan bir tük çəkmək qənimətdir (335, s.300).

**Donuzu əskikdir** - çox varlı adam.

**Dorğunu yel almaq** - qorxmaq, yorğunluqdan tərpənməmək.

**Dost dosta tən gərək, tən olmasa gen gərək** - dost çətin gündə dostuna arxa olmasa ondan dost olmaz.

**Dostluğu ayı dostluğudur** - xeyir vermək istədiyi halda ziyan buran adam. Rəvayətə görə, bir nəfər ayı ilə dost olur, ayıya çoxlu yaxşılıq edir. Bir gün ayı onun üzünə bir milçək qonduğunu görür, gedib bir böyük daş gətirib onun başına salır ki, milçək ölsün, amma adam ölür.

**Dost məni bəyənsin, bir içi boş qoz ilən** - əsas dostların diqqətidir.

**Dost yolunda boran olar, qar olar – Ya dost olma, ya zəhmətdən incimə**- əsl dost çətin gündə tanınar.

Dost qolunda boran, qar olacaqdır (32, c.II, s.19).

**Doşab almışıq, bal çıxıb** - alınan şeyin gözlənildiyindən pis nəticə verməsi.





**Doşablanmaq, qatıqlamaq** - xoşa gəlməyən zarafat etmək, məzəsiz, şit zarafat.

Qacar şahlarının ən mütərəqqisi Nəsrəddin şah Kərimşireyi adlı bir təlxək saxlayırdı. O, "Baqqalbazi dər hüzur" adlı tamaşada öz rolunu ustalıqla oynadığına və ünvan sahiblərini məsxərə etməyə görə "Doşabülmülk" ləqəbini şahdan alır.

**Dov düşmək-əlinə dov düşmək** - fürsət tapmaq.

Ələ bir dovdu düşüb, əski yuvanəm, sənə nə,
Mütrübəm, oynağanam, qaş-göz atanəm, sənə nə? (255, s.269).

**Dov gəlmək** - qalib gəlmək.

Ay Kərim, çox öyünmə, Ayrım qızı dörd-beş kişiyə dov gəldi (298, s.20).

**Dovşana qaç deyir, tazıya tut** – ikiüzlü siyasət yeritmək.

Dünyayi-aləm yığışsa, biclikdə buna çatan olmaz. Dovşana deyir qaç, tazıya deyir tut (9, s.128).

**Dovşan çomağa rast gəlib** - bir zalım əlinə düşmək; gizli işin üstünün açılması.

**Döhtür** - Təbrizdə ağlını itirmiş, ən məhşur dəliyə belə deyirlər.

**Dörd əli ilə yemək** - acgözlüklə yeyən, milləti soymaqdan yorulmayan.

Əhli-həqqin qəlbinə aləmdə təskindir qələm,
Dörd əlilə milləti rahət yeyənlər, əhv edin (69, s.172).

**Dördəlli tutmaq** - bir şeydən var qüvvəsi ilə yapışmaq, bir şeyə həddindən artıq həvəskar olmaq- adətən mənfi mənada işlənir.

Dördəlli tutmadıq biz bu dünyanı,
Həyatı şərəfdə, mərdlikdə bildik.
Yaşadıq şərəfli yaşamaq üçün
Savaşdıq, vuruşduq, öldürdük, öldük (Səhənd).
İtirəm gözünün qaranlığında,
Nifrətsə dördəlli tutur qolumu (218, s.67).

**Dörd gözlü** - çox ehtiyatlı.

Gözlə özünü, ovçudur hər yanı bu yurdun,

Quzğun kimi dördgözlü gəzir körpə şikarı (Y.Şeyda).

**Döş-döşə durmaq** – üz-üzə durmaq.

Əvvəllər beləydi: durub döş-döşə
Çıxardı düşmənlər açıq döyüşə (328, s.340).

**Döşünü qabağa vermək** – bir işə hazır olmaq.

Qazi deyir ki, vermə qabağa eylə düşün,
Mən bisipah, dini müsəlmanı saxlaram (69, 22).

**Döymə dəmir qapımı, döyərlər taxta qapını** - pislik etsən əvəz görərsən.

Deyirəm yəni döyməyək dəmir qapılarını ki, döyməsinlər taxta qapılarımızı (9, s.101).

**Dövlətlinin iti yatmaz, kasıbın s..i** - kasıb adamın çoxlu uşağı olar, dövlətlinin də çoxlu iti olar ki, var-dövlətini qorusun.

**Dövlətin başdan yağması** - çoxlu gəliri olmaq, hər yerdən qazanc gəlmək

Birisinin yağır dövlət başından
Birisi görməyib bir pul başından (147, s.367).

**Dövlətliyə saxsı lazım olsa, kasıb səhəngin sındırar** - kasıb yazıq olar, şüursuz olar, həddən artıq əli aşağı adam

**Dövranı keçmiş taxtanı əlində bayraq tutmaq** – vaxtı keçmiş bir şeyi özünə bayraq etmək.

Dev hüzurunda xidmətdədir, səkkizinci xəlifən isə budur dövranı keçmiş taxtanı əlində bayraq tutub düşmən içində hünər xəyalına düşüb, şəxsiyyətini nümayiş etdirir (144, s.183).

**Dövrəsinə qələm çəkmək** - uzaq olmaq, birini kənara qoymaq.

Arnandı, çox qoru qəmdən, qələm çək, dövrünə fikrin (338, s.33).

**Duanı biz elədik, yağış Qaradağa yağdı** - əziyyəti biz çəkdik, səfasını başqası gördü.

**Durna boğazlı sözlər** - ürəyə yatan, hamının xoşuna gələn.

**Duza qoymaq** – uzun müddətə saxlamaq.

Necə, necə, bitərəfləri duza qoyurlar? (72, c.III, s.31).

**Duz-buz kimi yalamaq** – hər yerindən öpmək.





Dərə Düzov Qarın Quliyevi duz-buz kimi yalayıb əhval tutandan sonra türkün sözü, arvadına xitab edib... (9, s.28).

**Duz kimi yalamaq** – birini çox sevmək, sevgi göstərmək.

Biz oxurduq, aba qaval çalardı,
Dədəm duz tək tutub bizi yalardı (60, s.130).
Ərin səni duz tək yalar,
Qolların boynuna salar (69, 108).

Padşah oğlunu duz kimi yaladı, bağrına basdı (148, S.65).

**Duzu quru** - işində bir kələk olmayan, hər işi təmiz ürəklə görən. Eybi olmamaq, yaxşı adam, günahsız.

**Dübərdinə hola qoşmaq** – müflis etmək.

Dedi: dübərdinə qoşmuşam hola, xəbərin yox,
Dedim, holanı qoşandan sonra nə əkdirəcəksən? (306).

**Düdü dolandırmaq** -ələ salmaq, bu gün sabaha salmaq.

**Düdük çalmaq** –birinin arxasınca danışmaq.

- Harda düdük çalınır? -deyə mən ətrafıma göz gəzdirdim (253, s.116).

**Düdük düdüyə calamaq** –birinin arxasınca çoxlu şayiələr yayılması.

Düdük düdüyə calanar çalınar, şeypurlar işə düşər (253, s.120).

**Düdük kimi olmaq** - çox dar.

**Düdüllü gəlmə** - hiylə gəlmək, bəhanə gətirmək.

Bir sözün altından qaçmaq, verdiyi qövldən boyun qaçırmaq, birini get-gələ salmaq.

**Dünbələndüz** - düz bir şey.

**Dünən bir, bu gün iki** - qısa, az müddət.

**Dünya başına dar gəlmək** - çox darıxmaq, çarəsiz vəziyyətə düşmək. Darıxmaq, üzülmək, özünü əlacsız görmək. Ürəyi sıxılmaq, çıxılmaz vəziyyətə düşmək

O paslı zəncirlər qırılmadıqca,
Dar gələcək insanlara bu dünya.

**Dünya başına yıxılmaq** - çox fəlakətə düşmək.

**Dünyadan dördəlli yapışmaq** – həyat nemətlərini çox sevmək.

Gənclikdən əlimiz üzülən kimi
Dünyadan dördəllə yapışırıq biz (328, S.149).

**Dünyadan kam almaq** - bütün arzularına çatmaq, ürəyincə yaşamaq.

Öldüm mən, anam qaldı,
Oduma yanan qaldı,
Nə dünyada kam aldım,
Nə bir nişanam qaldı (59, Səh.131).

**Dünyagörmüş** – təcrübəli.

Qayalı dağı da duman almışdır,
O dünyagörmüşdür, yaxşı bax ona (337, c.I,s.56).

**Dünya mənim deyənlər** - ölümünə inanmayan, dünyanı dördəlli tutan

Hanı dediyim bəy ərənlər,
Dünya mənim deyənlər-
Əcəl aldı, yer gizlədi (173).

**Dünyanın o biri ucu** - ən uzaq yer.

**Dünyanı su tutsa mənim vecimə deyil** - etinasız, laqeyd adam.

**Dünya ölüm itimdi** – həyat əbədi deyil.

Atam oğlu, dünya ölüm itimdi (260, s.95).

**Dünyaya yük olmaq** – həyatda birinə xeyir verməmək.

Min dəfə gözəldir çox erkən ölmək,
Dünyaya yük olub yaşamaqdansa,
Dünyanın yükünü çəkirkən ölmək. (328, s.70).

**Düşmən çomağı** - qorxmaz, dilli-başlı adam.

**Düşmən gözü çıxartmaq** – düşmənə dağ çəkmək.

Mən də istəyirəm oğluma ata-baba adəti ilə düşmən gözü çıxaran toy eləyim(1, s.172).

**Düşmən nədi, dost evini dost yıxar** – xain dost düşməndən çox pisdir.

**Düşünüşmək** – münasibətləri pisləşmək.

Yaman düşünüşmüşdü, bir dəlləkxanada iki keçəl olmaz (9, s.25).

**Düt deyincə yemək** - çox yemək.





**Düyünün qəddini qazan bilər** - yəni hər adamı, hər zadı imtahan etmək üçün bir yaxşı fürsət, çətin şərait tapmaq lazımdır.

**Düyün vurmaq** - bir işi daha da müşkülə salmaq, maneə törətmək

Dolaşıq bir düyün rast gələn kimi ona bir düyün vurub getdilər ( "Rübailər aləmində").

**Düyüşün qırağa qoymaq** - kənara qoymaq, birini gözdən salmaq, işini əlindən almaq.

**Düyü tapmamış çilov dəmləyir/ at almamış mıxını çalır** – dəryada balıq sövdası.

**Düz adam Heydər təkyəsində nə edir?** -Səfəvilər dövrünə qədər davam edən Heydəri- Neməti davasından alınmışdır. Burada Heydər Şah İsmayılın ulu babası Şeyx Heydərin adıdır. Nemətilər yaxud nemətullahılar özlərini beşinci imamın nəslindən olan əmir Nurəddin Nemətullaha bağlayırdılar. Heydərilər isə özlərini Səfəvi sülaləsinin cəddi Sultanəddin Heydərdən bilirdilər. Bunlar iki yerə bölünürdü, şəhər məhəllələri bir neçəsi neməti, bir neçəsi heydəri olub vuruşurdular. Nümunə üçün, Şirazın dörd quzey məhəlləsi Heydəri və 8 güney məhəlləsi Neməti idi. Yüz minlik Təbriz şəhərinin 13 məhəlləsi Heydəri və Nemətilər arasında bölünmüşdü. Bu deyim Heydərilərə düşmən münasibət bəsləyən Nemətilər tərəfindən yaranmışdır

Bir nəfər başqa məhəlləni pislədikdə işlənir.

**Düz ağac əyilməz** - düzlüyə adət eləyən adam əyri ola bilməz

**Düz danışan börkünü yan qoyar** - düzə zaval yoxdur. Düz yaşayan adam rahat olar.

**Düzdə qoymaq** – birinin hər şeyini əlindən almaq, pis günə qoymaq.

Allah, mənim balalarımı düzdə qoyanın balalarını düzdə qoy! (129, c.I, s.75).

**Düz düzdə qalar** - düz sözü sevməzlər, həqiqət acı olar, öz sahibinə əzab-əziyyət gətirər.

**Düzünəqulu** – düz danışan.
Sən ki məni düzünəqulu yıxmamısan (1, s.168).

**Düz yolda gedə bilmir, şumda şıllaq atır** - kiçik işin öhdəsindən gələ bilmir, böyük iddialar arzulayır.





# -E-

**El ağzı, fal ağzı** –elin dediyi əvvəl-axır olur.
Çömçə isti olub indi qazandan
el ağzı, fal ağzı.
Yaxşı deyirlər (328, s.301).

**Elə addım götür, ata biləsən, elə loqma götür, uda biləsən** -elə bir iş gör ki, onu başa çatdıra biləsən.

**Elə bil alçaq dağları bu yaradıb** – təkəbbürlü, hamıya yuxarıdan aşağı baxan

Zalımın biri zalım, elə bil alçaq dağları bu yaradıb. ( 253, s.282).

**Elə bil arşın udub** - quru ağac kimi yeriyən, təkəbbürlü.

**Elə bil ayaq daşı itibdir** - hər şeyin bir birinə qarışdığı yer.

Ümumiyyətlə, Azərbaycan hamamlarında ayaqdaşından istifadə olunur. *Hamamda sos-küy olduğuna görə, ayaqdaşı* itəndə onu axtaranda hay-küy düşür.

**Elə bil ayıya dəyirmançı dedilər** - təhqir eləmək.
Elə bil ayıya dəyirmançı dedilər (129, c.I, s.39).

**Elə bil başıma bir qazan qaynar su tökdülər** - gözlənilməyən halda çox təsirli söz eşitmək.

Behruz iti bir nəzər salıb başını aşağı dikdi və keçmiş həyatı qaynar qazan kimi sanki başına töküldü (30, №2, s.52).

**Elə bil bayquşdu** - ağlayan uşağa və pis niyyəti dilə gətirən adama deyərlər.

**Elə bil cinə "bismillah" dedin** - inanca görə, bir nəfərin gözünə cin görüksə, yaxud onu qara bassa, "bismillah" deyən kimi cin yoxa çıxar.
Məni görcək deyəsən cin eşidib bismillah
Zahidin pis gözünə bir çalıcı mar oldum (223, s.55).

**Elə bil göz işığı, peyğəmbər pişiyidi** – özünü çox əziz sayır (Ə.Saraçlı).

**Elə bil kasıb evinə gəlin gedir** - həvsələsiz, könülsüz bir işin ardınca getmək.

**Elə bil qurbağa gölünə daş atdılar** - sükut çökdü, səssizlik, hər yer sükuta qərq oldu.

Gecənin gölünə daş atılsaydı,
Susardı qurbağalar (154, s.43).

**Elə bil Mədədov atlısıdır** – Mədədov İran-rus davasında iştirak edən bir rus quldurunun adıdır. Yəni zalım bir insan.

**Elə bil müqəvvadır** – çox gözəldir.

**Elə bil naxırçı əlindən qoduq qurtulub** - əzabdan qurtulmaq.

Yeyin qaçanda, sevinə-sevinə bir yerdən uzaqlaşanda deyilir.

**Elə bil s..ş supadı** -narahatdı, kefi yoxdu.

**Elə bil Şəmundur** – Şəmun Urmiyada bir qantökən assori və ya ermənimin adıdır. Qəddar, rəhmsiz mənasındadır.

**Elə bil Rüstəmin şeyin sındırıb** - nə böyük iş görmüsən, nə arxayınsan.

**Elə cır, yamaq saxlasın** - boy demə, yalan, gop basma.

**Elə eləmə ki, körpü çayın o tayında qalsın** - bir iş görmə ki, aramız dəysin. Özünü elə aparma ki, pərdə aradan götürülsün.

**Elə gedərəm ki, çərçilər də sorağımı gətirməz** – sənin əlindən qaçaram.

**El ilə gələn bəla bayramdır** – bir çətinlik hamı üçündürsə, dözmək lazımdır.

El ilə gələn bəla bayramdır (229, s.25).

*El ilə gələn qərə gün düğündür* (229, s.25).

**Eli olmayanın dili də olmaz** - yalqız, qürbətdə yaşamağın çətinliyinə işarədir.

**Elm dəryası** – çox bilikli adam.

Maşallah, cənab elm dəryasıdır, mən belə alim görməmişəm (195, c.II, s.36).

**El üçün ağlayan gözsüz qalar** – ancaq öz mənafeyini düşünənlərin fikrinə görə belədir.





El üçün ağlayan gözsüz qalar (129, c.I, s.288).

**Eni- uzununu görmək** – hər zadını bilmək.

**Erməni dığası** – şüursuz, xalqın ənənəsinə xor baxan.

Bizlərdə günah yox, şahımız şumo-dığadır,
Vabəstədir Amerikaya, bişərmo- həyadı (168, səh. 912).

**Erməni eşşəyi kimi işləmək** – haqq-muzd olmadan gecə-gündüz işləmək.

Axşamadək erməni eşşəyi kimi işləyirsən, elə acsan ac (129, c.I, s.154).

**Erməniyə koxa dedilər çuxasını özgəyə götürtdü / anlamazın başmaqların cütlədilər, əyildi ona hörmət qoyanın götünü dişlədi ki, bu da ədəbdəndi** –ləyaqətsiz bir adama hörmət qoyanda qudurar.

Erməniyə koxa dedilər çuxasını özgəyə götürtdü (129, c.I, s.29).

**Eşşək** – qanmaz.

**Eşşək eşşəyi borc qaşıyar** – yaxşılıq, pislik borcdur.

"Eşşək eşşəyi borc qaşıyar" məsəlini də xatırladı (253).

**Eşşək gəlib, eşşək getmək** - heç nə qanmamaq.

Əgər Məmmə Mursaqulu deyən Məmmə olsa, onda bil ki, mən bu dünyaya eşşək gəlib eşşək gedirəm (84, s.6).

**Eşşək qızdırmalı olub** - yayda əgər bir adam qalın paltar geysə, bu deyim işlənir.

**Eşşək nə bilir cümə axşamı nədir? /Eşşək nə bilir döşək nədir?/Eşşək nə bilir zəfəran nədir?** – qanmaz adam yaxşı zada dəyər verə bilməz.

**Eşşək sudan gələnəcən** - uzun müddət, çox zaman.

Eşşək sudan gələnəcən vurdular.

**Eşşəyə minmək bir ayıb, düşmək iki ayıb** – fikirləşməmiş bir işə əl vurmaq başı aşağılıq gətirər.

Amma necə deyərlər, kürsüyə çıxmaq bir ayıb, kürsüdən düşmək iki ayıb (9, s.30).

**Eşşəyim ölüb, başı qızıldı** - öləndən sonra dəyərsiz birinə böyük dəyər vermək.

**Eşşəyi sudan keçənəcəndir -** işini həll olub qurtardı, adamı saymaz.

**Evdə xoruz, çöldə fərik/ evin xoruzu, çölün toyuğu –** evdəkilərə zülm eləyib camaat arasında özünü sakit, yazıq aparan.

**Evə girməmiş deyir: "tüfəngimi hardan asım?" / at almamış mıxın çalır--** bir işi qurtarmamış onu bitmiş bilir.

Evə girməmiş deyir tüfəngimi hardan asım (72, c.III, s.79).

**Evində yoxdu urvalıq, könlündən keçir kəndxudalıq -** ac adamın böyük arzusu. Yoxsul, imkansız olmasına baxmayaraq, böyük iddialarla yaşayır. Aciz, avara adamın böyük iddialara ət atması.

Cahan əhli, bu icz ilə özünü zənn edər sultan,
Sözü düzlük olar, lakin oğurluq işi hər an.

**Evi yıxılmaq –** başına fəlakət gəlmək.

Düşdü daş başıma yıxıldı evim,
Heç rəvadırmı mən bu yaşda ölüm?(195, c.II, s.179).

**Evləri cübbəxanadır –** evdə ağla gələn şeylər hamısı var. Cübbəxana Məşrutə dövründə silat-sursat anbarına deyilir.

Çox möhtərəm, evdar qadınlar hətta fədailər üçün paltar tikmək, məşrutəçilərin cübbəxanası üçün pukə(giliz) toplamaq və s. fəaliyyət göstərmişlər (350, s.103).

**Ev olmusan, olma axı eşik ol -** birinin damından yağış yağanda damardı, yağış kəsəndən sonra da dammaqda davam edir, ev sahibi deyir ki, ev olmursan, onda eşik ol. Yəni kömək etmirsən, niyə qolumdan çəkirsən.

**Ev tikiləndən sonra balta çöldə qalar -** yaxşılığı bilməyən adam.

**Ev yıxmaq –** birinə quyu qazmaq, pis günə qoymaq.

Gəldin ki, yüz görəsən,
Yüz göstər, yüz görəsən
Evin yıxdın Aşiqin
Yüz görə, yüz görə sən (33, s.78).

**Yaxşılıq eylə balığı at dəryaya, balıq bilməsə xalıq bilər** – yaxşılıq eləyən əvəzini görər.





Eyilügü eylə, dənizə buraq, balıq bilməsə xalıq bilür (229, s.32).

**Ev köçür, ev qaçır** – hər şey bir-birinə dəyib, ev tör-töküntüdür.

**Ev qalıb əyriyə, həm yeyə, həm səyriyə –** iş elə adamın əlinə düşüb ki, o bildiyin eləyir Ev qalıb əyriyə, həm yeyə, həm səyriyə (142, səh. 284).

**Ev məscid kimidir -** böyük və topdağıtmaz ev; boş və bir həsir bir, Məmmədnəsir olan ev.

**Eynalı qızılıdır -** gəliri xərcin ödəmir. 1083-cü ildə Təbrizdə olan Şarden deyir: «Eynalı qızılıdır, bir tümən qoyan, 9 qran götürür».

# -Ə-

**Əbanı yellətmək** – ifadə satmaq, məğrur olmaq.
Alıbdır fərmanı şəhrin imamı,
Əbanı yellədib etdi qiyamı (308, səh. 12).

**Əbülfəz qurbanlığıdır** - bu deyim mollalara və vətənin müdafiəyə ehtiyacı olan zaman qaçıb gizlənən xainlərə işarədir. İnama görə, Əbülfəz qurbanlığı ildə bir dəfə olur. Yəni pis adam az ölər.

**Əcəl camı içmək** – ölmək.
Qəribin boynuna kəfən biçilməz.
Əcəl camı çox acıdır, içilməz (35, s.538).

**Əcəllə oynamaq** – ölümdən qorxmamaq.
Bu İbrahim əcəllə oynayır nədi? (1, s.312).

**Əcəl şahı** – Əzrayıl.
İslam inamına görə, bütün yaranmışların canını Əzrayıl adlı bir mələk alır. Buna görə ona əcəl şahı da deyirlər.
Mən olsaydım əcəl şahı, uşağın canın almazdım.
Ucaltmazdım göyə madərlərin ahi-fəğanın mən (301).

**Əcəl təri basmaq** - qorxudan, ağır xəstəlikdən insanı buz tər basması.
Məni tezdən əcəl təri bürüyər, yay olunca sümüklərim çürüyər (267, s.391).

**Əcəri sabun** -sabunun lap balaca kirtiyi, arıq və uzun adama deyirlər.

**Əfil-əfil əsmək** - nanə yarpağı kimi titrəmək.
Ürəyim bir zərrə qayğı,
Bir zərrə məhəbbət üçün
Əfil-əfil əsir ( Səhənd).

**"Əh neynim" həbbi atmaq** -qüssə yeməmək, heç nəyə kədərlənməmək, laqeyd olmaq, heç nəyə görə narahat olmamaq.
Kopenləri satmışam, acqarına yatmışam,
"Əh neyniyim" həbbini
Çoxdan olar atmışam ( 340, s.10).





**Əhvalı zibil dadır** - kefi pis olmaq.
Hacının əhvalı zibil dadırdı, dilini bir qarış çıxarıb bizə yalvarırdı (335, s.292).

**Əkilmək** – aradan çıxmaq.
Molla ilə gələnlər işi belə görüb bir-bir durub əkilirlər (148, s..120).
Var xəta bunda canım, qoy əkilək burdan biz,
Açığı tutsa vurar başımıza qəlyanı (72, c.III, s.237).

**Əkməyən başaq dərər** - zəhmət çəkməyənin əlinə faydalı bir şey keçməz.

**Əksin çörək üstünə vursan, ac it də onu yeməz** - çox çirkin, xoşa gəlməyən
On dördüncü Məclis rəisinin müavini Şiraz nümayəndəsi sərdar Faxirhikmət isə sentyabrın 25-ində məclisdəki çıxışında tələb edirdi ki, Azərbaycanda öz hüquqlarının uğrunda mübarizəyə qalxmış şəxslərin əlləri və dilləri kəsilsin (Mirqasım Çeşməzar, s.378).

**Əl açmaq** – birindən xahiş etmək, birini vurmaq, dilənçilik etmək.
Dəli Həsən, səsinə qüvvət vermə, igid dil açmaz, al açar (174, s.16).

**Əlaltı** – yaltaq, birinə tabe olan, hər nə iş olsa qul kimi onu görən adam.
Lakin əlaltı işdə imiş fabrikaları
Hər yerdə var imiş nə gözəl texnikaları (72, c.III, s.225).

**Əlaltı dost** - yaltaq, simasız.

**Əlaltınca** – gizli.
Peşman evə qayıtdı, əl altınca qızı axtarmağa başladı (46, s.132).

**Əl atmaq** - bir qızın, qadının namusuna sataşmaq.
Saqi, dur əl at o badeyi qülrəngə,
Bir cam yetir bu morğe xoş ahəngə (223, s.129).

**Əl-ayağa dolaşmaq** – iş görməyib mane olmaq.
Yaradıcılar irəliyə, əl-ayağa dolaşanlar isə geriyə, tarixin amansız təkəri altına (72, c.III, s.79).

**Əl-ayağa düşmək** – pis bir əməlin üstünün açılmasını görüb o yolda ciddi tədbir görmək, bir qəfil qonaq gələndə tələsik iş görmək.

Qulların əllərində hökmdarın şəxsi avadanlığını tanıyıb əl-ayağa düşmüş və tezliklə onun özünü də tanımışdılar (144, s.98).

**Əl-ayağını itirmək** - qorxmaq, danışmaq bacarığını əldən vermək.

Tehrandan gəlmiş müdir Təbrizdə fars dilində danışırdı. Camaat fars dilindən qorxurdular, əl-ayaqlarını itirirdilər ("Azərbaycan səsi", № 9).

**Əl ayağını it yeyib?** – niyə belə əlsiz-ayaqsızsan?

Bəyəm, əl-ayağınızı it yeyibdir, balam? (253, s.273).

**Əl ayağın yığışdırmaq** - sakit olmaq, dinc durmaq, özünü bir işə hazırlamaq.

Çarizm dövründə xalq içərisində hörmətə malik olan qaçaqlar Kərəm, Nəbi, Fərhad lazım gəldikdə Arazı keçərək Qaradağda və s. yerlərdə özlərinə etibarlı sığınacaq tapır və əl-ayaqlarını yığışdırdıqdan sonra yenidən düşmənə qarşı hücuma keçirdilər (3, s.23).

**Əl-ayaq altında qalmaq** – bir hücum zamanı qurban olmaq, hörmətsiz olmaq.

Ərim yox, bir zorba dayım yox, qalmışam əl-ayaq altında (9, s.140).

**Əlaz olmaq** - bir sənətdə və ya alış verişdə çox az adamın iştirak etməsi.

**Əl basmaq** – and içmək.

İstolda oturmaram,
Ağır söz götürmərəm,
Gətir "Quran" əl basım,
Yardan əl götürmərəm (33, s.168).

**Əlbəyaxa vuruşmaq** - silahsız dalaşmaq.

**Əlbir olmaq** – bir işdə ortaq olmaq.

Onunla dostlaşmaq, əlbir olmaq fikrində idi (174, s.15).

**Əl boyda** - çox balacaboy adam.

Acımış bütün günü o yazıq, günbatan zaman,





Bir əl boyu çörəklə edib şam, həm nahar (80, c.II, s.187).

**Əl buyruqçusu** – hər şeyin dalınca göndərmək.

Mən sizin təmirat idarəsinin nə əl buyruqçusuyam, nə də müti məmuru! (253, s.226).

**Əl çatmayan, ün yetməyən** – çox uzaq.

Səməndər quşu Qaf dağının əl çatmayan, ün yetməyən bir yerində yuva qurub (103, s.13).

**Əl çəkmək** - buraxmaq, göz çəkmək.

Dünyadan əl çək, divanə könlüm,
Ulaş bir ustada, ər ilə görüş (150).
Molla getmək istəmirsə də, əl çəkmirlər (148, s.20).

**Əl çoxalmaq** - bir sənətdə bir alış-verişdə çoxlu adamların olması.

**Əl dalına çəkmək** - birini nahaq yerə müdafiə etmək, birinə dayaq durmaq.

**Əldə açıldı** - tez özünü büruzə verdi.

**Əldən getmək** – bir insanın və ya bir millətin yoxsulluqdan, səfalətdən yoxa çıxması.

Ey məşədi, ey kərbəlayi, ey hacı əttar,
Ey qırmızı saqqal kişi, islamidə dindar,
Baxma vətən övladına, əldən gedər onlar (82, səh. 79).

**Əldən salmaq** - yormaq, xəstələndirmək.

Üç gün Yevlaxda gözlədik, avtomobil olmadı, ağcaqanad bizi əldən saldı (197, s.146).

**Ələ alanda qavaldır, G... soxanda zurna** – yəni xeyrə yaramaz bir şey.

**Ələ almaq** – özünü toplamaq, birini özünə tabe etmək.

"Rica edirəm, özünüzü ələ alın"- deyərək qadını otaqda buraxıb getdi (234, s.447-448).

**Əl qatmaq** - özünə əl qatmaq, özünü döymək, bir işdə əli olmaq.

Elə özümə əl qataram ki, özümü özümün əlimdən alan olmaz.

**Əldə dəmir əsa, ayaqda dəmir çarıq** – birinin arxasınca dünyanı dolaşmaq.

Dolaşırıq dünyanı, əldə dəmir bir əsa (328).
**Əldəqayırma –** saxta, həqiqi olmayan.
Bu kapitan əldəqayırma azərbaycanlı idi (1, s.283).
**Əldən çıxartmaq –** fürsəti əldən vermək, kələk gəlmək
Heyfdir bu cür kişmişi əldən çıxartmaq (195, c.II, s.13).
**Əldən-dildən salmaq –** yormaq.
Fil bir neçə gün içərisində kəndi əldən-dildən salır (148, s.120).
**Əldən düşmək -** yorulmaq, qocalmaq.
**Ələ baxmaq –** birindən asılı olmaq.
Elə bilirsən sənin əlinə baxıram, xarabandan getsəm, qalmağa bir yer, yeməyə bir parça zəhrimar tapmaram? (9, s.53).
**Ələ düdük vermək -** bəhanə vermək, sarımaq.
**Ələ düşmək -** fahişəliyə düşmək, əsir düşmək, fürsət düşmək

Bir də ələ düşməz belə aylar, belə günlər, belə illər,
Dünya olacaq başımıza təng deyirlər.

**Ələ daş vermək -** türkdilli xalqlarda insanın daşdan yaranması əsatiri görüşün əsaslarından sayılır. Bu inam indi də müxtəlif şəkillərdə öz həyatına davam edir. Balaları yoxsulluqdan və ya müxtəlif illətlərə görə didərgin düşmüş, ölüm halında olan ananın əlinə axır ləhzələrdə bir daş verib onu balalarının gəldiyinə inandırırlar.
Aba öləndə deyərmiş ki, nə Behruz gəldi, nə Pərviz, bir azdan əlimə daş verib deyəcəksiniz ki, bu Behruz, bu da Pərviz.
**Ələkçinin qıl verəni -** ara qızışdıran, hər yerdə hazır olan, əlindən bir iş gəlməyən. Baltaçının hin deyəni ilə bir mənada işlənir.
Az yaz poz birliyində ələkçiyə qıl vermək üçün ixtisaslı kadrlar tələb olunur (9, s.51).
**Ələk-vələk -** altını üstünə çevirmək, hər yeri axtarmaq.

Bu hərc-mərc, basabas,
Ələk-vələk mühitdə bir-birinə qarışıb
ağciyər də, igid də.





**Əl-ələ, baş-başa çıxmaq-** nəzərdə tutulan işdə nə zərər, nə fayda oldu.
**Əl-əli yuyar əl də üzü –** yaxşılıq edən yaxşılıq görər.
Əl əli yuyar, əl də yüzü (9, s.143).
**Əl əl üztə oturmaq –**heç bir iş görməmək.
-Bəs onda niyə əl əl üstə oturublar? ( 253, s.19).
**Ələm -yesir olmaq –** çox yorulmaq, avara qalmaq.
Bu gün ələm-yesir olmuşam ( Humay xala).
Ondan gör ki, bunlar o əfəl Bağırın qabağında ələm yesir olub mil durublar (253, s.172).
**Əl-əli tanır –** hər kəs aldığına gərək pulu, yaxud bir şeyi gaytara.
**Əl əli yuyar, əl da qayıdar üzü yuyar -**yaxşılq yaxşılıq gətirər.
**Ələngə-üləngə -** dəyərsiz at, faydasız adam.
İş belə ələngə-üləngəyə qalsa, bunlardan mənim özümdə də çoxdur (174, s.6).
**Ələ salmaq –** birini təhqir etmək, məsxərəyə qoymaq.
Elə bilirsən dəlilərə həkimlik eləmək asan işdi hə, bizi ələ salıbsan, ya özünü ələ salıbsan (195, c.II, s.167).
Özün kasıb olmasaydın, deyərdim yoxsulları lağa qoymaq üçün məni ələ salmısan (201, səh. 223).
**Ələtəş olmaq -** əlimyandıda axtarmaq.
- Höccət qaya özü də ələtəş sizi ziyarət etmək arzusundadır ( 253, s.184).
**Ələ vermək -** satmaq, xəyanət eləmək.
**Əlfida -** bir şeyə əl tapmaq üçün özünü ora-bura vurmaq.

Göydə ulduz cidadır,
Mələklər əlfədadər,
Qəm çəkmə dəli könlüm,
Mətləb verən xudadır.

**Əl gərək tez gərək, o da cümə gecəsi -** mənim istədiyim nə cür olsa, gərək hazır ola.
**Əl götürmək –** əl çəkmək.
İstolda oturmaram,

Ağır söz götürmərəm,
Gətir "Quran" əl basım
Yardan əl götürmərəm (33, s.168).

**Əli ağzına yetişən** - varlı, sərvətli, imkanlı, yoxsul olmayan.

**Əli aşağı** –kasıb, imkansız..

Aradan bir müddət keçdi, atam-anam öldü, əlim aşağı düşdü (46, s.267).

**Əli aşından da, Vəli aşından da olmaq/ aranda xurmadan oldum, yaylaqda buğdadan** – hər şeydən əli çıxmaq.

Əli aşından olanlara Vəli aşı, Vəli aşından olanlara Əli aşı təqdim edirlər. Qonaqlara tutanda qatıq, tutmayanda ayran təklif edirik (9, s.48).

**Əli ayağından uzun gəlmək** - dalısınca getdyi işdən nəticə almamaq, peşiman, naümid qayıtmaq.

Əli ayağından uzun, ürəyində sıxıntı evə sarı geri qayıtdı (226, № 140).

**Əliboş** - yoxsul, kasıb, imkansız insan.

Necə behdari naxoşlar yeridi,
Elə məscid əliboşlar yeridir (168, s.27).
Bilməyirsən ay Nəbi!
Müftə yeməklər dadını
Əliboş olsan əgər,
Kimsə aparmaz adını (326, səh. 104).

**Əli də gətirir, ayağı da** - çox qazanır, bacarıqlı və şanslıdır.

**Əl içi/ ovucun içi** - düz, daşsız-çınqılsız, tanınan.

Həyatda iki yol var: biri əl içi kimi hamardır,
Yoxuşu yox (351, s.81).

**Əli əllərdə olmaq** - yuxarıda dayağı olmaq, çalıb çapmaqda əlbir olmaq.

**Əli əl üstünə qoyub oturmaq** – baş vermiş bir hadisənin aradan götürülməsinə müdaxilə etməmək.





Əlimizi əlimizin üstünə qoyub otursaq, onda firqə qarşısında məsuliyyət daşımalı olacağıq (77, səh. 30).

**Əli ətəyindən uzun** - əli boş gəlmək.

Bu balanı altı saat qapıda gözlədəndən sonra axırı əli ətəyindən uzun qaytarmısan (9, s.152)

**Əli əyri** – oğru.

**Əlif qəddin bükülməsi** – qocalmaq.

İsmi- pünhan, Şeyx Sənandan beşbetər,
Əlif qəddim bükən yerdir, bu yerlər (32, c.II, s..72).
Əllisində əlif qəddin çəkilir,
Altmışında ön dişlərin tökülür (35, s.237).

**Əli ilə beh verir** - özü bir işə səbəb olur, başını bir işə qatır, xata törədir.

**Əli qalınlaşmaq** – pullanmaq.

**Əliqanlı** – adam öldürmüş, qatil.

25 il əvvəl mənim qanıma susamışdı, ondan qabaq da əliqanlı idi (1, s.289).

**Əli qələm tutmaq** - savad öyrənmək.

Çernyayevskinin "Vətən dili" kitabını bir neçə ayın müddətində oxuyub qurtaracaqlar və əlləri qələm tutacaq (195, c.II, s.126).

**Əli qızmaq** - bir işdən ürəklə yapışmaq.

Altı ay növbəyə dur, bir maşın acir yetişə,
Odu ki, bir nəfərin də əli qızmır heç işə (168, s.920).

**Əli qoltuğunda qalmaq** - yaman günə düşmək, işsiz qalmaq, maddi və mənəvi cəhətdən çıxılmaz vəziyyətdə olmaq, bir iş görə bilməmək.

Qisməti od, qazandığı nifrət,
Əli qoynunda bağrıqan "Zənbur" (Əli Nəzmi, 1909).
Əməyi müftəxor əllərdə, ayaqlarda gedər
Yenə qoltuqda əlləri başmaq tikənin (304, s.156).
Nəzərində cahan olub zindan,
Boynu çiynində, qoltuğunda əli (72, c.III, s.164).

**Əli-qolu bağlanmaq** –heç bir iş görə bilməmək.

Bəlkə də heç şəhərə çıxmadım, sənin əl qolunu bağlamışam (1, s.261).

**Əli quru** - paxıl, xeyir verməyən, ərköyünlük etmək, xəsis.

**Əlim cibimdədi, ağlım başımda** - hər işim qaydasındadır.

Anam, daha məndən nigaran olma,
Əlim cibimdədi, ağlım başımda (260).

**Əlim ətəyinə** - pənah gətirmək, pənah istəmək, iltimas eləmək.

Mənim əllərim, sənin ətəyin
Yad ətəyindən əl götürmüşəm (277).

**Əlim xəmir, qarnım ac** - çox işləyib ac qalmaq.

Əlimdən dünyaya nur ələnsə də,
Həyatda qismətim ehtiyac oldu.
Sahiblər işimdən bəhrələnsə də,
Mənim əlim xəmir, qarnım ac oldu ( H.Tərlan).
Sən yarıvın ləblərindən, mən əllərin qabarından,
Əli xəmir, bir ömür ac insanlardan yazacağam (224, s.7).
Əli xəmir, qarnı ac olan kəndliyik,
Dərdi- qəmə amac olan kəndliyik (Şəhrək, s.57).

**Əlimin içindən gəlir** – mənim bacardığım budur, ocəb edirəm ki, bu işi görürəm.

Yaxşı eləyirsən, lap əlinin içindən gəlir (142, səh. 115)..

**Əli ilə qoymaq** - hər şeyin yerini dəqiq bilmək..

Uca Kamal Təbrizdən Tehrana bütün istqahların adını bilirdi, sanki öz əli ilə qoymuşdu (203, s.5).

**Əli işdən soyumaq** - bir işin gəlirinin az olmasına, yaxud mühitin pis olmasına görə işə əli yatmamaq.

Düşünəmmir nə cür etsin, əli işdən soyuyub ( M.Etimad).

**Əli iş tutmamaq** - sənət öyrəşməyib, işləməyə bir yer tapa bilməyib.

**Əli qoltuqda qalmaq** - çarəsiz vəziyyətə düşmək.

Saibin gözləri yaşlı, əli qoltuqda Hümmamın,
Qara köynək geyinib Gəncəvi və xaceyi- Şirvan (352, s.33).





**Əlimi yudum/ əlimi üzdüm** - naümid oldum, sənə inanmadım.

Səndən yudum əli, Rey sabunu ilə
Peşən utanmazlıq özün zülmkar ( Qətran Təbrizi).

**Əlim ayağım dəyməmiş** - Məni aldatmaq, tora salmaq olmaz, əlim ayağım Dəyməmiş qoşununu da götür çıx buradan get. ! (148, s.183).

**Əlimin duzu yoxdur** – kimə yaxşılıq edirəm mənə pislik edir.

Əlimin yox nəməki hər kəsə xoşluq edirəm.
Əvzində oluram tiri cəfanın süpəri (168, səh. 5).

**Əlinin duzunu dadmaq** – yəni birinin bacarığını, hünərini başa düşmək..

Qəsəbə əhli əlimin duzunu (sizdə təqsir yoxdur, lənət ruzi-qara, müəllimlik hara, sərmalınılıq hara) dadandan sonra, xamlığımı bilmişdilər (281, səh. 93)..

**Əlim üzümdə qaldı** -məəttəl qalmaq, heyrətlənmək.

Oğuz yolda gedərkən ağzında qaldı əli.
Çox böyük bir ev gördü gümüşdən pəncərəsi (236, s.23).

**Əlin aşda ikən gözün işdə olsun (229,** s.15).

**Əlin çək, yaxam cırıldı** - durduğu yerdə davaya düşmək

**Əlindən bir abbasılıq iş gəlməz** - əlsiz-ayaqsız, heç nəyə yaramayan

**Əlində bir isti çörək tutub ki, gəl məni öldür** - birinə acıq verən, savaşmağa təhrik edən

Acı-acı sözüş verən, hüququna təcavüz edən

**Əlindəki toyuğu uçan qazla dəyişməmək** -nağdı qoyub nisyə dalınca qaçmamaq.

İsmayıl bəy əlindəki toyuğu havada uçan qaza dəyişdirən adamlardan deyildi (166, s.198).

**Əlindən cəzana gəlmək** –bezmək, cana doymaq.

Burjuyların əlindən cəzana gəlmişik (148, s.117).

**Əlindən dad eləmək / əlindən dad çəkmək** – zülmdən fəryad eləmək.

Ana bacıları çəkdilər fəryad, bunların əlindən elədilər dad (80, c.II, s.155).

Bu qılınc ilə müxənnət bəylər, paşalar sənin əlindən dad çəkəcəklər (174, s.11).

**Əlindən gələni beş qaba çək** - əlindən gələni əsirgəmə, bacardığın hər pisliyi əsirgəmə.

Nazlı-əlindən gələni beş qaba çəksin (9, s.145).

**Əlindən gələni əsirgəməmək** – "Əlindən gələni əsirgəmə!" şəklində işlənir. Yəni səndən qorxan yoxdur, məni hədələmə.

Əlindən gələni əsirgəsən, kişi deyilsən (174, s.11).

Bağırxan: hər nə əllərindən gəlir, əsirgəməsinlər (149, s.52).

**Əlindən qan ağlamaq** – birinin zülmündən boğaza yığışmaq.

Bütün dünya onların əlindən qan ağlayır (46, s.22).

**Əlindən su dammaz** - xəsis, heç kəsə yardım etməyən.

**Əlində oyuncaq olmaq** - bütün həyatı, ictimai, siyasi fəaliyyəti başqalarının məsləhəti ilə həyata keçirilən adam.

İdrakı sönük başçıların qəfləti ancaq

Etmiş edəcək milləti əllərdə oyuncaq (Cavid, "İblis").

**Əlinə baxmaq** - birinin maddi yardımına göz dikmək.

**Əlinə dov düşmək** - mənfi mənada əlinə bəhanə, fürsət düşmək.

**Əlinə düdük vermək** – başını aldatmaq, tovlamaq.

Bir yoxsul kişi öz-özünə deyir: Gedim ölkənin yaman günə düşməsini şaha deyim. Ya öldürər, ya da xalqa nicat verər.

Çox çətinliklə şahın yanına gedir. Şah qocanı tək qəbul edir. Dərdin eşidəndən sonra, bir kisə qızıl verir. Vəzir bu işi görüb, təəccüb edir. Vəzir yoxsul kişidən soruşur: Şah sənə niyə qızıl verdi? Yoxsul cavab verir: Mən ona bir sehirli düdük verdim ki, çalanda nə istəsə, əlinə gələr. Vəzir də xahiş edir ki, ona da belə bir düdük versin. Yoxsul kişi evlərinə gələndən sonra qarğıdan bir tütək düzəldib, vəzirə ərməğan edir və yenə bir kisə qızıl alar. Bir gün şahın qonaqlığında vəzir başlar bu cır səsli düdüyü çalmağa. Şah soruşar ki, bu nədir belə? Vəzir deyər: Qibleyi Aləm, bu, səninkindəndir.





Şah bilər ki, bu arxac həmən kasıb kişidən keçib. Şah kişini çağırtdırıb soruşur: -Ay kişi, bu nə düdükdür vəzirə vermisən? Kişi olan macəranı şaha deyir: Buna görə ki, sirrimizi bilməsin, onun əlinə bir düdük verdim ki, çala-çala getsin (38, səh. 251-252).

**Əlinə su tökmək** - birinin var-dövlətini əlindən çıxarmaq, bir şeyi ucuz qiymətə birindən almaq.

Gözəllikdə elə bir afəti zaman idi ki, Yusufi Kənan onun əlinə su tökə bilməzdi (9, s.88).

**Əlinə su tökməyə yaramamaq** - müqayisə olunan adam o birisindən çox aşağı səviyyədədir.

**Əlinə tapşırmaq** – birinə şəxsən təhvil vermək.

Yazır ki, padşahın əlinə tapşırılan ixtiyar toxunulmazdır (234, s.461).

**Əlinə zırna vermək** - yalan vədə ilə başını tovlamaq, ələ salmaq.

**Əlin götür, üzün yu** - olan budu, qəbul etsən də etməsən də.

**Əlini ağdan-qaraya vurmamaq** – heç bir iş iş görməmək.

O, heç əlini ağdan-qaraya vurmaq istəmirdi (46, s.218).

Xanpərvər bəyim də əlini ağdan qaraya vurmur (335, s.85).

**Əlini çör-çöpə atmaq** -əlacsız qalıb hər kiçik bir şeydən yapışmaq.

Boğularkən əl atır çör- çöpə, dəryada Niyaz,

Belə gün əqlə gətirməzdi Niyaz!

Cavidan- bu gecə xəlqimizin şah zülmündən qurtuluş gecəsidir. Düşmən quduzlaşıb, necə deyərlər, dəyada boğulan əlini saman çöpünə uzadar.

**Əlini hara ucadı ora qoy** - əlindən gələni əsirgəmə, kimə istəyirsən şikayət et.

Əlini hara görsən ucadı, get qoy ora,

İndi get qoyma qala axşama vəxtin yubana (338).

**Əlini isti sudan yax suya vurmamaq** - heç bir iş görməmək.

**Əlini qana batırmaq** - birini öldürmək, yaxud yaralamaq.

**Əlini qoy ürəyinə** - rahat ol, nigaran olma.

**Əlinin börkünü Vəlinin başına qoymaq** - fırıldaqçı, özgələrin pulu ilə sərvət qazanan.

Bunlar ac qurdlardır ki, neft sayəsində dövlətlənən Bakıya yığılıb Əlinin börkünü Vəlinin başına qoyub ciblərini doldururlar ( M.Şahtaxtlı, 1903).

**Əlinin dalı qabağını tanımır** - bacarıqsız, huşsuz.

**Əlinin suyunu göstərmək** - indi sizə əlimin suyunu göstərərəm (129, c.I, s.442

**Əlinin içi kimi tanımaq** - bir yeri, dağı dəqiq tanımaq.

Başını saldı aşağı, xısın-xısın yol getdi. Yolu əlinin içi kimi tanıyırdı (203, s.31).

**Əlinin suyunu içmək** - gücünə bələd olmaq, ondan zərbə almaq.

Güclü idi: doqquzuncuda, onuncuda oxuyan uşaqlara da əlinin suyunu içirtmişdi (84, s.437

**Əlinin üstündə əl yoxdur** - böyük hökmdarlar haqqında işlənir. Ailədə, nəsildə ən hörmətli, nüfuzlu adam haqqında işlənir.

Sultan Əmirli də əlinin üstündə əli olmayan xozeynidir bu respublikanın (142, səh,26).

**Əlinin sağ-solunu bilməmək** – savadsız, bacarıqsız adam.

Sərbaza bax, ay Allah,
Fəxr eyləsin şahənşah.
Sağın-solun bilməyir (69)..

**Əlini özgə cibində qızdırmaq** – birinin cibinə girmək, birinin malını oğurlamaq.

**Əlini ürəyinə qoy** - rahat ol, arxayın ol.

**Əlini üzmək** – ümidini itirmək.

Zalım ovçu əldən əlin üzəndə
Qoymayasan bərələrdə durarlar ( Aqşin).
Əzizinəm hələ var,





Bağban bağda hələ var
Əlim səndən üzülsə,
Gözüm səndə hələ var (33, s.145

**Əlin üzə yapışması** - heyran qalmaq, təəccüblənmək.

**Əlin yağlıdır, öz başına çək** – bacarırsan, özünə bir gün ağla.

**Əli oxunmaq** - iş üzünə, daxili mahiyyətinə dərindən bələd olmaq.

Təməddünün qanunları qoxuyub.
Daha hamı onun əlin oxuyub (306, s.97).

**Əlisi dəli, Vəlisi dəli, qırılmışın hamısı dəli** – burda ağıllı adam yoxdur.

Əlisi dəli, Vəlisi dəli, qırılmışın hamısı dəli (335, s.88).

**Əli sulu** - bacarıqlı, hünərli, əlindən hər iş gələn.

**Əli uzun** - oğru, dalaşan.

neynək, sizdə də inqilab qələbə çalar, əliuzunların qollarını qanırıb dallarında möhkəm bağlayarlar (1, s.63).

**Əli yağa bulaşmaq** - çoxlu pul qazanmaq.

İnşallah, əliniz yağa bulaşar (129, c.I, s.439).

**Əli yalın** – silahsız.

Daşnak agentlər ağır bir cinayət törədirlər, Bağırovun köməkçisi İsmayılovu öldürüb qanını əli yalın camaatın üstünə tökürlər (105, s.25).

**Əli yanmaq** – dərdin, faciənin böyüklüyündən, onu qələmə gətirə bilməmək.

Qələm aldın ələ, heyhat, şikayətdən əlim yandı (264, səh. 18).

**Əli yanan ağzına təpər** - naçar adan nə etdiyini bilməz..

**Əliyanmış** – var qüvvəsi ilə

O da Dünyamalı gündə idi, əliyanmış ər axtarırdı (46, s.128).

**Əli yüngül** - uğurlu, düşərli. inama görə belə adamlar siftə verəndə, Birinə bir şey gətirəndə bolluq, uğur gətirir.

**Əlləri dilləri kəsmək** - haqlı istəklərin qarşısının alınması.

**Əllərinə xına qoy** - get sevin, şadlıq elə.

Bir nəfər düşməninə kinayə ilə deyər.

**Əllərini pişik yeyib** - əlsiz-ayaqsızdı, sakit.

**Əlləri ölçmək** – əllərini tərpədə-tərpədə, yellədə-yellədə danışmaq.

Əsirlərin hamısı azərbaycanlı idi. Lap qabaqda duran kişi isə əlini ölçə-ölçə yoldaşı ilə Maştağa (Bakı kəndlərindən biri) ləhcəsində danışırdı (1, səh. 271).

**Əlli arxın suyunu bir arxa calamaq** – hər şeyi bir birinə qatmaq, yersiz sözlər danışmaq.

Sanma bir məsləki təqiblə möhkəm qalaram,
Əlli arxın suyunu gündə bir arxa calaram (267, s.290).

**Əlli ayaqlı getmək** –uzun müddətə həbsə düşmək.

"Əşi, ağzını nə qoymusan Allah yoluna, dilini dinc qoy, əksinqilabi söz danışma, tutub apararlar əlli-ayaqlı gedərsən" (1, s.189).

**Əlli-ayaqlı** - bacarıqlı, zirək, hoqqabaz.

Əlli-ayaqlılar tapır, yağlı dili olan tapır,
Əlsiz-ayaqsız ortada qarət olur, talana bax (338, səh. 22).

**Əlli-dilli itmək** - bir nəfər itir və ondan heç bir xəbər çıxmır.

Bu dastan bir yaman dərd oldu mənə,
O quş əlli- dilli itdi ki, itdi (292).

**Əlli-dilli getmək** – yəni heç bir nişanəsi qalmadan itmək.

Biçarə əlli-dilli itkin düşübdür, nə bir xəbər var, nə də bir ətər.

**Əlli əlli üstündə, bir əlli də onun üstündə** - xərcə düşən adam onun az-çoxluğuna fikirləşməz.

**Əl mənim, ətək sənin** – sənə pənah gətirmişəm, mənə yardım et.

Bu əl mənim, ətək sənin,
Ölürəm amandır, Maral (230, səh. 55).
Əl mənim, ətək sənin (129, c.I, s.335).

**Əlsiz-ayaqsız** --bacarıqsız.

Mən hər cür olsa, öz başımı girləyərəm, vay əlsiz-ayaqsızların halına (72, c.III, s.36).





**Əl tutmaq** – kömək etmək.

Onlar da fəqirlərə, zəlillərə əl tutsunlar, ehsanı, xeyratı mənim adımla başlayıb mənim adımla da xətm etsinlər (144, s.106).

**Əl ulağı** – hər bir işdə ondan istifadə edilən adam.

Mənə çox vədələr etdin, hamısı oldu yalan,
Əl ulağı kimi basdın belimə yaxşı palan (168, səh.542).

**Əl üstündə aparmaq** - əzizləmək, qayğı göstərmək.

**Əmcəyini təndirə yapmaq** – qışqır- bağır salmaq. Yalandan ağlamaq.

Qardaş, gözün axtarmada qoy, bir səni tapsın,
Eşqin tilisim, dağları Fərhad kimi çapsın,
Düşmən var isə, əmcəyini təndirə yapsın (306 s.65).

**Əməli azmaq** - birdən- birə birinin rəftarı dəyişmək, yoldan çıxmaq.

**Əməlli-başlı** – hərtərəfli, kamil.

Ucundan qulağından başa düşdüm,
Amma əməlli-başlı yox (35, s.470).

**Əmr elə, qar yağsın** - sənin bu buyruğun qeyri-təbiidir, boş sözdür.

**Əndə-məndə danışma** - hədə mənasında işlənir.

O molla ki, deyəcək əndə-məndə minbərdə,
Məkanı Nöcədə, ya Saucbulaqda olacaq (300, s.104).

**Əndiz-əndiz** - ucsuz-bucaqsız.

Dəryanın ortasındakı əndiz-əndiz su təkin qaranlıq burulurdu, löngər verirdi (203, s.15).

**Əngəbəy** – çox danışan, gücünü ənginə verən.

Şair qalıbdı pulsuz, zorun veribdi əngə,
Fəryad onun əlindən, xəlqi gətirdi təngə (301).

**Əngəl- kələf** - başa bəla olmaq.

Turanlılarız adiyi-şüğli sələfiz biz
Öz qövmümüzün başına əngəl kələfiz biz (267).

**Əngiənginə keçmək** – lap arıq, cılız bir Adam. Yoxsulluqdan, aclıqdan, qəmdən nəhayət dərəcədə arıqlamaq.

Heç kəs deyə bilməz ki, millət qalıb avara

Əngi keçib əngindən şalvarı olub para (69).

Mənim sayeye-mərhəmətimdən ehsan plovları yeyirdi. İndi əngi-əngin ə keçib (201, səh. 63).

**Əngi qıfıllanmaq-** həyəcandan, qorxudan danışa bilməmək.

Birinə xox eləyəndə qıfıllanır əngi (168, səh. 442).

**Əngi qadaxsız -** ağızda söz saxlamayan, boşboğaz.

Bir gözü dar, bir boş, bir səfeh,
Əngi qadaxsız beşiminci paxıl (168, s.847).

**Əngin ə çəkmək -** vurmaq, təhqir etmək, yerində oturtmaq.

Hey gedər, hey gələr, ha mən əkərəm,
Dayanıb dursa, əngin ə çəkərəm (Şükuhi).

**Əngini bağlamaq -** susmaq, qorxmaq, nahaqqa etiraz etməmək.

Sun tutub bağlamadıq əngimizi,
Sadir etdik ora fərhəngimizi (168, s.166).

**Əntər məşki vermək -** birinə əzab vermək, başına oyun açmaq.

**Əntər oynadan -** xalqı ələ salan, birinə əziyyət verən, təhqir edən.

Gah əntər oynadır hacı, gah zırna çaldırır
Məqsudi puldur, puldan ötrü biqərar olur (168, s.915).

**Ənzəli balqabağı –** bacarıqsız.

Bilə-bilə rolu eləsinə verir ki, o da səhnəyə çıxdıqda Ənzəli balqabağına dönüb qalsın (72, c.III, s.284).

**Ənzəli oynayır -** çox o yan- bu yana qaçmaq.

**Əppək olub göyə çəkilmək –** yoxa çıxmaq.

Fikir-xəyal Şah İsmayılı lə çulğalamışdı ki, yuxusu bir əppək olub qalxmışdı göyə (35, s.257).

**Ərdək quzu -** anası ölən, yaxud anası yaxın durmayan quzu, qoyunçunun əli ilə böyüyür. Belə quzular ümumiyyətlə, bərkə boşa dözməyən və özü kimilərini sudan çıxardan olmurlar. Əlsiz, ayaqsız adamları ərdək quzuya oxşadırlar.

**Ərəbzəngi –** yol kəsən.





Bir ona baxın, gör Ərəbzəngi kimi nə kəsib yolun ağzını, iş yox, peşə yox (109, s.52).

**Ərə getmərik, bəxt açarıq -** bizim zəhmətimizdən özgələr faydalanar.

**Əri döymüş arvadı it də tutdu bir yandan -** bədbəxtliyin üstünə bədbəxtlik gəlir.

**Ərindiyindən erməniyə dayı deyir -** çox tənbəl adam.

Ərindiyindən erməniyə dayı deyən Adıgözəl yol yeriməyə, can Allaha verir ("Yol", 17 oktyabr, 1990).

**Əriyib çöpə dönmək -** fikirdən hədsiz dərəcədə arıqlamaq.

Sərçə deyir: hardasan ay yaz, qış əhdimi kəsdi, qırx put canımı əridib çöpə döndərdi (103, s.101).

**Ərk etmək -** güvənmək, intizarı olmaq, yaxın adam saymaq.

Ailəmizdə yeganə kişi xeylağısan. Sənə ərkim çatır. Ona görə deyirəm, uşaqlarımızın üstündə gözün olsun (269, səh. 246).

Topraq səbrlidir, amma bir gün saxladığı ərkləri, niskilləri açacaq, həmişəlik, örtülü saxlamaz (203).

**Ərsin boğaz -** uzun, arıq, ədəbsiz.

Longi uzun, ərsin boğaz,
Oturarkən ayaqların masa üstə dırmaşdıran
Bu daylaqlar (284, s.500).

**Ərsini özgə təndirində oynayır -** ona-buna dolaşmaq, özgənin malına təcavüz etmək.

**Ərsini təndirlərin govduşlarında oynayır –** özgənin işlərinə müdaxilə etməmək.

Kimdi bu govduşlara versin bu ərsindən nicat? (306, s.172).

**Ərş xoruzu -** xalq inamına görə, yer üzündə olan xoruzlar yerin yeddinci qatında olan ərş xoruzunun ban səsini eşidəndən sonra banlarlar. İlkin səsləyən.

**Əskik adam -** ən pis, yaramaz adam.

Mən bunları qəzəmətdə çürütməsəm, məndən əskik adam yoxdu (195, c.II, s.136).

**Əski qapı, əski daban** – heç nə dəyişməyib.

İndi yazır əski qapı əski dabanı birbəbir (72, c.III, s.231).

**Əsgim tüstülüdü** - hamı mənə pis gözlə baxır, məni təqsirkar bilir.

Əskin tüstülüdü? Bəs mənim bu çalğı-valğıda nə işim vardı? (84, s.79).

**Əsli qaraçı olandan şah olmaz** – əsli-kökü olmayandan yüksək əməl gözləmək olmaz.

Bir şəxsin ki, əsli ola qaraçı,
Hardan ki mən onu şahan eyləyim? (32, c.II, s. 116).

**Əslini danan qatırdır** – düz adam əslini danmaz.

Deyərlər, "əslini danan qatırdır!" (253, s.450).

**Ətdaş etmək** - ağır-yüngül etmək.

**Ətdən divar çəkmək** - *sıx cərgə ilə dayanmaq.*

Biz Hökmavarıq gəlmişik,
Ətdən divarıq gəlmişik.

**Ətək altı** - gizli, ikiüzlülüklə həm xurma, həm xuda dalısınca getmək.

Səngək qoyub satır, ətək altı da həşiş satır.

İranda islam Cümhurisi adı ilə hakimiyyət edən fars şovinistləri bu günə qədər özlərini müsəlman adlandırsalar da ətək altı Qarabağı işğal etmiş erməni daşnaklarına hər cür yardım, əsləhə verməkdən utanmırlar.

**Ətəkdə daş saxlamaq** - bir savaşa, mübarizəyə hazır olmaq.

Ətəyimdə hələ də saxlamışam daşlarımı,
Açmışam qəlbimizin bağlı qalan yollarını.

**Ətəkdən keçirtmək** - məhrəm bilmək, yaxın bilmək.

**Ətəkdən yapışmaq** – yardım istəmək, yalvarıb-yaxarmaq.

Ələsgər üz çevir şahlar şahına,
Yapış ətəyindən, şikayət eylə (14, səh. 30).

**Ətənə** - ölüvay, əlsiz-ayaqsız.





Təbrizdə bülbülün və serçənin yumurtadan çıxan zamanlarına deyirlər.

Ey istanbullu qardaş,
Nə yapdın gəldin vətənə
Oldun ətənə (80, s.94).

Yazın son ayında ətcə balalar pərvaz olanda fərələr səkəndə olaydı ki, insan xəyalı da düzələydi kaş (204, s.21).

**Ətəyi başına atmaq** - həyasızlıq etmək. Haqsız başqalarına damğa vurmaq, rüsvayçılıq etmək.

Bədəxlaq, hər sözə başına atar ətəyi (168, səh. 228).

**Ətəyi ələ verməmək** – fürsəti bada verməmək, ələ verməmək.

Elə ki, atdı, qaçar bəy, ələ verməz ətəyi.
Tutsalar şuxluqnan hamısı tapdarlar bəyi (168, səh.265).

**Ətəyindən çəkmək** – birini ayıq salmaq, xəbərdarlıq eləmək.

Düşünüb dərindən
Ancaq babası çəkir ətəklərindən (328, s.199).

**Ətəyindən əl çəkmək** – buraxmaq.

Çəkməz ətəyindən əlini, çəksə də hicran.
Eylər canını canına qurban səni istər (264, s.57).

**Ətəyindən daşı tökmək** - bir işi buraxmaq, əl çəkmək.

Ona görə gəl ətəyindən daşı tök, Məhəmmədi şaha verib iki özü ağırı qızıl alaq (46, s.174-175).

**Ətəyindən tutmaq** – birindən yardım gözləmək.

**Ətəyinə çörək qoymaq** - əlimə bir iş vermə ki, ziyanın çəkəm.

**Ətəyi tozlu** – kasıb-kusub.

Ətəyi tozla dolanlar vətən etmiş köyünü
Səni sovmuş göyə köydən evi viran etmiş (354, s.28).

**Ətəyivi at dalına, gör haran görsənir** - bu işi ki görürsən özünün, ailənin zərərinədir.

**Ət gətirməyib küftə istəyir** - imkanından artıq iddiası olan.

**Ət gövduşuna girmək** – normal olmayan bir şeyi normal saymaq.

Yüz nəfər türk bir farsla bir yerdə oturanda hörmət adı ilə başlayırlar əvvəldən axıra farsca danışırlar, axı deyən yoxdu qardaş hörmət, ədəb gəldi girdi ət gövduşuna?

**Əti acı** - xoşa gəlməyən, acı dil.

**Əti dırnaqdan ayırmaq** – iki yaxın adamın arasına ixtilaf salmaq.

Mən ayırmayıram, ayrı salmıram
Qardaşı qardaşdan, arvadı ərdən.
Ananı baladan, əti dırnaqdan,
Ürəyi ürəkdən, qanadı pərdən (161, №9, s.12).

**Ət ilə dırnaq arasına girən iylənib çıxar** - iki doğma adamın arasına girmək istəyən axırda çox pis vəziyyətə düşər.

**Ətindən kəsmək** – bir işi nəhayət hövsələsizliklə, narazılıqla görmək.

Mirza Abbasqulu, salaməleykum, dedi. Amma elə bil ətindən kəsib verdi (201, s.209).

**Ətini tökmək** – mənasız söz danışmaq.

Zalxa, Allahı sevirsən, ətimizi tökmə, az danış (5, s.59).

**Ətin suyun artırmaq** - bozbaş, piti Azərbaycanın milli yeməkləridir. Bu deyim qonaq gələcəyi zamanı işlənir.

**Əti pişiyə vermək** - cinsi təcavüzə məruz qalmaq, namusunu əldən vermək

Yenə qorxardı məbada əti versin pişiyə (168, s.480).

**Əti sənin, sümüyü mənim** – keçmişdə valideyn uşağı mədrəsəyə gətirəndə mollaya belə deyərdilər. Yəni döy, elm öyrət.

Bunu da ki, verirəm sənə, əti sənin, sümüyü mənim (9, s.110).

**Əti sümüyündən çoxdur** - yeməyə fikirləşən, arsız adam.

**Əti şirin** - xoşa gələn, mehriban.

Məcazi mənada kinayə ilə bir nəfəri təhqir etmək üçün onu dəvə ilə bir nəzərdə tutaraq əti şirin deyirlər.

**Əti tökülmək** -utanmaq, başı aşağı olmaq, xəcalət çəkmək.

Nənəm deyir gəl verək,
Dədəm deyir qoy görək,





Ətin tökülsün bacı,
Sən də bir dillən görək (38).

Oğlanın əlləri təndir kösöyü-
Böyü oğlum, yeni insan kimi sürətlə böyü.
Deyəcəksən ona baxsan ki qabandır sifəti,
Adamın gör tökülməzmi əti..
Canlıdır, kündəyə bənzər ayağı (S.Rüstəm, "Yaxşı yoldaş")

**Ətrafında çəkic vururlar, deyir: "nə tappatapdır?"** – ətrafda baş verənlərdən xəbəri olmamaq.

Axmaq kişi, budur tamam on ildir, dörd ətrafında çəkic vururlar, sən deyirsən nə tappatapdır (129, c.I, s.441).

**Əttar dükanı** - ağla gələn hər şeyi burada tapmaq olar.

Sən qəssab ol, mən davar,
Sinəm əttar dükanı,
Hər nə desən, məndə var (158, s.258).

**Ət torbası** – bacarıqsız, ağılsız adam.

Hamısı bəhanədir, ömrünü ziyafətdə keçirən o ət torbası at belinə qalxıbsa, demək qəsdi var (144, s.49).

**Əvəzin bədəl adlı oğlu var** – dünya əvəz-əvəzdi.

**Əyin başlı** - qəşəng geyinmiş.

**Əyni parıldar, qarnı quruldar** - yalandan özünü varlı göstərən, zahiri ilə batini bir-birini tutmayan.

**Əyri baxmaq** – kəc baxmaq.

Noğul yoxdursa, sən məndən bezarsan,
Tələbkar tək durub əyri baxarsan (80, c.II, s.265).

**Əyri buynuz göstərmək** - işin düz gətirməməsi.

Yalqıza dünya, Nəsira, əyri buynuz göstərər,
Çox iti, çox əyri qandır buynuzu qıpqırmızı (241, s.41).

**Əyri xiyar** - dərdə dəyməyən, xoşa gəlməyən.

Yüz aqilanə söhbət babət nahara dəyməz,
Cənnət, nəimsizsə əyri xiyarə dəyməz ( Molla Abbas İftixare Zünuzi).

**Əyri oturub düş danışmaq** - səhvləri etiraf etmək.

Gəl bir az əyri otur, düz danışaq,

Şah sən ol, ya mən olum, varmı maraq? (72, c.III, s.313).
Yox bu işin başqa bir hikməti, ya məktəbi
Əyri otur düz danış, vazeh edək söhbəti ( Valeh, s.192).
Leyk gəl indi biz əyri oturaq düz danışaq,
Elə bil ki, küsülüydük, təzədən gəl barışaq (S.Ə.Şirvani, s.69).
Əyri otur, doğru söylə (229, s.33).

**Əyri-üyrüsü şümşə suvaqda çıxar** - iş kamil olmayınca onda çatışmamazlıqlar olar.

**Əzrayılla çilingağac oynamaq**- ölümdən qorxmamaq.

Vəzir ona gözağartması verib dedi. Onu bil ki, Əzrayılla çilingağac oynamaq istəyirsən (46, s.130).

**Əzvay tuluğu** - acıdil, qaşqabaqlı, üzünü turşutmuş.





# -F-

**Falın açmaq** – fikrinə düşmək, niyyətinə düşmək.

Ələsgər: «Bizi bu qonaqcıl yerə olarmı aparasan?»
- Vallah, bu kəndin falını açma. Bu kənd qonaq alan deyil (14, 2-ci cild, səh. 357).

**Farsın düz sözü oraq kimidir** - oraq əyri olduğu üçün düz danışan fars da yalançı olar - anlamındadır. İranda fars şovinizminin acısını çəkən millətlər tərəfindən yaradılmış deyimdir.

**Fayton atı** - dərdə dəyməz, ərdəmsiz adam.

**Fələkdən bac almaq** – istəyinə çatmaq.

O gün namərd fələkdən bac alın siz,
Uçub göydə günəşdən tac alın siz (80, c.II, s.268).

**Fələkdən bir gün çalmaq** – özü üçün yaxşı bir gün keçirmək.

Gənclik müftə imiş, qocalıq baha,
Fələkdən gün çalaq, ömürdən ömür (328, S.141).

**Fələkdən gün oğurlamaq** - işi çox olan bir adamın sevdiyi adama, yaxud özünə gün ayırması.

**Fələkdən kam almaq** – ürəyi istəyən arzuya yetmək.

**Fələkdən kam almaq** – istəyinə çatmaq.

Sonra de ki, ey düçari-alam,
Bu çərxi-fələk kimə verib kam (80, II, s.246).

**Fələk kəndirimi kəsib** – arzusu gözündə qalmaq.

Mən aşıq, əsdi fələk
Səbrimi kəsdi fələk.
Hər yerdə çadır qurdum,
Kəndirim kəsdi fələk (148, səh. 24).

**Fələk qarğıyıb** – işin düz gətirməməsi, dolaşığa düşməsi.

Yüz min bəndə neyləsin,
Bir fələk qarğamışa (33, səh. 31).

**Fələk məni vurub** – taleyin zərbəsi.

Apar məni bəndə vur,
Zülfün ilə kəməndə vur
Fələk məni vurubdur.
Əsirgəmə sən də vur (33, s.149).

**Fələyin felinə düşmək** – fələyin sözünə aldanmaq, fələyin yaman günləri ilə rastlaşmaq.

Bu ömrü bizə kim biçdi

Fələyin felinə düşdük (260, səh. 100).

**Fələyin gözdən salması** – taleyi gətirməmək.

Yazıq Ələsgəri oda salıbdı,
Fələk gözdən salıb, o da salıbdı (32, c.II, s. 26).

**Fələyin göz oyməsi/ kəm baxması** – taleyin dönməsi.

Əziziyəm baxtı kəm,
İqbalı kəm, baxtı kəm,
Mən fələyə neylədim,
Fələk mənə baxdı kəm?
Zamandır bizlərə fələk göz əyib,
Polad üz qılınclar qında paslanıb (284, c.II, s.302).

**Fələyin kam alması** – yaman günə düşmək.

**Fələyin keçisini görmədik** - keçi türk mifologiyasında insanların, qəhrəmanların, hətta tanrıların himayəçisidir. Günümüz ah-vay ilə keçdi, yaxşı yaşamadıq.

Fələyin beş keçisi var, hərəsini bir gün bir adamın qapısına ötürər, gün gələr ki, biz də bu qara günlərdən qurtararıq ( "İki dost", s.177).

**Fələyin qəminə getmək** – bada getmək.

Yaman gedəcəkdik fələyin qəminə, Allah üzümüzə baxdı (1, s.27).

**Fələyin nərd atması** – işlərin düz gətirməməsi, gözlənildiyinin əksinə cərəyan etməsi.

Birdən görənək fələk atdı nərdini
Çəkərək xoş günü ahı sərdini (261, səh. 323).

**Fələyin sillisinə rast gəlmək** – böyük fəlakətə uğramaq.

**Fəlfəlləmək**- əldən düşmək, qocalmaq.

**Fəlsəfə toxumaq** – faydasız söz demək (77, səh.5)..

**Fərəsi tərsə düşüb**- özünü itirmək.

**Fərhad kimi külüng çalmaq**- çox əzab-əziyyət çəkmək.

Neçə ildir Fərhad kimi külüng vururam, bu səhnəni mən düzəltmişəm (72, c.III, s.75).

**Fərli cücə yumurtadan bəlli olar** - bir şeyin yaxşılığı ilk gündən gözə vurar.

**Fərmanlı dəli** – dəliliyi təsdiqli xəstə bir insan.

**Fətə və zir** – işin yolu.

Mirzə Məmməd dəxi o fətəvü- zirin bilməz,
Kim ki məşuq ola, öz zülfü-əsirin bilməz ( "Keçmişdən gələn səslər", s.87).

**Fın /fırt deyib burnundan düşüb** - iki adamın biri-birinə çox bənzəməsi.





Sən öləsən, elə bil fırt eləyib Balaqədeşin burnundan düşüb (9, s.116).

**Fındıq- fındıq danışmaq** - boş-boş danışmaq.

**Fır-fır fırıldamaq** – çox sürətlə işləmək, zamanın sürətlə keçməsi.

Bütün gün fır-fıra kimi fırlandım burda (142, səh. 87.).

**Fırıldaq çevirmək** – yəni, özünü müsəlman göstərib, birini aldatmağa çalışmaq.

Kənd mollası gündə min təsbeh fırıldaq çevirir.

**Fısı yatmaq** – qəzəbi soyumaq, kini -küdurəti kənara qoymaq.

Bunlara nə oldu belə? Nöşün bunların fısı yatdı?(1, s.23).

**Fısqırtmaq** – siqaretdən xoşlanmayanlar siqaret çəkməyi belə adlandırırlar.

Az çubuq fısqırt, səni şahı- Xorasan, Əmqızı (301, səh. 25).

**Fışqasını sındırdım** - qalib gəldim, səsini kəsdim, yerində oturtdum.

**Fikrə düşmək** – xəyal etmək, yeni bir fikrə düşmək.

Qadının üzünə təəccüblə baxdı, dərin bir fikrə cumdu (234, s.446).

**Filanının ipi ilə quyuya düşmək olmaz** – yəni güvənməli adam deyil, sözünün üstündə durmayan insandır.

Öz-özünə astadan: Arvad ipi ilə quyuya düşdün – dedi (348, səh. 121).

**Filankəsin ayağı biləni bizim başımız bilmir** – o çox savadlı, təcrübəlidi.

Əlbəttə, Şahqulu əmiuşağının ayağı biləni bizim başımız bilməz (253, s.326).

**Fil-fincan** - ər- arvadın zahirinin, gəlirlə çıxarının bir-birinə uyğun olmaması.

Ev xərci ilə dəraməd filü -fincana bənzər (340, s.20).

**Fili fincan görmək** - ağlı başında olmamaq; hər şeyi olduğu kimi görməmək.

Atamın (Rza xanın) yadigar taxtimi lərzan görürəm,
Gözümün nuru qaçıbdır, fili fincan görürəm. (Haşım Tərlan, s.29).

**Fil qulağında yatmaq** - dünyadan xəbərsiz olmaq.

Elə bil sən də fil qulağında yatmısan, ey zalım oğlu. Heç şeydən xəbərin yoxdur (62).

**Filürəkli** – qorxmaz, cəsur, igid,

Yaman dözümlüdür, fil ürəyi var (54, səh. 44).

**Fincan oynatmaq** - naz -işvə gəlmək, gülünc hərəkət eləmək.

Fincan oynatsa, nigarım, çarə yox, səbr eylərəm,
Turşuda gər qaş-qabağın, nazlı yarım xoşlaram (224, s.19).

**Fironluq eləmək** - ağalıq, hökmranlıq eləmək: Allaha asi olmaq, harınlamaq, qan tökmək, zor demək.

Taxta çıxdı yenə firon,
Ağız açdı zindan bizə (Sahirin çap olunmamış şeri).
Firon belə küfrə düşüb,
Allah dedi özünə.
Lakin cavab tapmadı o,
Musanın həqq sözünə (Bakıxanovun seçilmiş əsərləri, səh 446).

**Fişəngə qalxmaq** - dava qırğın salmaq.

Qalxdı fişəngə, o ki var ağzına gələn sözü dedi mənə (129, S.39).

**Fitilbörkdən gəlmək** -çox böyük adamdı, çox böyük iş görüb. "Fitilbörk" Peterburqun el arasında dəyişdirilmiş adıdır. Ən uzaq yer, elmin, sənətin mərkəzi kimi başa düşülürdü Başqa bir deyimdə "Fitilbörkə də getsən, gəlb taparam" şəklində bu fikir özünü göstərir.

**Fürsəti fötə vermək** – fürsəti əldən verməmək.

Əlivə to düşüb, day fürsəti fötə vermə (9, s.173).





# -G-

**Gavur əkməgi yeyən, gavur qılıncı çalar** -yad çörəyi yeyən, yad elə xidmət edər.

**Gavur ölüsü** - çox ağır bir şey, çalışmalı yerdə əlini ağdan qaraya vurmayan adama deyilir.

**Gecə mollası** -ümumiyyətlə, arvadı molla kimi nifaq salana, başqalarının əleyhinə təhrik edənə bənzədərlər.

**Gecəni gündüzə qatmaq** -gecə-gündüz işləmək.

**Gecənin bağrını dəlmək** –soyuq.

Və qaranlıq gecələrin bağrını dəlsin (337, I,s.54).

**Gecənin gülləsi gündüzün silləsindən yaxşıdır**- gecə adam xətərli işlərə gedib güllə ilə öldürülsə, gündüz caamat içində bir sillə yeməkdən yaxşıdır.

**Gecənin züyüldağı səhərə tapılmış olar/** bu günün öfkəsi səhərin quyruğundan yaxşıdır -fürsət olduqca işi vaxtında görmək yaxşıdır.

**Gecə gəl, vecə gəl** – yəni hər vaxt gəlirsən gəl, bir dərdə yara.

**Gec gələn qonaq öz kisəsindən yeyər** – çağırılmamış qonaq hər nə olsa, yeyər.

Gec gələn qonaq öz kisəsindən yeyər (9, s.17).

**Gec gəlib tez öyrəşən** - gördüyü hər şeyi tez öyrənmək istəsə də, buna nail olmayan.

Gec gəlib tez öyrəşənlər üzlərə çəkmiş niqab,
Hər yalançı çöhrədən rəddi-niqab olsun gərək.

**Gedəndə qum atırdı, qayıdanda daş tullur** -əsəb xəstəsini müalicə üçün çıldaq pirinə aparırlar. Çıldaq qorxmuş adamların üz tutduğu bir yerdir. Qayıdanda qonşulardan biri xəstənin halını soruşur, belə cavab verirlər. Yəni gedəndə bundan qat-qat yaxşı idi ( Ə.Əliyev).

**Gedər- gəlməz** – ölüm, o dünya.

Neçələrin gəlməz yola göndərdi
Bir ayrılıq, bir yoxsulluq, bir ölüm (35, s.537).

**Gen dünyanın başına dar olması** – pis vəziyyətə düşmək, bütün qapıların üzünə bağlanması.

Day bu keçəlliyim üzündən gen dünya mənə dar olub (174, s.118).

**Gen gəzmək** -uzaqlaşmaq, münasibət saxlamamaq.

Bəhanə tutuban bizdən gen gəzmə,
Sirr sözün yadlara deyən deyiləm (329).
Gen qaçdım qarətdən, ədəbsizlikdən,
Tüfeyli olmadım, sözdə heç kimə ( Ə.Maraqai).

**Gəngilif** -Təbriz həyətlərində su keçmək üçün süzkeş kimi bir şey qoyardılar ki, su keçsin. Ona gilif deyərdilər. Burada işləməyən, tənbəl adam deməkdir.

**Gen götdən zart o...urmaq** -özünü çox böyük bilib yersiz əmr edənlərə deyilir, yersiz yerə danışmaq.

**Get ağlayan yanına, getmə güldürən yanına** - üzə gülən, yalandan sevgi göstərən adamdan uzaq ol.

**Get ay batandan sonra gəl** -bu iş düzələn deyil.

Axırı...heç nə, get, ay batandan sonra gəl (335, s.301).

**Getdi kanal ikiyə** -Türklər illər boyu milli kimliyini əldən verdiklərinə görə, həm şovinistlər, həm də milli zülmdən tapdalanmış millətlər kimi özlərini təhqir etmədən üz döndərmirlər. Bu da fars dilinin üstünlüyünə və haqlı olmağına böyük bir zəminə yaradır. Ümumi danışıq bir fars olan yerdə fars dilində aparılır. Əgər biri yanında olan türklə bir kəlmə türkcə danışırsa, şuxluq və batində hədə-qorxu kimi "getdu kanal ikiyə" sözünü işlədirlər. Bu deyimin özündə də "kanal 1" farsca, "kanal iki" ikinci dərəcəli millət sayılan türkcə sayılır.

**Get-gələ salmaq** -ümumiyyətlə, idarələrdə, adamlar arasında bir işi uzatmaq, adamı aparıb gətirmək.

**Get göldə osdur ki, qurbağalar qorxsun** -yalandan hay-küydən heç kəs qorxmaz.

**Getmə gözümdən, gedərəm özümdən** – səni hədsiz sevirəm.

bir balaca maz get ona, deginən. sevirəm səni, day lap denən getmə gözümdən, gedərəm özümdən (9, s.172).





**Get naxıra, gəl axıra** – yəni gecə- gündüz işlə.

**Get qanqal otla** – mənim səviyyəmə çatmaq üçün gərək çox çalışasan.

Hələ sən get, qanqal otla, mən də Nurcahanam (335 s.64).

**Gəldi savab eyləsin, kabab eylədi** - və ya başqa deyimlə desək, - istədi qaş düzəltsin, vurdu gözün çıxartdı.

**Gəl eşşəyini palçıqdan çıxart** – bu çıxılmaz vəziyyətdən çıx görüm necə çıxırsan? Gəl anlamaza söz qandır.

Gəl eşşəyini palçıqdan çıxart (129, S.439).

**Gəlin bəzəkdə qaldı** - öz xəyalı əsasında düzür-qoşur ki, bir elçi gələcək və ya bir yerə çağıracaqlar.

**Gəlin oynaya bilmir, deyir otaq əyridir** -bir işin öhdəsindən gələ bilmir, bəhanə gətirir.

**Gəl məni gör? dərdimdən öl** – çox gözəl.

Gəl məni gör? dərdimdən öl (335, s.63).

**Gəmidə oturub gəmiçi ilə dava eləmək/ gəmiçi gözü çıxartmaq** – yersiz gəldi, yerli qaç.

Qəmər- gəmidə oturub gəmiçi ilə döyüşür (72, s.III, s.95).

**Gəmi üstündə qərq olmaq** - ağlagəlməz vəziyyətə düşmək.

Hər zadım dəyib biri-birinə, bilmirəm hara gedim, bir qızım Təbriz zindanında, biri Bəndərabbasda gizlin yaşayır, biri xaricə qaçıb. Buna görə gəmi üstündə qərq olmuşam.

**Gənbəhan ayısı** - Gənbəhan Səhəndəva mahalında bir yerin adıdır. Səhənd dağlarına yapışmağa görə orda çox ayı yaşayır və hər il kəndlilərin əkinlərinə, mal-davarına ziyan vurur. Buna görə Azərbaycanda, xüsusən Təbrizdə nəzmə, qanuna boyun əyməyən, ziyankar, ona buna kəngər vuran adama belə deyirlər

**Gəvəzə** - boş danışan.

Sən demə, bu yanşaq gəvəzənin birisi imiş (174, s.17).

**Gəzən qurd ac qalmaz** – axtaran tapar, işləmək istəyən ac qalmaz.

**Gicdıllaq** - gic, ağılsız, səfeh.

**Gilan aşıq yeri deyil** - bu misal ələvilər Gilanda hakim olan zamana aiddir ki? geriçilər musiqi və hər cür şadlığı yasaq sayırdılar. Ələvilər silsiləsi Gilanda hakim olan zaman musiqi haram olmağa görə, aşıqların ora getməsi yasaq olur.

**Gildir- gildir yaş axmaq** - yanıqlı ağlamaq; sakit ağlamaq. Oğlanın dilindən bu sözlər çıxmışdı ki, bir də görür dilənçinin gözlərindən gildir-gildir yaş axır ("Durnanın şəhadəti").

**Giləşir eləmək** – baş yumaq.

**Girdələmək** -həqiqəti danmaq, bilmədiyi mövzu barədə verdiyi nəzərdən dönməyib onu birtəhər qəbul etdirməyə çalışan adam/

Yüz də girdələsən kömür qaradır,
Ağ kürkə bürünsə, bürünməsə də ( Sönməz).

**Girdələmək** – bilmədiyi işə qarışmaq və onu yasalamaq.

**Girvənkə qıfılı** - bir növ möhkəm qıfılın adıdır. Məcazi mənada çox möhkəm və açılmayan qıfıla aiddir.

**Gizlənpaç** – ürəyindəki sözü deməmək, birindən gizlənmək.

Tahir: Yaxşı bəsdir, gizlənpaç oynadınız (9, s.157).

**Gor qazmaq** – quyu qazınaq, tələ qurmaq.

Hamıdan yayınıb gizli-gizli bəs,
Özgəyə gor qazmaq oğurluq deyil? (328, s.342).

**Gora aparmayacam ki** -yəni gördüyünüz, eşitdiyiniz şeyləri öyrənin.

**Göbək götürmək** - çətin iş, xərci çox olan iş, çətin bir işə əl vurmaq.

**Göbəkkəsdi** -iki yaxın ailənin eyni vaxtda birinin oğlu, digərinin isə qızı olsaydı? elə o vaxtdan əhd edib bir-birinə adaxlardılar. Buna göbəkkəsdi deyərdilər (148, S.131).

**Göbələkdi yerdən çıxıb** – heç kəsi olmayan, saysız-hesabsız.

Özü də qoşun nə qədərdi! Elə bil ki göbələkdi, yerdən çıxır (148, s.183).





**Göbəyin düşməsi** – ağır yük nəticəsində və ya bir tənbəl adamın yorğunluğunu etirafında işlədilən deyim.

Giribsən çox ağır yükün altına,
Yavaş ki, düşməsin göbəyin sənin (299, səh. 126).

**Göbəyini filankəs ilə bir kəsiblər** -həmişə bir yerdədir.

**Göbəyini filan yerdə kəsiblər** -Vətən, çox gəlib-gedilən yer mənasındadır.

Göbək quylanan torpaq adamı özünə çəkər. Dünyadan yorulan çağda bu torpaq yadına düşər, göbək quylanan torpaq məlhəm kimi olar, içəridən ürəyi safaldar (203, S.28).

**Gödən ağrısı** - birinə mane olan, vaxtını tutan

**Gödənsiz adam** -özünü aparmağı bilməyən.

Mənə bir cüt busə ver,
Adam gödənsiz olmaz (340, s.16).

**Gön atdayan şeyxlər** - həddindən artıq fırıldaqçı olmaqlarına baxmayaraq düzgünlüyə, xalqın mal-dövlətinə göz dikməyən kimi özlərini qələmə verirlər.

Təbrizdə gönçü bazarda inək, camış dərisindən olan, əyri gönləri xalqın ayağı altına salarlar ki, ayaqlanmaqla düzəlsinlər. Bəziləri özlərini ən mömin adam kimi qələmə vermək üçün bu gönlərin üstündən hoppanıb keçirlər ki, ayaqları gönə dəyməsin.

**Gön kimi olmaq** - gün altında qalmaqdan rəngi qaralmaq, dərisinin təravətini itirmək.

Kəndlinin əlləri dönmüşdü gönə
Ağa əl açaraq deyir: ver mənə ( Əhvədi)

**Gön qoymaq** - təcrübə ələ gətirmək üçün çox zəhmətlər çəkmişəm.

**Gönü duzlamaq** -ölmək.

Filan xərpul da murdar olmamış dabbaq gönü duzlar,
Yazın elanını meydan çayında bir ulaq öldü (306).

**Gönü qalın** – anlamaz, xeyrini-şərini başa düşməyən adam.

Bir də sənin bəs ki, qalındır gönün,
İlləf odur, böylə qaradır günün (168, səh. 507).

**Gönünü aldırmaq** -hədələmək.

Mənə doğrusunu de, yoxsa gönünü aldıraram (129, S.164).

**Gönü suya vermək** - işin işdən keçməsi, qiymətli bir şeyi əldən verib peşiman olmaq, fürsəti əldən vermək – bacarıqsızlığı nişan vermək.

Yoxsa gönü verəcək idi suya, ovqatımıza soğan doğrayacaq idi (1, s.14).

Bəli, onda gön suya verildi, qurtardı (129, S.142).

Deyirəm, xoşunuza gələ-gəlməyə,
Keçmişə gönüzü suya vermisiz.
Özgələr dolanda dərin mənaya,
Siz barsız söyüd tək boya vermisiz (291, səh 58).

**Gördün yemək, nə demək** – süfrə açılan zaman hamı yeməyə başlayar.

Ay Həmid, tikanlı sözləri at bir tərəfə, gəl otur, vuraq, gördün yemək day nə demək? (1, s.300).

**Gördüyün küllü kömbədi-** pis əziyyətdə yaşamısan, çətinlik görmüsən.

**Gördüyün ağaclar küləkliyə kəsilib** – son görən vəziyyət kökündən əvəz olunub.

Gördüyümüz ağaclıqlar küləkliyə kəsilmişlər (291, səh 89).

**Görmək** - rüşvət vermək, bu deyim keçmiş zamanlarda „bığ yağı vermək", „hörmət və rüşvət vermək" formasında da işlədilib.

**Görməmişin bir oğlu oldu, çəkdi çökünü qopartdı** -ifrat eləmək, birinə həddən artıq sevgi üzündən zərbə vurmaq.

**Görməyə gözü olmamaq** - sevməmək, nifrət eləmək.

Mirzə Xosrov, "Ölülər" əsərinə görə, mollaların, ruhanilərin məni görməyə gözləri yoxdur ( "Ədəbiyyat və incəsənət", № 35, 1965).

**Görüb gördüyün bu olsun** - son qismət.

**Göt atmaq** – birini saymamaq, və ya müvafiq nəzər nişan verməmək.

**Göt-baş vurmaq və ya baş-ayaq vurmaq** – bir işlə, bir həyatla yanaşı davranmaq.





Atdım oxumu hər zada, gördüm daşa dəydi.
Bilməm nədir illət, ayağa, gah başa dəydi (Qasir, səh. 172).

**Göt-götün düşmənidir** - biri duran kimi o biri onun yerində oturanda deyilir.

**Götü bir yerdə tikiş saxlamamaq** - bir yerdə qərar tuta bilməyən.

**Götü dar qapıda qalanda həzrət Abbas çağırır** -işi çətinə düşəndə mömin olur.

**Götü ilə quymağa düşmək** - xoşbəxtliyi yalnız var-dövlətdə görən tamahkar adamlar kişi və ya qadın olmağına baxmayaraq zəngin varlı adamla evlənsələr, onlar haqqında belə deyilir.

**Götü qaşınır /keçinin buynuzu gicişəndə çobanın çomağına sürtər** –özünə problem axtarmaq.

**Götü quş bişirir** – qorxaqdı.

Götü quş bişirir (126, s.45).

**Götünə tuman tapmamaq** – ən ağır və yalavac surətdə yaşamaq.

Götüvə tuman geyə bilmirsən?
Fatma, Tükəzi neyniyirsən.
Zudpəst (tez bişirən) qazı neyniyirsən? (Mirzə, səh. 79).

**Götünnən halallıx diləyir** – çox pis vəziyyətdədi.

Götünnən halallıx diləyir(126, s.44).

**Götünün dişi var** -şalvarını tez-tez yırtan uşaq və böyüyə deyərlər.

**Götünün qaranlığı var** – xətərlə üzbəüzdür, cəzalandırılmalıdır.

**Götür- qoy etmək** - fikirləşmək.

Xeyrullanın əli hər yerdən üzüldükdən sonra o çox götür-qoy elədi, nəhayət belə qərara gəldi ki, .. evinə getsin.

**Götür-qoy eləmək** – bir işi həyata keçirmədən əvvəl ətraflı düşünmək.

Əli hər yerdən üzüləndən sonra, o, çox götür-qoy elədi, nəhayət belə qərara gəldi ki, vətənə dönsün.

**Götü üstə oturmaq-** var-dövləti əldən vermək, birdən zərərə düşmək.

**Götü yoxdu** -cəsarətsiz, cürətsiz, qorxaq.

**Göy** - xəsis, səxavətsiz.

El arasında belə bir inam da var ki, göy adam sonsuz olar.

**Göydə axtardığını yerdə tapmaq** -çox uzun zaman arzu çəkdiyini ələ gətirmək.

**Göydə axtarırdım, yerdə əlimə düşmüsən** – axtarılan bir adama təsadüfən rast gəlmək.

Karvanbaşı dedi: belə adamı göydə axtarırdım, yerdə əlimə düşdü (46, s.236).

**Göydə götürmək** – bir şeyin tez alınması.

Bu gün-sabah bağdan qayıdandır, hər kimə versən 15 manata göydə götürər (72, c.III. s.75).

**Göydən düşmək** - özünü böyük, hamıdan üstün sayan.

C.Məmmədquluzadə birdən birə öz-özünə yetişməmiş və göydən düşməmişdi. "Molla Nəsrəddin"lə bağlı olan böyük ictimai ədəbi hərəkatın və məktəbin və hərəkatın daha böyük kökləri var (156).

**Göydəndüşmüş** - gözləmədiyi halda böyük bir xeyir görmək.

**Göydən qızıl zənbillə düşmək** – özünü hamıdan artıq tutmaq.

Bağır bəyəm göydən qızıl zənbillə düşüb, hamımızın qapaz altısı deyildi? (9, s.177).

**Göydən yerə yağmaqdan yerdən göyə yağır?** -varlı dost, qohum-qardaş köməklik etməkdən yoxsul adam onlara yardım edər?

**Göyərmək** – pis sifət göstərmək.

Bir söyüşdən ötəri etmə əziyyət balama,
Göyərib coşma utan, qonşuları yığma dama (267, s.144).

**Göyərmiş** - qarğış, məzəmmət kimi işlənir. Xəsis adama deyilir. M.F.Axundovun əsərində Tükəz də əri Hacı Qaranı xəsislikdə məzəmmət edəndə "ay göyərmiş! - deyə xitab edir.

**Göy əskiyə tikmək** - gününü qara etmək, əziyyət vermək.





Müsyö Jordan Şahbazı aparacaqdı, günümü göy əskiyə tikəcəkdi (5, S.35).

**Göylərə baş qaldırmaq** – ən şərafətlə yaşamaq, bir kimsəyə və bir millətə xəyanət etməmək.

Qürurumdan az qaldı göylərə dəysin başım (264, səh. 61).

**Göynən gedən** - yuxarıdan gedən, özünü hamıdan yuxarı tutan, hay-küy salan

**Göyşəmək** - birinə fəxr satmaq.

Peykanı sat, traktor al, kəfşənə
Müftə yeyirsən, bir belə gəvşəmə (İ.Qəribi, Kəleybər, s.26).

**Göy üzü daş saxlamaz** – nə yaxşılıq, nə pislik əvəzsiz qalmaz.

Durub göy üzünə daş atan oğlan
Göy üzü daş saxlamaz (260, s.26).

**Göz aça bilməmək** – yəni xoş gün görməmək, ağır vəziyyətdə yaşamaq.

Bu hariflər «İranın nizamül-ülamaları» İranın məhsulatını anbarlara doldurub, İran ölkəsini daimi surətdə özlərinə möhtac etmişlər. Odur ki, İranda bu saat aclıq və bahalıqdan yana, iranlılar göz aça bilmirlər (65, № 5, səh 11).

**Göz ağartmaq** - işarə ilə sözündən çəkindirmək, him-cim etmək.

**Gözağartması** – hədə-qorxu işarəsi.

Vəzir ona gözağartması verib dedi: Onu bil ki, Əzrayılla çilingağac oynamaq istəyirsən (46, s.130).

**Gözaltı** – biri ilə evlənmək istəmək.

Sevsəydi belə eləməzdi, yəqin ayrı gözaltısı var, qızın işi ayrıdı (1, s.225).

**Göz basmaq** – işarə etmək.

Molla Nəsrəddin camaata göz basıb dərvişə deyir: hə, bax, bu bizim eşşəyin quyruğudur (148, S 123).

**Göz bəbəyi** - insan üçün ən əziz göz işığı sayılır. Vətən, vətənin istiqlalı da belə müqəddəs məfhumlardandır.

İstiqlalımızı göz bəbəyi kimi müdafiəyə qərar verən bir məclisdə dinlədiyi bu ultumatumu qəbul etmək hökuməti kəndi əli ilə dost donuna bürünmüş düşmənə təslim etməkdi (M.Ə.Rəsulzadənin çıxışından).

**Göz bəbəyi kimi qorumaq** - üstündə əsmək, nəhayət dərəcədə qorumaq.

Gəl daireyi-çeşmi pürabində məqam et,
Ey göz bəbəyim, gör ki, nə xoş dürri-tərin var.

**Göz bozartmaq** - əyri-əyri baxmaq, acı-acı süzmək.

İstirəm ağzımı açam, tez gözüvü bozardırsan,
Elçi yanında hey məni danlayırsan, qızardırsan (168).

**Göz dağı** - böyük bir zərbə vurmaq; əziz bir adamının göz qabağında şikəst olması.

Azər övladıyam nişanbənişan,
Düşmana gözdağı, dosta mehriban (273, s.12).

**Göz dağı vermək** - öz mal-dövlətini və ya mənəvi, maddi imkanlarını yoxsulların üzünə çəkmək.

Özü qurd amma, qoyun paltarı xalq içrə geyənlər,
Qonşusu ac yatıban, özləri beş vədə yeyənlər.
Sonra göz dağı verənlər.

Düşmənə həmişə göz dağıydı o,
Kükrəyən çağlayan bulaqdı Nazim (124).

**Gözdən düşmək** - hörmətsizlik etmək, diqqət göstərməmək.

Əlində buda məni,
Çək tiğin, buda məni,
Elə gözdən düşmüşəm,
Tanımaz bu da məni (33, S.106).
Aşıqın düşmüş dəri,
Dur gör, sən düş müştəri
Yarəb anarmı ola,
Mən gözdən düşmüşləri (33, s.62).
Çökdü ortalığa duman,
Güman,





Güman,
Güman.
Buzlaqlar qonaqçı oldu,
Gözdən düşmüşlərə (207, S.37).

**Gözdən pərdə asmaq** –xalqı aldatmaq, yalandan başqa cür rəy yaratmaq.

1909-cu ilin aprel ayında Təbriz inqilabının rəhbəri, adı dillər əzbəri olan Səttarxan və onun dəstəsini əhali böyük sevinclə qarşılayır. Başlarına gül-çiçək və gümüş pul səpir. Xalqın gözündən pərdə asmaq üçün məclis Səttarxanı ordenlə təltif edir (149, s.58).

**Gözdən salmaq** -diqqətini, nəvazişini kəsmək. Birini hörmət və dəyərdən salmağa çalışmaq.

Gözlərin aldı məni,
Kəməndə saldı məni,
Amandı qoymayın,
Yar gözdən saldı məni.
Nə var nə yox, kim ölüb, kim qalıbdı,
Fələk orda kimi gözdən salıbdı! (339, s.6.)

Oğuzlar islam dinini qəbul edərkən bu din oğuz miflərini, o sıradan Pəri qızını, su və yaşıllıq ilahəsi məhəbbət onqununu da gözdən salıb sıxışdırır (279).

**Göz dikmək** – yəni bir arzunun həyata keçirilməsi əsasında intizar çəkmək, bir yeri ümid yeri bilmək.

Mənsiz səyahətə gedirsən barı, tez qayıt.
Göz tikmişəm yola, çəkirəm intizarını (250, səh. 16).

Onun oğlu ata taxtinə göz dikən vəliəhdlərdən deyil (144, s.43).

Sənə göz dikmiş idik, sən dəxi qalxdın getdin,
Gözümüz yaşı kimi didədən aqdın, getdin (25, s.143).
Mən aşıq tikən gülə,
Sarmaşır tikən gülə,
Heç kəs gözün dikməsin,
Mən gözüm dikən gülə (33, s.59).
Mən ölsəm, pərdəni yırt at,

Zəkatə tikmə göz, al, sat.
Noolur ki, eyləsə arvad
Ticarət ey Tükəz bacı? (300, səh 60).

**Göz evindən itmək** -gözün gördüyü qədər, gözün işlədiyi qədər məsafə.

Sürü ilanlar göz evindən itənəcən öz yollarında şaxırdılar (203, s.67).

**Gözə baxa bilməmək** -xəcalətdən, utanmaqdan birinin üzünə baxa bilməmək.

Şuşa qaytarılıb, Laçın dönməsə,
Düşmənin bayrağı yerə enməsə,
Biz baxa bilmərik elin gözünə (188, s.26).

**Göz işığı ilə çörək qazanmaq** -- müəllimlər, yazı-pozu adamları haqqında işlənir.

**Gözə kül üfürmək** – gözdən pərdə asmaq.

Hünər kimin idi ad kimin oldu,
Dövran kül üfürür çox zaman gözə (328, s.40).
Gör camaatın gözünə necə kül üfürürlər? (144, s.12).

**Gözəl ağa çox gözəl idi, vurdu çiban çıxartdı** -biri çox kifir olsa, günbəgün pis işilərini davam etdirsə, belə deyərlər.

Gözəl ağa çox gözəldi vurdu çiçək çıxardı (335, s.83).

**Gözəllik ondur, doqquzu dondur** -zahiri gözəlliyin roluna böyük əhəmiyyət verilir.

**Gözətlə, ayağın götvərən qəbrinə keçməsin** - mövhumata görə, pis əməlli adamların qəbirləri tez xarab olub yıxılar. Buna görə yıxılan qəbirlərdə ayağın sınmaq xətəri var idi. Elə iş görmə ki, işin polisə, çətinliklərə düşsün ki, nicat tapa bilməyəsən.

**Gözətlə, yeyər** - xətəri olmayan, faydasını bilməyib ondan uzaq gəzən adama belə deyilir.

Yeməz insanı mey, çəkil yaxına,
Durma, baxma qıraqdan, ey mömin.
Təlxdir zahirən, vəli mənən
Dadlıdır qayqanaqdan, ey mömin (301).

**Göz görmür, üz utanmır** – üz-üzdən utanır.





Mən aşiqəm, o xandan
O paşadan, o xandan
Göz görmür, üz utanmır
Qorxuram bu divandan (33, s.125).

**Göz götürmək** – əl çəkmək, əlaqəni kəsmək.

Könül bəsdir, gözəllərdən götür göz, hərzə gərd olma (289, səh. 38).

**Göz-gözə alışmaq** - birinə ürəkdən bağlanmaq.

Çətin olur ayrılıq, göz-gözə alışanda (49).

**Göz göz olmaq**- yara haqqında işlənir. Yaranın, acı bir xatirənin yenidən yada düşməsi.

Düz altmış min göz-göz olan yaranı,
Bağlayıram, yatmıram ki, gecələr (294, s.26).

Vurdular sinəmə möhnət qarası, acılıyor, göz-göz oldu yarası (237, səh. 212).

**Göz-gözü görməmək** - qaranlıq, sis, duman, toz ya tüstüdən, alovdan heç nə görməmək.

**Göz kötəyi vurmaq** - birinə çox əyri-əyri və qəzəblə baxmaq.

Təbrizin Əmir bazarından keçəndə gördüm rəhmətlik xanım bacı bir qızılçı camakısına uzun müddət baxır. Dedim: Xanım bacı gəlmirsən? Dedi: qayınxatını, bizim ki, gücümüz çatmır bunlardan alaq, qoy bir az da olsa, onlara göz kötəyi vuraq ( Əqdəs Haqverdi).

**Göz qırpımında** -- qısa bir zaman, an anlamında işlədilir.

Bircə göz qırpımında sevgini görəncədi (210, səh. 56).

**Göz qorxaq olar, ayaq mərd** – danışmaqla, baxmaqla bir iş qurtarmaq. Onu həyata keçirmək üçün bir hərəkət etməlisən.

Deyirəm gözə yox, ayağa alqış (215, Səh. 43).

**Göz-qulaq olmaq** – ayıq-sayıq olmaq.

Belə bir əmrdən sonra keşiş paşadan çox razı qaldı, şəhər əhli də göz- qulaq oldu ki, osmanlı torpağına Kərəm adında kim gəlsə, tutub paşaya versinlər (35, s.524)

**Gözünün şorbasını tökmək** - bir quldur insanın bir yazığı təhqir etməsi və ya birini aldadan bir şarlatanın göz yaşı tökməsi.

**Gözlərdən oxumaq** – birinin ürəyinin istək və arzusunu gözlərindən duymaq, başa düşmək.

Mən sizi duyuram,
Gözlərinizdə oxuyuram,
Öz keçmiş günlərimi ( «Bir gün payızda», səh. 74).

**Gözləri bərəltmək** - birinə qəzəblə baxmaq.

**Gözləri böyümək** –heyrətlənmək.

İki il zindan, təbid, qara günlər keçirdikdən sonra əfsərin rüşvət istəməsindən mənim gözlərim böyüdü (281, s.98).

**Gözləri döyə-döyə qalmaq** – mat-məəttəl qalmaq.

İngilis səfiri: Siz milli azadlığı neynirsiniz?

Qulam Yəhya: - Milli azadlığı yeyəcəyik.

Səfir gözlərini döyə-döyə Qulama bir daha başdan-ayağa baxdı və sağollaşmadan geri dönüb, maşina tərəf getdi ( 312, səh. 41).

**Gözləri ilə/kirpiyi ilə od götürmək** - çox əzab-əziyyət çəkmək.

**Gözləri qan çanağına dönmək**- qəzəbdən, ağlamaqdan, yuxusuzluqdan, və ya qanın həddən artıq sağılmağına görə gözlərin lap qızarması.

**Gözlərin dolması** – ağlamaq halına gəlmək, kövrəlmək, ağlamaq istəmək.

Bacı var başını yolsun? Dostu var gözləri dolsun? Bala var gül kimi solsun?

Mən aşıq dolan gözüm,
Dol gözüm, dolan gözüm.
Gedərsən, qayıtmazsan,
Vətəni dolan, gözüm! (105, səh. 18).

**Gözlərin quyuya düşməsi** - yaman gündən insanın gözlərinin adi halını itirməsi, dərinə düşməsi.

**Gözlərinin yaşı daşmaq** – bir gün haqlı olaraq bir kölənin etiraz etməsi.

Gözümün yaşı gərək bir gün daşa,
Sığmaya yazılara, dağa, daşa.

**Gözləri ölü qoyun gözüdü** - mənasız, ifadəsiz, halsız göz.

**Gözlərin yol çəkməsi** – müqəddəs bir inamın həyata keçirilməsi üçün və ya bir işin düzəlməsi üçün intizar çəkmək, yarın, yaxın bir insanın gəlişini gözləmək, hansısa insanın gələcəyinə işarədir.

Həsrətli gözlərin yol çəkməsini,
Gözləri yollarda qalanlar bilər (215, səh. 71).
Bir çıxış yolunun tamarzısıyam,
Haçandır yol çəkir ürəyim, gözüm ( "Məhdi azadi", 1997).
Elə bil yol çəkir onun gözləri,
Fəqət nə gələn var, nə də bir gedən (337, I, s.57).
Tarixin gözləri yol çəkə-çəkə,
Bundan böyük səvab görməmiş bəlkə (325, səh 15).
Yol çəkməkdən yorulmayan gözlərim,
Siz tərəfə, siz tərəfə baxacaq (111, səh. 12).

**Göz örtmək** – naümid olmaq, birinin balaca və ya ən böyük xətasını görməməzliyə vurmaq.

**Göz süzmək**- naz etmək.

Qol boyun oturub sürtək üz-üzə,
Baxaq bir-birimizə göz süzə-süzə (329).

**Gözü açıq** - ayıq, uzaqgörən, zəmanə adamı, sırtıq.

**Gözü açılmaq** – cəhalətdən qurtarmaq, bir məsələdən hali olmaq, xəbərdar olmaq, həddi-büluğa çatmaq.

Dəyil heç bir şeyə möhtac, özü iranlıların,
Nə səbəbdəndir açılmaz gözü iranlıların (80, c.II, s.114).

**Gözü ağarmaq** – ölmək.

Gözüm ağarsın əgər yüzdə mində, milyonda
Görürsə ölkədə bir əhli-himmətin üzünü (267, s.304).

**Gözü axmaq** – xumarlanmaq.

Aşna, içmisən çaxır, gözlərin axır (9, s.13).

**Gözü alça-gavalı dərmək / gözlərinin biri gilas dərir, biri səbətə doldurur**– ora-bura baxmaq.

-Sənin də gözün alça-gavalı dərməsin (9, s.143).

**Gözü asılı qalmaq** - intizar çəkmək, gözü yolda qalmaq.

Milli hökumət zamanında sevgililərini əldən verən gəlinlərin ürəkləri dondu, gözləri asılı qalıb ürəkləri bomboş oldu ( Xanım Qəffari Cabbari).

**Gözü ayağının altını görmür** – qudurmaq.

Əlinə bir az yer salıbsan gözün ayağının altını görmür (335, s.169).

**Gözü bərəltmək** – hirslə, əsəbi halda baxmaq.

Hər kimə nəql eləyirsən mədəniyyət sözünü,
Qabarıb üstünə hiddətlə bərəldir gözünü (206, səh. 199).

**Gözü böyümək** – təəccüblənmək.

Gedirəm izim böyüyür,
Susuram sözüm böyüyür,
Baxıram gözüm böyüyür,
Dünya mənə tanış gəlir (260, s.63).

**Gözü dağınıq** – onun-bunun arvadına baxmaq.

Ayağı sürüşkənin, gözü dağınığın biridir, kimdi onu alan (9, s.143).

**Gözü dar** – xəsis, qıtmır.

Bir gün görürəm milyonerəm, udmuşam amma,
Sabah görürəm bir gözü dar aldı əlimdən ( S.Rüstəm).

**Gözü doymaq** – qane olmaq, yeyib-doymaq.

Su gəlir axmaq ilən,
Qayalar yıxmaq ilən,
Gözəldən gözmü doyar,
Uzaqdan baxmaq ilən? (33, S.176).

**Gözü düşmək** – sevmək, tamah salmaq.

Bir qəmli xəbər bağrımı qan eylədi, saqi,
Mey ver, yenə rusun gözü İranə düşübdür (301, səh 97).

**Gözü əldən yığılmamaq** – vətəni, sevgini pula satan alçaq adamların haqqında deyilən deyim (39, səh 534).

**Gözü götürməz** - paxıl, doymayan.

**Gözü göylük** - xəsislik. Nağıllarımızda xalqın ən qəddar düşməni göygöz kosa adlandırılır.

**Gözü işığa gəlmək** – sevinmək.





Hüseyn bir qədər yedi, gözləri işığa gəlib dedi (46, s.21).

**Gözü kəlləsinə çıxmaq** - nəhayət dərəcədə təəccüb etmək, qəzəblənmək.

Mərəndli Mirzə Sadiqin şikayət dolu ərizələrini dövlət idarələrində oxuyanda rəislərin gözləri kəllələrinə çıpxardı (3).

Şahın gözləri kəlləsinə çıxdı, ömründə belə bir sovqat görməmişdi (46, s.122).

**Gözü kölgəli olmaq** – birinin qabağında eybi olmaq, pis hərəkət etmək.

Sən ömrün boyu Hacı Şirzada qul olmalıydın. Ömrün boyu gözü kölgəli yaşayacaqdın (30, № 2, səh. 55)

**Gözü qızarmaq** – dəli olmaq, şəhvətpərəstlik etmək istəmək.

Bax xoruza, içib, gözü qızarıb,
Çırmanıb qolların hərarətdən (301, səh. 68).

**Gözüm ayaqlar altında qaldı** - hörmətdən düşmək, yaman günə qalmaq, alçaq adamların qaxıncı ilə üzbəüz olmaq.

**Gözümçıxdıya salmaq** – incitmək.

-İncidirlər də, məni salıblar gözümçıxdıya (9, s.139).

**Gözümə alaca-bulaca gəlir** – ümumiyyətlə, bu deyim, xoşagəlməz insan haqqında işlənilir.

**Gözüm su içmir** - ağlın kəsməməsi, bir işin düzəlməsinə inamı olmamaq.

**Gözüm üstə yeriniz var** – əziz qonağa deyilir.

Dəyirmançı dedi: gözüm üstə yeriniz var (46, s.189).

Gözlərim üstündə sənin yerin var,
Yolları almasın nə boran, nə qar (337, c.I, s.106).

**Gözün ağarması** - pis günə qalmaq, kor olmaq.

Gözüm ağarsın əgər yüzdə, mində, milyonda
Görürsə ölkədə bir əhli-himmətin üzünü.

**Gözün ağı, qarası** – lap əziz, sevimli bir tək bala anlamında işlədilir.

Biri var idi, biri yox idi. Bir çobanın gözünün ağı-qarası bir oğlu var idi (38, səh 45).

**Gözündə gözü olmaq** – birini sevmək.

Ey gözəl, var gözlərində külli dünyanın gözü,
Sənsən aləmdə nigara, cümlə xubanın gözü (80, c.II, s.96).

**Gözündə qan yoxdur** - qorxmaz, cəsarətli, ürəkli.

**Gözün dörd olması** – hər tərəfə baxmaq, səbirsizliklə gözləmək.

Tək səni, tək səni görməkdən ötrü
Barmaqlıq ardında gözüm dörd olur (Ə.Tudə).

**Gözünə girmək** - özünü istətmək, nəzəri cəlb etmək.

Sənin qılığın yoxdur, kişinin də gözünə görə bilmirsən (129, s.412).

**Gözünə kül ələmək** – aldatmaq, gözündən pərdə asmaq.

"Çillənin gözünə kül ələyirik".

**Gözünə qubar qonmaq** – kədərli olmaq.

Səksəndə sınır yenər dizinə,
Doxsanında qubar qonar gözünə (35, s.237).

**Gözünə təpmək** – həvəslə yemək.

Gözündən gəlsin, hələ dünən xoruz ölmüşdü, bişirdim verdim, təpdin gözünə ki...(72, c.III, s.31).

**Gözün gözə saylanması/sataşması** - iki nəfərin baxışının toqquşması.

**Gözünü açmaq** – diqqətlə baxmaq, hüşa gəlmək.

Ana özünü itirib, oldu qüssədən bihuş.
Gözün açanda nə gördü, uçub qəfəsdən quş (300, səh. 45).

**Gözünü bərəltmək** – tərs-tərs baxmaq, işarə ilə hədə-qorxu gəlmək.

Mənə hər qəzetçi bərəldər gözün,
Yazır hey qəzetlərdə məktəb sözün (267, s.249).

**Gözünü başqalarının ağzına dikmək** – iradəsiz adam və ya iradəsiz millət

Yoxsa adam hiss eləyəndə ki, hamının gözü onun ağzına dikilib, boğazından aşağı getməz (115, № 2, səh. 62).

**Gözünü döymək** – key, məəttəl baxmaq.

Ölüm nə var, nə döyürsən gözünü,
Niyə belə itirmisən özünü (260, s.109).

**Gözünü duman almaq** - qürurdan kor olmaq.





**Gözünü qabar eləmək** -bezdirmək.

Dənizə gələn çılpaq qadınlara baxmaq kəndin bütün kişiləri kimi Ağarzanın da gözlərini qabar eləmişdi (91, s.30).

**Gözünü qan tutmaq** - heç nəyi görməmək. Nəhayət dərəcədə hirslənmək, əqlini əldən verən kimi hər bir işə hazır olmaq.

Hüsənin gözlərini qan tutmuşdu, nə baş verdiyini anaşdırmırdı (84, s.37).

**Gözünü qızıl-qızıl etmək** - gözünü bərəltmək.

**Gözünün ağı-qarası** - tək övlad.

Məsməxanım kişinin gözünün ağı-qarası yeganə qızı idi (91, s.28).

Anamın gözünün ağı-qarası bir mənəm, məni uzaq aparsan, anamın günü qara olar.

**Gözünün altını fənərləmək** – gözünün altına vurub göyərtmək.

Çuxamı cırma deyirəm sənə, Həzrət Abbas haqqı, fənərlərəm o biri gözünün də altını (72, c.III, s.23).

**Gözünün içinə demək** – üzünə demək.

Mən heç kəsdən qorxmaram, Adışirinovun da gözünün içinə deyərəm (9, s.191).

**Gözünün içinə kimi yalan deyir** – ağ yalan deyir.

Çox yaxşı bilirdi ki, Çopur Abdulla gözünün içinə kimi yalan danışır (1, s.168).

**Gözünün kökü saralmaq** – həsrətdən, gözləməkdən yorulmaq.

Gözləməkdən gözümün kökü saraldı ki... (9, s.155).

İskəndərin anası oğlunun yolunu gözləyirdi, yola baxmaqdan gözlərinin kökü saralmışdı (46, s.208).

**Gözün qorasını sıxmaq** – ağlamaq, yalandan kədərli olmağa çalışmaq. Mollalar kimi xalqı aldatmaqdan ötrü yalandan ağlamaq ədası verib gözlərindən yaş çıxartmağa təzahür etmək.

Rəğayib yığva olar, el baxar
Dərvişlərin ilanı torbadan çıxar.
Pərdəçi də gözdən qoralar sıxar (251).

Gözün qorasını sıxma,
Gül danış deyirəm,
Salammıram başa leykən
Bu milləti könəzi (qanmazcasına bir söz üstündə duran) (300, səh.101).
Nəqşə çəkir zülm eyvanın yıxmağa,
Gücü çatır gözdən qora sıxmağa.
**Gözün qurdu ölmək** – doyunca yemək, baxmaq.
Doyunca ye ki, tamahın qalmasın.
**Gözünün odunu almaq** -- düşməni yaman günə salmaq və ya yazıq bir insanı qorxutmaq.
Sadiq əsgəriyəm döyüşən yurdun,
Gözünün odunu almışam, odun (325, səh. 25).
Düşmən başın o daşlara çalmışdı,
Xan paşanın göz odunu almışdı (339, S.2).
**Gözünün ucu ilə baxmaq** -heç bir təmənnası olmamaq.
Daş üzə bənzər
Gözünün ucuyla qundağa sarı
Baxmadan
Astaca qalxdı yuxarı (328, s.393).
**„Gözün üstə qaşın var" demək olmur** – həqiqəti dilə gətirmək olmur.
Göz üstə qaşın var, deyənə, vurdu təpik (264, səh. 123).
**Gözünü sil, gözümə bax** – hədə-qorxu gəlmək.
Gözünü sil, gözümə bax (335, s.67)
**Gözün üstə qaşın var demək** - cürətli, şücaətli.
Dar ağacı quran hər sultan
Canavarcasına boğdurmuş,
Hər gözün üstə qaşın var deyəni ( Sahir).
Ürəyivi buz kimi elə, nə qədər mən varam, bir köpəkoğlu sənə gözün üstə qaşın var deyə bilməz (9, s.144).
**Gözünü torpaq doyursun**- çox tamahkar adama deyilir.
**Gözünü yayındırmaq** – diqqətlə baxdığı bir şeydən gözlərini kənara çəkmək.
Düz Allahın gözlərinə baxırdı





Allah dözə bilmədi, yayındırdı gözünü (260, s.105).
**Gözünü yığmaq** - bizdən gözünü yığ ki, sənə aldanan olmaz, ümid etmə.
Get onları xam tövla ki, təzvir eləyirsən (267, s.202).
**Gözü yolda qalmaq** – çox gözləmək.
Gəl, gəl ulu xaqanın
Qalmış gözü yollarda (75, c.IV, s.23).
**Gözün yumub, ağzın açmaq** –heç nəyə və heç kəsə fikir vermədən, ağzına gələni danışmaq, söyüş söymək.
Bir şey tapa bilməyib qayıdırdı evinə sarı, gördü ki tində bir qarı oturub yumub gözlərini, açıb ağzını (46, s.347).
Cavan xanımı gözünü yumub, ağzını açıb Məşədiyə dişindən qopanı misal edibdir (281, səh. 96).
**Gözü su içməmək**- ağlı kəsməmək.
Qəmgin idi ona görə ki, Kərim şahdan gözü su içmirdi (46, s.164).
**Gözü tar olmaq** – gözü torlanmaq.
Demə ki tar olub gözü, düşübdü qüvvədən dizi,
Meyl etsə məst Möcüzü, çıxar tavana, ey Tükəz (80, c.II, s.90).
**Gözü tox** –heç nədə gözü olmayan.
Hamıdan yayınıb gizli-gizli bəs,
Özgəyə gör qazmaq oğurluq deyil? (328, s.342).
**Gözü üstündə olmaq** –muğayat olmaq.
Toğrul- yadından çıxmasın, İmamyar dayı, gözün uşaqların üstündə olsun (72, III, s.55).
**Gözüvə tikan batsın** - qarğışdı, yaxşılğı bilməyən, axtarılan şeyi tapa bilməyənə deyilir.
Tikan olub yad gözünə batarıq.
Hə.. niyə yazdırmırsan, niyə gözlərini bərəldirsən?(195, c.II, s.47).
**Gözün gülməsi** – bir nailiyyətdən, bir xoşbəxtlikdən sevinmək.
Doktur Mahmudbəy: sizin gözünüz gülür. Elə bil sevinirsiniz (101, səh. 257).

**Gözü yolda qalmaq** – iki parçaya bölünmüş bir millətin birlik arzusu. Ananın oğula, qıza qovuşması.

Qarabağda qalan var,
Zülfün üzə salan var,
Mən burda çox əyləndim
Gözü yolda qalan var (38, səh 17).

**Göz yağını yedirtmək** - əzizləmək, böyük fədakarlıq etmək.

**Göz yaşı kimi duru** – dupduru.

Bulaqlar yenə də elə durulub ki, elə bil göz yaşıdır axır (174, s.14).

**Göz yaşını ələmək** - ara vermədən ağlamaq.

Nöhə səsi qulaq dəlir.
Sədavü simadan gəlir,
Anam da göz yaşın əlir.

**Göz yaşını içinə axıtmaq** –zahirdə göz yaşını saxlamaq.

Kimi də göz yaşını içərisinə, ürəyinin özəyinə axıdırdı (144, s.58).

**Göz yummaq** - mənfi və müsbət mənada işlənir. Özünü bilməməzliyə, görməməzliyə vurmaq, birini xətalı bir işinə görə cəzalandırmamaq.

Niyə gizlədim ki, öyrənmişəm mən
Haqsızlıq yanından sakit keçməyi.
Qoluzorlu önündə susub durmağı,
Yalana göz yummağı (110, səh. 175).

**Göz verib işıq verməmək** -incitmək, nəhayət əziyyət vermək.

Ah, burada, gəlin mənim günümü düyünləyib göy əskiyə, soxub qoz qabığına (205, s.28).

Axır vaxtlar bəzi nadürüst adamlar mənə göz verirlər işıq vermirlər (288, s.122).

**Gur-gur yanmaq** – işıq vermək, birinin sevgisi ilə yaşamaq.

Min illər keçsə də gur- gur yanacaq,
Hicran adasında mayakdı Nazim (124).





**Gurultuya vermək** - birini lova vermək.

Bir nəfər adi bir iş üstündə təsadüfən giriftar olduqda nadanlıq üzündən polisə aldanır, özünü xilas etmək üçün bir iddə adamı gurultuya verir (248, s.437).

Yox, heç ağlım kəsmir bizi bular gurultuya verəcəklər (195, c.II, s.16).

**Güc billahla yaşamaq** - çox çətinliklə güzəran sürmək.

**Güclü ilə kasıbınkı tutmaz** – varlı və yoxsul mənasındadır.

Güclü ilə gücsüz düşə savaşa,
Olur tərlan ilə sar aşnalığı ( Məhəmməd İbrahim, «Qaşqay türkləri»)

**Güdaza vermək/bada, lova vermək** -ələ vermək, satmaq.

Verdim güdaza canımı hicrin odunda mən,
Bir qıl nəzərə gör, necə suze-qudazı var (147, s.47).

**Gülabını tikan sormaq** - özgələrin əlində əsir düşüb var-dövlətini biganələrin mənimsəməsi.

Ona havadarlıq etdik, bizi söydülər, xeyirxahlıq etdik, bizi bədnam etdilər. Onun lələzarlığına pərəstiş etdik, öz ciyərimizin qanını udduq, suyunun bolluğunu arzu etdik...getdik, getdik, mənzilə çatmadıq, vətən, vətən, nə vətəndir bu..tuf belə vətənin valilərinə. Bu vətən bir gülə bənzəyir ki, bunun gülabını tikanlar sorur ( Q.Şərifovun..məktubu).

**Gül boxçası** - ən əziz və gözəl bir şey.

Dünən şerimin bəlli yarısı
Tutulmuşdu ərəb -fars bəlasına.
Mən yaxın qoymaram ərəbi, farsı
Doğma şerimin gül boxçasına (S.Rüstəm).

**Güldən ağır bir söz demək** – birinin ürəyini incidən söz demək, xətrinə dəymək.

Niyə küsdün? Sənə bir güldən ağır sözmü dedim? (264, Səh. 49).

Mən istəmirəm ki, sənin adına güldən ağır bir söz deyilsin (72, c.III, s.91).

**Gül-gülü, bülbül-bülbülü çağırır** – çox gözəl bir yer.

Gül-gülü, bülbül-bülbülü çağırır.. (148, S.118).

**Güllə kimi** – çox sürətlə, odlu silah təzə kəşf edilləndə güllə ən sürətlilik, ən yeyinlik simvolu idi.

Qapı dartılıb açılanda Səməd özü də yerundən qopdu, güllə kimi düz Çimnaz müəllimənin qucağına atıldı (260, s.126).

**Gülmə qulunc olana, plovu linc olana, gülsən eləsinə gül, qulağı dinc olana** -bədbəxt, işi çətinliyə düşən adama gülmə.

**Gülmə qonşuna, gələr başına** – özgələrin yazıqlığına güllmə, sənin də başına gələr.

Gülmə qonşuna, çıxar qarşına (9, s.50).

**Gülməşəkər** - ərköyün, özünü hamıdan yuxarı tutan, hamıdan əziz bilən.

Nənən soğan, dədən sarımsaq, hardan oldun gülməşəkər, qurumsaq?

**Gül yemək** - tovlanmaq, aldanmaq.

**Gül vurmaq** - hər şeyin, xüsusən qızın ən yaxşısını seçmək, hər şeyin ən gözəlini seçmək.

Qoçaqsan, gül vurubsan (129, s.415).

Bazarın gülün vurub.

**Gümbəz üstə girdəkan dayanmaq** - bir-birinə uyğun olmayan bir zad əbədi yaşaya bilməz ( «Vətən dili» kitabından Mirzə Həsən Rüşdiyyə).

**Gümrah adam** - sağlam adam.

**Gümrah addım** – möhkəm addım.

Şən musiqi səslənir, müəllif gümrah addımlarla səhnədən çıxır (77, səh.35).

**Gün ağlamaq** – özünü, millətinin gələcəyini düşünmək, şəxsi mənafeyini millətin mənafeyinə qurban vermək.

Ay insanlar! ..Özgələrdən çıxmaz bizə gün ağlayan,

Məsəldə var ac yaşayar qonşusundan yemək uman (113, s.111).

Bizə baxma, bizim dövran başqa idi,

El üçün çalışdıq, özümüzə gün ağlamadıq (310, səh. 5).

**Gündə bir don geymək** – şəxsiyyətsiz.





O hankı vicdan ki, ağlar ay aman,

Gündə bir don geyən dövran əlindən (337, c.I, s.104).

**Gündüz qurd ağızlı, gecə qarğa gözlü ol** - gündüz çalış zəhmət çək, ayıq ol, gecə də ehtiyatı əldən vermə.

**Günəş girməyən evə həkim girər** - günəşin həyatverici, mikrobları məhvedici xassəsini bildikləri üçün düşünürdülər ki, evə günəş işığı düşməsə orda yaşayanlar xəstələnərlər.

**Gün görmək** – yaxşı həyat sürmək.

Gün görmədim bu dünyaya gələli

Ağlayıban gözüm yaşın siləli (35, s.532).

O gündən bəriyə bir gün görmədi,

Onun cavan ömrü uzun sürmədi (337, I,s.113).

Sənə Zöhrə, Ay, Günəş qoydular cahanda,

Ancaq özün dünyada bir gün görə bilmədin (80, c.II, s.163).

**Gün görmüş** - yaxşı güzəran keçirmiş, təcrübəli.

**Gün kimi aydın olmaq** - izaha ehtiyac yoxdur, hər şey bəllidir. Heç bir şübhə yeri qalmamaq.

Bu məsəldir xəlqə rövşən gün kimi,

Gülşəni- cənnət fəqirə xar olur (25, səh 94).

**Gün kimi yanmaq** –gözəl, parlaq.

Qılınc nə qılınc, vallah bu elə bir qılıncdır ki, gün kimi yanır, ay kimi işıq salır (174, s.10).

**Güngünə basmaq** - güng ət palçığından düzələn balaca balaca su borularına deyilir. Adamın ayıb yeri nəzərdə tutulur.

Qoymaram, vəli soxarlar güngümə

Kərvəşanı sərtasər (301, s.47).

**Gün qoçusu** - vəziyyətdən qüdrətə çatan, alçaq, cahil adamın böyük yerdə oturması.

Bağladı rəhmü -şəfaət qapısın gün qoçusu,

Barilahə, sən özün rəhm elə halətimizə (255, s.180).

**Günortadan sonrakı kişilər** -- alçaq adamlar, birdən-birə əlləri pula çatanlar, görməmişlər.

**Günü barmaqla saymaq** - gözü yolda qalmaq, bir sevimli insanın gəlməsinə göz tikmək, bir şeydə, intizar çəkməkdə, gözləməkdə günləri saymaq.

**Günü doğmaq** – müsbət mənada nailiyyətlərə əl tapmaq, mənfi mənada alçaq adamların yüksək dövləti işlərdə yer tutmaları və ya çoxlu pula əl tapmaları.

Bir parça mundar ləşə həsrət qalan
Kaftarların, tülkülərin günü doğdu ( «Həyat təranəsi», səh. 55).

**Günü göy əskiyə tutmaq** - məlumdur ki, göy rəng bizdə həmişə yas, matəm əlaməti və xəsislik nişanəsi olmuşdur. Əzab-əziyyət həmişə bu rəng ilə ifadə olunmuşdur. "Dədə Qorqud" qəhrəmanları həmişə yasda qara geyib göz sarınırlar. Zülm görənlər zülm edən haqqında danışanda həmişə "günümü göy əskiyə büküb" deyirdilər (Təhmasib, s.27).

Yar günümü göy əskiyə düydü ki, dur məni boşa (Şəhriyar).

**Günü günə calamaq** – uzatmaq.

Sabaha caladın nə tez bu günü,
Ölməmiş sən ona kəfən biçirsən? (328, s.141).

**Günü qara olmaq** – uğursuz, yaman gündə yaşamaq.

Aşığam nağaradır,
Nə toydur, nağaradır?
Həmarın Behbud əlindən
Gör günü nə qaradır? (33, S.97).

**Günün əyilməsi** – gün batmağa az qalmaq.

Həmid küçəyə çıxanda gün əyilmişdi, saatına baxdı (1, s.162).

**Günün səsini duymaq** –müasir tələblərə cavab vermək.

Geri dönmədik,
Duyduq qəlbimizdə günün səsini ancaq...(328, s.353).

**Günü pis yerdə batırmaq** – fürsəti əldən vermək, ömrü yararlı işlərə sərf etməmək.

**Gümrahlığı əldən getmək** - sağlamlığı, cəldliyi əldən getmiş.





Getdi gümrahlığım, ərköyünlüyüm,
Qayıtmaz atalı, analı dünyam (Ə.Miyanalı).

**Gürz yerə vurmamısan** - böyük bir iş görməmisən ki.

**Güzgüyə baxan özgəni görməz** - bir adam öz yaşayışının çörəyini yeyər. Yaxşı dost ayna kimi eybi göstərər.

Güzgü sənin eybini düz göstərirsə ancaq,
Özünü qır, güzgünü yaxşı deyildir qırmaq (Nizami).

# -H-

**Hacı Qara** - xəsis. M.F.Axundovun eyni adlı əsərindən alınmışdır.

**Haci Seyid Hüseyn qarasıdır** - Yəni bu qara başqa qaralara bənzəməz, bu tamam başqa bir şeydir.

Təbrizdə Hacı Seyid Hüseyn adlı məşhur bir tacir yaşayırmış. Onun ruhi xəstəliyə tutulmuş bir qızı varmış. Qız qarabasına xəstəliyinə mübtəla imiş. Qız xəstələndikdə evdə olanlar hamısı onu su verib ovuşdurmaqla sakitləşdirməyə çalışarlarmış. Deyərmişlər ki, qorxma qara basıb, indi keçər. Bir gecə tacirin evində olan qara qul fürsətdən istifadə edib qızla yatır. Qız yenə qışqırır, nökər və qaravaşlar tökülüb həmişəki kimi yenə qızı sakitləşdirtməyə çalışırlar ki, qorxma səni qara basıb, indi keçər gedər. Qız isə deyir: Yox, bu qara, o biri qaralardan deyil, bu Hacı Seyid Hüseyn qarasıdır. Təbrizdə Nəsrəddin şah zamanınacan varlılar qul saxlayardılar. Nəsrəddin şah zamanında bu iş qadağan olunub.

**Hacı, şeyx mədəsi** - bu deyimi o adamların haqqında işlədirlər ki, hər şeyin ən bahalısını, ən yeməlisini bəyənirlər.

Təbrizdə hacı, şeyx adına çoxlu saray, timçə, dalan... vardır. Belə nəzərə gəlir ki, bu deyim Hacı Şeyx Cəfər Qəzviniyə aiddir ki, İranın ən gözəl, ən uca və möhtəşəm memarlıq əsərlərindən olanTəbrizdəki Müzəffəriyyə timçəsi onun yadigarıdır.

**Haça dırnaq** - inək, qoyun

Faydalı adama işarədir.

**Hax hax quşudur** - hədə-qorxudan, quldurluqdan qorxmayıb həqdən müdafiə edən adamlara işarədir. Türklərin əfsanələrində haq-haq adlı bir quş vardır ki, gecə səhərə kimi başı aşağı asılı vəziyyətdə o qədər "haq-haq" deyib oxuyur ki, ağzından bir damcı qan düşür və quş sakit olur (80, II, s.554- 555).

**Hakimin ağzını bağlamaq** - keçmişdə qadınlar hamama gedəndə ayıb yerləri görünməsin deyə qabaqlarına nazik bir şey





bağlardılar. Bir nəfər də lap nazik bir şey bağlayır, deyirlər ki, onsuz da hər yerin görünür, bunu niyə bağlamısan, cavab verir ki, hakimin ağzını bağlamaqdan otrüdür. Hakim dairələrin əlinə bəhanə verməmək.

**Haqqın yüzünə sillə vurmaq** - həqiqəti inkar eləmək.

Biz həqqin yüzünı sillə vurmuşduq,
Vicdanın əmrinə qarşı durmuşduq (165, S.174).

**Haqqı ovuca qoymaq** – birinin istədiyi pulu nəqd vermək və ya birinin etdiyi yaxşılığın qabağında pislik etmək.

**Halal süd əmmiş** –düz adam, nəcabətli adam.

Balaca uşağın var, halal süd əmmişlərin birini al, həm sənə təmkin olar, həm də uşağına(46, s.29).

**Halı duman olmaq** - gələcəyi aydın olmamaq, halı nəhayət dərəcədə pozulmaq.

**Halın yaxşıdır?** – çox zaman bu söz dəlisən? mənasında işlədilir.

İşdən eşiyə salandan sonra Tehranın Əmir Sultan meydanında getdim birinə dedim: mənə iki sandıq meyvə ver, satım, gətirim pulun verim. Mənə baxıb dedi: Halın yaxşıdır?

**Hallı-dullu** - ətli-canlı, xoşa gələn.

Gedib özünə münasib totuq xanım adlı hallı-dullu bir arvad aldı (46, s.148).

**Halva biş ağzıma düş** - hər şeyi ələ gətirmək üçün gərək zəhmət çəkəsən.

**Halvanı yeyib eşşəyi minib** - istək və arzusuna çatıb. Ağzı çörəyə çatmaq.

**Halvasını çalmaq** - birini məğlub etmək, məhv etmək.

Mən Hüseynin görmüşəm davasını,
Hər dilir olsun, çalar halvasını (950).

**Hamama girən tərləyər** - bir işə əl qoyan adam zərərini də çəkər. Əlindən xəta çıxan adam gərək rüşvət versin.

Təhqiqat sona çatdıqdan sonra o (polis) ciblərimi axtararaq qoltuğumdakı qələm, kağız parçalarının hamısını götürdü. Bu həbsə alınmaq əlaməti idi. Birlikdə otaqdan çıxdıq: yolda mənə dedi: Hamama gedən tərləməmiş çıxmaz (S.C.Pişəvəri).

**Hamam dalanıdır** - bir adamın kefini soruşanda "hamam dalanıdır" cavabını verməklə anladır ki, halı babatdır, nə çox yaxşı nə də çox pisdir.

**Hamam fitəsi olmaq** - ümumiyyətlə, tez-tez ərə gedən arvadlara və sürtük kişilərə işarədir.

**Hamam suyu ilə dost tutmaq** - boş yerdən, xərc çəkmədən, zəhmət çəkmədən şəxsi mənafeyi üçün dost tapanlara işarədir.

Azərbaycanda qədimdə ümumi hamamlarda birinə hörmət qoymaq üçün hamam suyunu məşkəfəyə doldurub birinin çiyninə tökərdilər. Deyim öz kökünü bundan götürüb.

**Haman aşdı, həman kasa** - vəziyyət dəyişməyib, köhnə hamam köhnə tas.

**Hamı gedər quş gətirər – Şahqulu bayquş gətirər** - fərsiz adam, yarıtmaz adam.

**Hamını ley vurdu, mənim kimi tükü dağılan olmadı** - mənim dərdim hamınınkından artıqdır.

**Hamının nənəsi arxadan doğdu, onunku öndən** - bu özünü başqalarından üstün bilir.

**Hamısına bir səqqə vurmaq** - hamısına qalib gəldim, hamını yerində oturtdum.

**Hamıya it hürər, bizə də çaqqal** – bizə zor edən adam da fərli bir adam deyil.

**Hampalığına görə danış** - imkanına görə danış. Hampa bir parça torpağı olan kəndlilərə deyilirdi. Hampalar imkanlarına görə biri-birindən fərqlənirdi. Varlı hampanın sözü o birilərindən fərqlənirdi.

**Handan-hana** – xeyli keçəndən sonra.

Qardaşlar yerlərində donub qaldılar. Handan hana böyük qardaş ona baxıb dedi (148, S.117).

**Hansı bərkdi, al tut** - bu deyim Azərbaycanda yaz bayram günlərində yumurta oyunundan alınmışdır Mən təklif etdiyim iki sözün birini qəbul elə.

**Hara gün olsa, qurudun orada sərir** - öz şəxsi mənafeyi üçün yaşayır.





**Haram pul müzvərəyə gedər** - bir adam xəstəlikdən duranda ona xüsusi yemək verilir ki, ona müzvərə deyərlər. Yel gətirəni yel aparar. Məqsəd insanları düzlüyə dəvət etməkdir.

**Haraya mıx çalıram, papağını asır** - hər yerdə o xeyir görür, mənim zəhmətimin nəticəsini o görür.

**Harda aş, orda baş** – özünü həmişə xeyir gələn yerə soxur.

Əmirqulu- sən harada aş, orada başsan da...(72, c.III, s.59).

**Harda gördün lotu, ayaqlarıvı cütlə otur** - lotu adamdan zərər gəlməz, lotu dəli dolu olar.

**Harda gördün seyid, yolun yarısından qeyıt** - seyidlərə mənfi münasibətdən yaranıb. Müsəlmandan xeyir gəlməz.

Xari- müğilan görürəm, qorxmuram
Harda müsəlman görürəm ( M.Ə.Sabir).

**Haris kimi durmaq** - hirsli, qəzəbli adama işarədir.

**Haşa burdan** -üzdən iraq, burdan uzaq.

Biri misal çəkəndə içində söyüş, nalayiq bir söz olanda belə deyilir.

**Hava bağlamaq** – dəli olmaq.

Abdullah alı çəkməkdən,
Axırda hava bağlar (32, c.II, s60).

**Havalanmaq** - başına hava gəlmək, qudurmaq, yüksəkliyə əl tapmaq.

Havalanıb ərş üzünə qalxırsan,
Dağların sultanı nər Ağrı dağı ( S.36).

**Havasına danışmaq** - məsələnin mahiyyətindən xəbərsiz danışmaq.

Cənab doktor! Bunlar dəliliyin havasına danışırlar (195, c.II, s.161).

**Havaya bulud gəlmək** - siyasi və ictimai anlamı vardır, durum pisləşəndə, bir təhlükə yarananda yalançı pəhləvanlar aradan itib gedirlər.

Əlbəttə bir iddə vardır ki, hava bulud olan kimi, gözdən itir, sözdən düşür, çünki can məsələsi hər kişinin işi deyil (315).

**Havayı** - pulsuz, müftə.

Həm də tutalım şofer tapdım, havayı kim mənim üçün işlər? (269, s.172).

**Haya bənd olmaq** - bir bəhanə, fürsət axtarmaq.

**Hay-hayı gedib, vay-vayı qalıb** - əldən düşüb, qocalıb, kasıblayıb.

Əgər köhnə arvadın yanına gedərəm, hay-hayı gedib, vay-vayı qalıb, kaftarlayıb (77, səh 17).

-Day-dayının hay-hayı gedib vay-vayı qalıb, Məlik (9, s.161).

**Hay-həşir** - qara qışqırıq, ürəyə yatmayan vəziyyət.

Hay- həşir var gecədə
Quşlar uça bilmir qonçalar üstə ( Lalə Cavanşir).

**Hay olmaq** – dayaq durmaq, kömək etmək.

On beşimdə bədirlənmiş ay oldum,
Atama, anama külli hay oldum (41, s.31).

**Hazıra nazir**- əziyyət çəkməyib hər şeyin hazırına sahiblənmək.

Hər yerdə hazır-nazir məşvərətçim Molla Nəsrəddin ağ əbasının ətəklərini yellədə-yellədə mənə yanaşdı (253, s.113).

O, yol açacaqdır, ölüm gələcək,
Gəlib hazırına nazir olacaq (167, s.152).

**Hazır aşın dik qaşığı olmaq** -hazıra nazir olmaq, əziyyət çəkmədən bir şeyin bəhrəsini görmək.

**Hazırına şah olmaq - hazırına çörək tapmaq / Hazır oğlan babası - bişmiş aşın darğası/ Nə yoğurdum, nə yapdım, hazırca kökə tapdım**- zəhmət çəkmədən xeyir qazanmaq.

**Heç hənanın yeridir?** – dilə gətirdiyin sözün bu məqama heç bir aidiyyatı yoxdur.

Görən, doğrudanmı belə nəzərlərdən, işıqlı dünyadan binəsib olan günlərimiz olacaq? Cavid kinayə ilə deyir: «Heç hənanın yeridir?» (145, səh.168).

**Heç kəs heç kəsin kitabını oxumur** - hər kəs öz başının hayındadır.

**Heç kəsin çırağı sübhədək yanmayıb** - nə xoşbəxtlik, nə də bədbəxtlik əbədi deyil.





Dünya bu şahdır, bu gəda qanmayıb,
İndiyədək bir kəsə aldanmayıb,
Heç bir çıraq sübhə qədər yanmayıb.

**Heç kəsin toyuğuna kiş deməmişəm** – heç kəsə pislik etməmişəm.

Bu vaxta kimi heç kəsin toyuğuna da kiş deməyib (91, s.206).

**Heç pişik dədəsi xeyrinə siçan tutmaz** - insanlar şəxsi mənafeləri üçün iş görürlər.

**Hesab kitab bilməyən** - xeyrini-şərini bilməyən, alıb qaytarmayan.

**Heyif ölmək** – birdən-birə ölmək, xəbərsiz ölmək, döşəyə düşmədən ölmək.

**Heyvalar barı, baxçalar narı, hamı dinsə də, sən dinmə barı** -eybəcər bir adam başqalarına irad tutdiqda işlənir. Yəni sən ki, hamıdan betərsən niyə canamaz suya çəkirsən?

**Helqarın** - çox yeyən, qarınqulu.

**Heyva kimi saralmaq** – həsrətdən pis günə qalmaq.

Gülüzaram sənə qurban olum mən,
Heyva kimi saralıban solum mən (35, s.262).

**Həççi betərinə** - yeddi arxa dönənin.

Bir gün Hacı Mir Yaqub məşrutəçi bir yerdə var idi. Adətən əlində həmişə təbərzin saxlardı. Müstəbid rövzəxanın cavabında qorxmazcasına əlindəki təbərzini müstəbidlərin həççi-betərinə deyərək həvalə elədi. Bu zaman rövzəxan içəri girdi. Bu zaman Hazı mir Yəqub dedi: İşəri girənin də həççi-betərinə.

**Həftə xiyal/ hərdəm xiyal** - tez-tez fikrini dəyişən adam.

Mən də deyirəm olsan əgər əlli xəyallı,
Bu dərs oxumaq verməyəcəkdir səmər, ey qız. (Qəhrəman Xətibi).

**Həftə səkkiz, mən doqquz** – arası kəsilməz.

Həftə səkikiz, mən doqquz kağız yazıb Aslandan pul istəyirdi.

Xaspoladov da deyirlər, həftə səkkiz, mən doqquz bunlardadır (9, s.170).

**Həkim eşşək əti buyurmayıb ki** - məcbur deyiləm ki, bu işi görəm.

**Həqqi-salamı itirmək** – nankor.

Yüz il biriylə həmdəm olub duz-çörək yeyə,

Bir gündə yüz ilin poza həqqü- salamını (80, c.II, s.151).

**Hələm-qələm adam** - etibar eləmək olmaz.

**Həqq danışanın başına döyən çox olar / Həqq danışanın börkünün təpəsi yırtıq olar** – düz düzdə qalar, düz danışanın başına çox bəla gələr.

Həqqu olan nişaneyi tiri -cəfa imiş.

Yansın dilim ki,öz başıma bir bəla imiş (147).

**Həmi qız olsun, həmi tez** – hər şeyin həm yaxşısını, həm də tez istəmək.

Həmi qız olsun, həmi tez (335, s.94).

**Hənasının rəngi yoxdur** - əli açılıb, sözlərinə daha inanan yoxdur.

**Hənək hənək, sonu dəyənək** - zarafatın sonu dalaşmaqdır.

Lazım gəlsə hənəklə, lazım gəlsə dəyənəklə (84, s.43).

**Həpənd oğlu həpənd** – boş danışan, sarsaq.

Həpənd oğlu həpənd, həzrətin tuman bağı ilə nə işin var (195, c.II, s.156).

**Həpərutdadır** - xəyallar aləmindədir.

**Həprimək /əprimək** – çox qocalmaq.

Sənin də ki, nə cavanlığında bir ayıq vaxtını gördüm, nə də indi qocalıb həpriyəndə (9, s.128).

**Hər adamın ipi ilə quyuya düşmək olmaz**. - hər adama etibar eləmək olmaz.

**Hər anqırana axur bağlamazlar** - ümumiyyətlə, bu deyimi savaş zamanı boş söz danışan adamların haqqında işlədirlər.

**Hər aparan su Araz deyil** - əşyaların və hadisələrin zahiri görünüşlərinə aldanmaq lazım deyil.





**Hər aşın qaşığı** - hər yerə baş uzadan, hər işə qarışan.

**Hər aşın noxududur** - hər qazanda bişəndir. Sözü, fikri sabit deyil.

Hər qazanda, hər ocaqda bişənik,

Xarici hər bir modu söydu, düşənik (168, s.524).

**Hərçi-badabad** – ən pis halda.

Odur ki, hərçi-badabad deyib atın başını döndərdi, bir dəstə qoşunla Koroğluya hücum elədi (148, S.186).

**Hər damardan qan çıxmaz** - yaman gündə hər kəs yardım etməz, yoxsuldan ummaq olmaz.

**Hər daşın dibində bir Koroğlu var** - adi xalqın içində qəhrəmanlar çoxdur.

**Hər dona düşmək** - düz yola getmir, çörəyi gün bahasına yemək.

**Hər gələnə qulp qoymaq** -hamıya eyib irad tutmaq.

**Hərə bir tük versə, kosa da saqqallı olardı** – insanlar əli açıq olsa, millətdə yoxsul olmaz.

Hərə bir tük versə kosa da saqqallı olardı (9, s.24).

**Hərə odu öz qabağına eşir** – hərə öz xeyrini güdür.

**Hərəngixana** - qarmaqarışıq yer, həddən artıq gülüb-danışmaq, müftə sözlərlə zamanı keçirmək üçün bir yerə yığılmaq.

**Hərənin ağzından bir avaz gəlir** – hər kəs öz fikrindədir.

Hərənin ağzından bir avaz gəlir (1, s.197).

**Hərəni öz arşını ilə ölçmək** - adamların hamısını özü kimi bilmək.

**Hərə öz nehrəsini çalxayır** - hərə öz işini görür, öz cibinə fikirləşir.

Bir ev adam işləyir, handa görür bəhrəsin,

Ər gedir hammallığa, arvad əyrir cəhrəsin,

Dörd-beş uşaq hər biri çalxalır öz nehrəsin,

Bunla belə şərmi var, açmağa boş süfrəsin ( A.Sabiri).

**Hərə özün bəyənər, dəvə dizin** - çirkin, eybli adam özünü bəyəndikdə deyərlər.

**Hərif** – küt, səfeh.

Hərif zad deyilik ki.. (9, s 189)

**Hər kəs əksə dolayın, özü bilər qolayın** – hər kəs öz işinin yolunu bilir.

**Hər kəsin damarına görə qan alırlar** - hər kəsin var-dövlətin nəzərə alıb ondan umarlar. Xeyirdə, şərdə hər kəsin imkanına görə ondan bir şey umarlar.

**Hər kəsin xoruzu səhərə qədər banlamayıb** - bir adamın işi axıra qədər yaxşı ola bilməz.

**Hər kəs öz atını çapır** - öz hədəfinin dalınca gedir, başqalarının fikrini çəkmir.

**Hər kəs öz evinin qibləsini yaxşı tanır** - hər kəs öz işinin həlli yolunu yaxşı tanır, yəni mənim işimə heç kəs müdaxilə etməsin. Mən öz işimi hamıdan yaxşı bilərəm.

Bizim kənddə heç bir evə kitab-mitab dolanmazdı.

Öz evinin qibləsini yaxşı bilər, hər kəs özü (Səhənd, səh. 68).

**Hər kəs öz qoturun qaşıyır** - hərə öz başının hayındadır, öz qazancını hər şeydən üstün tutur.

**Hər kəs öz ürəyindən su içir** - hər kəsin qəzavəti öz düşüncəsinə görədir.

**Hərki-hərkilik** – özbaşınalıq.

İdarədə bir hərc-mərclik, bir hərki-hərkilik salsınlar, gəl görəsən (9, s.151).

**Hər kuzəyə qulp qoydu, qulpu əlində qaldı** - bütün işlərdə uğursuzluğa düçar olmaq.

Xanəvadəsini keçindirmək üçün hər kuzəyə qulp qoydu, qulpu əlində qaldı (214).

**Hər küzəyə qulp qoymaq** - yəni əlacsızlıqdan hər işin dalısınca getmək.

Kasıblığın üzü yansın ki, dünyadan doydum. Həmin Mərağada hər kuzə gəldi, qulp qoydum (168, səh. 446).

**Hər quruldayan qəlyan deyil** - zahiri görünüş oxşarlığına görə fikir söyləmək olmaz.

**Hər oxuyan Molla Pənah Vaqif olmaz / hər oxuyan Molla Nəsrəddin** - taleyin, fitri qabiliyyətin rolu nəzərə alınır.





**Hər nə töksən aşına, o gələcək qaşığına** – insan həyatda öz əməllərinin nəticəsini görür.

Bəşər öz əkdiyin axır dərər, vurar maşına,
Qaşığına çıxacaq, hər nə ki, salıb aşına (168, səh. 449).

**Hər saqqaldan bir tük çəksələr, kosaya saqqal olar** - hərə bir az kömək etsə, eldə, tayfada ac-yalavac tapılmaz.

**Hər sazdan bir avaz gəlir** - qarışıq yer, heç kəsin sözü bir birinə uyğun gəlməyən yer.

**Hər sözbaşı** - yerli-yersiz bir şeyi təkrarlamaq.

Hər sözbaşı xumar baxıb gülərdi,
Zülfün töküb başın asta əyərdi (353, s.86).

**Hər şeyin təzəsi, dostun köhnəsi** - insanı tanımaq üçün zaman lazımdır

Bir oğlan dostluğa layiq olmayan adamlarla dolanırmış. Ata nə qədər oğluna nəsihət verirsə də, oğul ona qulaq asmır. Ata bir qoyun öldürüb onun qanlı baş-ayağını bir təlisə doldurub oğluna deyir: Adam öldürmüşəm, dostlarının yanına apar görək, nə köməklik edə bilərlər. Oğlunun dostları hər biri qanlı təlisi görən kimi bunlara hədə-qorxu gəlib qapıdan qovurlar. Ata deyir ki, mənim də bir qoca, əldən-ayaqdan düşmüş dostum var, onun yanına gedək. Onun qapısına gedirlər, dostu beli bükülmüş halda gəlib qapını açır, ata dostundan yardım istəyir. Qoca kişi tez onları evə salıb deyir: heç ürəyinizi sıxmayın, mən bunları indi yerbəyer elərəm. Ata deyir: gördün bala, hər zadın təzəsi, dostun köhnəsi.

**Hər yarağım düzəlmişdi, qalmışdı saqqal darağım** - çox ciddi məsələlər olduğu halda xırda bir şeyə artıq əhəmiyyət vermək.

**Hər zaddan bir diş götürmək** -hər işdən yarımçıq baş çıxartmaq, hər şeydə dayaz olmaq.

**Hər zadın bir hesabı kitabı olsa, yaxşıdır** – yəni yaxşılıq və ya pislik həmişə nəzərdə tutulmalıdır.

Bu mən, bu dəftəri-ömrüm, mühasiblər hesab etsin,
Nə qorxum var qiyamətdə, hesab olsun, kitab olsun (168, səh 67)..

**Hər zadın çərdəyini çıxartmaq** - hər şeyin kökünə getmək, faydasız sözə davam etmək.

**Hərzə sözün mərzə cavabı olar** – nə tökərsən aşına, o gələr qaşığına.

Xoş niyyətli bir dost yaxşıdır inan,
Hərzə-hərzə durub danışanlardan ( "Yeddi gözəl").

**Həsən keçəl, ya keçəl Həsən** - söz dolandırma, sözlə oynama.

**Həsəno meşəsi** - Qaradağın ən gözəl və adlı meşələrinə işarədir ki, bu gün o meşələr aradan getmək təhlükəsi ilə üzbəüz qalmışdır. Qanunsuzluq, qarmaqarışıqlıq mənasındadır.

**Həsənsoxdu dəyirmanı** – qanunsuz yer.

Sakit, sakit, bura Həsənsoxdu dəyirmanı deyil (9, s.156).
O qəsr ki, mələkə, şah olurdu mehmanı,
Olub məsəldə Həsənsoxdu dəyirmanı (168, s.772).

**Həsrətlə yanmaq** – çox darıxmaq.

Qələbə sevincini duyduğu andan alovlanıb vüsal həsrəti ilə yanırdı (144, s.72).

**Həştərxan xoruzu** - dalaşqan, davakar.

Həştərxan xoruzu kimi üstümə gələr, məni söylətmək üçün min vasitə düşünürdü (298, s.46).

**Hətərən- pətərən danışmaq** – artıq- əskik danışmaq.

Qalan 115 kağızda da hətərən- pətərəndən savayı özgə bir mətləb yoxdur.

Mərd Məzarov kurorta gedib, eloğlum Cızmaqarayev kəndə toya gedib, məhlə qonşumuz Hətərən Pətərənov da ki, məndən bir balaca inciyib (9, s.30).

**Həvəngdə döymək** - həyatın çətinliklərinə bələd olmaq.

Ustad həvəngində mən döyülmüşəm,
İrisiyəm, hələ narın deyiləm.

**Həvəngə qarşı sinə tutmaq** - zərbəyə qarşı durmaq.

Hər kim ki baxa bir dəm dilbər qaşı, ya sinə
Həvənglərinə qarşı ya can tuta, ya sinə (225, s.46).

**Həqqə vasil olmaq** - ölüb getmək, əbədiləşmək.

Olur bu eşqilə can həqqə vasil,





Ki, eşqi olmayan canan nə hasil? (150, səh.19).

**Həmişə dəvə xurma sıçmaz** – həmişə şans üz verməz.

**Hər il Novruz şənbə gününə düşməz**- həmişə belə imkan olmaz.

İngilislər həmişə bir nəfərdən istifadə etməzlər- Bunlar bütün İranı özlərinin balaca mənfəətlərinə fəda edərlər. Sənin taylarını tez eləyə bilərlər, yontalayarlar, düzəldərlər.

**Həvədiş** – qaban kimi dişləri dodaqlardan eşiyə çıxan.

«Bir gözlü div», «həvədiş divi» qar tək əridib axıtdıq çaya (57, səh. 47).

**Həvəngə salmaq** – imtahan etmək.

Gəl indi onları bir-bir qərəzsiz salaq ustad kimi burda həvəngə, döyək. Ta iri-narını seçilsin.

**Həvəsdi bəsdi** – bu faydasız işə son qoymaq.

O necə deyərlər day həvəsdi. Bəsdi, gəl bu daşı ətəyindən tök (148, s.183).

**Həyat boyu tərəzinin ağır tayında oturmaq** - həmişə rahat yaşamaq, qüdrətə yetişən adamların palanı olmaq, çörəyi gün qiymətinə yemək.

**Hırdan düşmək** - qocalmaq, iş görə bilməmək.

**Hır-zır / hertinən perti qanmamaq**- yaxşı-pis qanmamaq, heç nə bilməmək.

Molla gördü bu hır-zır qanmır (35, s.240).

Bu gün saat 00.00 dəqiqədə Qırsaqqızov nadanşünaslıq elmləri namizədi adını almaq üçün Hırnan zırın fərqi mövzusunda dissertasiya müdafiə edəcəkdir (9, s.51).

**Hicran sazını köklәmək** – dərdindən, ayrılıq həsrətindən danışmaq.

Məşəd Məmməd özü Şimali Azərbaycanın Qazax nahiyəsindən idi. O, bizləri görəndə (Tehranda) vətən yadına düşərdi. Hicran sazını kökləyib, şirin-acı xatirələrindən danışardı (281, səh.101).

**Hicran şərbətini içmək** – ölmək mənasındadır.

Hicran şərbətini içəcəyəm mən,
İnsanlar həyata baxacaq mənsiz (264, səh. 14).

**Him-cim** – işarə etmək.

Arvadım da bu adamla danışır, sözləşirmiş, bu novcavan da şüşədən ona him-cim eləyirmiş (9, s.93).

**Himmət kəmərin belə bağlamaq** – yəni bir işi görmək üçün dizi qeyimliklə, möhkəm iradə ilə işə başlamaq.

On-on beş sənə sonra İsmayıl bəy hümmət kəmərini belinə bağlayıb, Həsən bəy kimi müsəlmanların qəflətdən ayılıb, elm və maarif kəsbinə rəğbət etmələrinə öz «Tərcüman»ı ilə çalışmağa başladı (166, səh. 200).

**Hin deyib burundan düşmək** - bir nəfərin başqa birisinə həddən artıq oxşadığı vaxt deyilir.

**Hirs gələr göz qızarar, hirs gedər üz qızarar** - əsəbi olan zaman elə bir hərəkət etməyəsən ki, sonra utanasan.

**Hirsi boğmaq** – hirslənməyə baxmayaraq, üzə gətirməmək.

Ülkərin sözü kürən ajana toxunsa da, o, hirsini boğdu (92, səh. 312.

**Hisi-pası açılmaq** - əhvalı yaxşılaşmaq, kefi açılmaq.

Atıl-düş, hisin-pasın açılsın.

**Hoqqa çıxatmaq** – oyunbazlıq eləmək, özündən iş çıxartmaq.

Ya nə vicdanə dəyər bir işə çulğaşdı, yetim?
Hərə bir hoqqa çıxartdız kırıxıb çaşdı, yetim (267, s.196)

**Hoqqulu ev** - xırda, lap balaca ev.

**Hop eləyib udmaq** – bizi yeməyəcək ki.

Qəmər xanım, axı Gülər demişkən, o bizi hop eləyib udmayacaqdır ki? (72, c.III, s.87).

**Hoydu-hoyduya götürmək** – birini oynatmaq, hərə bir söz demək.

Biçarə kişini hoydu-hoyduya götürmüşdülər ki, Allah göstərməsin(335, s.105).

**Hökmavar eşşəyi boş olmaz** - bir iddələr var ki, onlardan həmişə istifadə edərlər.

Bu deyim Təbrizin göy göyərtisini yetirən Hökmavar məhəlləsindən olan əkinçilərə aiddir. Onlar Təbrizə gələndə kəvər, reyhan, göyərti gətirib satandan sonra eşşəklərinə quru çörək, yaxud təzək yükləyib geri dönərdilər. Buna görə deyərlər ki, Hökmavar eşşəyi gedəndə də geri dönəndə də yüklü olar.





**Hökmavarın suyu düşüb** - yorğunluqdan yatmağa düşüb, taqətsiz, halsız olan adama işarədir.

Hökmavar Təbrizin görməli yerlərindəndir. Uzun məsafəni gedib gəlmək nəticəsində yorğun düşənlərə deyərdilər ki, Hökmavarın suyu düşüb, yəni rahat yatıb.

**Hökmavar uzaq, kərdisi yaxın** -biri yalan danışanda ki, mən Hökmavarda bir kərdini birdən adlardım, onda deyirlər. Yəni yalan söyləmə.

**Hökmü daşdan keçmək** – sözü kəsərli.

Müqtədir söylər mənə fərman gəlib Tehrandan,
İşdə bu daşdan keçər hökm ki, Tehrandan gələ (301, s.123).

**Hövsələsi dar adam** - səbrsiz, bir yerdə qərar tutmayan.

Köynəyi, şalvarı dar
Hövsələsi dar olar (301).

**Humay quşu - Turk** mifologiyasında Humay nəcabət, ağır təbiətli, aza qənaət edən, birinə əzab verməyən quşdur.

Uf, səni görən deyir,
Humay quşun balasıdır ( Molla Cümə, s.90).

**Hüddülüm** - əskik adam, yüngülbeyin.

Bel şappası Mirabın əlindən yeməyibsən,
Hər hüddülümə "başına dönnəm" deməyibsən (168, s.173).

**Hülhülü məzhəb, yaxud hürhürü məzhəb** - hər gün bir dona girən, heç bir sözə, inama vəfadar qalmayan adam.

Gəldi çün bəhri- ətlasi, hülhüli- məzhəb oldu mollası (301).

Dedim axır sizə mən, hülhülü məzhəbdi Tağı,
Qoymayın Mirzə Tağı yanına məsum uşağı (300, səh. 115).

**Hürər, hürər burnu şişər** – qışqırar, sonra adamdan inciyər.

**Hürüt-hürüt baxmaq** - mat qalmaq, heyrət etmək.
Rəssam uyur, hürüt hürüt durub baxır,
Kirpik çalıb dönə-dönə
Gözlərini ovuşdurur,
Yenə baxır.





# -X-

**Xaxol** - Ruslar bu sözü ukraynalıların bir qrupu haqqında işlədirlər. Ukraynalıların bəziləri başlarının hər yerini təkdən qırxıb lap kəllədə olan tükləri kəllədə hörüb boyunlarının dalısına atırlar. Ruslar tarix boyu ukraynalılarla çox dava etdiklərinə görə onların əleyhinə çox mənfi təbliğat etmişlər. Təbrizdə də gic, ağlı başında olmayan mənasında işlənir.

**Xala gəlib nənə olmaz** - ananı heç kəs əvəz edə bilməz.

**Xala-xala oynamaq** -- uşaq oyunlarından birinin adıdır. Əvəz-əvəz eləmək deməkdir.

Gözlüyürük haçaq arançı arabaları gələcək, dəyiş-düyüş eləyib xala-xala oynayacağıq (296, s.127).

**Xala xanbacı sözləri** - boş sözlər, dedi-qodu, həqiqətə uyğun olmayan sözlər.

**Xala xatirin qalımasın** - yalandan təklif eləmək, özünü canıyanan göstərmək.

Könülsüz, ürəkdən istəmədən, könlü olmadan görülən bir iş, ya deyilən sözdür.

Ayın 11-də Sultan da "xala xatirin qalmasın" babətindən camaəti aldatmaq və qoşunun başının altına yastıq qoymaq qəsdi ilə guya ki, qanuni-əsasi elan edib (211, 1908).

Vaqifin arvadı Qızxanım sabahdan bircə dəfə onun başına gəlib xala xatirin qalmasın deyə ərinin halını soruşub, yenə çəkilib getmişdi ( Y.V.Çəmənzəminli, "Qan içində").

Söyüş verir ki, daha qalmasın xalanda xatir ( Şəhriyar).

**Xalam bildi, aləm bildi** - bir nəfər söz gəzdirən qadın bilsə, hamı bilər.

**Xalamın daş...ı olsaydı, dayı olardı** - mücərrəd bir şeydən danışmaqla, iş düzəlməz.

**Xala vurmaq** - qalib gəldi, düz hədəfə vurdu.

**Xalqa it hürər, bizə də çaqqal** - biri başqasının özünə tay olmadığını bildirmək üçün belə deyir.

Xalqa it hürər, bizə də çaqqal, qudurasan səni (84, s.175).

**Xalqı bərq tutar(elektrik), bizi əl çırağı/ xalqa it hürər, bizə çaqqal** -birini özündən artıq adam təhqir edər, bizi özümüzdən əskik.

**Xallı ceyran** - Azərbaycanda gözəl qız və qadını xallı ceyrana bənzədərdilər.

**Xamdamaq** -kefsiz, pərt.

Hamısı xamdamaq evlərinə dağıldı (35, s.249).

**Xam xəyal** - həyata keçməsi çətin olan bir xəyal, fikir, istək.

And verirəm o səndəki ehtiraslı xislətə,
Sənin ögey atandakı xam xəyala, niyyətə (Bakıxanov A. Seçilmiş əsərləri, s.423).

Mənim ümdə məqsədim müsəlmanların elmsizlik, anlamazlıq səbəbindən bu bəlalara düşdüyünü deyib ermənilərin də bir para yazıçılarının bir para xam xəyala qurban olduqlarını onlara bildirmək (232, s.7).

..Adfiyüksəkdən fayda gözləyib Təbrizin xilasına ümid bəsləmək xam xəyaldır (144, s.163).

**Xamıram suyam, durmuşam buyam** - məni olduğum kimi qəbul etməlisən (39, s.554).

**Xam iş** – düşünülməmiş, yarımçıq iş.

Xeyr, biz heç kəsə rast gəlməmişik, deyirəm çox xam iş tutduq (195, c.II, s.15).

**Xamlamaq** – səfeh yerinə qoymaq.

Sən bu uşaqları xamlaya bilərsən ə, da məni yox (9, s.127).

**Xançalının qaşı düşər** -əskilərsən?

... Əlbəttə, işçilərlə bir vaxtda gəlsə, xançalının qaşı düşər (9, s.126)

**Xan xanlıq** - dərəbəylik, qanunsuzluq.

Nə qədər dünyada var xan –xanlıq,
Bu cəhalət, bu nadanlıq qalacaq (338, s.122).

**Xanım sındıran qabın səsi çıxmaz** – "dövlətlinin qəhbəsi, kasıbın xəstəsi dilə gəlməz" deyimi ilə eyni anlamdadır.





**Xan ilə plov, aş yemir ki, bığı yağa batar** - özünü çox yuxarı tutan, varlı-dövlətli, yekəxana.

Sultan bəy: əşşi, xan ilə aş yemirəm ki, bığım yağa batar.

**Xan qulluğuna gedən atlı gedər, piyada qayıdar** - xanlar birinin əlində nə görsə, tutub alarlar.

**Xaraba dəyirmanda yeddi il yatmaq** - qayğısız, qeydsiz, özgələri vecinə almayan.

**Xasaxor** - hər şeyin yaxşısını yeyən.

Bir neçə il bundan əvvəl Təbrizdə iki cür səngək bişirilirdi. Xasa çörək bir az ağ, xərci çörək isə qara olurdu.

**Xasiyyətin bilməyən atın dalma keçməzlər** - bir adamı taniyib ona yanaşmaq lazımdır.

Xasiyyətin bilməyən atın dalına keçməzlər (335, s.268).

**Xaşalım çıxdı** - dədəm yandı, pis yoruldum.

**Xeyir söyləməz-** xeyir söyləməzə dedilər ki, xeyir söylə, səfərə gedirəm, gələndə papağımı sənə verəcəyəm. Dedi indidən ver, bəlkə getdin gəlmədin.

Xeyir söyləməzə dedilər ki, xeyir söylə, gələndə sənə xələt gətirərəm, dedi ki, bəlkə getdin gəlmədin (1, s.16).

**Xeyri yoxdur çaxırın, içmə açar paxırın** – sərxoşluq insanı rüsvay edər.

Aşna, içmisən çaxır gözlərin axır, və yaxud xeyri yoxdur çaxırın içmə açar paxırın (9, s.13).

**Xəbərçi Xədcə** - söz gəzdirən.

Nazlı-bəs sənin o xəbərçi Xədicən nədir, mənim telefonuma qulaq asır, gəlir qoyur, sənin ovcuna (9, s.187).

**Xəfəngini basmaq** - danışmağa izin verməmək.

Tez xəfəngimi basdılar, lal ol!
Çıxmadı daha zərrə cınqırım (338, s.47).

**Xəmir ağız** - sözü kəsərsiz, sözü keçməz, iradəsiz.

**Xəmir aşı** - hər zadı biri-birinə qarışmış yemək, meyvə.

Alıma düşdü düz doğru məğrur qurdun başına,
Bu qoçağı döndərdi xəmir aşına ( A.Bakıxanov "Qurd və ilbiz").

**Xəmir çox su aparar** – bu iş uzun çəkər, bu tezliklə bitməz.

Sonra məsləhətlə deyir: Bəlkə xəmirimiz çox su apardı, çalış elə bu il, universtitetə daxil ol (55).

**Xəncər- bıçaq olmaq** - düşmən, qanlı bıçaq olmaq.

Ev sahibi kirə üstə mənimlə,
Axşam-səhər xəncər-bıçaq olubdur (275, c.I, s.334).

**Xəriflәmək** – səfehləmək.

Məlik sən də lap xərifləmisən, at o dəftərçəni ki, orada Qənbərovun adı yoxdur (9, s.152).

**Xəstə tələsər armud vaxtında yetişər** – hər şey adamın istəyi ilə olmur, hər şeyin öz vaxtı var.

Xəstə tələsər armud vaxtında yetişər, Nuhbala! Az qalıb day, qadası (84, s.289 ).

**Xəşə yaxud, xaşal qarın** - yekə qarın, şişman kişi.

Yenə də Xəşə Məmmədağanı gördüm, səhər çağı atla gəlib şeytana papış tikən çörəkçinin məxsus valiyə bişirdiyi çörəkdən bir parça yoxlamaq üçün aparırdı.

**Xərcləmək** - qızı ərə vermək.

Xərclədik day bala, yoxdur qızımız,
Gəlin oldu o kiçik baldızımız (Şəhrək, s.175).

**Xərgəzləmək** – ağacın qocaldığını xərkəzləməklə bəyan edərlər. Qocalan, taqətdən düşən insana aid olunar.

Xərkəzlədim nəvə- nəticə odur aldı dövrəmi (168, s.71).

Qoca ağac kimi xərkəzləsəm də qeyrətim üzrə,
Yenə quru kötüyündən cavanı bağlamışam mən (Sönməz).

**Xətir dərdindən xəstə yatmaq** - üzə düşüb bir söz deməmək.

**Xətrinə düşmək** - hansısa bir yeməyi ürəyi istəmək.

**Xətt çəkmək** - birindən vaz keçmək, münasibətlərini kəsmək.

Özündən və özgədən elə azad oldum ki,
Sərbəstlikdən hər sabah Xaqani, xaqana xətt çəkirəm (163, s.103).





**Xəttə düşmək** - işləri yoluna düşmək, mənfi mənada çox işlənir. İkiüzlü və riyakarlar hər gün bir don əvəzləməklə və ya saqqal qoyub xalqın cibini kəsməklə xəttə düşürlər.

**Xəyalplov** – real olmayan fikir.

Bunlar hamısı xəyalplovdur, siz teatrı oyuncağa çevirmək istəyirsiniz (72, s.136).

**Xəzinə tapmamışam ki** - pul kürümürəm ki, pulu çətinliklə qazanıram.

**Xımiri oğurlamaq** - heç k çik bir səs belə çıxmamaq.

Xımırıvı oğurladın, qulaq asdın, getdikcə suyun səsi havalanırdı (203).

**Xınca xınc** - lap dolu, iynə salmağa yer olmayan salon, tənəbi, zal.

1952-ci ili İstanbulun sənətsevərləri şairləri... aşıq Veysəl üçün bir yubiley hazırlayırlar. Şəhər teatrosu salonu xıncaxınc dolur (18).

**Xırçaya qarpız bağışlamazlar** - kiçik bir iş üçün böyük hədiyyə verməzlər.

**Xırda pul səs verər** - savadsız, düşüncəsiz, təcrübəsiz adam hər şeydə iddialı olar.

**Xırmanı göyə sovurmaq** - axırına çıxmaq, hər şeyin üstünü açmaq.

Dərbədər etdi yenə dilbər məni,
Sovurdular göylərə bu xərməni,
Eylədilər axəri kafər məni.

**Xirnək olmaq** - qarğışdır, əmr formasında qarğış kimi işlənir. Xirnək güclü boğaz ağrısı ilə müşayiət olunan xəstəlik. Ehtimal ki, boğaz xərçənginə deyilirmiş

Dedim bir- bir ona başım qəzasın,
Dedi: xirnək görüm boğsun balasın (300).

**Xırtxəşil olmaq** - əzilmək.

Qaratel, deyirlər lap xırtxəşil imiş (118, s.411).

**Xısın-xısın ağlamaq** - gizlicə, yavaş-yavaş ağlamaq.

Öz evlərinə qapılıb xısın-xısın ağlayanların sayı küçələrə çıxıb çadlıq edənlərin sayından bir neçə qat artıq idi (234, s.7).

Münəvvər xısın-xısın ağlayır, qapı döyülür, iki əmniyyə və katda içəri daxil olur (77, s.18).

**Xış kötüyə dəyib** - iş bərkə düşüb.

**Xış kötüyə xaşalqarın deyir** - təxminən öz gözündə tiri görmür, başqasının gözündə qıl axtarır- mənasındadır.

**Xirmən etmək** - viran qoymaq, bərbad etmək.

Biz zatən varını talan etmişdik,
At sürüb o bağı xirmən etmişdik (165, s.174).

**Xirtdəyə qədər borc içində olmaq/ yemək** - həddindən artıq.

**Xox eləmək** -gücü olmadığı halda yalandan hədələmək.

Biri şikara gedir, şir ilə edir cəngi,
Birinə xox eləyəndə qıfıllanır əngi (168).

**Xoruz banı**- səhər erkən.

Xoruz banı yerindən durmaq,
...Qaynar marten peçlərində metal əritmək...
Hə, necədir?
Əlinizdən gələr? (275, c.I, s.309).

**Xoruzdan gizlənən** – qısqanc, qəlbiqara.

Lap arvadını xoruzdan gizlədəndi (9, s.79).

**Xoruz döyüşdürən** - ara vuran, qızışdıran.

**Xoruz göz** - qaynar göz, diribaş, gözündən od yağan, ehtiraslı.

Çay aşağı getmərəm,
Çadranı yellətmirəm
Xoruz göz oğlan gərək,
Dul kişiyə getmərəm ( Y.Vəzir).

**Xoruz kimi özünü çəkmək** – yekəxanalıq eləmək, yalandan özünü şişirtmək

Mənə nə? - deyə Güləli xoruz kimi özünü çəkdi ( 253, s.415).

**Xoruzquyruğu** - xoruzquyruğu çay şəklində geniş işlənir. Yəni, təzə dəm, tünd qırmızı gözəl rəngdə çay.

Elə bu vaxt süfrəyə bozbaş gəldi, yamyaşıl göy-göyərti, qıpqırmızı turp gəldi, bir də o xoruzquyruğu zəhrimar (9, s.28).





**Xoruzlanmaq** - dava etmək, birinin üstünə cummaq, birinə müqavimət göstərmək.

Cabbar bir az yuxarı qalxıb xoruzlanır. - Necə ala bilmirsən? (195, c.II, s.174).

Ay heyvana oxşayan tülkü balası, ananı gördün xoruzlandın? (335, s.74).

Mədəmizi ağlımıza dəyişməyi şərəf sandıq,
Özgəsinin qabağında toyuq olub, evimizdə xoruzlandıq (328).

**Xoruz səsi eşitməyib** - təzə, gözlənilməz, qeyri-adi.

Katolik papasları deyərdilər ki, dil sadə və açıq olsa fəsihi olmaz. Rusun qədim yazıçıları yazı yazanda elə bir kəlmə və ibarələr işlədirdilər ki, xoruz səsi eşitməmiş olsunlar (246, s.136).

**Xoruz toyuğa baxan kimi baxır** - əyri-əyri baxır.

**Xoruzum başqasının damında banlasın** - əri başqa qadınla gəzən bəzi qadınlar özlərini sındırmamaq üçün belə deyirlər.

**Xoruzun ban səsi** - məcazi mənada azadlığın, sülhün car səsi kimi işlənir.

Sanmagilən bu gələn səs
Çaqqalların ulaşması, xoruzların ban səsidir ( Fərhad).

**Xoruzun qoltuğuna vermək** – işdən çıxartmaq, birinə qalib gəlmək

Nazlı- Day denən xoruzun verib qoltuğuna da (9, s.176).

**Xoruzun quyruğu görünür** - birinin sirrinin, eybinin üstü açılır.

Hə, xoruzun quyruğu yavaş-yavaş görükürdü (84. s.47).

**Xoruz yox idi, səhər açılmırdı** - insanlar yaşayış üçün bir yol tapırlar, heç vədə birinə əbədi bağlı qalmırlar, sənsiz işim aşmırdı? Özünü çox böyük adam bilmək

"Xoruz olmasa səhər açılmaz" iddiasında olan Şahquluya qarşı deyəsən bir daxili inamsızlıq özünü göstərirdi (253, s.282).

**Xosunlaşmaq** - iki nəfərin sakitcə bir tərəfə çəkilib bir məsələ haqqında danışması.

Gün çırtladı, göz qamaşdı,
Araz mənlə xosunlaşdı ( S.Rüstəm, s.210).

**Xoş görməyənin halına** - pis, dəyərsiz bir hadisə, tamaşa haqqında işlənir.

**Xozeyin** - həqiqi mənası Sahibkar, ağa deməkdir. Azərbaycanda iddialı adama, özünü çəkənə deyilir.

Qoy iki yaylığı satsın xozeyin bir manata,
Dişi düşmüş qocanın ağzı nədir dillənsin (306, s.113).
Xoşeyin, belə iş olmaz (148, s.116).





## -İ-

**İbrət sırğası** – acı təcrübələrdən, baş vermiş yanlış hadisələrdən dərs götürmək.

Ordubad Mahal Cəmiyyətinin bu dərəcədə olan qeyrətləri onlara (erməni xəfiyyə cəmiyyətinə) girdəkan müharibəsində yetişən məğlubiyyət bir ibrət sırğası kimi qulaqlarından asılmışdır (232, səh. 163).

**İçərini qəm qaraltmaq** – yəni ürəyi, könlü dərd almaq.

İçərin qəm qaraldıb,
Gəl barı sən, ağla yar! (158).

**İçi-içini yeyir** -istədiyi işi görə bilmənəyə görə və ya nəhayət kədərdən ürəyi sıxılır.

**İçi qara** -rəhmsiz, sözə baxmayan, söz çıxardan.

Bir rəhm eylə ey cəfalı yoldaş,
Olma içi qarə ürəyi daş (83, s.115).

**İçi quru** - arıq, qarnı kürəyinə yapışmış adam

**İçimiz özümüzü yandırır, çölümüz özgəni** – dolanışığımızdan belə zənn edilir ki, bizim vəziyyət başqalarından üstündür, amma bu belə deyil.

Eşiyi özgə xəlqi yandırırdı, içi mollanı çox odlandırırdı (147, səh. 122).

Eşiyi özgə xəlqi yandırırdı,
İçi mollanı çox odlandırırdı (147, s.122).

**İçinə sıçmaq** - korlamaq, xarab eləmək.

**İçini qurtlar yemək** – pis fikirlər, pis niyyətləri ürəyində bəsləmək.

O sakit ola bilməz, içini qurdlar yeyir (264, səh.131).

**İçini yemək-** dərd çəkmək, qüssə yemək.

Deyirlər sən içini yeyirsən ki, Nigar xanımı Moskvaya aparmağımız xəbərini niyə dedim atama? Ürəyinə salma (292, s.337).

**İçi yanmaq** – nifrətdən, dərddən, həsrətdən əzab çəkmək.

Qara quşun bir bölük qaz,

Sırasına düşdü qu tək.

**İdmi düzəlməmək** – pis adətindən əl çəkə bilməmək.

Belin qırılsın, kasıbın malı, ye da, idmin düzəlməz sənin (296, s.197).

**İgidin ağzını bıçaq açmaz** - əski düşüncələrə görə igid adamın gülməsi yüngüllük sayılırdı.

**İgid ya Heratda, ya yer altda** - Türk ənənəsində döyüşdə olmaq böyük şərəf sayılır. Deyim Heratın türklərin əlində olduğu dövrə aiddir.

**İki at bir aslana dov gələr** - birlik bütün çətinlikləri aradan götürər.

**İki ayağı gorda** - ölüm ayağında olmaq.

Üfləmə Qasımın iki ayağı gorda olan, gözlərinə ağ gəlmiş nənəsi böyrü üstə düşüb canını allaha tapşırdı (288, s.161).

**İki ayağını bir başmağa soxmaq** - bir sözün üstündə israr etmək.

Oğlum iki ayağın diriyib bir başmağa (9, s.65)

Əslində Rəhimin arvadı Növaziş iki ayağını bir başmağa təpib (29, səh. 4).

**İki baş, dörd ayaq olmaq** – evlənmək və bir işin tənəzzülə və ya nailiyyətə uğraması.

**İki daş arasında qalmaq** – ağır vəziyyətdə qərar tapmaq.

Qalmışam iki daş arasında mən,

Axı bu soyuqluq hardan yarandı (Xanəli Kərim, səh. 59).

**İkibaşlı danışmaq** - qəti mövqeyi olmamaq.

**İkibaşlı siyasət** – iki üzlülük.

Qəvamın ikibaşlı siyasi oyunbazlığı və ikiüzlülüyü bir tərəfdən sovet dövlətinə razılığı bir tərəfdən Vaşinqtondakı İran səfiri Hüseyn Əla vasitəsi ilə ara qarışdırması yenidən qaldırılmışdı ("İkinci dünya müharibəsindən sonra İranın xarici siyasəti", s.31).

**İki cüt, bir tək** - az, saya gəlməyən.

A balam, bəsdir, həya eləyin, balam bu iki cüt, bir tək qorxaq ermənilər bilmirəm bizdən nə istəyirlər? (195, c.II, s.104).





**İki daşın arasında** - münasib olmayan şərait, çox tələsik vaxt.

İki daşın arasında başlasaydılar elçiliyə, qız gülərdi (84, s.31).

**İkidilli** – iki üzlü, fikrini tez dəyişən.

Yox böylə ikidilli, yaman üzlü cəfakar

Bir zərrə utanmaz (267, s.16).

**İki eşşəyin arapasını bölə bilmir** - heç nə bilmir.

İki eşşəyin arpasını bölə bilmir (1, s.197).

İki eşşəyin arpasını bölə bilmir, gəlib çıxıb səhnəyə (84, s.102).

**İki əli, bir başı olmaq** - əzizini əldən verməkdən qəzəbdən özünü döymək; tək olmaq.

Yağdı yaş yerinə qan gözlərindən,

İki əl bir başı oldu ananın ( Daşqın).

**İki fındıq bir girdakanın bətərin dağıdar** – güc birikdədir, birliyə sahib olan millət hər bir böyük düşmənə qalib gələr.

**İki göz də borc almaq** – diqqət ilə birinə baxmaq.

İntizarın bir günündə

Qocalmışam

İki göz də borc almışam

Gözləyirəm səhəri mən (328, s.105).

**İki göz istəyir ki ona baxasan** – çox gözəldi.

iki göz istəyir ki, ona tamaşa eləsin (174, s.8).

**İki gözün bir deşikdən çıxartmaq** – hədələmək.

Özün öləsən, iki gözünü bir deşikdən çıxardaram sənin (9, s.145).

İki gözüvü bir deşikdən çıxardaram (84, s.142).

**İki it küçüyüm olsa birini ona verməərəm** – heç cür bəyənmirəm.

İki it küçüyüm olsa birini ona verməərəm (46, s.107).

**İki köynək dəyişmək** –iki nəsil.

Alayla Çəmənin toy gecəsindən bu yana Qanıq evinin nəsli iki köynək dəyişmişdi (296, s.120).

**İki qoçun başı bir qazanda qaynamaz** - iki döyüşkən, dalaşqan, ağır xasiyyətli adam bir yerdə ola bilməz.

Keçənə güzəşt deyərlər, Fərəc, bir də ki, iki qoçun başı bir qazanda qaynamazdı (9, s.181).

**İki məscid arasında benamaz qalmışam** – dəqiq qərara gələ bilmirəm.

İran konsulluğuna gedəndə farsi bilmədiyim üçün mütərcim aparanda mənə deyirlər sən iranlısan, gərək İran dilində, farsca danışasan. Anketləri də farsca doldurasan. Mən 72 yaşında, necə deyərlər, iki məscid arasında benamaz qalmışam (M.Purimanı, 27.V.1998).

**İki pulluq ağlı olmamaq** – ağılsız.

Analı-qızlı iki pulluq əqliniz yoxdur, hər boş sözdən ötrü yerdən olursunuz (5, s.28).

**İkiüzlü sac çörəyi** - ikiüzlü adam, işi düşəndə yaltaqlanan.

Bu günlər heç zad da olmasa, yeri gələndə mollalara və daldada şaha yaltaqlıq edən ikiüzlü sac çörəkləri hər yeri tutubdu.

**İqbalı şax durmaq** - uğurla üzbəüz olmaq.

**İlana balası qənim olar** – adama yaxın adamı zərbə vurar.

İlana balası qənim olan kimi zalım padşaha da sən qənim olacaqsan (46, s.159).

**İlana sarılmaq** – naçarçılıqdan, hər bir qabağa gələn adama, bir şeyə ümid bəsləmək, ondan kömək ummaq.

Əbdülvətən: «Dənizə düşən ilana sarılır» dedikləri kimi bu gün bir səadətə müstəqbələri üçün olan mübarizədə bulunan sairə millətlər bizimlə qardaş kimi isələr də, rahat yüzü gördüklərindən bizim rəqibimiz olmayacaqlarını nərədən biləlim (28, səh. 91).

**İlan bel** – ucaboy, incəbel.

**İlan boğan vaxt** - uşağın bir yaşı olan zaman işlənir.

**İlan boğazından düşüb** - gözəl, məlahətli, qaş-gözü yerində olan qız .

**İlan dili tökmək/ çıxartmaq** - yalvarıb yaxarmaq, dil tökmək.





Nə oldu, işin düşəndə ilan dili çıxardırdın, indi başlamısan məntiq filan ..(9, s.55).

Nə bir həkım nə qəza var,
Nə iyi bir mənzil ötənlərə
Çıxarırsan yazıq ilan kimi dil (69).

**İlanın qənimi balasıdır** - yaxın adamdan gələn ziyanı heç kəs vura bilməz.

**İlanın zəhləsi yarpızdan gedər. O da yuvasının qabağında bitər** - nədən zəhlən getsə, gəlib səni tapar.

Yarpızgülü, yarpız kolu min dərdə dəvadır.
Getsin ilanın zəhləsi qoy yarpız əlindən (241, s.22).

**İlanı yuvadan çıxatmaq** – şirin dilli adam.

Səni yaxşı tanıyıram, ancaq elə qadınlar var ki, ilanı yuvadan çıxarır (1, s.176).

**İlan kimi qabıq qoymaq** – çox zəhmət çəkmək.

Mən sənin qapında can çürütdüm, ilan kimi qabıq qoydum (174, s.6-7).

**İlan qurbağa** - pis, səliqəsiz xətt.

Dünən poçtdan bir məktub aldım, yazıb Rastaküçəyə (Təbrizin məhəllələrindən biri) mənim adıma altı aylıq ruznameyi- "Molla Nəsrəddin" göndərilsin. Gülüncə layiq olan millət varsa, o da həmin başıboş ağalardır ki, anaları qoyduqları adı yazmağa guya utanıb ilan-qurbağa çəkirlər ki, bədbəxt kağızı oxuyan bilməsin ki, kağızı yazan kimdir. Yazıq millət (211).

Etdiyi tədris ilan-qurbağa,
Dərs deyil, hərzəvü- hədyandı bu (166, səh. 97).

**İlanlar qarnında baş-başa verib** - paxıl, pis fikirləri ürəyində saxlayan, özgəyə quyu qazan.

**İlanmələyən vaxt** -yayın ən isti vaxtı.

Yayın ta ilanmələyən vaxtınacan o ağac gözünün yaşını axıdırdı (118, s.308).

**İlan mələyir** – həddindən artıq isti və qumsal yer, əkilməyən yer, isti. Qumsal yer, bərri- biyaban, susuz yer.

Bu ilanlar mələyən səhradə xanların tökdüyü qanlar (S.Rüstəm).

Möj vurur zəmilər, isti bir yel əsir, ilanlar məlir (219, 18).

**İlan oynatmırlar ki** – baxmalı şey yoxdur axı.

Niyə gülürsünüz, burda ilan oynatmırlar ki! (195, c.II, s.68).

**İlan vuran ala çatıdan qorxar** - bir işdən ziyan çəkən adam daha o işin təkrarına yol verməz. Azərbaycan öz acı xatirələrini yadında saxlayıb və bir də zor və əsarət altına getməz.

İlan vurmuş ala çatıdan qorxar (F.Xoşkinabi).

İlan vuran ala çatıdan qorxar, arvad! (253, s.11).

**İlan vuran yatdı, mən yatmadım** – bir acı olaydan, hadisədən, xəbərdən gecəni yata bilməmək.

İlan vuran yatar isə, sevgi sevən yata bilməz (160, səh.27).

**İlan vurmuş**- birdən-birə, qəflətən yerindən durmaq, tam mənada narahat olmaq.

Akademik ilan vurmuş kimi dik yerindən qalxıb, gəldi mənimlə səmimi və möhkəm əl verdi (157, səh. 12).

**İldırım daşı** - ağır yük, möhkəm.

Üstündəki yorğan ildırım daşına dönüb sinəsini sıxırdı (310, s.4).

Bir də baxdılar ki, bir ağ paltarlı ağ atlı adam ildırınm kimi gəlir (148, s.83).

**İliyinə işləmək** - bir inamın, fikrin canına hopması.

**İliyə-qana işləmək** – pis və yaxşı ənənələri, əxlaqın unudulmaması.

Qüssəsi xəlqin oturub canıma,
İşləyib hətta iliyə-qanıma (338, səh.19).

**İliyin ərimməsi** - candan düşmək.

Əridi iliyim, qaldı sümüyüm,
Bu təni tərk edir canım, nə dersən? (150, s.18).

**İliyin gizildəməsi** – vətən həsrətindən, sevdiyi adamın sevgisindən ən nəhayət rahatsız olmaq, can ağrısı.

Yurddan ötrü sümüklərim göynəyir, iliyim gizildəyir («Qaranın söhbətləri», səh. 125).





**İlqarın bir olması** – bir hədəf üçün, bir iş üçün işdə, sözdə bir olmaq.

**İmalə suyu** - tez-tez narahat edən, əl çəkməyən.

**İmam Hüseynin qız uşaqları** - əziz, ərköyün, hamıdan üstün.

**İmanı qırx səkkiz olmaq** - heyrətdən əl-ayağını itirmək.

**İnək göz eləməsə öküz atılmaz** - qızın könlü olmasa, oğlan yanaşmaz.

İnək göz eləməsə, kələ sıçramaz (84, s.425).

**İnək sağa bilməyənə həyat əyridir** – bacarıqsız adamın öz nöqsanını ört-basdır eləmək üçün bəhanə uydurması.

İnək sağa bilməyənə həyat əyridir (103, s.72).

**İnək su içər süd olar, ilan su içər zəhər** - bir şey hamıya eyni cür təsir eləməz.

**İngilis baydağı/ bayrağı** - sözünün üstündə durmayan, öz qazancını üstün tutan.

**İngilis sovqatı** – nifaq və sümürücülük üçün göndərilən casus, ya işə aparılan siyasət.

İngilis sovqatısan, kim bura azdırdı səni?

**İnsafı əldə tutmaq** – vicdanı yaddan çıxarmamaq, rəhmli, ədalətli olmaq.

Əlac odur gərək bu saat biz,
Əldə insafı biz tutaq hamımız (195, c.II, s.179).

**İnşallah pişikdir** – bir adam billə-bilə özünün və özgənin başına beh qoymaq.

Bir molla qonşu kənddə hamama gedir. Hamamdan qayıdan zaman arxın yanından keçəndə bir köpək sudan çıxıb silkələnib, mollanın hər yerini murdarlayır. Molla şəri bir beh qoymaq üçün deyir inşallah pişikdir.

Desəniz, siz bilmirsiniz, inşallah bu pişikdir - mən onu da qəbul edərəm (Qurbanəli Şərifov).

**İpək o qədər xar olub, eşşəyə ovsar olub** - nəcib adamların hörmətdən düşməsi, alçaq adamların əli ilə hörmətsiz olması.

**İpə-sapa yatmaq** – yola gəlmək, mülayim, yola yaxın olmaq.

Qəssab Alı nə qədər dil-ağız tökdüsə, gördü ki, yox müştəri heç ipə-sapa yatan deyil (174, s.82).

Şah Abbas gördü pəri ipə-sapa yatan adam deyil, əl vursa özünü öldürəcək.

**İpə-sapa düşməmək, yatmamaq** – heç kəsin sözün qəbul etməmək, heç kəsə boyun əyməmək. Yola gəlməmək.

Amma Rəcəb ipə-sapa yatmaq istəmir (118, s.273).

Nə qədər onu ipə-sapa yatırtmaq istədisə də, olmadı (9, s.25).

Müslüm Maqomayev az vaxt içərisində ipə-sapa yatmayan, tez-tez konsertə gecikənləri elə ram eləmişdi ki, sonralar onun sözündən çıxmağa cəsarət eləmirdilər (145, səh. 88).

**İpim qırıldı, kəsildi** – yaman günə düşdüm, yoruldum.

Məni bir basdı fələk, qərarım kəsdi fələk,

Çöllərdə çadır qurdum, ipini kəsdi fələk (24, səh. 111).

**İpini qırmaq** – cızığından çıxmaq, qudurmaq. Sözdə, əməldə birini yerinə oturtmaq.

**İpinin üstünə odun yığmaq olmaz** - etibar eləmək olmaz.

**İp qıran dəli** - ağlını itirmiş, ən nəhayətdə ruhi xəstəliyə düçar olmuş.

Bakıda getdim bir doktora mənə bir neçə əsəb davası yazmışdı, onları apardım məşhur bir həkimin yanına dedi ki, bunları ip qıran dəlilərə verərlər.

**İpləmə** - dəli.

Ədə, bu dəli ipləməymiş ki...(9, s.145).

**İp sabunlamaq** – birini dara çəkməyə hazırlamaq, birinə quyu qazmaq.

Həbsxana xidmətçilərinin peşəsi ip sabunlamaq, günahsız adamların boğazına keçirmək olubdur (234, s.444).

**İp üstə un sərmək** - etibar etməmək, faydasız bir iş görmək.

Nöqsanını bir kimsəyə göstərmək olurmu,

Ya ki ipinin üstünə un sərmək olurmu?





Evlənmək olurmu? (69).

**İrəli çəkilmək** – vəzifəcə böyümək.

Çəkildi hey irəli, verməzdi iki ay ara,

Vəzifəmə yiyələndi mənim o qəlbi qara (80, c.II, s.177).

**İri tikəsi qulaq boyda olmaq** – doğram-doğram olmaq, öldürülmək.

Allahın altında görəydim, onun iri tikəsini qulağı boyda eləməsəydim, atamın oğlu deyildim (62, səh. 347).

**İsfahan şeyxləri** – şarlatan, islam adı altında günahsız qızları ələ gətirən, xalqın malın-dövlətini mənimsəyən. Ən fırıldaqçı, xalqın cəhalətindən din adına istifadə edən.

İsfahan şeyxləri sizi də inandırmışlar ki, hər kəs bu mübarək otağa qədəm qoysa öləndən sonra qiyamətədək qəbrinin qapısından mələikələr ilə söhbət edəcəkdir (195).

İsfahan lotuları bizim başımıza gətirəni, sizin də başınıza gətirirlər (195, səh. 77).

**İsinmədik istisinə, kor olduq tüstüsünə** - çox zəhmət çəkməyimizə baxmayaraq xeyir görmədik, əvəzində ziyan gördük **(Nizami).**

**İsti aşa soyuq su qatmaq** - nəticə vermək halına gələn bir işə pəl vurmaq, manеə törətmək.

Qoymasınlar zillət börkü başıva,

Yaxmasınlar möhnət rəngi qaşıva (95, s.547).

Çarəsiz dərdə düşüb qan qusasan, ta sevinəm,

Çünki buzlu suyu qatdın gözəl, isti aşıma (224, s.13).

**İstibdad qatırı** – qanmaz, yaramaz, hər bir pisliyə qadir olan insan.

Cəhənnəm dərəsi Culfada gömrük rüsumatını icra etdik, Arazı keçdik. İranda təbii yollar olmadığı kimi, mənəvi yollar dəxi yoxdur. Burdan ancaq istibdad qatili, zülm eşşəyi keçə bilər („Tərəqqi", № 115, 1905).

**İsti-isti** – həmin anda, zaman keçmədən.

Elə oradaca isti-isti bir qazı çağırdılar (46, s.130).

**İstiqanlı** – mehriban.

Davud özünə xas istiqanlılıqla Həmidin qoluna girib onu divar dibinə çəkdi (1, s.226)

**İstiot dadmamaq** - zamanın qayda-qanununa bələd olmayan, qorxmaz, yaxşı-pisi bilməmək.

Dəllək gördü Dəmirçioğlu o deyənlərdən deyil. İstiot dadmayıb, heç hır-tır qanmır (174).

Məgər ömründə istiot dadmayıbsan (147, səh.123).

**İstəkan götü** - eynəyin şüşəsi həddindən artıq qalın olduqda deyərlər.

**İstəmirəm, yan cibimə sal** –pul almağa razı olsa da, yalandan naz eləmək.

**İstirdi qaş düzəltsin, vurdu gözün çıxartdı** -iş düzəltmək istəyən yerdə daha da ziyan vurdu.

**İstola satmaq** – məqam üçün hər bir alçaqlığa əl vurmaq.

Bişərəflər anasını istollara satdılar (185, №2).

**İş / çörək, buğda çıxıb ceyran dağına** - hər şey çox bahadı.

Söz çıxıb ceyran dalına,
Həsrət qalıb bir müqəyyəd qafiyənin vüsalına (167).

Pul əldə etmək üçün də işləmək lazımdır. Lakin iş hanı, iş çıxıb ceyran dağına (82).

**İşdə bişmək** – yəni həmkarlıq etmək, təcrübə qazanmaq.

İşləyib bu işdə, çoxdan bişmisən (338, səh 132).

**İş əyilsə ya yellə, ya ətəklə** - iş əyilsə ta neyləsən düzəlməz.

**İş xirtdəkdən aşıb**- həddən çox işi olmaq.

**İşi bitmək** – pis əməlin nəticəsində ağır bir cəzaya məhkum olmaq

Gücü çatmaz ki, bitirə işini, qıcıdıb hirslə ona dişini (A.Bakıxanov).

**İşi daşa düşmək** – işi düzəlməmək.

Çox xoş ikən nəhsə dönübdü işim,
Fələk işlərimi daşa salıbdı (35, s.470).
Namərd qərar verən yerdə,
Mərdin işi daşa düşər (294, s.49).





**İşi duman olmaq** - vəziyyəti aydın olmamaq, yaman günə düşmək.

**İşi fırıq** – işi müşkülə düşüb.

Bu il girməsə işlər fırıqdır (9, s.114).

**İşi ilmək düşmək** – işi çətinə düşmək.

Qızın hər bir işini tanrı salıbdır ilmək,
Onun hər rəncü-əzabına gərəkdir gülmək (72, c.III, s.238).

**İşıq ucu** – ümid.

Vəziyyət bir o qədər ümidsiz deyildi, işıq ucu vardı (91, s.25).

**İşıq üzü görmək** – ümumiyyətlə, hünər ərsəsində yaranmış bir əsərin xalqın ixtiyarında qoyulmasına deyilir.

Məndən soruşsalar ki, 1996-cı il bir ədəbiyyat adamı kimi sizə hansı sevincləri bəxş etdi, tərəddüd eləmədən deyərəm ki, Vaqif Səmədoğlunun yeni şerlər kitabının işıq üzü görməsini (342, səh. 97).

**İşim eşşək quyruğuna dönüb** - qurtarmaq bilmir.

İşim dönüb eşşək quyruğuna, nə uzanır, nə gödəlir (129, s.157).

**İşin başının əyilməsi** – işin kasad, pis olması.

**İşin düyün düşməsi** - kələfçənin başını itirmək, nəhayət uğursuzluq.

Fələk işlərimi salıb düyünə,
Kafir də düşməsin mən düşən günə (69).

**İş-işdən keçib** – fürsəti əldən vermişik.

Yoxsa iş-işdən keçəndən sonra bədən qartalır, ruh süstləşir, etiqad təğyir tapır. Nicata bir ümid yolu qalmır (195, c.II, s.126).

Vəli, yaxşı nə gərək edəsən. İndi ki, iş-işdən keçib, azərbaycanlılar demiş: „daldan atılan daş topuğa dəyər" (192, səh.293).

**İşin qulpundan yapışmaq** - kömək eləmək, əlbir olmaq, bir işlə məşğul olmaq.

Qıy vur qoşulsunlar,
Hərə bir işin qulpundan yapışsın

Tək əldən səs çıxmaz (266, s.309).

**İşi nəhsə düşmək** – işi düz gəlməmək.

Çox xoş ikən nəhsə düşübdü işim.

Fələk işlərimi daşa salıbdı (35, s.470).

**İşinə qarışmaq** – bir işə müdaxilə etmək.

Şeyx isə şah və sultanların ruhunu xarab edən bu qan-qadalı dünyanın işlərinə qarışmaq istəməyib (144, s.49).

**İşin püfü** - işin lap incə məqamı.

**İşi yaş olmaq** - vəziyyəti pis olmaq, pis işinin üstü açıldığına görə halının pisləşməsi.

Dutub afaqı məasi işimiz çox yaş olub,

Vaqeən gülməli işdir, hacılar əyyaş olub (168, s.221).

**İşi yaş** – vəziyyəti pisdi, pis işinin üstü açılıb.

İşləri yazdır qoymayın.

Lap danabaşdır, qoymayın (267, s.50).

**İşlər belə getsə, daş daş üstə qalmaz** - belə vəziyyət davam eləsə, ölkə, cəmiyyət qabağa getmək. Köhnə əsasda qurulan nizamı dağıtmağa çalışmaq.

«Ölülər» komediyasında müəllif yalnız mövhumat və cəhaləti deyil, köhnə cəmiyyətin sarsılmaqda olan ictimai əsaslarını, çürük əxlaq normalarını baltalayır, bir sözlə, daşı daş üstə qoymayır (Abbas Zamanov).

**İşlərin saz olması** – işlərin yaxşı getməsi, uğur, nailiyyət qazanmaq.

Sözüm bəyənilib, işim saz olub (13, səh. 30).

**İş mərrə başına gələndə** - sonunda, fürsət düşəndə.

Amma atanın meyli budur mərrə başında,

Evləndirə oğlun, onu da əlli yaşında (M.M. Etimad).

**İştah diş altındadır** – istəsən bir şeyi əldə edə bilərsən.

İştah diş altındadır (84, s.137).

**İt ağacı** - dəyərsiz, hörmətsiz, rüsvay, xalqın xoşu gəlməyən.

Xəlq içində olasan, it ağacı, pox kürəyi (168, səh. 924).

**İt ağzına düşmək** - arxasınca başqalarının danışması.





**İt aparan olsun** –başıma sadağa, könülsüz bir şeyi birinə vermək.

Ancaq bu Nazı o Qismətullah Kovxaya "it aparan olsun" deyə, azdan-çoxdan qismət olsa da, qalanı Şahquluya –köhnə şorgözə qismət olsun (253, s.333).

**İt araba kölgəsində yatır, elə bilir öz kölgəsidir/ it qaya kölgəsində yatar, elə bilər öz kölgəsidir** – bəzilərinə ətrafı, tanışları üçün hörmət qoyarlar, elə bilər ki, öz hünəridir.

Araba kölgəsində yatırsan, elə bilirsən öz kölgəndir? (129, s.256).

**İt aşı** – qarışıq durum.

Bu gün it aşı kimi qarışmış dünyada bir para qanmaz siyasi xadimlər belə düşünürlər ki, başların saxlamaq üçün gərək bir qoluzorbanın qoltuğu altına soxulsunlar.

**İt ayağı yemiş kimi gəzmək** - çox dolanmaq, yorulmamaq.

Amma budur üç gündür dərə-təpələri it ayağı yemiş kimi gəzirəm (129, s.79).

**İt baxandan baxa bilməz** - yəni bura girmək haqqı yoxdur.

Dəxi qoymaram baxa bir kəs itbaxandan (168, səh. 533).

**İt balasın yeyən kimi, yemək** – aldığı bir şeyi qaytarmamaq, danmaq. Ümumiyyətlə, bunu yetimlərin, adamsızların, yazıqların haqqını ayaqlar altında tapdayan adamlara, yalançı din xadimlərinə aid edirlər.

İt balasını yeyən kimi beytül-malı yeyənlərdən,

Uzunqulaq, cütayaqlı heyvanlardan yazacağam (224, s.8).

**İtcanlı** - hər əzaba dözən, sınmayan.

İnsan itcanlıdır, hər zəhmətə dözər (281, s.53).

**İt dəftərində adı yoxdu** – hörmətli adam deyil.

Get ədə, kimdi səni tanıyan, it dəftərində də adın yoxdu (9, s.174).

**İt də getdi, ip də getdi** – hər şeyi əldən getmək.

Çox danışsan, aparram komisara, onda it də gedər, ip də gedər (82, s.233).

**İtdən çox çarıq oğurlayan yoxdu, həmişə ayaqyalındı/ oğru qapısı quru olar-** əyriliklə varlı olmaq olmaz.

-Oğru itdir, arvad, itdən çox çarıq oğurlayan olmasa da, həmişə ayaqyalındır ki, ayaqyalın ( 253, s.257).

**İt döyən -** avara, işsiz.

Kəndin it döyənniyindən gəlib mənə burada mövhumat dərsi verirsən? (118, s.237).

**İtə bax, qarpız yeyir-** anqır tayını tap.

İtə bax, qarpız yeyir (129, S.162).

**İt əlindən çörək almaq -** çox yoxsul, kasıb.

Elə günə düşübsən ki, az qalırsan it yeyən çörəyin də parasını itin ağzından alıb yeyəsən (129, S.86).

**İt əlindən saqqız çeynəmək olmur** – hər hansı bir işə əl vursan, yüz adam ona şərik çıxar. Ətrafdakı adamların qorxusundan bir iş görmək olmur.

**İt hürər, karvan keçər/ yel qayadan nə aparar? -** boş, səviyyəsiz sözlərin heç bir təsiri olmaz.

Sən tarixdən gələn səsə səs ver, qoy düşmən bacardıqca qışqır- bağır salsın. Əməl xainlər ilə xadimləri daha gözəl surətdə tanıda bilər. Azərbaycanlıların möhkəm bir məsəli vardır: it hürər, karvan keçər (30, №12).

**İt günündə olmaq** – pis vəziyyətdə yaşamaq, pis durumda olmaq.

Uzanmış torpaq üstə it günündə (147, səh 15).

**İti açıb daşı bağlamaq -** birinə ağır şərait yaradaraq onun bütün yollarını bağlamaq.

**İti bibər** - diliacı, hamını özündən incidər adam.

**İti görən göz** – heç bir zadı gözdən qaçırmayan.

Ey əziz Azərbaycan. Sən bir iti görən gözsən ki, İran səninlə Qərb mədəniyyətinə baxır («Təcəddüd», 1920, № 24).

**İti qovan kimi** – hörmətsizlik edib birini qovmaq.

Heç nə əşi, iti qovan kimi qovdum (9, s.69).

**İt ilə qolboyun olmaq -** ...düşüncəsiz bir adamla yaxın münasibətdə olmaq.





**İt ilə ovduq çörək etmək -** pis adam ilə oturub durmaq, alış-veriş etmək.

**İt ilindən qalmaq -** lap çoxdan.

Əhmədin bu maşını da it ilindən qalıbdı (198).

**İti məscidən qovan kimi qovdu** – rüsvay edib qovmaq.

İti məscidən qovan kimi qovdu (129, S.418).

Qara polkovnik daşnak ermənilərı qabağına qatıb iti qovan kimi qovalayırdı.

**İtimin qurd dayısı** – lap uzaq bir qohum, tanış.

Birdən itimin qurd dayısı gəlsə səfərdən,

Biz eyləməsək bir quzu qurban, nə deyərlər (338, səh. 64)..

**İtin götünə düşən pox tapar -** pis adamın arxasınca düşən peşiman olar.

**İtin dişi, donuzun tükü** – ikisi də murdar adamdı.

Cəhənnəm olsun hamısı, özləri bilirlər itin dişi, donuzun tükü (72, c.III, s.118).

**İtin əbləhi qaysavadan pay umar** – qanmaz adam çox böyük istəklər dalınca gedər.

İtin əbləhi qaysavadan pay umar (335, s.123).

**İtin yanından xan kimi keç, xanın yanından it kimi** - itdən də qorxulu qanmaz ağalardır ki, onlara gərək boyun əyəsən.

**İt-itin ayağını basmaz** –qohum qohumunu, iş yoldaşı həmkarını özgələrin ayağına verməz.

Pirqulu fikir verib eşidir, bilirdi ki, "İt itin ayağını basmayan" kimi divanbəyi də öz gəlirinin, qazancının bərəksinə gedib oğru-əyrinin boynuna dolanmaz (253, s.327).

**İt itliyindən əl çəkər, sümsünməyindən əl çəkməz -** bir adam pis işə adət eləsə, yenə o cəhəti özündə saxlar.

**İt itliyindən əl çəkməz** –pis adam pisliyindən əl çəkməz.

- "İt öz itliyindən əl çəkməz" deyiblər ( 253, s.357).

**İtivə tök** – həddən artıq bir zadın ucuz və çox olması.

Cavad: «Bəs o boyda şəhərin dükanı yoxdur? Orda dükan itivə tök» (29, səh 36).

**İti vurursan çıxır şair üstünə** - şer yazan həddən ziyadə çoxdur.

Dur gör, iti vuranda çıxır şair üstünə (168, səh.288).

**İt kimi qovmaq** - təhqir eləmək, çöx hörmətsizliklə qovmaq.

Vallah, Sultana heç zad vermə, it kimi qov, getsinlər (195, c.II, s.8).

**İt kimi gəbərtmək** - qəddarlıqla öldürmək.

Cəllad təslim olmayıb *it kimi gəbərdiblər* onu (288, s.145).

**İt kimi yeyirlər** - paxıllıq etmək.

**İt kökünə düşmək** – pis vəziyyətə düşmək.

İt Pünhanın günündə,
Pünhan da it günündə.

**İt-qurd ağzına düşmək** – səviyyəsiz adamların dilinə düşmək.

İt-qurd ağzına düşmüş necə gör şairlik,
Hər gələn şair olubdur, baxınız ey həzərat (Qasir, s.11).

**İt qursağı yağ götürməz** – pis adam heç vaxt yaxşılığa qiymət verə bilməz.

Rəhim: Camaat Qabağın (it adıdır) şit yağ yeyib, gəbərməsindən göz bərəldə-bərəldə danışırlar.

Nəva: Camaat nə qanır belə niyyətləri. Deyərik ki, it qursağı yağ götürməz (29, səh. 10).

**İt quyruğu** – əyri, başqalarının xidmətində olan adam.

Gedib hər qapıda olmasan köpək, fikrin əyri olmaz, it quyruğu tək (Xaqani Şirvani).

**İtlə pişik kimi yola getmək** - daim dalaşmaq, yola getməmək.

Ağzında ayrım qızı deyirsən, necə keçinəcəyik, itlə pişik kimi (298, s.11).

**İtlər gəlib sallaqxana üstünə** – 1945-ci ildə Milli Hökumətin dağılmasında iştirak edən fars ordusunun və fars lümpenlərinin Azərbaycanda qan tökməsinə işarədir.

**İtlər oturub küçüklər hürür** - böyüklərin danışığına, ixtilafı zamanı cavan adamların qarışmasına deyilir.





**İt meyiti, xan bağında?** – uyğun olmayan bir şey.

Dünyamalı xan mırıldandı: "İt meyiti, xan bağında?" (253, s.425).

**İt ola, ət ola / axtardığın yar idi yetirdi pərvərdigar** – ürəyindən keçənə çatmaq.

İt ola, ət ola (103, s.73).

**İt otaran** - işsiz, avara.

**İt unu kimi dağıtmaq** – pərən-pərən salmaq.

Çox danışarlar hamısını it unu kimi dağıdar (129, s.414).

**İt yesə, gözü ağarar** - ağlagəlməyən bir söz demək.

Elə fikrə düşür, elə qələt eləyir ki, it yesə gözü ağarar (335, s.88).

**İt yiyəsin tanımamaq** – hərc-mərc olan yer, böyük-kiçik tanınmayan yer. Başsız, qarmaqarışıq yer.

Bu evdə it yiyəsini tanımır, nə vecinizə, kef apar:n, Allah sizə baxıbdır (335, s.87).

O zamanlar Bakı belə deyildi, küçələr, meydançalar, dava meydanına bənzəyirdi. Zorlular zorsuzlara qan uddururdu, it yiyəsini tanımırdı (254, s.18).

**İt yorğunu** - çox yorulmuş.

**İyi burnunda qalmaq** - şirnikmək.

Yoxsa çar jandarmlarına aid hərəkətlərin iyi burnundan getməyibdir? (298, s.108).

**İyini salmaq** – yəni məhəbbət yetirmək, sevmək.

İyini sənə salmışdı, atası-anası da sən idin (142, səh.65).

**İyirmi dörd əyar söz** – düzgün söz, sınaqdan, təcrübədən çıxan bir nəzər.

Xalis bir sözün var, iyirmi dörd əyar,
Hamı dayananda Təbriz başlayar (Məftun Əmini).

**İynə atsan yerə düşməz** – adam çox olan yer.

Dava təbili çalındı, meydana iynə atsaydın, görünərdi (46, s.14)

**İynə ilə gor/ qəbir qazmaq** - çox çətinliklə ruzi qazanmaq.

İynə ilə gör qaz, inşallah az keçər, əlin çörək qulağına çatar (129, s.97).

Ağamusa Nağıyev: «Atam-anam, qaranlıq yerin altında iynə ilə gor qaza-qaza mis axtarmaq karıma gəlməz» (297, səh. 100).

**İynə kimi incəlmək** – ağır vəziyyətdən bir dəri, bir sümük olmaq.

Bu nə işdir ki, bizi iynə kimi incəldib («Füzuli qəzəlləri», səh. 88).

**İynənin ucu qədər** - lap balaca, kiçik, gözə dəyməyən.

İynə ucu boyda işıq istədim,
Lampa əvəzinə yandı ürəyim (124).

**İynəsini yeyən çuvaldız siçar**– çox xəsis, zirək adam. Bir zadı ələ gətirməkdən ötrü ondan artıq zərər qoymağa məcbur olmaq. Elə adam haqqında işlənir ki, ona zor demək, haqqını yemək olmaz.

Biri bir iynəvi meyl etsə, çuvaldız sıçar (168, səh. 554).
Basarıq on tüməni yüz tümənə,
Yeyərsiz iynə, sıçarsuz təpənə (böyük iynə) (168, səh. 579).





# -K-

**Kabab iyinə getdim, gördüm eşşək dağlanır** - ümid olunan işin tərsinə cərəyan etməsi.

Biri kabab iyinə gəlmişdi, gəlib gördü ki, eşşək dağlayırlar (1, s.287-288).

**Kağızını vermək** - talağını vermək.

Güllü: kağızımı ver, kəbinim halal, canım azad (129).

**Kağız kimi** - ən gözəl, ağappaq, sifəti ağ adam.

Alay komandanı kağız kimi ağardı ( M.Hüseyn).

**Kalafa sümük olmaq** - çox arıqdı.

**Karın götünə badam ağacı soxdular, dedi: "nə səs gəlir?"** - bir mühitdə ola-ola o mühitdə baş verən hadisələrdən xəbərsiz qalmaq

**Kar quleybanı** - özünü anlamazlığa vuran.

**Kasa aşdan isti/** ölü yiyəsi kiridi, ölü yerinə gələn kirimədi.

Yəni kasa aşdan isti oldu? (72, c.III, s.103).

**Kasa kuzə kimin başında sındı?** - qovğanın axırında kim ziyan çəkəcək.

**Kasa rəqsi eləmək** - Azərbaycanın çətin rəqslərinin birinin adıdır. Çətin bir işə əl vurmaq.

**Kasıb axça tapdı, boxça tapmadı** – bir şeyi ələ gətirəndə onu saxlamaq üçün də gərək fikirləşəsən.

Fərəc, belə yerdə deyərlər, ə kasıb axça tapdı, boxça tapmadı (9, s.165).

**Kasıb əlində kükə təbərrikdi** - kasıblara təhqiramiz münasibətdən yaranmışdır.

**Kasıbı dəvə üstündə bövə sancar** - baxtsız adamın başına ağlagəlməyən bəlalar gələr.

**Kasıblığın xəmri ilə yoğrulmaq** – dünyaya göz açan zaman yoxsulluğa adət eləmək.

O bir kasıb ailədə doğuldu Kasıblığın xəmri ilə yoğruldu (30, № 2).

**Katda-katda danışmaq** - böyük-böyük danışmaq.
İndi iki il olar, Xudayar bəy Danabaşda katdalıq eləyir (195 ).
**Keçə börk** - qanmaz, gönü qalın.
**Keçəbörk nağılına döndərmək** – yəni kələk etmək, fırıldaq gəlmək.
Mədədin ölümünü Keçəbörk nağılına döndərib, generalın ayağına yazasan (142, s. 203).
**Keçəl ağa çox gözəl idi, vurdu çiçək çıxardı** – eybi, günahı çox olan bir adamın daha böyük günah etməsi. Adətən zahiri görünüşlə bağlı işlənir.
Həmid öz-özünə baxıb deyirdi: Keçəl ağa çox gözəl idi, vurdu çiçək də çıxartdı (1, s.375).
**Keçəl dərman bilsə, öz başına çəkər** – özünə əlac edə bilməyən adam başqasına nə edə bilər?
Davud lələ, ay rəhmətliyin oğlu, keçəl dərman bilsə öz başına çəkər (9, s.25).
**Keçəl həkim olsaydı, öz başına dərman edərdi-** boş-boş danışmaqla kar aşmaz.
Dedim: Mürşüdün də güzəranı sənin kimidir?
Dedi: O, yorğan-döşəkdə yatmır. Tulanbarda isti kürk üstündə oturur.
Dedim: Elə, öz yerini yaxşı tapıb. Keçəl həkim olsaydı, əvvəlcə öz başına çarə qılardı (201, səh. 223).
**Keçəl suya getməz** – məni aldada bilməzsiniz.
Pis kişi: Xeyir, ağa, keçəl suya getməz (9).
**Keçənə güzəşt deyərlər** – keçmiş günahı böyütmək düz deyil.
**Keçəni həvəngdə döymək-** ən faydasız bir işə əl qoymaq, xeyirli bir nəticə verməyən işi təqib etmək (332, səh. 170).
**Keçəsini ovmaq** - çox zərər vurmaq, əziyyət etmək.
**Keçi başı tutan** - faydasız iş görən.
**Keçi can hayında, qəssab piy axtarır** –hərə öz xeyrini güdür.





Əh, keçəl, keçi can hayında, qəssab da piy hayındadı (46, s.120).
Keçi can hayındadır, qəssab piy axtarır (335, s.283).
**Kül başuva ay Kür ki, üstündən Araz atlanır** - sən gör nə gündəsən ki, çox əskik adam səni təhqir edir.
Kül başuva ay Kür ki, üstündən Araz atlanır (72, c.III, s. 100).
**Keçidən xərmən döyən çıxmaz** – hər işin öz sahibi var, hər işi hər kəs görə bilməz.
**Keçinin qoturu bulağın gözündən su içər / armudun yaxşısını çaqqal yeyər**– ləyaqətsiz adamın iddiası böyük olar.
Keçinin qoturu bulağın gözündən su içər (335, s.275).
**Keçi su bulandırması** - ara qarışdırmaq.
Bir keçi su bulandırması eləyib onu lap tez öldürmək lazımdır (46, s.54).
**Keçmə namərd körpüsündən, qoy aparsın su səni** – namərd qabağında əyilmə.
Keçmə namərd körpüsündən, qoy aparsın su səni (**150).**
**Kef havasına danışmaq** – içkili olub ağzına gələni danışmaq.
Ana bəlkə mən kef havasına bu sözləri danışıram (195, c.II, s.32).
**Kefi ala buluddadır** – kefi kök.
İştirakçıların kefi ala buluddadır (9, s.13).
**Kefi durulmaq** – kefi kökəlmək.
Elə ki, saqi bir baş məclisi dolandı, keflər durulldu, başlar ayazıdı (174, s.110).
**Kefi kök** - vəziyyəti, əhvalı yaxşı.
İcalətən kefi kök saxla, çünki bayramdır,
Həna qoy əllərivə, bir bəzən, Məhəmmədəli (300, s.151).
Həmid oradan evə kefi kök qayıdanda, yolda Bakı sovetinin qabağından keçəndə onu çağırdılar (1, s.226).
**Kefim Mavərənnəhr havası çalır** – kefi çox kök olmaq.
Kefim Mavərənnəhr havası çalır (129, s.68).
**Kefinə soğan çırtmaq** - qanını qaraltmaq, kefini pozmaq.
İndi bu saat Allah qoysa, kefinə soğan çırtarlar (129, s.68).

**Kefin gələndə** - ürəyi istəyəndə.

Özü də minməli atdı yorğadı, kefin gələndə minərsən (195, c.II, s.133).

**Kefinin duru vaxtı** - kefi kök.

Padşahın kefinin duru vaxtı idi (103, s.144).

**Kəbə yıxmaq bir günah, könül yixmaq yüz qandı**- birinin qəlbinə dəymək olmaz.

**Kəbini boş olmaq** – keçmiş zamanda sənəd alan zaman adını deyən qadın, xurafat əsasında düşünülürmüş ki, ərinə naməhrəm olar.

**Kəbinləri göydə kəsilmək** - qız ilə oğlanı bir-birinə göbəkkəsmə edərdilər. İnama görə onların kəbinləri göydə kəsdilərdi.

**Kəc baxmaq** – pis gözlə baxmaq.

Qəlbi düz olanın evi hac olu,
Qonşuya kəc baxan özü ac olu (32, c.II, s.10).

**Kədəri boğmaq** - böyük bir dərdi olsa da zahirdə özünü sakit, soyuqqanlı göstərmək.

Müridlərinin gözlərində yaş parıldayanda da, o öz müqəddəs kədərini boğmadı (142, s.150).

**Kəfəni boğazına dolaşmaq** – ölümdən qorxmamaq.

Məhərrəmə indi hamı «böyük çekist» deyir. Ona görə yox ki, kəfəni boğazına dolayıb. Mirqəzəbin bəd niyyətini SSRI prokuroruna yazıb (142, səh. 213).

**Kəfəni müftə olsa düşər, ölər** – tamahkar.

**Kəfəni yırtmaq** - ölümdən qayıtmaq.

Bizim sağ-salamat qalmağımız kəfəni yırtıb çıxmaq kimidir (1, s.53).

**Kəklik kimi başını qara quylamaq** - hadisələrdən xəbəri olmamaq, saymamazlıq.

Mərkəz kəklik kimi başını qara quylamaqla xalqın ehsasatının üzərinə pərdə çəkmək istəyir (248, s.32).

**Kəklik səkdirmək** - oynatmaq, şadlıq eləmək.

Hələ qocalmamısan, qoy sənə ərus gələ, damad
Fərihləri hələ kəkliksayağı səkdirəcəksən (306, s.129).





Kəkliyim səkər gələr,
Dağ-daşı sökər gələr,
Eşitsə balaları gəlir,
Qəbrini sökər gələr (Hüseyn kişi).

**Kəkliyi azmaq** - özünü itirmək, nə etdiyini bilməmək, yolundan azmaq.

Mən dünyanın alçaq-ucasın görmüşəm az-maz.
Beş gün əlimə fürsət düşə, kəkliyim azmaz (168, s.745).

**Kəlağayısını yan bağlayan** -şücaətli, qorxmaz.

Həmin bu gün yurdumuzda.
Kəlağayısını yan bağlayan
Mərd analar başdan başa (234, s.192).

**Kəlbətinlə söz çəkmək** - qaradinməz adamı zorla danışdırmaq. Siyasi məhbuslarda təşkilatın sirrini saxlayanlar haqqında işlənir.

**Kələfçəsi qarışmaq** - işin çətinə düşməsi.

**Kələfçənin başını itirmək** – yəni işlərin çətinliyə, dolaşığa düşməsi.

İtirmişəm kələfçənin başını,
Tapammıram üzüyümün qaşını (306, səh. 164).

**Kəl/kər divardan qaçmaq** - yaman günləri, ağır işləri görüb yorulan adam.

**Kəllə dəbənək** - cürətli, qorxmaz və ağılsız adam.

**Kəllədən tut, ya tüstü çıxmaq** – dəli olmaq, əsəbiləşmək.

**Kəllə kəlləyə gəlmək** - üz-üzə gəlmək, münasibətlərin kəskinləşməsi.

**Kəlləni yerə qoymaq** - ölmək.

Ancaq onu fikir edirəm ki, bu gün kəlləmi yerə qoysam, taxti-tacıma kim sahib duracaq (46, s.93).

**Kəlləmsağı** - başı soyuq, məsuliyyətsiz.

**Kəllə suyu** – dadsız- duzsuz.

**Kəlmə kəsmək** – bir söz danışmamaq.

Əslində sən demə hələ qızla bircə kəlmə də kəsməmiş, həmsöhbət olmamış, ürəyini ona açmamış (110, səh. 9).

Bir öyrətdi, yüz öyrətdi,

Doğru dedi, düz öyrətdi,
Kəlmə kəsdi, söz öyrətdi
Ələsgəri doğan ana. (14, II).

**Kəm baxmaq** - pis gözlə baxmaq, məhəbbət göstərməmək.

Əziziyəm baxtı kəm,
Bağbanım yox bağ tikəm,
Mən fələyə neylədim,
Fələk mənə baxdı kəm? (33, s.68).

**Kəmərin altı boş olmaq** - ac olmaq, qarının boş olması.

**Kəmərin altını bərkitmək** - doyunca yemək.

**Kəmsiyini qırmaq** - böyük zərbə vurmaq.

**Kəndxudalıqdan dəm vurmaq** – əlindən bir iş gəlməyən adamın böyük arzularda olması.

Sənə möhtac olan bəndə əyər baş, qul olar, lakin,
Ona düşsə işin dərhal, vurar dəm kəndxudalıqdan (A.Bakıxanov).

**Kəndirin kəsmək** - xətərlə üzbəüz etmək, ölümlə üzbəüz etmək.

Hər yanda çadır qurdum,
Kəndirim kəsdi fələk! (148, s.24).

**Kəndi satdı, kətxuda oldu** - öz əli ilə özünü yaman günə saldı.

**Kəndlini kənddən çıxartmaq olar- amma kəndi kəndlidən çıxartmaq olmaz** - insanlar göz açıb böyüdükləri mühiti ömürlərinin sonuna qədər unuda bilmirlər.

**Kəngər yeyib, ləngər salmaq** - yəni bir yerə gedib, yeyib-içib, evini yada salmayan kəslər. Bir yerə gedib qayıtmaq bilməyən.

Gedib qürbətdə qalma, cani-madər,
Yeyib kəngər, əzizim, salma ləngər (147, s.188).
Hanı kəngər yeyib, ləngər salanlar (168, səh. 155).

**Kənkan quyunu hər nə qədər dərin qazsa, özünü içində görər** -bir adam ki həmişə başqalarına dolaşır, onların bədbəxtliyini axtarır, xoşbəxt ola bilməz.





**Kərə yeyən də yaza çıxar, tərə yeyən/ yağlı yeyən də yaza çıxır, yavan yeyən də** -

Hərə bir cür ömrünü başa yetirir, adam gərək heç kimə əyilməyə. Kərə, yağlı burada var-dövlət əlaməti, tərə, yavan isə yoxsulluq əlamətidir.

Hər qövm kərəylə tərənin bilməsə fərqin,
Aldansa adına, moduna Qərb ilə Şərqin (168, s.564).

**Kərki öz sapını kəsməz** - qoyun quzu ayağı basmaz /it itin ayağını basmaz.

**Kərməni dadıb alar** - hər şeyi yoxlamamış almayan, vasvası.

**Kərvaşan soxmaq** – çox ağır cəza vermək. Azərbaycanın güneyində kərvəşan – nazik-uzun ağaca deyilir.

**Kəsdirə bilməmək** - anlaya, qəti qərar verə bilməmək.

**Kəsdiyi çörəyi ayaqlamaq** - yaxşılığı yaddan çıxartmaq.

**Kəsək oturub daşın gününü ağlayır** - əlindən iş gəlməyən bir adam özündən çox bacarıqlı, varlı adama ürək yandırır.

**Kəsərdən düşmək** - nüfuzunu itirmək.

**Kəsik baş** -sevinc və şadlığı ürəkdən olmayan adam. İnanırlar ki, kəsik baş yerə düşəndən sonra öz qanına gülər.

**Kəsilə-kəsilə qalmaq** - çıxılmaz vəziyyətdə qalmaq.

Məktubu oxuduqda qanım başıma vurdu, kəsilə-kəsilə qaldım (232).

**Kəsilən barmağa duz vurmayan** –heç nəyə yaramayan.

Kəsilən barmağa duz vurmayan (85, s.109).

**Kəsilən başın zülfü üçün ağlamazlar – naxırı itirib alagöz dana dalınca ağlamaq** - böyük məsələni qoyub kiçik bir məsələ ilə məşğul olmaq.

Kəsilən başın zülfü üçün ağlamazlar (21).

**Kəsmək** - gözü düşmək, yoldan çıxartmaq istəmək.

Kobirlinskinin özü də bir balaca Vəcihədən kəsirdi (84, s.126).

**Kətxudanı gör, kəndi çap** - geri qalmış ölkələrdə həqiqi mənadadır. O yerin böyüyü ilə tanışlığın olsa, orada hər iş görə bilərsən.

**Kilimarası** - oyunbazlıq, baş tovlamaq.

Azərbaycanın cənubunda bu milli oyun şovinist siyasət nəticəsində aradan gedib, təkcə deyim şəklində işlənməkdədir.

**Kilkə süpürgə** - lazımsız bir şey, səliqəsiz, saçları daranmamış qız-qadın

Ana ilə uşaqlar əlbir olub işdən yorğun-arğın gələn dədəni kilkə süpürgə kimi qoydular otağın bir bucağına.

**Kilkə toyuq** - saçları pırtlaşıq adam.

Pırsıma, kilkə toyuq tək özünü lap-lap aç (223, s. 10).

**Kim deyə bilər ayağın yandı geri çək** - ərköyün, qudurğan.

Xorxahor nə qədər kefindir yat, bir adam da deyə bilməsin ki, ayağın yandı, geri çək (129, s.162).

**Kimə müsəlman dedik, yaxasından xaç çıxdı** - inandığımız adam etimadımızı doğrultmadı (Ə.Saraçlı).

**Kimi bəxtin narda sınar, kimi yarda** – biri dünya malına, biri mənəvi dəyərlərə meyl salır.

Bir adama qismət eləsin, deyir kimi baxtın narda sınar, kimi yarda..(9, s.173).

**Kimin toyuğuna kiş demişəm?** - kimə pislik eləmişəm?

**Kimin toyuğuna daş atmışıq?** – kimə əziyyət eləmişik?

Kimin toyuğuna daş atmışıq (29, səh. 214).

**Kim kimədir, zümzümədir**- hərə öz başının hayındadır.

**Kirli alın**-düşmən üzü.

Yolladığım qurşun ərməğan sənə,
O kirli alnını öpər bismillah (74).

**Kirli qafa** – pis fikirli.

Haydı, rədd ol buradan kirli qafa! (75, c.IV, s85).

**Kiprik qırpmamaq** – yata bilməmək, diqqətlə bir sözə qulaq asmaq.

**Kisədən getmək** - yaxşı bir işdən, gəlirdən məhrum qalmaq, bir işi təklif edən zaman, əgər biri boyun qaçırırsa, onda





ona deyərlər ki, «kisəndən gedər». Yəni belə bir iş bir daha ələ düşməz.

**Kisənin başın açıq qoymaq** - pulu həddən artıq xərcləmək, qədrini bilməmək, bir məqsədə çatmaq üçün pulu əsirgəməmək.

**Kişiliyi olmamaq** - qeyrəti, cəsarəti olmamaq.

Gördülər yoxdu beqeyrət kişilərdə kişilik
Qeyrət əl verdi ünasə ki çıxa meydanə (Zeynəb paşa).

**Kişinin köynəyi ağarıb** – kişi ikinci dəfə evlənmək fikrinə düşüb.

**Kişinin sözü bir olar** – adam sözünün üstündə durar.

Kişinin sözü bir olar (147, s.126).

**Kiş-kişlə donuz darıdan çıxmaz** – gücə gərək güclə cavab verəsən.

Özü də "kiş-kişlə donuz darıdan çıxmaz"- deyiblər. (253, s.270).

**Kiş-kişlər olsun** - uzaq olsun, allah eləməsin.

**Kişmişi gülmək** - yavaş-yavaş gülmək.

Bəxtəvər necə kişmişi gülür.

**Kitabdan-kitaba salmaq** – dini vəsilə qərar verib, xalqın malını yemək, xalqın başına börk qoymaq.

İnəyi itmiş birisi deyirdi, «Allah elə et ki, inəyim nə mollaya, nə seyidə rast gəlsin. Çünki molla tayfası kitabdan-kitaba salıb, halal eləyəcək və yeyəcək. Seyid olsa, lap pis. Deyəcək, ceddim göndərib» (19, səh. 12).

**Kitabı bağlanmaq** -- ömrü sona yetmək, ya birinin işdən çıxarılması.

1930-cu ilin dekabrında həkimdən ağzıbağlı bir məktub gəlmişdi. Həkim yazmışdı, xəstənin, yəni Cəlil Məmmədquluzadənin kitabı bağlanmışdır. O, iki aydan artıq yaşamaz (197, səh. 181).

**Kitab olmaq** - kötək yeməkdən kitab kimi nazik olmaq.

Nə mənə mütaliə eləyirsən? Mən ki burda bir zad görmürəm. Vurublar kitab olmuşam, özümü mütaliə edirəm (340, s.46).

**Kol-kosa əl atmaq** - naümid ola-ola yenə də nicata, qurtuluşa fikirləşmək.

Son nəfəsdə bir kırıxan ümid naümidlikdən duruxar. Birdən amma kol-kosa əl atar (204, s.60).

***Konsulun qızı dadar durub*** - mühüm bir işin baş verməsi, biri səbəbsiz şad olsa, tez çıraq yandırsa, buna etiraz edərək belə deyirlər.

**Kora gecə -gündüz birdi** - yaşayışı pis olan adam üçün, gəliri olmayan adam üçün fərq yoxdu.

**Korboz adam** - yaşından böyük görünən, qüvvətli.

**Kor eşşəyin kor nalbəndi** - özünə tay tapmaq.

Yadında bu sözü saxla əfəndi,
Olar kor eşşəyin kor da nalbəndi (168, s.7).

**Kor əlinə ağac vermək** - qanmaz adama bəhanə vermək.

**Kor getdi korxanaya** -öz ayağı ilə ölümə getdi.

**Kor-kora deyir: "cırtbəri gözüvə"/ kor kora kor deməsə bağrı çatlayar.**

Özünün də eybi ola-ola başqasının eybini üzünə vurur. Eybi kim çıxardar - eybəcər.

İki kor düçar oldular bir-birə,
Biri basdı yıxdı o birin yerə.
Sıxırdı boğazın, vururdu kötək,
Deyirdi: "dədən odlarım kor köpək!" ( Hidəçi).

**Korlar şəhrində ayna satmaq** - lazımsız bir işlə məşğul olmaq.

**Korluğuna görə şorgözlüyü də var** – yəni, əlsiz-ayaqsızlığına baxmayaraq, çox sırtıq, arvadbaz insandır.

**Korluq çəkmək** – ehtiyac çəkmək.

Nə lazımdı camaat bilsin ki, onların əli aşağıdı, korluq çəkirlər (1, s.164).

**Kor nə istər iki göz, biri əyri, biri düz** – istədiyim yar idi, yetirdi pərvərdigar.

Kor nə istər iki göz, biri əyri, biri düz (288, s.115).

**Kor ölər, adı qalar badamgöz** - bir adamı öləndən sonra şişirtmək.





**Kor peşiman-** gəldiyinə peşiman olmaq.

Anam kor-peşiman yenə Qazaxıstana qayıtdı (105, s.17).

Kor peşiman geri qayıdarmış (148, s.55).

**Kor şeytana lənət** –pis fikirdən daşındırmaq.

Kor şeytana deyib oldu Nəsirə yar,
Eylərdi Nəsir bu sözü hər bəzmdə təkrar (72, c.III, s.264).

**Kor tutduğunu buraxmaz** - bir adam öyrəşdiyi pis işi əldən verə bilməz.

Kor tutduğunu buraxmaz məsəli mocibincə, öz vəhşiyanə hərəkətlərini daha da şiddətləndirmək və xəlqi fişar altında qoymağı bizim *bitərəfanə nəsihətlərimizi* qəbul etməyə tərcih verdilər (288, s.392).

İnsan olan xəncər belinə taxmaz.
Amma heyf, kor tutduğun buraxmaz (306, s.34).

**Korun- korun yanmaq** – içəridən yanmaq.

Həsrət alovlanır neçə baxışda,
Ürək korun-korun yanır,
Göynəyir (167, s.120).

**Kor yuxu** - ətalət, qəflət yuxusu.

Çıraq yandır, ocaq qur,
Kor yuxudan birdə dur (H.Sahir).

**Kov-** hesab.

Lap ciddi, çünki sənin o sayaq məni yıxmağın kov deyil (1, s.168).

**Kovxanı gör, kəndi çap-** bir yerin başçısı ilə əlbir olub oranı soya bilərsən.

"Kovxanı gör, kəndi çap" məsəlini əzbərdən bilən əmiuşağını xatırladı ( 253, s.326).

**Köçün sürmək** – ömür sürmək, ömrü başa çatdırmaq.

O məşhur teleqramı vuran adam, köçünü sürüb, dünyadan getməsəydi... (142, səh. 144).

**Köhnə bazara təzə nırx qoymaq** – köhnə dəyərlərə hörmət etməmək, hər şeyi dəyişmək.

Bu təzə gəlin təzə nırx qoyanda köhnə bazara,
...Ana dözəmmədi (328, s.303).

Köhnə bazara təzə nırx qoymaq olmaz (9, s.17).

**Köhnə beyin** – qoca, yaşlanmış, mədəniyyət sahəsində zamanın istəyindən geri qalmaq.

Hələ sən köhnə beyinsən, hələ sözə quş eyləmirsən,
Savadın yoxdur, bu mətləbləri huş eləmirsən (168, səh. 270).

**Köhnə çuval** - həyat, dünya.

Ey şeyx, sual tərkini qıldın qıl,
Bu köhnə çuval tərkini qıldın qıl!

**Köhnə dağarcığı tumaş yerinə qoymaq** – gözdən pərdə asmaq.

Köhnə dağarcığı tumaş yerinə,
Aşıq Ələsgərə satma, heyifsən (32, c.II, s.17).

**Köhnə dağarcıq** – dərdə dəyməyən bir zad.

Köhnə dağarcığı tumaş yerinə,
Aşıq Ələsgərə satma, hayıfsan (14, səh. 206).

**Köhnə dərdin qövr eləməsi** – köhnə dərdin təzələnməsi.

Ax gözəl Azərbaycan vətənim, harda qalmısan? Böyük yazıçının ürəyində qövr etmiş köhnə dərdi idi (197).

**Köhnə hamam, köhnə tas** – yəni, əvvəlki zamanlar kimi qanunsuzluq.

Fəqət məəltəəssuf,
Köhnə hamam, köhnə tas.

Yaltaqçı məmurlar, rus konsullarının başmağını təmizləməklə məmuriyyət alan alçaqlar iş başından qovulmamışlar. Səhlidir. hələ bəlkə ən mühüm məmuriyyətlərə də göz dikmişlər (65, № 2).

**Köhnə xərmənləri sovurmaq** – köhnə işlərin, sözlərin, ənənələrin dalınca getmək.

Amma mən onu deyirəm ki, köhnə xərmənləri sovurmaqdansa, təzə sözləri ortaya qoymaq lazımdır (195, səh. 35).

**Köhnə küllük eşələmək/ köhnə palan içi tökmək**- lazımsız yerə köhnə haqq-hesabları təzələmək.

Kim isə hacının keçmişini qurdaladı, köhnə küllükləri eşələdi ( M.Cəlal).





**Köhnə qabala açmaq** - keçmişdə baş verən xətaları üzə çəkmək.

**Köhnə qapı həman daban/ köhnə hamamdı köhnə tas** - heç bir şey dəyişməyib.

Hə de görüm nə oldu bəs, ay balam iddiaların,
Tutmuş idi yeri, göyü nalələrin, nəvaların,
Köhnə qapı həman daban, mən deyən oldu, olmadı (267).

**Köhnə qurd** - təcrübəli adam, hiyləgər.

**Köhnə palan içi tökmək** – keçmişdə baş verən xoşagəlməz işləri yada salmaq.

Hampa Qüdrət, mən demədim ki, gələk burda köhnə palan içi tökək (77, səh. 17).

**Köhnə yaranın qövr eyləməsi** – dərdin təzələnməsi.

Köhnə yaranı qövr eylədi təzədən,
Təbib neştər vurdu yara dəyməmiş (32, c.II, s.12).

**Köhnə yaraya duz səpmək** - dərdini təzələmək.

Duz səpsən köhnə yarama,
Yaram gülsün, duzun gülsün (260, s.86).

**Kökdən kasıb, ya «sifr kasıb»** - əzəldən kasıb, ən yoxsul insan.

Qurbanidən (Təbrizin Eynalı ətəyində yer adı) üstə, hamısı kasıbdı,
Uşaqlarının başını bit-sirkə basıbdır,
Sübh hay düşürü kəbla İman özün asıbdı,
Hər dərdi-bəla gəlsə, dözər, bu bala məmbeh.

**Kökəlmisən su iç** - kökəlmək hirslənmək mənasındadır. Hirslənmisənsə, su sənin hirsini söndürər.

**Köksü gen** - ürəyi açıq, böyük qəlbli.

Dəniz kimi tükənməz, dəniz kimi köksü gen (Z.Xəlil, s.140).

**Kökünü qazmaq** - bir şeyin axırınadək yemək, birinin həyatını əlindən almaq

Dallarını salma, kökünü qazma,
Özgə baltasına sap olma, dayan (H.Düzgün).

**Kölgə salmaq** - işinin əhəmiyyətini azaltmaq, yoxsullardan himayə etmək.

Nə kütləvi surətdə edam edilmək və nə də rəhmsiz zülmə qəddarlığa məruz qalmaq azırbaycanlıları sarsıda bilmədi. Bu şanlı ölkənin yaralı sinəsi üzərində dar ağacları qurdular. Bu dar ağacları qızıl qana bələnmiş bu torpağın üstünə uzun kölgələr saldı (153, s.7).

Canım qurban ədalətli insana,
Adil olan kölgə salar hər yana (159, səh. 69).

**Kölgəsindən keçmək** – hesaba qoymamaq.

Var günündə gəlib yeyib içərlər,
Yox günündə qohum-qardaş yad olar (32, c.II, s.38).

**Kölgəsindən qorxmaq/ürkmək-** ürəksiz, çox qorxaq.

Falçı ağzına baxan, kölgəsindən qorxar ( 332, səh. 147).

**Kölgəsində yatmaq** – birinin yaltaqlığını etmək, birinin himayəsi ilə əli pula, çörəyə çatmaq.

Mənsəb üçün onun-bunun kölgəsində yatanlar,
Namusunu, vicdanını bir çörəyə satanlar (Mirzə).

**Kölgəsiylə danışmaq** – ruhi xəstəliyə düşmək, tənhalıq rəmzi.

Bilməyirdim, bir gün olar,
Öz kölgəsiylə danışar insan («Bir gün payızda», səh. 45).

**Kölgəsi uzanmaq-** qocalıb, divar başının günü.

Oğlum, mən bir batan günəm, gündüzdən- gündüzə kölgələri uzadıram (204, s 25).

**Kölgəsi üstündən əskik olmamaq-** himayəsində olmaq.

Allah-təala siz tək üləmanın sayəsini bizim üstümüzdən əskik eləməsin (195, c.II, s.35).

**Kölgəsiz** – xalqa fayda verməyən, xalqa acımayan.

Xalqa ağlamayan, xalqa gülməyən,
Kölgəsiz olandan nə zəhləm gedir (88, səh. 50).

**Kölgəsiz ağac-** heç kəsə xeyri dəyməyən.

Bənzisən bir ağaca meyvəsi yox, kölgəsi yox (168, s.846).





**Kömür kimi olmaq** – ümumiyyətlə, ətin və ya insanın lap yanmasını və ya dərman, zəhərlənmək nəticəsində kül olmasını kömürün qaralığına bənzədirlər.

Əranının ölüsünü əsləhəli iki polislə qəbristana apardılar. Anası oğlunun kömür kimi qaralmış ölüsünü tanıya bilmədi (30, № 27, səh.2).

**Kömür qazana deyir, götün qaradır** -öz eybini bilməyib başqasında eyib axtaran.

**Könlü balıq istəyənin quyruğu suda gərək** – bir iş görmək istəyən gərək çətinlikdən qorxmaya.

Könlü balıq istəyənin quyruğu suda gərək (335, s.123).

**Könlü bulanmaq** – qəm qaralmaq.

Könlüm bulanır küçədə cövlanını görcək,
Nitqim tutulur, hərzəvü-hədyanını görcək (267, s.31).

**Könlün açılması** – ürəyin şad olması.

Əl yaylığı açılmaz,
Saçaqları saçılmaz.
Bu mənim sınmış könlüm,
Yar görməsə, açılmaz (33, s.160).

**Könlü sıxılmaq** – yəni darıxmaq. həddən artıq pis fikirlərə məğlub olmaq.

Qoynunda yatıbdır gecənin, sübhün ümidi,
Bəxtin açılar, dan yeri tək könlümü sıxma (317, səh. 20).

**Könlün sınması/ sönməsi** -ürəyi qırılmaq.

Əl yaylığı açılmaz,
Saçaqları saçılmaz
Bu mənim sınmış könlüm,
Yar görməsə, açılmaz (33, s.160).

**Könlü sınıq** – ürəyi dağlı, ağır dərdli, əzizini itirmiş, vətənini əldən verən mənasında.

Bu dərədən çay gəldi,
Bahar gəldi, yay gəldi.
Sınıq könlüm gülməmiş,
Qarabağdan hay gəldi (38, səh. 34).

**Könlünü ovlamaq** - ürəyini ələ gətirmək.

**Könlü talan olmaq** - dərdin təzələnməsi.
Xəraba tək boşalıbsan,
Nədən oldun talan, könlüm (32, c.II, s.42).
**Könül almaq** - incitdiyi adamı razı salmaq.
Əlində yar alması,
Dutubdur yar alması,
Yaxşı olur yar könlün,
Yar yıxıb, yar alması (33, s.82).
Minlərcə şəhər, ya qala almaqdan, əmin ol
Bir sadə çoban könlünü almaq, daha məqbul! (75, c.IV, s.50).
Aşığam nəylən alım,
Əlifi beylən alım,
Küsdürüb yola saldım,
Könlünü nəylən alım? (33, S.138).
**Könül gözdən su içər** -birini görməsən sevgi ölər.
Bacısından çox az xatirəsi olduğuna görə, onun ayrılığına o qədər də ürəyi acımır, deyər məhəbbət gözdə olar (292, s.169).
**Könül qoymaq** – iradə etmək, razılıq vermək.
Gündə üç dəst libas olsa,
Könül qoysa, tikər (168, səh. 233).
**Könül təxti viran olmaq** – qəlbi qırılmaq.
Yəqindir səndən ayrı şahi-xuban,
Bu könlüm təxti viran oldu sənsiz (142, s.82).
**Könül tikmək** - ürəyin almaq, küsənləri barışdırmaq.
Məslək olam sınıq könül tikənə,
Onda şirin olar bu həyat mənə (273, s.3).
**Könülün pərvazlanması** – ruhun açılması.
Könül pərvazlandı yarı görməyə,
Qar kəsdi yolları, boran qoymadı (32, c.II, s.9).
**Könül vermək** –birinə aşiq olmaq.
Başımda nə füsun eylədin bilməm,
Bu gün sənə könül verməyə gəldim (165).
**Könül yaxmaq** – ürəyini qırmaq.





Şimşək kimi çaxdın da neçin könlümü yaxdın,
Bilməm, niyə getdin, niyə döndün, niyə baxdın! (75, c.IV, s.24).
**Könül yıxmaq** – birinin evini yıxmaq, ürəyinə dəymək.
Budur sözüm, sənə məndən əlamət,
Könül yıxma, bəli, eylə imarət (150, səh. 20).
Əlində yar alması,
Dutubdur yar alması,
Yaxşı olur yar könlün,
Yar yıxıb yar alması (33, s.82).
Kəbə yıxmaq bir günah,
Könül yıxmaq, min qandı.

Bir məclisə getməginən, orda dura bilməsən,
Bir könülü yıxmaginən, yıxıb hörə bilməsən.
**Köpəyin iyə düşəni tuladan yeyin olar** – tamahkar adam zirək olar.
Köpəyin iyə düşəni tuladan yeyin olar (335, s.118).
**Könəz adam** - bir sözünün üstündə dayanan, haqlı sözü qəbul etməyən.
**Köpü alınmaq** - qarşısı alınmaq, qüdrətdən salmaq.
Elin zəfər marşı hər gün çalınır,
Qudurmuş çayların köpü alınır (Vahid).
**Köpük kimi** - dəyərsiz.
**Köpük qusmaq** - acından köpük qusmaq, mədənin boş olması.
**Köpünü yum** -ağzını yum, danışma.
**Köpüyünü almaq** - qəzəbini azaltmaq, hirsini yatırtmaq.
Pişəvərinin inkaredilməz dəlilləri, Mircəfər Bağırovun köpüyünü alsa da, içindəki qəzəb odunu söndürə bilmir.
**Körpü altında dəlik tapıb** - bəhanə axtaran, fürsət gəzən.
**Kösövü tüstülü olmaq** - adı pisə çıxmaq, adı vayqanlı olmaq.
Bu sözü burda dedin, başqa yerdə demə.. Onsuz da kösövümüz tüstülüdür (M.Hüseyn).

**Kötük kimi arada durmaq** - əl-ayağı tutan yerdə duran, kara gəlməyən.

Nə kötük kimi durmusan, karsan nədir, get qapını aç (danışıqdan).

**Kötük üstə çox cüvürlər kəsilib** (çox küplər yanında küzələr sınıb)- yəni, çox qocalar yanında cavanlar həlak olub.

**Kötüyün üstündə od yandırmaq** - nəslini kəsərəm.

...Hər yandasan en gəl, kötüyünün üstündə od yandıraram, dədəvi belivə sanram, ey kafər (203).

**Köynək-köynək ət tökmək** - bərk utanmaq, xəcalət çəkmək.

**Köynəyi qaradan biçilən** – şanssız, qarabəxt, taleyi gətirməyən insan.

Araz sahilində ayrılıq günü,
Köynəyi qaradan biçilən mənəm (264, səh. 109).

**Közmələnən yaranı aşlandırmaq** - yaddan çıxan bir dərdi təzələmək.

İstəmirəm gözləri yaşlandıram,
Közmələnən yaranı aşlandıram (306, s.88).

**Küçələri ölçmək** - işsizlikdən xiyabanları gəzən.

**Küçənin canına düşmək** – avaralanmaq.

Genə bu dəli bambılılar nə düşüblər küçənin canına (195, c.II, s.155).

**Kükü dadı vermək** - çox dadlı, xoşa gələn.

**Kül altında od** – zahirdə sakit, əslində od-alov olmaq.

Kül altında yüz il qala od sönməz,
İgid ölürsə də, həqq yoldan dönməz ("Peyami no" Təbriz, ordebehişt, 1999).

**Kül başına** – qarğış mənasında, acıqla deyilən söz, başın yerə girsin.

Fətəli şahın nəvəsi Mücəlliddövlənin qızı İsmət də ingilislər tərəfindən İrana qoyulan şahın arvadı olmuşdur. Əbdülrza, Məhmudrza və Həmidrza onun uşaqları idi. Bu uşaqların dayələri Məşəd qadınlarından idi. Tacülmülk (Şəms, Məhəmmədrza, Əşrəf, Əlirzanın anası) onları göndərirmiş ki, o





birisi arvadı vursunlar. Onlar Rzaxanı gördükləri zaman, qorxub qaçırmışlar. Məhəmmədrzanın anası onlara deyirmiş ki, „qorxaqlar, Rzanın ki, qorxusu yoxdur, kül başına! (Fərdust, səh. 75).

**Kül edib göyə sovurmaq** -məhv eləmək, yoxa çıxarmaq.

Ata sərvətindən nə cür barına,
Bir gün də kül edib göyə sovura,
Nə də ki qat-qat artıra (284, s.311).
Alov tutub qovrulmuşuq,
Kül tək göyə sovrulmuşuq (226, №348, 2004).

**Küllük sərçəsi** -Kifir, baxımsız uşaq.

**Kül tək göyə sovurmaq** – hər şeyin yoxa çıxması, düşmən, zalım əli ilə talan edilməsi.

**Külünü göyə sovurmaq** – məhv eləmək.

O da odur ki, burjuyların külünü göyə sovurasan (148, s.118).

**Küp dibində yatmaq** -içki düşkünü, sərxoş.

Sən də mənim kimi dərs oxuyub qurtarandan sonra başlayacaqsan İskəndər dadaşın kimi küplərin dibində yatmaga (195, c.II, s.21).

**Küpə girən qarı** -hiyləgər, ara vuran, çoxbilmiş.

**Küpünü doldurmaq** - fürsətdən istifadə edib pul qazanmaq və ya fırıldaqla çoxlu var-dövlət ələ gətirmək.

**Kür adam** - xasiyyəti ağır, dalaşqan, hamıya pis nəzərlə baxan.

**Kürd çaldıqca börü çingənə oynar deyirlər** – hər kəs öz adamını tanıyır.

Kürd çaldıqca börü, çingənə oynar deyirlər.
Bu məsəldir ki, demiş Türkiyə iranlıları (267, s.287).

**Kürdoğlu küləyi** – bala, kiçik çillənin axır günlərində Kürdoğlu dəyirmana gedir. Çillənin axırıncı gecəsi qayıdan zaman küləyə düşüb qarın içinə yıxılır. Dədəsi deyir: Əgər gecə yarısına qədər ölməsə, daha ölməz.

Xalqın inamına görə, hər il bu gecə Kürdoğlu küləyi yağar. Cənubda yellə yağan qara külək deyilir.

**Kürək dil** -dili uzun, hər sözə hörmətsizliklə cavab qaytaran.

**Kürəkən küllükdədir?** - nə tələsik iş var ki?

**Kürəyə əl vurmaq** - birinin dabanını çəkmək, təhrik eləmək.

Milləti qəyur..deyə kürəyinə əl vurub dilini kəsirlər bir millətin (54, s.43).

**Kürkünə birə düşmək** - narahat olmaq, əl-ayağa düşmək, qorxmaq. Kürk qoyun dərisindən tikilən uzun qış geyimidir.

Bilmirəm bu kağızlarda nə yazılıb. Dünəndən kürkünə birə düşüb (302, s.31).

Mirzə, bu uşaq gəlibdir, indi mənim kürkümə birə düşüb (129, s.105).

Kişinin kürkünə birə doldura-doldura axırda dəli-divanə etməsinlər ( 253, s.257).

**Kürkə bit daraşmaq** – cocalmaq, əldən düşmək.

At qəmi, tut dəmi,
Öz varlığının qədrini bil
O qədər keçməz oğul,
Kürkümüzə bit daraşar (168, səh. 377).

**Kürlük** - dalaşqan, davakar, ağır xasiyyət.

Elə həmin gecə uşaq kürlük eləyir, ağlayır, özünü öldürür (84, s.457).

**Kürsü altından boğma çıxarmaq** - ürəyində olanı açıq deməmək.

Biz Tehranda hay-küy salan ağalara deyirik: əgər sizin doğrudan Azərbaycana ürəyiniz yanırsa, buyurun. Bu meydan, burada xalqın içərisində çalışıb öz fikrinizin doğru olduğunu isbat edin. Daldan boğma çıxarmağın mənası yoxdur (246, s.248).

**Kürt toyuq** - evdən çölə çıxmayan, başqaları ilə gəl-get etməyən.

**Kürt yatmaq** - tərpənmir, tənbəl.

**Kütbaş** - ağılsız, düşüncəsiz, gec başa düşən.

**Kütbaşlar** – ağılsızlar, savadsızlar.





Kütbaşlar deməsin ki, başa düşmürük səni (264, səh. 114).

**Kütbeyin** -səfeh, anlamaz.

Kütbeyin düşmən mağara axtarır gizlənməyə,
Hər biri olmuş odur quli-biyabamm mənim ("Rübailər aləmində", s.123).

**Küt getmək** - haldan düşmək.

Yorğunluqdan uşaqlar küt getdilər.

**Kütü kəsilmək** – çörəyi kəsilmək.

**Küy düşmək** -bu qəzet hər nömrə çıxandan sonra hay-küy düşüb müdiri gözdən itib dalda-bucaqda daldalanıb səs-küy yatandan sonra yenə işinə davam edərdi (191, "Adinə", 6 isfənd, 1980).

# -Q-

**Qabağa çəkmək** – hörmət qoymaq, irəli çəkmək.
El səni istəyib qabağa çəksə,
Ağır ol, alçağa düşmə dünyada (148, s.248).

**Qabağına ağac qoymaq** – manea törətmək.
Öz istədiyimi seçəcəyəm, kimin nə ixtiyarı var ki, mənim qabağıma ağac qoysun? (257, c.I, s.100).

**Qabal olmaq** - qabal fərş toxumaqda müşəxxəs bir miqdarın vahididir.
İş qabal olmasa, yatar fələ, kişi, xatircəm olma naəhlə (301, s.76).

**Qab dibi yalamaq** - əcnəbilərə vətəni satmaq, varlılara yaltaqlıq eləmək, özgələrin minnətli çörəyini yemək.
"Ədalət " firqəsi kəndləri mülkədarların qabının dibini yalayan onların xainanə məqsədlərinə xidmət edən kəndxuda və mübaşirlərdən xilas edib rəyasətin və hökumətin kəndlilərin özləri intixab etdiyi kənd şuralarına mühəvvəl edilməsini tələb edir (141, 21 noyabr, 1919, 33).
Bizim o qüdrətimiz yox çalaq, çapaq talayaq,
bizə müqəddər olubdur qab dibi yalayaq (168, s.3).
Şəl ola ingilisə qab yalayan,
Türkmənçay sənədin imzalayan (168, s.784).

**Qab dibi yalayan** - öz mənliyini itirən varlıq.
Təqlid və təkrar bizləri bacarıq və hünər sıralarından qırağa tullayıb, süfrə açan yox, bəlkə qabdibi yalayan... becərdibdir (314, səh. 25).

**Qabığında qurumuş** - yoxsul, yaman günə düşmüş.

**Qabıqdan çıxmaq** - zəhmət ilə yaşamaq, don əvəz etmək.
O xanımlar «qonaq» gəlib Nyu-Yorkdan, Londondan
İlan kimi çıxıb hər gün min qabıqdan, min dondan (263, səh. 356).
Borclarını verə bilməməkdən yana nə qədər cəfalar görsələr də biyara işləməkdən qabıqdan çıxsalar da, yeni





həyatlarından bir dərəcə məmnun idilər. Çünki "Krepostnaya prava" denilən əsarətdən xilas olmuşdular (65, №1, s.4, 1917).

**Qabına salmaq** - birinin yalan iddialarını rədd edib cavab vermək, yerində oturtmaq.
O, Milli hökumət ərəfəsində maarif vəziri olan Biriya şəm paylayanda məni görüncə dedi: deyəsən sən də şəm paylayırsan. Mən dedim, yox mənim nəzirim yoxdur. Sənin varsa, Allah qəbul eləsin. O, yollanandan sonra bir daha dönüb dedi: Saldın ha. Bir dənə mənim tələbim ("Biriyanın istintaqnaməsi").

**Qabırğası qalın** - söz əsər etməyən insan, sırtıq, gönüqalın adam.
O vədə ki, gəlin oldun, qabırğası qalın oldun (13, səh. 69).

**Qabırğasız** - arvadsız dolanmaq.
Norveç qəzetləri yazırlar ki, vəkil seçmək üçün qadınlar ixtiyar aldılar. Əgər ki, atamız Həzrəti Adəm övrəti öz qabırğası bilirdi və hər yerdə yanınca dolandırırdı. Amma bu iş bizim qeyrətimizə sığışmadı, dedik: Qabırğasız dolanmaq, kəç qabırqadan yaxşıdır (195, səh. 596).

**Qablamaq** - kimsənin avamlığından təcrübəsizliyindən istifadə edib ona dəyərsiz bir şeyi baha qiymətə satmaq.
Baxıllar müştərinin ağzına hesablıllar,
Tərəf görürlər ki, xamdı üçəlli qablıllar (168, s.234).

**Qaçanı qovan namərddir** - acizə zor demək kişilikdən deyil.

**Qaçanı tut, qalan malınızdı** - bir zaman hökumət tərəfindən köçərilər üçün vergi kağızı göndərilir. Savadsız köçərilər bu vergi kağızını o vaxt, yazıb-oxuya bilməyən bir adama aparırlar. Kağızı kəllə-baş tutaraq deyir: «Bu uzunlar odundur, yandıracaq üçündür, bu yumrular «yuvarlaq», qığdır, qoyun qığı, bu yastı yastılar da təzəkdir, sığır təzəyi. Hökumət sizdən bunları istəyir» Onlar da istənilən şeyləri yükləyib Kərkükdə hökumət evinə gedirlər. Hökumət adamları bunları həbsə alır. Zindan məmurları bunların nə qədər cahil olduqlarını bilməkdən ötəri, bir miqdar qara üzüm, bir az da qapa pıspısla qara böcək bunlara yemək üçün verirlər. Ac və yorğun

kəndçilər pıspısların yeriməyini görüncə deyirlər: «Qaçanı tut, qalan malımızdı». Əvvəlcə pıspısları yeyirlər. Məmurlar işi belə görüb, onları bağışlayırlar (158, səh. 83-84).

**Qadaxlı ağız** - sirr saxlayan.

Bağırmışam, boğulmuşam,
Elin qadaxlı ağzıyam ( N.Xiyavi, s.31).
Hər qayçının qadağını açanda,
Tiyələri ayrılıqda küt gördüm.
Köçən quşlar dəstə-dəstə uçanda,
Onların da ən azını cüt gördüm (292, s.340

**Qafın kəlləsi** - ən uca zirvə, ən çətin və əlçatmaz yer.

Qafın kəlləsində olsa məskənim,
Yaraşmır şənimə bəndəlik mənim (282, s.146).

**Qaqqapapaq** - təhqir əlaməti, söyüş.

Aşıq Ələsgər çox varlı və nüfuzlu bəyə «Haydı, qaqqapapaq» misrası ilə başlayan elə bir söyüş də demişdir (14, 1-ci cild, səh. 30).

**Qaqqıldamaq** - Azərbaycanın cənubunda tüfəngin və müsəlsəlin (avtomatın) səsinə deyilir.

Ata-bala danışarkən qaqqıldadı bir müsəlsəl.
Gənc igidin göz önündə yatdı yerə neçə heykəl (273, s.26).

**Qalan işə qar yağar** - işi vaxtında görmək lazımdır (148, s.37).

**Qalını/xalını öz xabına sığallarlar** - hər kəsin dilini taparlar.

**Qalsın palaz altında** - sirri açmamaq.

Baş tutardı çox yaxşı, tutmazdı qalardı palaz altında (335, s.61).

**Qəmişliyə keçmək** – əsl mətləbdən yayınmaq.

Burax görüm əmi, sən lap qəmışlığa keçdin,
Apar vur öz başına, bu yamaqlı torbanı (168, s.144).

**Qana çalxamaq** – özünü xətərə salmaq.

Özüvü xətərə salma, Allahı sevirsən, özünü qana çalxama, baban goru xatiri üçün, gizlən pərdənin dalısında (5, S.98).





**Qana çəkmək** - xarakter baxımından nəslə, ata-babaya oxşamaq.

**Qanad gərmək** - himayə eləmək, müdafiə etmək.

**Qanadı qırılmış** - ruhdan düşmüş.

Öksüzəm mən də, qırılmış qanadım,
Getmə mümkünsə... (75, c.IV, s.96).

**Qanadını qırmaq** – arzuları gözündə qalmaq.

Kərəm indi satın gəzir ölümü,
Fələk qırdı qanadımı, qolumu (35, s.530).

**Qanadının altına al** – himayə et.

Allah Petkanın atasına rəhmət eləsin, alıb səni qanadının altına (1, s.56).

**Qanadı sınmaq** - ruhdan düşmək, zərbə almaq.

Yoxsa sınmış qanadım dəydi sənin gül üzünə,
Bir toxunmaqla məyər inciyər insan, Qarabağ!
Arzumuz əl-ələ verməkdədir bir də sən ilən
Bağlayaq dostluğa, qardaşlığa peyman Qarabağ! ( Bəhmən Zamani).
Bu gözəl mənzərənin seyrinə dalmaz, baxmaz,
Kim bilir bəlkə də sınmış qanadı,
Bəlkə də qəlbində dərindir yarası (264).

**Qanadlı sözlər** - xalqın ürəyində iz qoyan, ümid verən söz.

**Qana düşmək** – xataya düşmək.

Boşasam qorxuram oğlanlarından,
Boşaya bilmirəm, qana düşmüşəm (32, s.15).

**Qan ağlamaq** – çox şikayətlənmək, iztirab çəkmək, hədsiz kədərli olmaq, yalandan özünü çox yoxsul göstərmək.

Ələsgərəm, qan ağladım,ölüncə şad olmadım,
Dostlarımla fələk mənə qara baxdı dünyada (32, s.31).
Heydərbaba dalınca qan ağladı,
Ancaq ayaq izlərini saxladı (328, s.87).
Mən burda qan ağlaram,
Sən orda gül gejələr.

Göycə və Qarabağ şivəsində «c» hərfinin yerini «j» əvəz edir (39, səh. 675).

**Qana qan etmək** - birindən intiqam almaq, əski zamanlarda hakim olan düşüncə əsasında, hər pisliyin cavabını pisliklə verməyə işarədir.

Edibdir bağrımı qan ləblərin, qoy bir içim qanın.
Bu başsız bir məmləkətdə qanıma qan etməyim, neynim? (289, səh. 36.

**Qan beyninə vurmaq** - qan beyninə çıxmaq, həddsiz dərəcədə əsəbiləşmək və fiziki mənada beyinə qan sızmaq.

Çünki baxacaq qeyzilə qənd tayına tacir,
Qanı çıxacaq beyninə, murdar olacaqdır (300, səh. 64).

Kərəm bunu eşidən kimi qan başına sıçradı (117, s.147).

İbrahimin isə qan beyninə vurdu və o, cilovsuz qəzəblə: Əmir Teymur əməl adamıdır, Şeyx! - dedi (144, s.112-113).

**Qancıqlanmaq** - pis zarafat etmək, sözünün yerini, oturub durmağını bilməmək.

**Qan çanağı** - davakar, çox əsəbi.

Çıxsam öldürəcəkdi, zalım oğlu qan çanağı idi, qan...(298, s.95).

Bir çanaq qandır, cında qızı,
Alışdı-yandı, yandı, cında qızı (92, səh. 359).

**Qan dağarcığı** - davakar, savaşqan, təhlükəli adam.

**Qan damazlığı** - davakar, söz gəzdirən, ara vuran.

**Qan əkmək** - düşmənçilik toxumu səpmək, hörmətsizlik etmək.

Həsrət çəkdin, ortalığa qan əkdin,
Qara nöqtə qoydun, ağ ürəyimdə (14, 1-ci cild, səh. 131).

**Qanı bonunda qalmaq** – birinin ölümünün günahını birində görmək.

Biz getdik qanı qaldı,
Kor yolun qanı qaldı,
Öldürdün sən Tənhayi
Boynunda qanı qaldı (33, S.69).

**Qanı dolmuş** – birini çox qəzəbləndirmək.





Su gedər yarğan eylər,
Bayqular yarğan eylər,
Gəl qayıt, qanı dolmuş
Eşidər yar, qan eylər (33, s.120).

**Qanı durulsun** – kefi durulmaq.

Öldür də, qanın bəlkə durulsun (75, c.IV, 53).

**Qan düşmək** – böyük bir dava- dalaş

Saçlarıma dən düşür, dən düşür, yaman düşür.
Hər baxanda anamın ürəyinə qan düşür (328, s.18).

**Qanı getmək** –hədə-qorxu.

Biz dünyadan gedən təki
Dünyanın qanı gedəcək (260, s.71).

**Qanı içəriyə getmək** -ağır vəziyyəti üzə gətirməmək. Millətin başı kəsilib, qanı içəri gedir.

**Qanı qan ilə yumazlar** - Türklər ictimai problemləri çözməyə dahiyanəliklə baxaraq bu ata sözlərini Avropa alimlərindən çox qabaq tarixdə səbt ediblər. Beləliklə, onlar bunu deyiblər ki, qatili qətlə yetirmək yeni bir cinayətə əl vurmaqdır.

Gözün qanlı yaşın tökmə ayağa,
Ey Şükuhi, sən müdara eylə çay ilə,
Yumazlar qan ilən qanı ( Şükühi, s.46).

**Qanıqara olmaq** - kefsiz, dilxor, hansısa bir pis olaydan bikefləmiş.

Qan tökmək qanunla yasaq olandan,
Qanları qaraltmaq dəb olub yaman (328, s.341

Gəlib mənim şikayətlərimi eşitdi, qanı qaraldı (1, s.224).

Cığatay qanıqara halda küçəyə çıxdı (269, səh. 172).

**Qanı qaynamaq** - coşmaq; doğma gəlmək.

Baxışından ismət yağır,
Gülüşündən rəhmət yağır.
Yerişindən qanlar qaynır,
Duruşundan izzət yağır (345, s.111).

Bayaqdan başıma dolanan bulut
Səni görən kimi qanım qaynadı (260, s.15).

Odur bax o qıza, bax o gəlinə,
Baxdıqca qaynayır insanın qanı (337, c.I, s.59).

**Qanı qiymətinə** - həddən artıq baha.

Heyf, kimdi anlayan ki, qan elə qanı qiymətinədi (84, s.75).

**Qanına boyanmaq** - qanına qəltan olmaq, ağır zərbədən ölümcül hala düşmək.

O ölkə ki, xalq qanına boyana,
Lənət olsun, onun başın qoyana (353, səh. 57).

**Qanına qəltan olmaq** - qanını tökmək, bıçaqla vurmaq..

Qərb demokratiyasının nümunəsi isə, Abadan fəhlələrinin əhval və vəziyyətidir ki, orada fəhləlləri öz qanlarına qəltan edirlər ( "Rəhbər", №776).

**Qanında donuz qanı var** - soyuğa dözümlü, üşüməyən.

İslami düşüncələr və mövhumat əsasına görə donuz əti yeyən kişinin nə qeyrəti olur nə də soyuq başa düşür.

**Qanına susamaq** - öldürməyə hazır olmaq.

El bu yandan susayıblar füqəranın qanına,
Zəlzələ, zəlzələ saldı dirili ərkanına (168, s.922).

25 il əvvəl mənim qanıma susamışdı, ondan qabaq da əliqanlı idi (1, s.289).

**Qanına yerikləmək** – birinin ölümünü istəmək, öldürmək fikrində olmaq

Amma vallah, fürsət tapsan, sən də haman müsəlman qanına yerikləyən ermənilərin birisən (195, c.II, s. 105).

**Qanını başa salmaq** - birinə şər yaxmaq, birini əziyyətə salmaq.

Bəs ki bizi həlim görür, başımıza qanın salır (69, s.121).

**Qanı birinin başına salmaq** - günahı kiminsə üzərinə yıxmaq.

**Qanını şüşəyə tutmaq** - zülm eləmək, birinin həmişə kölgəsini qılınclamaq. Məhəmməd şah və Nəsrəddinşah zamanlarında Allahyar xan Təbrizin qeyrətli və məşhur lotularından idi. Tehrandan göndərilən Rəcəbəli darğa xalqın qanını şüşəyə





tutur, bir gün Allahyar xan bazarda olan dalanına gedib onu öldürür. O vaxtdan oranın adı Qanlı dalan olur.

Qanını şişəyə tutdu fələk o tiflilərin,
Ac qalıb, qaçdı uşaqlar dodağından qanı (S.Ə.Şirvani, s.73).

**Qanı su yerinə axıtmaq** – çox qan tökmək.

Savaşırdı, vuruşurdu, qanı su yerinə axıdardı (148, s.65).

**Qanı yol verməк** - insafı götürməmək.

**Qanım tərs işləyir** - hirslənmək, əsəbiləşmək.

**Qan iyi gəlmək** -- təhlükəli, qorxulu.

Deyirsən: sən Allah, əlimi öpmə,
Əlindən deyəsən qan iyi gəlir (260, s.50).

**Qan kimi** - gün qabağında isinmiş suya, ən yetişmiş qarpıza deyilir.

**Qarıqal otlasa da dəvə ağızlı olmayıb** - hələ əlindən bir iş gəlir.

**Qan-qan demək** - dava-dalaş salmağa çalışmaq, ona şərait yaratmaq.

Cəllad tək gözün necə qan-qan deyir gözümə,
Əzbəs ki, qan içib nə qədər içsə qanmırı (147).
Desə də tufan qan-qan,
Çəkinmə qaranlıqdan (353, s.52).

**Qanı qaralmaq** - kefi pozulmaq, yeni şeyləri qəbul etmək istəməmək.

Cahanda var hələ qəlbi qaralar,
Ki hər bir tazədən qanı qaralar.

**Qanlı canlı olmaq** - sağlam və güclü olmaq.

**Qanlı-qadalı** – ölüm-itimli, təhlükəli.

Sizi öz əlimlə bir yana çıxarmağa ömrüm çatmayacaq, qələbə şərbətini mənsiz içəcəksiniz (144, s.150).

Həyat suyu axır bal dodağından,
Baxışları qanlı- qadalı qızlar (234, s.426).

**Qanlı teatr** - bir facia yaratmaq, bir millətin torpağını işğal etmək üçün müxtəlif hiylələrə əl vurmaq.

Birinci səbəb erməni daşnaklarının müstəbid bir üsul-idarə təşkil etdiyidir ki, Qafqazda bir taqım qanlı teatrlar oynadı (233, s.2-3).

**Qan ocağı** – hər addımda dava salan adam.

Doğrudan da bu oğru əmiuşağının ocağı, deyilənlərə görə, həmişə qan ocağı olubdur (253, s.281).

**Qan oldu?** – nə oldu, böyük bir xəta olub?

Bənd oldu könül bir gülə, səs tutdu mahalı,
Guya ki, bu dünyada qan oldu, qada düşdü (72, c.III, s.188).

**Qan salmaq** – böyük dava-dalaş salmaq.

Bir belə can alan olmaz,
Bir belə qan salan olmaz (148, s.34).
Mümkün isə cəhd eyləyir salmağa,
Ortaya qan bir, iki, üç kərə (72, c.III, s.268).

**Qansız** - insafsız, mərhəmətsiz, şərəfsiz, qeyrətsiz, nənəsinin əmcəyin kəsən.

«Təki biz uşaqlarımızı, hərəmlərimizi həlak olma burulğanından qurtaraq, imkansızlar qalıb, düşmən əsiri olsunlar» - xəyal edən qansızlar özlərinə insan və islam adı verməkdən əslən çəkinmirlər (232, səh. 32).

**Qan-tər içində olmaq** - zəhmətlə çörək pulu qazanıb yorulmaq.

Lakin od içində zəhmət çəkənlər
İsti gün altında qan-tökənlər (77, səh. 7).

**Qan uddurmaq** – zülm etmək.

Bu qılınc ilə sən bəylərə, paşalara qan udduracaqsan (174, s.11).

**Qan yatırmaq** - sülh yaratmaq.

İgid odur qan yatıra, iş düzə
Hər qovğaya qarışmağın yəni nə? (Şair Məhəmməd, s.43).

**Qapan it dişini göstərməz** - bir iş görmək istəyən adam boş hay-küy salmaz

**Qapaz altı** – əl buyruqçusu.





Bağır bəyəm göydən qızıl zənbillə düşüb, hamımızın qapaz altısı deyildi? (9, s.177).

**Qapazı başına vurmaq** - əlsiz-ayaqsız.

Vur qapazı başına, al çörəyi əlindən. Adını da qoyublar, Fağır Bağır (9, s.127).

**Qapı dalına düşmək** - pulsuzluqdan, utanmaqdan evə və ya başqa lazım olan yerə getməmək.

Məsrəf çoxaldı, boşladıq Təbrizi həm, Tehranı həm,
Düşdük qapı daldasına, çıxdıq vətəndən ba dideyi-tər (301).

**Qapı dalında qalmaq** - bir pis əməldən və ya yoxsulluğun ucbatından birinin evinə getməyə üzü olmamaq.

Münəvvər – Oğul, Allah başını qarışdırmasın. Nə olub? Yeddi yetimlə qapı dalında qalmamısan ki? (77, səh. 16).

**Qapıdan keçməzin adını qoyarlar Xırdaxanım** - zahiri ilə batini, adı ilə özü, rəftarı uyğun gəlməyən adam haqqında işlənir.

**Qapını almaq** - qocalıq, qış, düşmən qapını alıb, qalib gəlib.

Ay qış, qıçın sınaydı,
Gəldin qapını aldın.
Ay qar üzün qaralsın,
Xalqı bəlaya saldın (Ə.Əmirxizi, əlyazma).

**Qapın vurulsun** – evin yıxılsın, yaman günə düşəsən.

Dünya yolların yorulsun,
Suların axsın durulsun,
Ev yıxan, qapın vurulsun,
Bu qapıya gəlin gəlməz (260, s.98).

**Qapısının dabanını çıxartmaq** – çox gəlib-getmək.

Day elçilər qapımızın dabanını çıxartmışdılar (9, s.169).

**Qapmaq** - kobud cavab vermək, nifrət göstərmək.

**Qara atın gümüş nalı əskik idi** /düzəlib hər yarağım, qalıb saqqal darağım
Qara atın gümüş nalı əskik idi (103, s.69).

**Qara baxmaq** – kəc baxmaq, taleyi kəm olmaq.

Ələsgərəm, qan ağladım, ölüncə şad olmadım,
Dostlarımla fələk mənə qara baxdı dünyada (32, s.31).

**Qara baxt** - talesiz, böyük bir kədərə, dərdə tuş olmaq, işləri gətirməmək.

Əzizi, qara baxtım,
Açılmaz qara baxtım,
Ölübdü Əkbər oğlum
Yatıbdı qara baxtım (33, s.102).
Ağ köynəyi düymə düymə açıldı
Qara baxtın kim bağladı bu qızın (260, s.90).

**Qarabaxt dağlara çıxsa, dağları duman alar** - talesiz adam hər yerdə talesizdi.

**Qarabaqara** - addım addım izləmək.

**Qara bardaq sındırmaq** - qədim ənənələrə görə, xoşagəlməz insanın ardınca bir qara bardaq sındırıb, onun əksinə xoşagələn qonaq üçün arxasınca su atardılar.

Yamanın dalınca qızım, hər zaman,
Rəsmdir çalınar, bir qara bardaq (57, səh. 51).

**Qara basmaq** – qorxulu yuxu görmək.

Nədi bu gördüyüm xiyaldı belə,
Qara basmış məni, nə haldı belə ( Səlmaslı Mahmud).

**Qarabaş** – qulluqçu.

Nola bir evdə qoyaydız qarabaş,
Verməyəydiz məni bu əbləhə kaş (267, s.181).

**Qara bayram** – təzə ölüsü ölənlərin Novruza bir çərşənbə qalmış tutduqları mərasim. Təbrizdə bu bayramda qəhvə verirlər.

**Qaraboğaz** - qaraxəbər, pisniyyətli insan.

Tamah daşdı, qəzəb coşdu get-gedə.
Ömrü boyu qaraboğaz, bədxəbər (48, səh.15).

**Qara çadırda qırmızı yamaq** - iki müxtəlif xarakterli adamın evlənməsi.

**Qara çalı kimi** -manee yaradan, aranı kəsən.

**Qaraçı** – hay- küyçü, qışqır- bağır salan.





**Qaraçı çalır, qurd oynur** - qarmaqarışıq bir yığva, hər şeyin bir-birinə qarışması.

**Qaraçı inəyi** - hər cür istifadə eləmək.

Qaraçılar inəkdən hər cür istifadə edərlər, həm yük daşıyar, həm cinsi əlaqədə olar, həm də sağarlar.

**Qaraçı köçü** - qatmaqarışıq olan vəziyyətdə səfərə çıxmaq.

Onların ancaq kiçik bir otaqları var idi. Qaraçı köçü kimi birtəhər şüşəbənddə yerləşdik (197, s.143).

**Qaraçı qaraçıya öpüş verməz/ çıraq öz dibinə kölgə salmaz** - özünə, öz ailəsinə, millətinə xeyir verməyən.

**Qaraçuxa** - inanca görə, hər bir insan dünyaya gələndə onunla bərabər ömrünün sonuna qədər onu qoruyan, kölgə kimi onu izləyən bir məfhum da mövcud olur. Urmiya Federal Hökumətində (1196-1213) ordunun lap savaşan, döyüşkən hissəsinə Qaraçuxa deyirdilər.

Ömrümün qaraçuxası idin,
Ömrümün qaraçuxası.
Səni küçə-küçə gəzdirərdim özümlə şəhər-şəhər (Lalə Cavanşir, 258 ).

**Qaraçuxam yatıb** - yəni şansım, iqbalım, naxışım məndən üz döndəribdir.

Arzum karvanı batdı, Qaraçuxam yaman yatdı (331, səh. 110. № 94-95)..

**Qara daban** - ayağı ağır, bəd uğur.

**Qara dağ çəkmək** – Türklərdə qara böyük, qüdrətli mənasındadır.

Aşığam Qaradağı,
Gənconi Qaradağı,
Sinəmin üstə çəkdin
Əlif tək qara dağı (33, s.122).

**Qaradağ qədəri malın olsa, nəsibindən artıq yeyə bilməzsən** – yəni bir adamın varı nə qədər çox olursa-olsun, taleyi özündən asılı deyil.

**Qara dalaq etmək** - ayaqdan salmaq, yormaq.

Quyruq doğmasından sonra Savalana çıxmazlar, yayın 45-indən sonra Süreyya, Pərvin xuşəsi göydə quyruq kimi görsənir. Havalar soyumağa doğru gedir. Ellər yaylaqdan qışlağa qayıdır. Bu ulduza Elqovan, Şamtərzi, Karvanqıran, Quyruqdondu da deyərlər.

**Qara daş atmaq** - qədim ənənələrə görə, düşmənin bir daha gəlməməsini istəmək üçün, onun dalısınca qara daş və ya qara duvaq atırdılar.

**Qara daş** - türklərdə və bəluclarda uğursuzluq əlamətidir.

Qabağında neçə cəllad düzülüb,
Qəlbləri bir qara daşdan da betər,
Yoxdur insafdan əsər (82, səh. 165)

**Qara daşı yastıq etmək** - çətin günə düşmək, ev-eşikdən əl çəkib çöldə yatmaq.

Yar yolunda verdim başı,
Yastıq etdim qara daşı.

**Qara dəstələr** – xarici düşmənlərin və ya milli azadlığa mane törədənlərin əlinin çomağı.

Qara dəstələr təşəkkülündə müttəhim olan sabiq poçt və teleqraf vəziri Müxbirül-səltənə ingilis səfarətxanasına qaçıb gizlənib (257, c.I, s.392).

**Qaradinməz** - danışmayan, qaş-qabaqlı.

Onun xasiyyətindən dilgir idi, bunlar ikilikdə danışmağa söz tapmırdılar ( 62, s.210)

**Qara doğramaq** - mövhum xətərlər ilə birini bir işdən və ya qərarından çevirmək.

**Qara eşşək başına cilov vursan, qatır olmaz** - hər adamın özünün bir çıxarı var. Onu paltarla dəyişmək olmaz.

**Qara əmcək** - uşağı diri qalmayan.

**Qaragün** - yaman gün, ağrılı gün, faciəli bir gün.

Mən qaragün, ağ günlərə çıxanda,
Vurar qara gözlərimə, ağ gələr (349, səh.22).

**Qara günlü** – talesiz, zülm çəkən.

Fələkdən gileyliyəm, mənə günü qara verib,





Möminі zəlil edib, suru günahkara verib (32, s.33).

**Qara günün sıxması** - yoxsulluqdan, işin uğursuzluğundan qol-qanadın sınması.

Qar getməsə, yerdən çiçək çıxammaz,
Heç məngənə qara gün tək sıxammaz ( Səhaf).

**Qara gününü qablamaq / qabqarmaq** – bir bədbəxtliyin gəlməsinə hazırlaşmaq,

-Qara günü qablaşdır, Çopur Abdulla, pələng Rzaqulu qənimindir (1, s.13).

Ölsə məşdi Haşim, qara günün qablar,
Görməzsən onu bir də güləndə Məmmədəli (301, s.102).

**Qarağac kimi qabıq qoymaq** – çox işləyib günün altında yanmaq.

İşləməkdən qarağac kimi qabıq qoyuruq, ayda bir tula payı da muzd almırıq (148, s.116).

**Qara xəbər** - bəd xəbər, bir insanın ölüm xəbəri.

Ali bir insan, dahi ədib vəfat elədi,
Ah, ah, nə qara xəbər (165, səh. 213.)

**Qara kağız** - bəd xəbər, birinin matəmi, qara xəbəri.

Ümmanlar qədərdir kədərin sənin,
Yeddi qara kağız, yeddi bəd xəbər (48, səh. 86).

**Qarakasa** - uğursuz, xəsis.

**Qara kölgə** - lümpən, başqalarının qazancına yeyib-içən, müftə yeyən. Qara kölgələrin hərəkətləri müxtəlif olsa da, məqsədləri birdir. Sairələrin vaxtını zay etmək, özgələrin bədbəxt və pis vəziyyətlərindən məmnun və xoşhal olurlar (65, №3, səh. 9-10. 1917).

**Qaraqabaq** - deyib-gülməyən, özü özü ilə danışan.

Dostlar mənə qaraqabaq deməyin
Mən gülürəm, ürək gülmür neyləyim? (285, s.42).
Yox, o yaman qaraqabaqdır (9, s.21).

**Qara qarğa** - arıq və uzun adam.

**Qara qeyd (qayğı) canını alıb** - çox narahat olmaq, acı bir xəbər, hadisə gözləmək.

**Qaraqışqırıq salmaq** - həyasızlıq etmək, yersiz qışqırıb-bağırmaq.

Bu nədir, nə qara-qışqırıq salmısan? (269, səh. 277).

**Qara qızın dərdi varmış** – birinin gizli sözünün məlum olması.

Qara qızın dərdi varmış, az (ay qız), səni kimdi alan? (9, s.155).

**Qara qorxu gəlmək** - qaş göz, yaxud danışmaqla birini qorxutmaq.

Bütün günahkarlar içində tək mən
Dayanıb duraram qara qorxusuz ( Vazeh, "Nəğmələr", s.42).

**Qara quyruq** - İran -İraq savaşında işsizlik və bahalıq xalqı məcbur eləmişdi ki, bir tikə çörək tapmaq üçün bir neçə yerdə çalışsınlar, şəxsi maşınlarından da taksi kimi istifadə etsinlər.

Təbriz valisinin göstərişi ilə şəxsi maşınlardan taksi kimi istifadə edənlər məcbur olurlar maşınlarının gil-gillərini qara boyamaqla bir az benzin alsınlar. Bu deyim o zaman yaranıb.

**Qara ləçəyə xanım dedik, gəldi başımıza bəla oldu** - qanmaz adama hörmət elədik, başımıza bəla oldu. İndi bizi bəyənmir.

**Qara ləkə ağ ləkəni *basmasın*** -gün bulud altında qalmasın, həqiqət unudulmasın.

Bəli, işin əsl həqiqəti budur ki, qara ləkə ağ ləkəni basmasın (195, c.II, s.126).

**Qaramal** - xəlqin ənənəsinə hörmət qoymayan, dilsiz-ağızsız.

**Qara *maşında eninə* aparmaq** – ölünü- basdırmağa aparmaq.

Zindan rəsi: əvvəl *deyərlər, yoldaşlarıvı de,* səni bağışlarıq, adamdan etiraf alandan sonra onu qara maşında eninə apararlar ( Tə

**Qaranquşcan ömrü qalmayıb** - ölməyinə az qalıb.





A qız, axmaq olma, xanım qaranquşcan ömrü qalmayıb (335, s.308).

brizin zindan rəisi Hacı Həsən).

**Qaranlıq yerə daş atmaq** - xəbəri olmadan gümanla danışmaq.

**Qaranlıq quyuya daş atmaq** - fikirləşməyib iş görən, ölçməyib- biçən.

Leyk qaranlıq yerə daş atdılar,
Doğrusu bunlar dəxi bədzatdılar (267, s.129).

**Qara nöqtə qoymaq** - birisinin ürəyinə dəymək, ürək sındırmaq mənasındadır.

Həsrət çəkdin, ortalığa qan əkdin,
Qara nöqtə qoydun, ağ ürəyimdə (14, 1-ci cild, səh. 131).

**Qara palaz yumaqla ağarmaz** - yoldan çıxmış, heç bir qayda-qanuna boyun əyməyən adamı yola gətirmək olmaz.

**Qara pula dəyməz** – heç nəyə yaramaz.

Sən deyilsənmi tutan acizi-miskin əlini?
Yoxluğundur o fəqirə qəmü-nikbət, qara pul! (257, c.I, s.27).

Koroğlu: indi namərd dünyası, bic əyyamıdır. Bundan sonra igidlik bir qara pula dəyməz. Mən bu gündən Koroğluluğu yerə qoyuram (174, s.314).

**Qara salxım ağ olmaz** – bir şeyin əsli əvəz olmaz.

Xurmatuda bağ olmaz,
Qara salxım ağ olmaz (24, s.154).

**Qara sevda mələyi**- əzab mələikəsi.

O yağmurlu axşamda pəncərədən baxan qız,
Qara sevda mələyiydi, görmədi (208, s.75).

**Qarasına deyinmək** - arxasınca danışmaq.

Ağabacı ürəyində bu sözləri deyə-deyə, yoğun səsli qızın qarasına deyinə-deyinə çayniyi elə hirslə samavarın dəmkeşinə basdı ki su tökülüb baş barmağını yandırdı (84, s.277).

**Qarasınca söylənmək** - arxasınca narazılıq eləmək.

A Zalxa, sənsən, kim ilə gap eləyirəm? Tarverdinin qarasınca söylənirəm (5, s.51).

**Qara sudan qaymaq tutmaq** -bacarıqlı, xəsis, əlli-ayaqlı, kara gəlməyən bir zaddan bəhrələnmək.

Tutar səliqəli aşpaz qara sudan qaymaq,
Səliqəsiz gözəl ətdən kabab salar doğanaq (168, səh. 228).

**Qara tale** – bütün qapılar üzünə bağlı olan.

Qara tale, mənə az uddur qəm, ey dönük bəxt, mənə etmə sitəm (80, c.II, s.43).

**Qaratikan koluna dönmək** - iki sevəni ayırmaq.

Bu deyim əslini "Əsli və Kərəm" dastanından almışdır. Dastana görə, Əsli və Kərəm öldükdən sonra hərəsinin qəbrindən bir qızılgül baş qaldırır, ancaq Qara keşişin qəbrindən qalxan qaratikan kolu onların arasına girib birləşməyə qoymur.

**Qara yaş** - gənc ölən, kiçik yaşda dünyadan gedən uşaq. Qarğışdır. Ölməyə layiq

**Qara yazı** - taleyi gətirməmək, bədbəxtlik.

Ey düşmən, alnının yazısı qara,
Öldürməz bizləri vurduğun yara ( "Min beş yüz ilin oğuz şeri", s.727).

**Qara yel əsmək** - uğursuzluq, işlərin nəhs gətirməsi, taleyin dönməsi. Fəlakət rəmzidir.

Qoca İskəndər Naib: Ay qırılmışlar, ay qəzəbə gəlmişlər, onlara dinməyin, toxumuz Gilana düşsün, onlara dinməyin, istirsiz üstüzə qara yel əsə bəyəm (204, s.67).

**Qara yel** - faciəli bir olay, xoşagəlməz bir hadisə.

Nəfəsini kəsər qara yellər (264, səh. 98).

Arazın aynası kaslandı, yenə qəmlə yanaşdı,
Gözlərin kasası daşdı,
Qara yel əsdi, xiyalın atı düz yolda da çaşdı.

**Qara vermək** - işçilərin arasında vaxt keçirmək

**Qara yaxmaq** - ləkələmək, böhtan atmaq, hər şeyi tərsinə görmək, pis adamı düzgün sayan adam.

Əbəs yerə qara-qara baxırsan,
Qar, qardaşım, ağlığını itirməz (349, s.52).

Əşi, xəlqə qara yaxırlar, adamın imanı var. Həqdən keçmək olmaz. Adam hampalığına görə danışar ( "Yol", 1369)





Sən bu boyda dünyaya barmaqarası baxma,
Dünya beşgünlük deyil, yaşına qara yaxma.

**Qar, ayaq üşütmək üçündür** – çətinlik də lazımdı, dəyərli bir şey çətin qazanılar.

- Qar, ayaq üçütmək üçündür! – indi sizdə kişilik qeyrəti varsa, qayıdın!!! (253, s.444).

**Qara yer** - ümumiyyətlə, qəbir mənasında işlədilir.

Rahat olsun sənə qara yer, nuranə olsun sənin türbən (166, səh. 213).

**Qarayaz** - yazın axırlarında zumarın qurtulan çağı

Torpağı boğaz olan çağda buraxdılar, yazın oğlan çağında, qara yazda qudurdular (203).

**Qara zoğalaça** - kömürün naziklərinə zoğalaça deyirlər. Arıq, çəlimsiz.

**Qardaşın necə adamdı-yoldaşlıq etməmişəm, deyəmmərəm** – adam biri ilə yoldaşlıq etməsə, onun xasiyyətini dəqiq bilməz.

Qardaşın necə adamdı-yoldaşlıq etməmişəm, deyəmmərəm (103, s.10).

**Qaqqa adam** - davakar, söz çəkməyən adam.

**Qarğa balası** - zirək, şüurlu, uzaqgörən.

Qarğa istəyirdi ki, balasına yaşamağı öyrətsin. Ona dedi ki, görsən bir nəfər əyilib yerdən daş götürsün bil **ki**, səni vurmaq istəyir. Tez uç! Balası deyir: əgər əlində daş olsa necə? Qarğa deyir: bala, sən öz başıvı saxlayarsan.

**Qarğa da özünü quş bilir** - təhqir mənasında işlənir. Biri özünü bilici, ağıllı bilən zaman deyilir.

**Qarğalanmaq** - əsil mahiyyətini əldən vermək, pis xislətlərə sahib çıxmaq, əskilmək, alçaqlıq etmək, yaman günə düşmək.

Əzizim qar qalandı,
Qar yağdı, qar qalandı
Qarğalar laçın oldu,
Laçınlar qarğalandı (105, səh. 51).

**Qarğa məndə qoz var - keçən it, gəl məni qap** - oğru yadına daş salmaq -özünü şübhəli aparmaq, ağrımaz başa duz bağlamaq.

**Qarı düşmən** – köhnə düşmən.

Qarı düşmən hücum edib üstümə,
Neyzəni gözünə soxan gündü bu!

**Qarı düşmən dost olmaz** - köhnə düşmənə arxayın olmaq olmaz. O hər zaman çalışacaq ki, intiqam alsın, arxana zərbə vursun.

**Qarına daş bağlamaq** - yeməkdən imtina etmək, nəfsini sıxmaq.

Eybidir şair boğazın yağlaya,
Çün o gərək az gülə, çox ağlaya.
Ac dolana, qarnına daş bağlaya (168, səh.393).

**Qarın ağrısı** - dərd, birinin istədiyi.

On, iyirmi manat apar, bas ovcuna, ağzı yumulsun, onun qarnının ağrısı budur (129, s.410).

**Qarın boğazdan aşağıdır** - insan tamahının qulu olmamalıdır.

**Qarın doyuran aşı göz tanır** - gözdən pərdə asmaq olmaz.

**Qarını yasdan çıxartmaq** - ac adamın doyunca yeməsi.

**Qarın qardaşdan irəlidir** - yemək insani hissləri də yaddan çıxarır.

**Qarın üstə düşmək** - çox yeməkdən qarın ağrısına düşmək.

**Qarın yamaq götürməz** - yeməyi axıra qədər, doyunca yemək gərəkdir

**Qarın vermək** – bir divarın çökmək istəməsi, qarın kimi qabağa gəlməsi

Sanki samanlı çiy divar, neçə yerə qarın verib (338, s.55).

**Qarı si....di, qapı bağlandı** - iş-işdən keçdi.

**Qarışqanı da ayaqlamamışam** - heç kəsə əziyyətim keçməyib.

Yamanlıq görmədi məndən bir nəfər,





Məndən qarışqa da çəkməmiş zərər (Rübailər Aləmində).

**Qarışqaya qohum çıxmaq** - tanıyan adama dayaq durmaq.

**Qarış -qarış gəzmək** - hər yerə bələd olmaq.

Vətənin qədrini, elin qədrini
Onu qarış-qarış gəzəndən soruş.

**Qarnı burnunda olmaq** - ikicanlı olmaq və hamiləliyin son dövrü.

**Qarnı kürəyinə yapışmaq** - çox arıq, cılız, bir dəri bir sümük.

**Qarnına daş bağlamaq** - dözümlü olmaq, heç nə yeməmək.

Ac olana qarnına daş bağlaya,
Cəşn tutarlar ona 80 yaşı (168, s.393).

**Qarnında saxlamaq** – dərdini heç kəsə deməmək.

Odur ki, narazılığını qarnında saxlayıb dinmədi (46, s.153).

**Qarnının altına vurmaq** - başına vurmaq, ağlını əldən vermək.

Bir gün vurdu qarnının altına, su adamından alan daşı aparıb Nəccar Əhməd adlı bir qonşuya göstərdi (189).

**Qarnı tox olan köpək gecə ulduza hürər** - ehtiyacı düzələn bir adamın faydasız iş görməsi.

Qarnı tox olan köpək gecə ulduza hürər (335, s.275).

**Qarnı üstə ağac götürmək** - həddən artıq ac olmaq.

**Qarnı yoluq** – yoxsul.

Mən qızımı yerdən tapmamışam ki, hər dərənin qarnı yoluğuna və acına verəm (46, s.96).

**Qarnı zığlı** - alçaq adam, xalqın xoş gününü görə bilməyən.

**Qarpız alansan, ya bostan talayansan** - sənə dəxli olmayan işə niyə baş soxursan?

**Qart ağalar** -ilan yeyib əjdaha olmuş müftəxorlar, xalqın zəhmətindən kef çəkənlər.

Qart ağalar, tamam bizim boynumuza biçər kəfən,
Dərdimizə əlaq gərək çarəni şanlı kütlədən.

**Qartalgöz** - diri, qaynar gözlü.

Nəbi o zaman deyərdi ki, mənim gözüm qartal gözündən də itidir (67, s.111).

**Qart təvvab** - təvvab zindanda cinayətkarların işkəncələrinin müqabilində dayana bilməyib onlara təslim olub öz həmzəncirlərinin qanını şüşəyə tutan yazıq adamlar. Təcrübəli.

Onun dalında qart bir təvvab çoxdan tökülmüş üzünün suyu ( Nəsim).

**Qar yağmaqla qarğa ağarmaz** – gərək bir şeyin əsl mahiyyəti dəyişsin.

Qar yağmaqla qarğa ağarmaz (103, s.67).

**Qaş ağarmaq** -- sübhün açılması.

Gəlməz tanıram bəxtimi, indi ağarar sübh,
Qaş böylə ağardıqca belə, baş da ağarı (80, c.II, s.251).

**Qaş düzəldən /qayıran yerdə vurub göz çıxartmaq** - yaxşı bir iş görmək istədikdə onu daha da korlamaq.

Qaş düzəldən yerdə vurub göz tökmək olardı (91, s.54).

Ağa dərviş, qaş qayırdığımız yerdə göz çıxartdıq, deyəsən biz buradan sağ-salamat keçə bilməyəcəyik (46, s.205).

**Qaşı qara** - birinin digəri yanında özünü çəkməsi, başqalarından üstün deyilsən ki?

Çəkildi yoldaşım xalq üçün dara,
Nə ondan artığam, nə qaşı qara (303, səh. 7).

**Qaşınmayan yerdən qan çıxartmaq** -özü -özünə problem yaratmaq.

**Qaş ilə göz arasında** - ən yaxın.

**Qaş ilə göz arasından çıxan çiban** - ən ağrı verici yara, bir millətin ikiyə bölünməsi.

Demə dağ-daşdır Süleyman, məni səndən ayıran şey,
Bir çibandır ki, çıxıbdır göz ilə qaş arasında (306).

**Qaşqabağından qar yağan** - hövsələsiz, hirsli.

Bayaqdan qaşından-qabağından qar yağan və cavabı ciro ilə verən kişi (Arşaq) qolunu açıb Səmədə tərəf gəldi. Bərkdən çığırdı: «Ay sənə mənim canım qurban» (254, səh. 168).





-Hələ qış gəlməmiş qaşqabağından niyə belə qar yağır? (253, s.251).

**Qaşqabağından zəhər damır** – bikef, acıqlı.

Qaşqabaqdan zəhər deyil, nə damar
Öldür qoyma həsrət didarə məni (32, s.53).

**Qaş-qabağı sallamaq** – qaraqabaq, narazı.

Buludam, sallansa qaşım-qabağım
Ağlaram, aləmi sellər aparar ( Səhənd).

**Qaş-qabağını tökmək** -birinə yaxşı üz göstərməmək, ifadə satmaq, narazılığını bildirmək.

Hər kəs görən dəmdə öz sirdaşını,
Məgər tökər qabağını qaşını (329, s.68).
Qırovlu qaşından, ala gözündən,
Yaraşır tökəsən bizə qaşqabaq (56, s.32).

**Qaşqabağı turşutmaq** - birinə pis üz göstərmək.

Nə olub, yenə qaş-qabağını turşudubsan (129).

**Qaş-qabağı yer süpürür** - ən ağır vəziyyət, kədər, qüssə.

Dindirəndə necəsiz
Qaş-qabağı yer süpürür.
Halı yoxdur edə xoş-beş
Qaralan günləridir (Mir Mehdi Etimad).

**Qaş qaralmaq** - gündüz ilə gecə arasında olan azacıq bir zaman kəsiyi.

Uşaq-böyük yığışdılar,
Batdı günəş, qaraldı qaş (216, səh. 57).

**Qaşla gözün arası** - ən qısa zaman, məsafə kəsimi.

Uzaq deyil, yol ki yaman yaxındır,
Qaşla gözün arasından yaxındır (264, səh 86).

**Qaşları çatılıb / qaşları düyünlənib** - hirslənmək, qəzəblənmək, gözlənilməyən bir hadisədən, bir sözdən heyrətlənmək, kədərlənmək.

Gördüm ki düyünləndi qaşlarının arası,
Qanadı sinəsinin sanki köhnə yarası (161, № 2).
Gah görürsən ki, çatıb qaşlarını
Baxıram dərdli Arazdan o taya.

Nə deyim, ah nə deyim mən bu çaya? (264, s.441).

**Qaşları düyünlənmək** - hirslənmək.

Düşmən gözümə min süngü vursa da,
İntiqam düyününü başıma vurmaram (163, s.21).

**Qatarlanmaq** - nizamlanmaq, cərgəyə düzülmək.

Qatarlanıb nə diyardan gəlirsiz,
Bir xəbər versəniz bizə durnalar? (329).

**Qatığında qıl olmaq** - hiyləgər, düz iş görməyən.

**Qatıq alan sovuşdu** - bazar qızdıranlar sovuşub getdilər, odun qoyanlar yoxa çıxdılar.

**Qatır alan sovuşdu** -bir şeyin əsl zamanı keçdi.

Enli-enli kabab qoxusuna yığışan pəxmə məşrutəçilər bu qədər qanlar və canlar töküləndən sonra nə üçün bu məşrutəni köhnə həriflərə verirlər? Aydındır ki, daha qatır alan sovuşmuşdu. Məşrutədən mənzur həmin türk əlilə türkü yıxmaq və ingilislərin türk və çar əleyhinə olan dünyalıq siyasətini icra etmək idi ( Təbrizli Əli).

**Qatır nəsli** – sonsuz.

Elə bil biz yazıq qatır nəslindənmişik, bax bunun fikrini çəkirəm (46, s.94).

**Qatış-bulaş** - ərəb və fars dilindən elə bir xoruz səsi eşitməmiş kəlmələr, ibarələr lüzumsuz yerdə işlədirdilər ki, daha onları ərəb və farsca az savadlılar oxuyub başa düşmürdü. Bu icad etdikləri qatış-bulaş dilin adını ədəbi dil qoyub ancaq ana dilini "çoban dili" adlandırdılar (195, s.159).

**Qatışdırmaq** - əsəbləri pozulmaq, yadı və qohumu bir-birindən ayıra bilməyən

Bir gün olar sən də məni atarsan,
Yadlarnan tanışları qatarsan ( Şeyx Daravalı, Xasa Xatın Aşıq).

**Qatlayıb döşəyin altına qoymaq** – bir sözü danışmamaq, yaman günə pul saxlamaq.

Bu sözü qatlayıb döşəyin altına qoysun, yetimdir qıvrılsın yatsın, hər kəsin öz tay- tuşu var (46, s.97).





**Qaya uçmasa, dərə dolmaz** - böyük bir xəsarəti aradan qaldırmaq üçün böyük bir qüvvə lazımdır.

Yıxılsın uca dağlar, dolsun dərin dərələr,
Aradan getsin bu vəhşətnak fasilələr.

**Qayçılamaq** - birinin sözünü kəsmək, geridə qalmış ölkələrdə bir alimin və ya bir millətin yazıçılarının sözlərini sensor etmək.

**Qayış yaxama tikmə** - birini təzyiq altında qoymaq, qul etmək.

Dedim qayış yaxama tikmə,
Dedi: hələ neçə bayram donun da tikdirəcəksən (306, s.129).

**Qaynatmaq** - hirslənmək, birinin yalan sözünə dözə bilməyib dava-dalaş eləmək.

**Qazan dedi dibim qızıldı, çömçə dedi bulanıb çıxmışam** - sənin hər şeyinə yaxşı bələdəm .

**Qazan qaynatmaq** - əl altından iş görmək.

Nazlı sən nə qazan qaynadırsan? (9, s.177).

**Qazannan qablamanı ayıra bilmir** – savadsızdı, təcrübəsi yoxdu.

Mən ərəbcə bilirəm, farsca bilirəm, azərbaycanca bilirəm urusu da bilirəm, sən deyinən heç qazanla qablamanı bir-birindən ayıra bilməzsən (72, c.III, s.100).

**Qazan qazana deyir: götün qaradı** -kor-kora kor deməsə bağrı çatdayır.

**Qazan qazanla döyüşər, arada küvəc (palçıqdan düzəldilmiş saxsı piti qabı) çatlar** - Yəni bütün savaşlarda, yaman günlərdə nə bəla gələrsə, məzlumlara gələr. Qazan qazanla döyüşər, arada küvəc çatlar (72, 2-ci cild, səh. 210).

**Qazılanmaq** - yekələnmək.

Əməl divarının altın oyubsan,
İşin bu adını molla qoyubsan.
Əməl yoxsa şəriətdə dolanma,
Adın qazı qoyub, çox qazılanma (147, s.14).

**Qazlanmaq** - zor demək, yuxarıdan getmək.

Nataraz bənnaların sazlamaq olmur tarazın
Görərsən bir bu cənabın divar üstündə qazın (168, s.918).

**Qaz vurub qazan doldurmaq** - böyük iş görmək, çoxlu pul qazanmaq, zəhmətlə bir şeyi ələ gətirmək, süfrəni doldurmaq.

Allah, sənə şükür, qaz vurulub, qazan dolub (335, s.109).

Çalış mənim kimi ol, qaz vurub, qazan doldur (264, səh. 121).

**Qeyrəti götürməmək** – namussuzluğa, alçaq işlərə dözə bilməmək.

Onun anası ilə bağlanmağına, nə iləsə ona yarınmağına Hüsənin qanı yol verməzdi (84, s.75).

**Qəbri nurla dolmaq** - yaxşı adamlara dua mənasındadır.

**Qəcələ beyni yeyib** - qədim fikirlərə görə qəcələnin beynini yemək insanın əqlini zay edir.

Bu inama görə, Təbrizdə hökumətin yaramazlığından yüzlərlə ruhi xəstəliyə düçar olmuş adamı müalicə əvəzinə onlara qəcələ beyni yeyib- deməklə yola salırdılar.

**Qəddin yay olması** - beli əyilmək.

Qəddim yay oldu, ömrüm zay oldu,
İşim vay oldu, eşqin əlindən (89, 162).

**Qədəm araya qoymaq** - xeyirxahlıq etmək, bir davanın sona çatmasına .vasitəçilik etmək.

**Qədəm pulu** - zəhmət haqqı.

Faiq Əfəndi gürcü həkimin qədəm pulunu cibinə qoyub faytona əyləşdirib qayıtdı (62, s.731).

**Qədir-qiyməti çox olmaq və ya qədir ağacı tikmək/əkmək** - hər hansı bir insana layiq olduğu qiyməti vermək.

Əski zamanlarda yaxşı bir insan dünyasını dəyişən zaman, onun məzarı üstündə, qazandığı xətir-hörmətə, elədiyi yaxşılıqlara görə ağaclar əkilərmiş. Ona da Qədir ağacı deyərlərmiş.

Qədir-qiymət çox olar,
Ər qiymətin ər bilə.





**Qəhbə şivəni** - günahkar adamın özünü günahsız göstərmək üçün hay-küy salması, ağlayıb şivən etməsi.

**Qəlbə dəymək** - incitmək.

Çox şahlar əmr etmiş, o baş əyməmiş
Nə təslim olmamış, qəlbə dəyməmiş (230, s.83

**Qəlbin qan olması** - nəhayət qəmdən, qüssədən sıxılmaq.

Ey gülün budağı, etdin məni zar,
Qəlbimi qan etdin, qoydun intizar ( Heyran xanım)

**Qəlbi kor** -ürəyində sevgi məhəbbət olmayan, dünyaya açıq-ürək və açıq görüşlə baxmayan.

Qalmayacaq iş başında bu klassik görbagörlar,
Gözləri sağ ola ola, qəlbi korlar (266).

**Qəlbi qara** – qısqanc.

Fəryadü -fəqan ilə sağalmaz yaralar
Cahil kişi bica yerə qəlbin qaralar (301, s.253).

Buna da etiraz olundu ki, peşmənkəsin qəlbi qaradır (9, s.21).

Hər kimin qəlbi qara isə utansın, a balam!
Bəlkə illərcə yatanlar bir oyansın, a balam (267, s.166).

**Qəlbini oxumaq** – ürəyindən keçəni duymaq.

Dərhal Qətibənin qəlbini oxudu (234, s.510).

**Qəlbinə qan axmaq** - çox kədərli olmaq, gizli dərd çəkmək.

Keç ruhuma, keçirdiyim ahı gör,
Gir qəlbimə, içdən axan qanı gör! (7, s.50).

**Qəlbin sıxılması** - darıxmaq, kədərli olmaq.

Görəndə bülbülü qəfəsdə nalan,
Pərişan oluram, qəlbim sıxılır.
Gahdan görürəm insan əli ilə
Qəfəslər açılır, zindan yıxılır (200).

**Qəlbin sınması** - yaxın bir adamdan incimək.

**Qəlbirə çevrilmək** - dəlik-deşik olmaq.

**Qəlbirdə/xəlbirdə su duran qədər** - əgər bir adama inanmasalar haqqında belə deyərlər.

**Qəlbi yanmaq** – ürəyi yanmaq.
Qəlbimi yandırdın oda
Sirr sözümü vermə yada (32, s.7).
**Qələbə şərbətini işmək** – qalib gəlmək.
Sizi öz əlimlə bir yana çıxarmağa ömrüm çatmayacaq, qələbə şərbətini mənsiz içəcəksiniz (144, s.150).
**Qələm çalmaq** – Allaha aiddir, yəni taleyi belə yazıb. Dua yazmaq, birinin bəxtin bağlamaq.
Belə çalıbdı qələmi,
Yanıram, Əslim yanıram (35, s.564).
Evində yediyim çörək məni dizin-dizin süründürsün, əgər mən bu barədə qələm çalmışam (129, S.42).
**Qələmin ağlaması** - acı talelərdən, həyatın acı olaylarını qələmə almaq.
Qələmim ağlamazdı,
Yarımcan olmasaydı (264, səh. 104).
**Qələm işləməz** – bir şey eləmək olmaz.
«Yox»a qələm işləməz.
Tərsə qanma, eşidibsən ki, qələm yox dəliyə (168, səh. 42).
**Qələm yazanı qılınc poza bilməz** – qələm elmin, düşüncənin, qılınc isə hərbi qüdrətin simvoludur.
Qələm yazanı qılınc poza bilməz (148, s.39).
**Qəlyanın – radiatorun suyun əvəz etmək** - işəmək mənasındadır.
**Qəm belini əymək** – dərddən vaxtsız beli bükülmək.
Qəm əydi belimi bilmədim çara,
Yalvarmaqdan öldüm gülüzlü yara (32, s.38).
**Qəm çırağının sönməsi** – xoşbəxt olmaq.
Açıldıqca könlüm bağı,
Söndü ömrün qəm çırağı (337, c.I, s.31).
**Qəm dəftəri** - qəmlə, kədərlə dolmaq.
Mən səni görəndən bəri
Sinəm olub qəm dəftəri,
Yazıq aşıq Ələskəri





Öldür, günahkar ol yaylaq!(13).
**Qəmdən çürümək** - dərd-qəm çəkməkdən ölmək, haldan düşmək, sağlamlığını itirmək.
Belə iş üz verə əgər məndən
Çürürəm teylik ilə mən qəmdən (195, c.II, s.181).
**Qəm dəryasına düşmək** – qara günə düşmək.
Qəribəm vətənim yox,
Bir qulam satanım yox,
Düşdüm qəm dəryasına
Qolumdan tutanım yox (33, s.150).
Yenə də qəm dəryasına qərq olmusunuz, bu nədir (35, s.465).
**Qəməni üstdən bağlamaq** - dava istəmək, dava üçün bəhanə axtarmaq, savaşa hazırlaşmaq.
Son zamanlar gedələr bağlayıb üstə qəməni,
Az qalıb ki adamın lərzəyə düşsün bədəni (69, s.28).
**Qəmə salmaq** - şərik salmaq, şətəl atmaq.
Çörək baziresləri o vaxt gəlirlər ki, bizim ağızalmaya qəmə salırlar.
**Qəməni yalxı üzdən bağlamaq** - birisinə və ya düşmənə qarşı aşkarcasına savaşı bildirmək.
**Qəmiş olmaq** - böyürdən çıxmaq, mane olmaq.
Mənə vaiz, qəmiş qoyma, yeri, rişə hənə bağla
Mənə meyxanə yer olsun, sənə mənzil hamam olsun (175, s.178).
**Qəm ocağına çevrilmək** – dərd-qəm yuvası.
Məlhəm pirinin şeyxi ilə onun sağ qalan qohumları isə qara geyinib, onlar üçün indi qəm ocağına çevrilmiş ata-baba yurdunu tərk edirlər (144, s.51).
**Qəm sazı çalmaq** – ah-nalə etmək.
Bozən ac da qaldıq, susuz da qaldıq,
Alıb qəm sazını birlikdə çaldıq (337, c.I, s.39).
**Qəm yükü** – dərd-qəm.
Könlüm bir alma dilər,
Yeməyə alma dilər,

Aşığın qəm yükünü
Üstündən almadılar (33, s.103).

**Qənbərqulu** - görəsən yeni dərgisinə "Buxara" adı vermiş Əli Dehbaşının yerinə bir azərbaycanlı türk dilində bir dərgini çıxarmağı qərara alsaydı, birdən dərginin adını "Bakı", "Gəncə", "Şəki" "Şirvan" bu kimi Azərbaycan Cümhurisinə aid olan adları qoysaydılar necə? Görəsən bu işdən hansı qənbərqulu çıxmazdımı? (323, №5, s.295 1999).

**Qənd kimi gözüm ağarsın** - anddır, gözü ağarmaq ölmək mənasındadır.

**Qıfıllanmaq** - ümumiyyətlə, bu deyim əmr formasında işlədilir və onun anlamı danışma, sükut et.

**Qıl baha olub, qaraçı saçın kəsir** - saç kəsmək türklərdə eyb sayılırdı. Tamahkar adamları məzəmmət etməyə görə belə deyilir.

**Qıldırımqaş** - işvəli-nazlı anlamında işlədilir.

**Qılı qıldan ayırmaq** - çox ayıq, ədalətli adam, çox məsuliyyətlə, diqqətlə, ədalətlə birinin barəsində söz açmaq.

Xəzinə tökdü, ləşkərin çatırdı,
Ədalətdən qılı qıldan ayırdı (175, s.303).

**Qılıncı qalaf kəsir/ qınını kəsir** - igid; qorxmaz.

**Qılıncından qan dammaq** - zalım, quldur, rəhmsiz, igid.

Dünən qılıncından qan damanları,
Bu gün çarmıxlara çəkilən gördüm ( M.Azaflı, s.49).

**Qılıncının dalı da kəsir, qabağı da** - Çox güclü, hökmlü, fürsətdən istifadə edən.

İstəsə day onun qabağında dura bilməyəcəksən ki... Qılıncının dalı da kəsir, qabağı da... (9, s.170).

**Qılınc qınını da kəsər** - insan bəd ayaqda hər şeyi anlar.

Qılınc kəsə bilir bəzən qında da (328, s.335).

**Qılınc qınını kəsməz** - heç bir insan yaxınlarına dolaşmaz.

**Qılınc müsəlmanı** - islamın qılıncla qəbul etdirilməsinə işarədir, qorxu ilə iş görən, zor olmayanda iş görməyən.

**Qılınc oynatmaq** - quldurluq etmək, hərbə zorba gəlmək, haqq danışanın dilini boynundan çıxarmaq, mənəm-mənəm





demək, düşmənə sinə gərmək, qəhrəmanlıq göstərmək. Türklərdə ağaca inam o qədər güclü olmuşdur ki, islam dininin qılınc oynatdığı bir dövrdə ağaca, "Quran"a and içmək eyni gücə malik idi (279, s.94).

Oynat ədo başında ölüncək qılıncını,
Sən həqq lisani, el dili, tufan şəhabısan (99, səh.34).

**Qılınc zamanı** - zor-zorakılıq, quldurluq.

Mıkırtç cənabları alman kabinəsindən: «İndi qılınc zamanıdır» sifarişini ermənilərə yetirən kimi, ermənilər Türkiyədə münəzzəm bir daşnaksütyun hizbi təşkil və tənzim etdilər (232, səh. 10).

**Qıl körpüsü** – islam görüşü əsasında insanlar qiyamət günü Qıl körpüsündən keçən zaman yaxşı və pis əməllər bəlli olacaqdır.

Qıldan körpü yaratmısan,
Gəlsin qullar, getsin diyu.
Hələ biz şöylə duralım,
İgid isən keç, a Tanrı! (Qayğusuz Abdal, səh. 296)..
Biz körpünün bu başında dayanmışıq,
O yan həyat?
Bu yan ölüm! (291, səh. 74.).

**Qıl qədəri** – ən qısa zaman kəsiyi.

Sədaqətlə xəyanətin
Bir qıl qədər arası var (291, səh. 76).

**Qının boş qalması** – dava sona çatmayacaq.

Bir diyarda almazsa, hər kəs zəhmət həqqini,
Hər çəkilən xəncərin boş qalacaqdır qını (30, №39, s.3).

**Qınından çıxıb qınını bəyənmir** - öz kökünə, öz ailəsinə, milli kimliyinə arxa çevirənlər.

H.Mayılov tostunda qınından çıxıb qınını bəyənməyən bəzi cavan içkibazları kəskin tənqid etdi (9, s.14).

Eləcə də öz qınından çıxıb qınını bəyənməyən satqın azərbaycanlılara Dədə Qorqud, Füzuli, Nəsimi, Mirzə Fətəli Axundov, C.Məmmədquluzadə, Sabir, H.Cavid C.Cabbarlı və

illa yüzlərcə müasir yazıçı və şairlərimizin bu dildə yaratdıqları ölməz sənət əsərləri tarixi sənədlər deyilmi?

**Qınqıtmaq/ çılpıtmaq** - xəlvətcə oğurlamaq, aradan götürmək.

Sanma yalqızam, yoxdu bir kəsim,
Təkləyib məni qınqıdarsınız (338, s.50).

**Qıpqırmızı** – utanmadan üzünə demək.

Mollanın belə qıpqırmızı "verməyəm" deməyinə qonşu heyrətlə soruşdu (148, s.125).

**Qıpqırmızı politika** – göz qabağında olan siyasət.

Bəs sən Tehran hökumətinin qıpqırmızı politikasına niyə bir söz demirsən ki? Hazır qırmızıca bizim Arazın o tayında Zünuz və Mərəndli qardaşlarımızı fars eləmək istəyirlər (195, VI cild, s.62-63).

**Qırağına bax bezini al, nənəsinə bax qızını al** - ananın tərbiyəsi qızın .üzərində böyükdür.

**Qırağını qatlamaq** -ölmək, pis, xalqın dərdinə dəyməyən adamın ölməsi, birinin ölümünə işarədir.

**Qıram, mumam qopmaram/ qır tək suvaşmaq** - qırsaqqız olmaq, əl çəkməmək.

Sağlıqda mənim qədrimi bil, mərhəmət eylə,
Məndən sonra gəl qəbrimə qır tək suvaş, olmaz! (268, s.248)

**Qırğı damına qonmayıb** - xəsis.

**Qırğı əlinə sıçıb** - Türklərdə qırqının çiyində oturması uğur və xoşbəxtlik rəmzidir. Havayı, zəhmət çəkmədən var-dövlət ələ gətirmək, müftə mövqe qazanıb elə bilir ona layiqdir.

Qırğı çiyninə sıçıb, deyir bəs ulduz alıb.

**Qırğı Şirvanı aşdı** - fürsət əldən getdi, daha zamanı gəlincə gözləmək lazımdır.

Ta düşə fürsəti- cübrani xəta bir də ələ
Bu məsəldir: görərük qırğı aşar Şirvanı ha.. (168, s.511).

**Qırxa bağlamaq** - suyu kuzədə, günü bacada görüb xalqa öcəşən adam haqqında işlənir.





**Qırxdı, biri əskik deyil** - öz bildiyini demək, dediyindən əl çəkməmək.

Deyir qırxdı, biri əskik deyil, gərək qızı doqquz yaşında ərə verəsən (129, s.429).

**Qırxılmış başı yenə də qırxmaq** - var-dövlətini əldən almaq, rüşvət almaq.

Tehran hər gün bir oğrunun ustandar, fərmandar ünvanı altında əlinə böyük bir çamadan verib üstümüzə göndərir. Təzə və iti bir ülgüc ilə min dəfələrlə qırxılmış başlarımızı qırxmaqdan utanmırlar ( Pişəvəri).

**Qırxmaq/ qırxıb sağmaq** - pis günə qoymaq, hər şeyi əlindən almaq, birinin cibinə girmək, bahalıq nəticəsində yoxsulların cibində olan-qalanı yox etmək.

Qoyun kimi bizi qırxdı bahalıq,
Millətin evini yıxdı bahalıq (299, s.112).
Hacısan, məşədisən, sahibimizsən, ağasan,
İstəyirsən həmi qırxıb bizi, həm də sağasan (230, səh.198).

**Qırılan qoşundandır** - görülən işdən, kiçik yaxud böyük bir hissənin görülməsi o işin yerinə yetirilməsinə doğru addımdır.

**Qırışın açılması** - donun açılması, şad olmaq, əhvalının açılması, bir məclisə adət eləmək.

**Qırqovul başın kola təpər, daldan xəbəri olmaz** – elə bilir ki, elədiklərini heç kəs görmür.

Qırqovul başın kola təpər, daldan xəbəri olmaz (335, s.55).

**Qırmızı adam** - sözü üzə deyən, həyasız, utanmaz.

Cavab bu oldu ki, yox, Behmənkəs qırmızı adamdır (9, s.21).

**Qırmızı don geymək** - keçmiş zamanlarda şahın cəlladları qırmızı don geyərdilər və burda qırmızı don qəddarlıq və zalımlıq əlaməti idi. Qanlı hadisədən kimlər sevindi? Qırmızı don geyən namərd cəlladlar bir soğana yüz baş kəsən obaşlar (112, səh. 50).

**Qırpaç eləmək** - maşında yataq adlı bir şey var ki, o yağsız işləsə, qırpaç edər. O adam ki, ölmə-diril başını saxlayır, birdən ölür, pis günə düşür, onda belə deyirlər.

Maşını qırpacam mən,
Qırx il olar acam mən (340, s.15).

**Qırsaqqız olmaq** - əl çəkməmək.

Yenə olsun-deyə qırsaqqız olub yapışdı (84, s.103).

Bu gün saat 00.00 dəqiqədə Qırsaqqızov nadanşünaslıq elmləri namizədi adını almaq üçün "Hırnan zırın fərqi" mövzusunda dissertasiya müdafiə edəcəkdir (9, s.51).

**Qırsıçmaz** - xəsis.

**Qısır ömürlü adam** - bir adama yardım etməyən, birinə kömək etməyən

Novruzgülü: qısır ömrü neynirəm, qoy gecəni sübhə qədər nağılımı söyləyim, bəlkə niskilim yüngül ola (204, s.13-14).

**Qışda bostan əkən çox olar** - boş söz danışan çox olar, işə gələndə azalar.

**Qışda bostan əkmək** - boş, mənasız işə əl qoymaq.

**Qışını yaz eyləmək** - ağ gününü qara etmək.

Bilsən necə minnətdaram,
Sən qışımı yaz eylədin (328, s.256).

**Qışın oğlan çağı** - ilin ən soyuq vaxtı, qışın ən sərt soyuq, şaxtalı-boranlı vaxtı.

Mən qışın oğlan çağında, özü də belə bir soyuq yerdə heç cür papaqsız otura bilməzdim (288, s.107).

Əgər sən rəhm eləyən idin, naxırçı Eyvaz beş balası ilə qışın oğlan çağı acından öldü. ..... Onlara rəhm eləyəydin də? (77, səh. 17).

**Qıvır- zıvır** - çox ucuz şey, dərdə dəyməyən, müxtəlif.

**Qıya baxmaq** – yanakı, çəpəki baxmaq.

Bir qıya baxanda evlər yıxan yar.
Cəllad olub tökmə qanım, yavaş get (32, s.11).

**Qıyğacı baxmaq** - işvə-nazlı baxmaq.

Sıxlaşan bir duman aldı Təbrizi
Fələk baxtımıza baxdı qıyğacı (337, 1-ci cild, səh. 58).





**Qız ağacı, qoz ağacı** - qızı çox oğul sevər, biri alar.

Qız ağacı, qoz ağacı, hər yetən bir salba atar (335, s.247).

**Qızarmaq** – utanmaq, xəcalət çəkmək, pörtmək.

Səttarxan Narınqala zindanından qaçandan sonra Mərənd, Xoy, Səlmaz arasındakı yol məntəqəsində mühafizlik edib, Rzaquluxanın tapşırığı əsasında şərab içməməli olur. Bir gün o, otağa girib, Səttarxanın mizi üstündə bir qədəh şərab görür. Səttarxana acıqlanır ki, niyə şərab içirsən? Səttarxan deyir: «Bu sudur, qurban, sizi görən kimi xəcalətindən rəngi qızardı» (3, səh. 59).

**Qız arpadır, oğul buğda** - qız övlada oğula nisbətən ikinci dərəcəli, arzu olunmaz övlad kimi baxıldığı dövrlərin deyimidir.

**Qızdır-basdır** - yəni tələm-tələsikdə.

Bu qızdır-basdırda hər şeyi təşkil edib, planı kəsirdən çıxartsın? (142, səh. 159).

**Qızdırıb** - sidik atmağın vaxtı keçmək.

İnsan maşınla müqayisə edilir, radiator qızan kimi, insan da vaxtında sidiyini buraxmasa bədəninə ziyan dəyər.

**Qızı doğ, beşikdə doğ** - bu deyim də qız doğulmasına ailələrdə mənfi münasibətin izidir.

**Qızıl alma kor əlinə düşər/ meşədə armudun yaxşısını ayı yeyər** -yaxşı şey onun qədrini bilməyən adamın əlinə düşər.

**Qızıldan balta çəksən, gedər düşər kol dibinə** - qanmaz adama, tərbiyəsiz adama nə qədər dəyər versən, yenə özünü göstərər.

**Qızıl-qırmızı oğlan** - ən gözəl, cavan, ətli-canlı, sağlam oğlan.

Sultan Əmir Əli də qızıl-qırmızı bir oğlan idi (142, səh. 206).

**Qızıl mıx tövlədir** - ümumiyyətlə, torpağı və mülki qızıl mıx-tövlə deyimi ilə anladanlar. Yəni mülk qaldıqca qiymətə minər, onu nə oğru, nə əyri mənimsəyə bilməz.

**Qızıl tasa qan qusmaq** – var- dövlətli olmağa baxmayaraq günü ahü-vayla keçən adam.

Ey taleyim, etmə mənə naz,

Qan qusmağa neylirəm qızıl tas? (A.Şaiq).

**Qızım sənə deyirəm, gəlinim sən eşit** - sözü dolayısı ilə demək.

Siz demək istəyirsiniz ki, azərbaycanlılar farsdırlar, lakin bu sözü açıq deməyə cəsarət etmirsiz. Əgər doktor Əfşarlar "qızım sənə deyirəm, gəlinim sən eşit" məqsədi ilə bizə aid olan sözləri əfəndilərə xitabən deyirsə, biz bu bəhanələrin astarını yaxşı tanırıq (30, №22, 15 mehr).

**Qızın döyməyən dizini döyər** -qızına vaxtında tərbiyə verməyən sonunda peşiman olar.

**Qızınmadıq istisinə, kor olduq tüstüsünə**- xeyir görmədik, ziyana düşdük.

**Qızın oldu, qırmızı donunu soyun** - qızı olmaq qara gün, qayğı deməkdir.

**Qız qapısı, şah qapısı** - *yəni elçiliyə dəfələrlə getmək gərəkdir*. Qız qapısı hörmətli olar.

Qızlar üçün də darıxma – qız qapısı, şah qapısı (82, səh. 178).

**Qız qarısa, dayısına yetişər** - yaşı keçmiş, yetim qalan bacı qızını dayısı, yaxın qohumu himayə etməlidir.

**Qızlar** - başarıqlı, vəfalı, el dayağı yaman günün aslanı ilan qıza qızlar deyilir.

Hər qıza qızlar deməzlər ki, bütün bu mahallarda üç dənə qızlar tapılıb. Üç dənə el dayağı, maral körpəsi, ürəklərə od yaxan qızlar qızı tapılıb (203, s.74)

**Qızlar bulağından su içmək** - yetkinlik yaşına çatmaq.

İndi yayın son çağında gecələr "Bənövşə, bəndə düşə" oyunun oynamasalar olmaz. Oğlan olub oğlanlığa yetməz, qız olub qızlar bulağından su içməz (203, s.79).

**Qızı otaqlıya yox, papaqlıya ver** – papaq qeyrət rəmzi olmuşdur. Yəni qızı qeyrəti olan adama vermək daha yaxşıdır, qeyrəti ilə onu xoşbəxt eləyə bilər.

Qızı otaqlıya yox, papaqlıya ver (103, s.72).

**Qızmış qaban** - yırtıcı, davakar insan.

Başımı görcək olursan, misli bir qızmış qaban (58, səh. 188).





**Qız uşağını özbaşına qoysan, ya aşığa gedər, ya nağaraçıya** – təcrübəsiz adam yaxşını-pisi bilməz.

Qız uşağını özbaşına qoysan, ya aşığa gedər, ya nağaraçıya (335, s.98).

**Qiblə divarına bir çöp taxın** - gün haradan çıxıb, nə yaxşı gəlmisən.

**Qismətdə varsa, gələr Yəməndən, qismətdə yoxdusa düşər dəhəndən** – fatalist düşüncəyə görə, qismətdə nə varsa insan onu görər.

Qismətdə varsa gələr Yəməndən, qismətdə yoxdusa düşər dəhəndən (103, s.68).

**Qiyamət** - aləmin bir birinə dəyməsi, çox yaxşı.

Məşədi Ağakişi kənddə qiyamətdi, mən doğrusu dayana bilmədim (195, c.II, s.109).

**Qiyamət xoşgili** - üzü çiçək xəstəliyindən dəlik-dəlik olan, çopur.

**Qiyamətin qopması** - dünyanın axırı.

Aşiqəm yüzəngini,
Gedirəm, bas üzəngini
Qiyamət ol gün qopar,
Dostdan əl üzən günü (33, s.122).

**Qoca qurd** – dünya görmüş, zirək, hiyləgər.

Gördü röya görən kimi nazənin,
Bir qoca ona dikmiş gözlərin (80, c.II, s.242).

**Qoca quyruq yedirdər, cavan yumruq** – cavan ər arvadı döyər.

Qoca quyruq yedirdər, cavan yumruq (103, s.21).

**Qocalıqda balaban öyrənən gorunda çalar** - qırxında öyrənən gorunda çalar. Bu deyim insanlarin orta yaş həddinin çox qısa olduğu vaxta aiddir.

Çifayda, elmi- düdük öyrənən,
Qocalıqda çalar gorda dünbələk (Mirzə Nəbi əfəndi).

**Qocalıqda yorğalıq** – yaşına yaraşmayan bir iş görmək.

Altmışda yorğalıq?
Çətindir, çətin!

Kösövün təzədən alovlanması (328, s.135).

**Qoca sərçəyə cib-cib öyrətmək** – təcrübəsiz bir adamın özündən ağıllı, təcrübəli adama ağıl öyrətməsi.

Qoca sərçəyə cib-cib öyrədirsən? (335, s.63).

**Qoç altından keçmiş** - sağlam, güclü, yenilməz olmaz.

Türk sülaləsindən olan Ağqoyunlu və Qaraqoyunlu imperiyalarından qalan yadigarlardan biri də həmin dövlətlərin əhatə etdiyi ərazilərdə qalan qoç heykəlləridir. Bu qoçlar kənd və şəhər meydanlarında, məscidlərin qabağında, qəbristanlarda qoyulurdu. Türklər inanırdılar ki, bu qoçlar müqəddəsdir. Qoçun altından keçən xəstələr şəfa tapıb sağlam olur, sağlamlar isə güclü, igid olardılar.

**Qoç aşığıdır** - qorxmaz igid.

**Qoç quzu qaşaqda qalmaz** - qaşaq Məşhəd türklərində quzu saxlanan yerə deyirlər. Bacarığı, istedadı olan adam özünə bir yer tapar.

**Qoçulanmaq** - hədə-qorxu gəlmək, zor etmək.

Qobustan tərəfindən Qoçu adında 20-25 yaşında bir gədə Bakıya gəlir. Ondan sonra kim ki, bir az xoruzlanırdı, deyirdilər ki, «adə, qoçusan? Zalım oğlu, qoçu deyilsən ki?!» və ya «mənim üçün qoçu olmayacaqsan ki?!» O xislətdə olan insanlara «Qoçu» adı qoydular (297, səh. 44).

**Qoduxluğa basmaq** – həbs etmək.

Pis söz üstə heç kəsi qoduxluğa basmazlar (1, s.169).

**Qoduq eşşəkdən baha olub?** - ata-ana olan yerdə övlada hörmət qoyan adam haqqında.

**Qol-boyun oturmaq** - qolunun birinin boynuna salmaq, çox mehriban oturmaq.

Qol-boyun oturub sürtək üz-üzə,
Baxaq bir-birinə göz süzə-süzə (329)

**Qol çəkmək / qoymaq**– razılıq vermək.

Yolunda özünü qurban verdiyin
Atan bu ölümə qol çəkərdimi? (328, S.168).

- Ömür yoldaşım qərar verib qol qoydu (253, s.11).





**Qol-qanad almaq** - zövq almaq, kömək almaq, şərait yaratmaq.

1905 verdi mənə sənət şövqünü,
O ziyalı iksirdən aldım mən də qol-qanad (165, səh.18).

**Qol-qanadın sınması** - arzuların puç olması, ümidin qırılması, ruhdan düşmək.

Dedi: «Nişanlıyam, özgə malıyam»,
Sındı qol-qanadım, yanıma düşdü (13, səh. 29).

**Qolları sızıldamaq** - əsəblərin narahat olması, qolun bərk ağrıması.

**Qolları taybatay açmaq** - birini sevgi ilə, ürək dolusu sevinclə qarşılamaq.

Ey Qaraçayın gözəl sevgilisi,
Yay pəncərəsi tək qollarını taybatay aç (180, səh. 52).

**Qolları yazıq qalmaq** – əzizini itirmək.

Göydə bir cüt qanad kimi çırpındı
İtib qaldı,
Azıb qaldı qolları.
Yetim qaldı,
Yazıq qaldı qolları (260, s.95).

**Qoltuğuna qarpız vermək** - tərifləmək, fitnəkarlıqla yaramaz işi görməyə təşviq etmək.

**Qoltuğuna qısılmaq** - himayəsində yaşamaq, bir adama sığınmaq.

Mən belə bir nəfi buraxıb sənin qoltuğuna qısılmışam, sən də mənimlə belə rəftar edirsən?(129, S.102).

**Qolun sağı kəsilmək** - əziz dəyərli bir adamın ölümü, yəni bədənin ən yararlı, ən əhəmiyyətli hissəsinin əldən verilməsi, və yaxud ən yaxın sirdaşın itirilməsi.

Nagah badi-sərsər əsdi üzürnə,
Ömür bostanımın tağı kəsildi.
Öz əlimlə xəta dəydi özümə,
Bədəndə qolumun sağı kəsildi (13, s.39).

**Qolun sınığı boyuna bir yükdü** - qohum -əqrəbanı himayə etməkdən boyun qaçırmaq olmaz.

**Qoluva çöpdən dirək** - bu deyimi o vaxt işlədirlər ki, bir böyük və güclü adam bir balaca və əhəmiyyətsiz işi görməyi özünə fəxr hesab edir.

**Qonağa üz versən, s...i taxçalarda gəzər** - qanmaz adama həddindən artıq hörmət qoysan, qudurar.

**Qonaq qapılarını tanımayıb** -heç kəslə get- gəli yoxdur, xəsisdi.

**Qondum, köçdüm – oynamaq** -uşaq oyunlarından birinin adı və məcazi mənada ömür sürmək anlamındadır. «Qondum, köçdüm» oynayarkən, bu beş günlük ömür bitdi (291, səh. 60).

**Qonşu muncuğunu oğurlayan gecə taxar** - yaxınlarına xəyanət edən, qonşudan bir şey oğurlayan ondan istifadə edə bilməz.

**Qonşuya ümid olan şamsız qalar** - hər adam özünə güvənməlidir.

**Qora bişən ay** - yayın ən isti ayı, iyul.

Qaflantının çobanları deyirlər ki,
Hər il qora bişən ayda
Hilal çıxcaq
Çox qəribə bir səs gəlir,
Qızılözən sularından.
Cavan bir səs qılınc deyir, haray çəkir (219, s.83).

**Qorxaq yüz dəfə ölər, igid bir dəfə** - qorxaqlıqla yüz il yaşamaqdansa, igidliklə bir il yaşamaq şərəflidir.

**Qorxan gözə çöp düşər** - çox ehtiyat eləmək axırda fəlakətə səbəb olar.

Qorxan gözə çöp düşər (148, s.39).

Qırpıq gözə ox dəyər, nadan bütə baş əyər,
Tülkü qurddan qorxanda, quyruğunu tərpədər (80, c.II, s.240).

**Qorxulu baş salamat olar** - ehtiyat edən adam xətərdən uzaq olar.

Qorxulu başlar salamat qalmağın baş tapmadım
Ağrımaz başa salıb saqqız nə dığlatdın başı (241, s.23).

**Qovaqlı göz** - üstü dik qapaqlı göz, üstü qovzaq.





Amma əminin qovaqlı gözlərini künlüklü qaşlarını, qartal burnunu aydınca gördün.

**Qovra çəkmək** - ruha qovra çəkmək, birinə əzab çəkmək, deyingənlik etmək, xoşa gəlməyən bir səsin təkrarlanması.

Yolda olasan anlamaz insanla yoldaş,
Hey qora çəkə beyninə hər anda, çətindir (168, s.733).

**Qovrulmaq** - yanıb - cızzağı çıxmaq, hər bir ağır təhqirə dözüb, etiraz bildirməmək.

İlan vuranlar kimi qovruldum öz yerimdə (264, səh. 61).

**Qoydum ovcuna** - xəbər verdim, birinin kobud cavabını vermək.

**Qoyun başlı qurd** - zahirdə yaxşı, batində qəddar adam.

Niyə qoyun başlı qurdların ürəyinə işıq salmır? (129, s.133).

**Qoyun quzu ayağını basmaz** - hər kəs öz qohum-qardaşının, tanışının tərəfini saxlar.

**Qoyun olmayan yerdə keçiyə Kəramətdin /Əbdülkərim deyərlər** - imkan olmayan yerdə hər bir dəyərsiz şey də dəyərli sayılır.

Qoyun olmayan yerdə keçiyə ağa deyərlər (103, s.67).

**Qoyunu qurda tapşırmaq** – şərəfsiz, oğru bir adamı başçı təyin eləmək.

O burda naçalnik idi, qoyunu qurda tapşırmışdılar (1, s.204).

**Qoyunu olmayanın bıçağı iti olar (103,** s.67).

**Qozbeli qəbir düzəldər** – şəxsiyyəti formalaşmış adamı dəyişmək olmaz.

O, bu dünyaya belə gəlib belə də gedəcək, qozbeli qəbir düzəldər (1, s.119).

**Qoz qabığına soxmaq** – çox incitmək, sıxışdırmaq.

Nazlını yaman qoz qabığına soxublar ha..(9, s.178).

Mazan əmi, ayağını yorğanına görə uzat deyiblər, bizi niyə qoz qabığına soxursan? (1, s.269).

**Qoz-qoz oynamaq** - sözümün qabağına söz demə.

Mənnən qoz-qoz oynama. *(danışıqdan)*

Fikirləşdim gördüm ki, daha qoz-qoz oynamağın vaxtı deyil (9, s.172).

**Qoz üstünə qoz qoymaq** - bir dərdin, bir eybin üstünə daha bir dərd qoymaq.

Cəngin yarası toxtamamış zəlzələ gəldi,
Qoz qoydu qoz üstə, bu yazıq millati əzdi (178, səh.43).

**Qucağına atmaq** – ona sarı yönəltmək.

...İbrahim xatırladı ki, oğlunu Fəzlüllahın qucağına atan, onu dost Əmin Məhrəm edən əslində özü idi (144, s.43).

**Qudurasan qurbağa** – imkanından artıq iddiası olan adam.

Qudurasan qurbağa, gəldi bizi udmağa. Özü üçün umac ova bilmir, özgə üçün əriştə kəsir (72, c.III, s.150).

**Qu kimi** - çox yüngül, gözəl, yumşaq.

**Quqquluqu** - arıq, bir dəri, bir sümük.

**Qulağa pambıq təpmək** - eşitməmək, bir sözə qulaq asmamaq.

**Qulağını kəsmək** - kələk gəlmək, əlindən var-yoxunu almaq

Yenə kimin qulağını kəsibsən? (129, s.60).

**Qulağı batmaq** – çox uca danışmaqdan.

A kişi, təngə gətirdi məni vallahi bu naqqal şüəralar, hətərəndən, pətərəndən nə bilim boymadərəndən, necə sərsəm danışırlar qulağım batdı, nə çox-çox danışırlar..(267, s.315).

Gözlər asılı, yox nə qaraltı nə də bir səs,
Batmış qulağım gör nə düşürməkdədir darı (80, c.II, s.251).

**Qulağı çalmaq** - eşitmək, duymaq.

Qulağı nə çalırdısa, bütünlükdə bunun hamısının ona dəxli vardı (84, s.71).

**Qulağı darı dənləmək** - hər şeyə qulaq vermək, diqqətlə qulaq asmaq.

Gözləri dağ dəlirdi, qulağı darı dənləyirdi (84, s.359).

**Qulağı dinc** – sakit, heç kimin minnətini çəkməmək.

Əşi..o heç, deyirəm bəlkə qulağımız dinc olsun (9, s.160).





**Qulağı qırmızı** - utanmaz, həyasız.

**Qulağımın dibindən keçdi** - xətər nə qədər yaxınlaşsa da, mənə zərər vura bilmədi.

**Qulağım səs verir/ cingildəyir** - haqqında danışırlar.

Qulağım zəng çalır, fikr edirəm sən gəlirsən
Necə ki, fikr eləyir qafiləsalar Cərəsə (255, s.151).

**Qulağının ardı zəfəranlı** – biz son deyən deyilik.

-Ağabəy, adını da bilmirəm, bizə zəfəran göstərməyin, bizim qulağımızın ardı zəfəranlı deyildir (80, c.II, s.293).

**Qulağının dibinə ölçmək** – sillə vurmaq.

Bir dənə ölçərəm qulağının dibindən, bir dənə solaxay qoyaram əngindən (9, s.143).

**Qulağının dibini görmək** - qeyri-mümkün olan şey, mümkün olmayan bir işə işarədir.

Nikolay hökumətini yıxanı, hələ anasının qarnından çıxan görməmişəm. Qulaqlarının dibini görərlər, Nikolayı yıxmaq istəyənlər (29, səh. 52).

**Qulağın gəlməsi** – inama görə bu halda evə qonaq gələr.

**Qulağın minbərdədir?** - sözə qulaq asırsanmı.

**Qulağın səsdə olmağı** - xəbər gözləmək.

Qulağım səsdədir olan belə zənn edirəm,
Yardan elçi gəlib yenə, xəbər var yenə də ( Qüdsi)
Qulağı səsdə olar qulağı qalar yolda,
Aydın səhərin carçısıdır dan yeri bir bax ( H. Möhsüni).
Şirvanda xəstə mənəm,
Xəstəni bəslə, mənəm.
Gözləri yol yorğunu
Qulağı səsdə mənəm (38, səh. 145).

**Qulağı tüklü** - yaşı keçmiş, zamanın istək və arzularına uyğun düşünməyən

Düz müsəlmana deyirdik qulağı tüklüdür bədbəxt,
İndi bax gör ki, o düzlük də müsəlman ilə getdi (Şəhriyar).

**Qulaq günahkarı** - deyilən sözü birindən eşidib, düzlüyünə arxayın olmadan təkrar etmək.

Bilmirəm düzdü yalan, hər nə desə özgə deyib

Mən günahkar deyiləm olsa günahkardı qulaq (A.Sabiri)

**Qulaq kəsmək** - pul almaq, gözünü qorxutmaq.

**Qulaqları elə bil kababpəz yelpiyidir** - həddən artıq yekə qulaqlı.

**Qulaqların ağırlaşması** - qocalmaq əlamətidir.

İnsan qocalmış olsa, qulaqlar ağırlaşar,
Sanki yazıq qulaqda guruldur zaman səsi (306, səh.116).

**Qulaqların qızışması** - qulağına söz girməmək, deyilən sözə baxmamaq.

**Qulaqlarını sallamaq** - küsmək, kefsiz olmaq, bikef olmaq.

-Niyə eşşəyin qulaqları şuş tutmayıb, sallanıb.
-Molla: O da sizin kimi təcdid gətirib (qəbul olunmaq üçün lazım olan nömrədən az gətirən adama deyilir).

**Qulaq yatırt** - eşit, fikrini topla.

**Qul xətasız olmaz, ağa kərəmsiz** – insan bağışlamağı bacarmalıdır.

Bağışlar, əlbəttə səhv olan vaxtı (32, s.50).

**Quli-biyabanı** - tək-tənha, əfsanəvi bir qorxunc məfhum.

Bu əmri mühəqqəqdir ki, biz milləti- İran
Xortdana və həm quli- biyabana inanmıq (301).

**Qulp qondarmaq** - eybi çıxartmaq, kələk gəlmək.

Görürəm, bu qurultay (Bakıda Türkoloji qurultay) məsələsinə və yeni türk əlifbasına «rəqiblər» yenə də qulp qondaracaqlar (195, 5-ci cild, səh. 127)..

**Quma quylanmaq haqqı** - Milli Hökumət dövrünəcən hər yerdə olduğu kimi Azərbaycanda da kəndlinin və işçinin qanı sorulmaqda idi. Onlar gələndən sonra kargərlər12 saat əvəzinə 8 saat işləmək qanuni olub və yayda istirahət üçün onların Urmiya və Ənzəli bəndərinə gedib orada dincəlmək haqqı var idi. Quma quylanmaq dəryaya getmək haqqı demək idi.

**Qum göyərəndə dəvə buynuz çıxaranda** - heç vaxt.

**Qumluq yerə su bağlamaq** - faydasız iş görmək.

**Qum səpmək** - mane olmaq.





**Qundaqdan şıxmaq** – yaşı az.

Qundaqdan dünən çıxıb, mən bu səhnədə neçə ildi can çürütmüşəm. Xüsusi məktəb yaratmışam (72, c.III, s.84).

**Qupqupu çəlik** - çox arıq, eybəcər.

**"Quran"dan köynək geymək** - and içmək, ölməz olmaq,

Səttərxan vurub eynəyi,
"Quran"dan geyib köynəyi.

**"Quran"dan köynək də geysən inanmaram** - Nə qədər and içsən də inanan deyiləm (danışıqdan).

**Quraza** - işdən düşmüş, qocalmış, yorulmaq, istifadəyə yararsız.

Qocalanda olar insan quraza (168, s.30).

**Qurbağa gölünə daş atmaq** - sükut, səssizlik, hamının susması.

Sanki qurbağanın gölünə daş atmışdılar (84, s.172).

**Qurban gözü qorxana kar kəsər, bağrı çatlayana yox** - iş-işdən keçəndən sonra heç bir xeyirxahlıq nəticə verməz

**Qurban gözünü boğaza sürtmək** - qurban kəsilən heyvanın gözü inama görə, şəfavericidir.

**Qurd** – zirək, bacarıqlı.

Gör nə qurddur ki, qaçar ondan əcəl! (75, c.IV, 122).

**Qurda dayı deyir** - qorxudan bir sözü qəbul etmək.

**Qurda gedən** - qorxmaz, igid, yaman gündə xalqı müdafiə edən.

Yenə millət özüdür, öz halına ağlayacaqdır, dözəcək dərdə müsibətlərə dözmüş babalar tək,
Şanlı ellər, obalar tək.
Qorxmayıb qurda gedən, hər zaman aslan balalar tək (338, s..152).

Qurda gedən itlər də ki yox el-obamızda,
Qurdlar aparar şəngilimiz-məngilimizdən (338, səh. 31).

**Qurd ağzından almaq** - zalimlərdən, quldurlardan heyf almaq, intiqam almaq

Onda sən də atı minib çaparsan,
Öz həqqini qurd ağzından qaparsan ( Şəhriyar).

**Qurd bazarı** - xəlvət yer, qədim zamanlarda Qurd meydanı, ya Qurd bazarı adlanan yerlərdə türklər tərbiyə olunmuş qurtları güləşdirərlərmiş. Azərbaycanın çox yerində şəhərlərdə bu ad qalır.

Quzuçu, mal dili, xər meydanı, üç görməli oymaq,
Doludur qurd ilə qurd bazarı, dullar kimi yarpaq (Pirimuğan, s.17).

**Qurddan qorxan qoyun saxlamaz** – bir işin təhlükəsini nəzərdə almaq.

Qurddan qorxan qoyun saxlamaz, mən ölümü gözümün qabağına alıb Türkmana- qılınc zoruna qız gətirməyə gedirəm. Siz məni Ərəbzəngi ilə qorxudursunuz (35, s.254).

**Qurd dedik, qulağı çıxdı** - adını çəkdik, özü gəldi.

**Qurd dişi** - silah, tank, top.

Biz məclisi-müəssisanımızın verdiyi elamiyyə və deklarasiyonu Tehrana göndərib haqqımızı istədik, Tehran cavabında bizi qurd dişləri, yəni tank və silah ilə təhdid etdi" (30, 1324).

**Qurd doğan havadı** - əsatiri inama görə, yağışla gün bir yerdə olanda qurt doğarmış.

**Qurd dumanlıq axtarar** - birinə zərbə vurmaq üçün fürsət dalısınca düşmək.

Qurd tək kim istəyir olsun, daim hava dumanlı,
Kaş arzusu gözündə qalsın, gözü, kor olsun (338, səh. 35).

**Qurd əli** - Türklər qurdu müqəddəs saydıqları üçün qurd pəncəsindən müalicə vasitəsi kimi istifadə edirlər. Xəstə, qorxmuş, boğazı gəlmiş adama qurdun pəncəsi ilə vurmaqla onun sağalması üçün çalışırlar.

**Qurt qocalanda itlərə güləcək olar** – igid adam yaşa dolanda, iqtidarını əldən verəndə gülünc olar.

**Qurd qocalanda s...ə kəpənək qonar** - gücdən düşəndən sonra başqalarına məsxərə olar.

**Qurd quzu ilə otlayır** - əmin-amanlıq, zahiri sakitlik.

Sakitlikdi, cənab! Qoyun quzu ilə otlayır (254, s.12).

**Qurdla qiyamətə qalmaq** - çox qocalmaq.





Türklərin inamına görə, qurd ölməzdir. Çox yaşayan adama belə deməklə onun uzun yaşadığına işarə edirlər.

Ey əzəldən vurub, yorub Nəsiri,
Qurd ilən axıra qalan dünya (241, s.65).
Bu ölsün, sən qal qurdnan qiyamətə (335, s.77).

**Qurdla qoyun olmaz, qılıncla oyun** – təhlükəni nəzərə almaq lazımdır.

Qurdla qoyun olmaz, qılıncla oyun (103, s.67).

**Qurdlar dövlətindən quşlar da yeyər** - igidlərin zəhmətindən adi adamlar da bəhrələnər.

**Qurdları qaynadı** - paxıllığı tutdu. Başqasına sevgidən narahat olmaq.

**Qurdlu kalah/ qurdlu qıra** - paxıl, gicikli.

**Qurd nə bilir, qatır bahadır** - zəhmət çəkməyən adam xalqın alın təri ilə ələ gələn şeylərin qədrini nə bilir.

**Qurd olmaq** – igid, qorxmaz.

Çətin bir yolu getməyə hazır ol, çalış gah quzu, gah da qurd ol, oğul! (100, s.138).

**Qurd özü üçün işlər, it çoban üçün** - biri özü üçün ürəkdən, biri isə başqası üçün yalandan işləyir.

**Qurd özündədir** - günahı özündədir.

**Qurdun gözünü qorxudan dəyənəkdir** - düşmənə zor gücünə qalib gəlmək olar.

Qurdun gözünü qorxudan olsa dəyənəkdir (M.Əmini).

**Qurdun yeriyi başlanan zamandır** - Azərbaycan əsatirinə görə, qurd türkün əcdadıdır. Böyük çillə başlanan gecə qurd adam ətinə yeriklər.

**Qurdu ulamaq** - işləri düzəlmək, xoşbəxt olmaq.

**Qurd ürəyi yemək** - çox cəsarətli olmaq, qorxmamaq.

Türklər oğulun igid olması və qızın gözəl olması üçün oğlana qurd ovlayıb ürəyini, qıza isə ceyran ovlayıb onun ətini yedirdərdilər.

Bu ənənə bir neçə il bundan qabağa qədər ikiyə bölünmüş Azərbaycanın güneyində yaşamaqda idi.

**Qurd üzlü olmaq** - Türk mifologiyasında türk qurddan törəmə olur. Buna görə də Qurd bizim şifahi xalq ədəbiyyatında, igidlik, qorxmazlıq simvolu kimi işlədilir. Atalar sözü var ki, «Qurd üzü mübarəkdir».

**Qurdu ulamaq** - xoşbəxtlik əlaməti, taleyi üzünə gülmək, işlərin düz gətirməsi.

**Qurd yağı sürtmək** - mövhumata görə, bir adama qurd yağı sürtülsə, onun işləri pisləşər, adamlarla münasibətləri korlanar.

**Qurğuşun, ya mis olmaq** - keçən zamanlarda qurğuşun, ya mis ən möhkəm və dözümlü metal növü idi.

De görüm bir mənə, xudavəndə,
Bu bədən qurğuşundu, ya misdi? (80, səh. 38).

**Qursaqlı adam** -hər möhnətə dözən, söz saxlayan.

**Quru ah** - əlimdən ancaq ah-nalə gəlir.

Əlim boşdur, məndən quru ah istə,
Gecə-gündüz mən ah çəkim ah üstə (349, səh. 16).

**Quru bəy** – keçmiş imkanlarını əldən verməyinə baxmayaraq, yenə də fors içində yaşamaq istəyənlər. Varı-dövləti olmayan, amma yalandan özünü bəy kimi aparan. Əlindən ancaq buyurmaq gələr.

Şərif bəy adlı birisi iki ilin içində mal-dövləti elə dağıtdı ki, ancaq "bəy" adı qaldı. Necə deyərlər, Şərif bəy "quru bəy" oldu (13, s.295).

Hər ol bir kimsə kim əhli səxadır,
O kəs Simürğdür, ya kimiyadır.
Tapılmaz mülkü-imkanda vücudu,
Bəradərcan, quru adın nə sudi? (S.Ə. Şirvani, s.74).
Mən fəzilət sahibi olsam da yoxdur dövlətim,
İndi dövlətsiz fəzilət bir quru addır, aman! (163, s.83).

İrəvan əyanları hələ də babalarından qalan özlərindən razıqalma xəstəliyinə tutulmuşdular. Ermənilər bunları məhv etmək xəyalında olanda, bunlar qurubəylik iddiasında idilər (232, səh. 31).





**Quru-boş sözlər** - dərdə dəyməyən sözlər, mənasız sözlər.

Bir quru boş baş sağlığı,
Başqa bir şey görəmmədim (282, səh. 134).

**Quru kəllə** - şüursuz, ağılsız. Düşünməz adam, bilməz, anlamaz, qocalmış.

Əgər fərz eyləyək bir quru kəllə, içi boşdur,
Olsa nəmənə bil ki, qəbuldur, bizə xoşdur ( M.Etimad).

**Quru qəfəsi qalmaq** - dərddən ərimək, fəlsəfi baxımdan qəfəs canın qəlibidir. Ruhu ölüb, quru canı qalmaq. İnsan mənəvi güc və eşqdən məhrum olursa, o, canın əldən verib yalnız qəfəsə malik olur.

Dünyanın bir adı quru qəfəsdir,
Ona könül bağlamaq tam əbəsdir.
Bu sözü söyləyən Şah Abbasdır,
Bu dünya kimsəyə qalmaz, əfəndim ( Şah Abbas).

**Quru-quru qurbanın olum** -yalandan dil tökmək, zahirdə yaltaqlanmaq, əslində heç bir yardım etməmək.

**Qurumsaq** – namussuz, sözünün üstə durmayan.

- Mən xanzadəyə qurumsaq olmağı məsləhət görməzdim (253, s.443).

**Qurunun oduna yaş yanır** – günahı olmayan bir adamın bir başqasının günahına görə əziyyət çəkməsi.

Bəzən qurunun oduna yaş da yanır (1, s.197).

**Qurut əzərik, ona da dözərik** -məqsədə, hədəfə çatmaq üçün hər çətinliyə dözərik.

**Quru yerdə şan bağlamaq** -bacarıqlı adam, heç zaddan bir zad düzəldən, yaşam üçün çalışan.

İki könül bir-birini istəsə
Arı kimi quru yerdə şam bağlar ( Sara Xatın).

**Quşbazlıq eləmək** - yuxarıya baxa-baxa danışan, ayağı altına baxmayan.

**Quşbeyin** - ağlı az, hər sözə inanan.

**Quş bişirmək** – qorxmaq.

Cürət eylə, çıx çölə

Çox da bişirmə quş, bala (69, s. 43).

**Quş dili oxumaq** - birinin ürəyincə danışmaq.

Heç kimsə Nəsimi sözünü kəşf edə bilməz,
Bu quş dilidir, anı Süleyman bilir ancaq (225, s.41).

**Quş qanad çalmayan yer** - uca, əlçatmaz, təhlükəli yer.

**Quş südü** - məcazi mənada az tapılan, nadir bir şey.

Yem üçün gələr quş bu gözəl yurda
İstərsən quş südü, taparsan burda (Nizami).

**Quş uçurtmaq** - quş uçurtmanın məcazi mənası göyə, o yan- bu yana qulaq asmaq.

**Quşu əldən ötürüb biyah-biyah çağırır** - yəni fürsəti əldən verəndən sonra gözləyir ki, yenə əvvəlki imkanı ələ keçirsin.

**Quşu gözündən vurmaq** - düz mətləbə toxunmaq, sözü yerində işlətmək, demək.

Yaralama, qol-qanadından
Quşu da vurasan gözündən gərək (328, s.84).
Mən quşu gözündən vuraram deyə,
Ötəri bir nəzər salardım göyə (325, səh. 112).

**Quş ürəkli olmaq** – qorxaq.

Əşi, sən də lap quşürək imişsən, sən tərəqqi axtarsan, gərək qorxmayasan ("Yol", "Kənd uşağı").

**Quş ürəyi yemək** - ən gorxaq.

**Quş yuxulu** - sayıq yatan, tez-tez ayılan, balaca bir səsə oyanan.

Ümumiyyətlə, körpə uşağın yuxusu ayıq yatan adam mənasında.

Başı qarlı bir Savalan donmayıbdır,
Haray çəkən gözlərinə yuxu quşu qonmayıbdır (235, səh. 59).
Beşikdəki quş yuxulu körpələr,
Dodaqları süd qoxulu körpələr,
Babaları dağdan ulu körpələr ( S.Rüstəm).
Yuxum elə bil ki, quş yuxusudur,
İtdi rahatlığım, xam fikrə getdim (80, c.II, s.273).





**Qut-qutu** - eyib çıxardan hər zadı söz edən.

**Qu vurursan, qulaq tutulur** - ən sakit, səssiz-səmirsiz məkan. Çöl, bərrü-biyaban, sükuta qərq olmuş yer.

Nə bir çıraq işığı görünürdü, nə də ki bir xoruz banı, it səsi eşidilirdi (F.Xoşkinabi, s.178).

Zaman səsindən savayı
Qu vurursan, qulaq tutur (114, səh. 10).

**Quyruğu ilə qoz sındırmaq** - ən uğurlu, güclü olmaq, xoşhal olmaq.

**Quyruğu qapı altında qalmaq** - çıxılmaz, pis vəziyyətə düşmək, işi çətinə düşmək, tutulmaq, köməyə ehtiyacı olmaq.

Azərbaycanda Milli hökumət dövründə Kürdüstan Milli Hökuməti ilə bütün sahələrdə dostluq və iş birliyi müqaviləsi bağlanmışdı. Onlardan biri də Kürdüstanda yaşayan türklər Mahabadda xilaf iş görən zaman onların Azərbaycana təhvil verilməsi və orada mühakimə olunması barədə idi. Buna görə o adamlar üçün belə bir söz yaranmışdı: Nə qeyrirdin Mahabadda, Quyruğun qala qapı altda.

Çox yaxşı xatırlayırlar ki, şah 1944-45-ci illərdə bəzi rövşənfikirlərə görüşlərində dönə-dönə deyirmiş ki «mən də kommunistəm». Şah o zaman bu sözləri ona görə deyirmiş ki, xalqımızın dediyi kimi, quyruğu qapı arasında idi. Xalq hərəkatı güclü idi, fədai dəstələri Qəzvinə yaxınlaşırdı (115, № 5, səh. 5).

**Quyruğu qapı arasından çıxmaq** - işini yola salmaq, dünənki ağır vəziyyəti yada salmır.

**Quyruğu qısıq it** – qorxmuş.

Mayor əvvəlcə üstümüzə şeşələnmək istədi, sonra fikrini dəyişdi... quyruğu qısıq it kimi uzaqlaşdı (310, s.363).

**Quyruğunu belinə qısmış qurd** - acizləşmiş, gücdən düşmüş.

**Quyruğunu qıçının arasına qoyub qaçmaq** - pis vəziyyətdə, qorxa-qorxa qaçmaq.

**Quyruq bulamaq** - yaltaqlıq etmək, birinə yalandan sevgi göstərmək.

İt də görər varlını, quyruq bular (168, səh. 58).

Harda bir nur görürsək ona qarşı olarıq,
Bəzinə diş qıcıdıb, bəzinə quyruq bularıq (267, s.237)

**Quyruq ələ verən deyil** - razılığını ələ gətirmək, bir iş görəndə tapmaq asan deyil.

**Quyruq pursutmaq** - naz-işvə etmək.
Görürsən qürbeyi miskin bir az ətdən ötür,
Quyruğun pursudur, həm ağzın əyir, Məmmədəli! (301, s.149).

**Quyruq sallamaq** - yəni yaltaqlanmaq, ikiüzlülük etmək.
Bir alçağa qarşı quyruq sallayan,
O alçaqdan daha səfildir, inan (145, s.334).

**Quyu qazan özünü quyunun təkində görər** – özgəsinə quyu qazan, pisliyini istəyən özü yaman günə düşər.
Nərbala" başqası üçün quyu qazanın özünü quyuya salmaq lazımdı" dedi (148, s.69).

**Quyu qazmaq** – birinə tələ qurmaq.
Qazır mənə quyu Sumbat,
Gah quzeydən, gah güneydən (328, s.48).

**Quyuya su tökməklə sulu olmaz** – bir şeyin gərək əsli-kökü olsun.
Yadına saldı ki, su gərək quyunun dibindən çıxsın, quyuya su tökməklə sulu olmaz (9, s.37).

**Quz- balaquz** - günah üstündən günah etmək.
Bir pis işin nəticəsini aradan qaldırmaq istədikdə daha böyük bir pis işə əl qoymaq.
Əgər oğlan düşə qız ardıca heyrət yeri yok,
Quz-balaquz odur qız düşə qızbaz dalıca (168, s.264).

**Quzğun** – müftə yeyən, hazıra nazir.
Əti çox istəyirəm, leyk pulu ondan çox,
Nola quzğun kimi ta müftə qonam leşə, ətə (267, s.81).

**Quzu cildinə girmək** – özünü yazıq, məzlum göstərmək.
Hər axmağı, xamı quzu cildində soyardım,
Həq söz deyənin canın alıb çeşmin oyardım (267, s.39).

**Quzu keçi** – şüursuz, dərindən düşünməyən.
Tanrı buna şahid,





Quzu-keçiyik biz (267, s.17).

**Quzunu qurd əlinə tapşırmaq** - düşmən əlinə vermək.

**Quzu ömürlü** - qısa ömürlü, açılmamış solan.
İndi qudurğanlar uzun ömürlü,
Fağırlar yenə də quzu ömürlü ( M.Araz).

**Quzu tək** - mülayim, məzlum, mehriban, sözəbaxan, bəzən də təslim olan, hər kimə boyun əyən.
İstədim quzu tək körpə sözləri,
Yolların üstünə düzdüm, a dağlar (311, səh.145).

**Quzu və qurd olmaq** - zamanın istəyi əsasında dosta quzu kimi, düşmənə qurd kimi olmaq.
Çətin bir yolu getməyə hazır ol, çalış gah quzu, gah da qurd ol, oğul (100, səh. 130).

**Qürbətə salmaq** -- bu sözə inanın.
Qürbətə salmayın atalar sözün
Boğaza sürtməzlər hər qurban gözün ( Sönməz, s.82).

# -L-

**Lağ-lağı nəzər** - bizim müsəlmanlar isə ermənilərin işinə barmaqarası lağlağı bir nəzərlə baxıb, meydanlarda düzəltdikləri qorunma yerlərini cocuqlar bazısına bənzədirlər (232, səh.91).

**Lahıc Modlu çaxmaxlı tüfəng** -dərdədəyməz, əsrin texnologiyasından geri qalmış silah. Ermənilərin sürətlə atan tüfəng almasını görüb də babadan qalma Qara Mahmud Lacıh modelində çaxmaqlı tüfənglərini də ermənilərə münasib qiymətlə satan əcaiblərə insan adı verməyi də özünü böyük bir xətaya salmaq hesab edirəm (232, səh.91).

**Laqqırtı vurmaq** – deyib gülmək.

Siz axı bu adamların laqqırtısına nəçin qulaq asırsınız (72, c.III, s.86).

**Lalam lal, karam kar** - heç nə görməmisən, heç nə eşitməmisən.

**Lalapitik** - yəni sözü çeynəyən və düzgün dilə gətirə bilməyən adam.

Yadımdadır o qızla lalapiti söhbətim,
Kəlməni kəlbətinlə qəlbindən çıxardığım (264).

**Lal xoruz** - bacarıqsız, danışa bilməyən.

Lal xoruz tək vədəsindən banlayır,
Pis işində öz-özünü danlayır (16).

**Lalın dilini anası bilər** - hər kəsin dilini bilən var.

**Lam-cim oturmaq** - səssiz, sakit.

Lam-cim oturdum yerumdə, heç bir söz demədim (129, c.I, s.38).

**Lampa dəvəsi** - çox böyük.

İnqilabdan əvvəl Bakıdan lampaları dəvə ilə gətirirmişlər.

**Lap duz mədənidir** - çox duzsuz adam, rəftarını bacarmayan.

**Lay divar** - enlikürək, ucaboy.

Ömrünün 32 ilini Məhəmmədrzanın zindanlarında qəhrəmanlıqla keçirən Səfərxan Milli Hökumət dövründə Təbrizdə yeriyəndə deyərdin bəs lay divardı – yeriyir (danışıqdan).





**Lay-lay demək** - birinin ayıq-sayıq olmasına maneə törətmək, aldatmaq.

Bizə təsvib olunub nani-covin oldu hər an,
Zülmü gör ərşə dayandı, demə lay-lay mənə,
Baxıram özgə zamandır, demə lay-lay mənə (30, № 5).

**Ley kimi getmək** - lap yeyin, ildırım kimi getmək.

**Ley kimi qaçmaq** - ən cəld, yeyinliklə bir işi başa çatdırmaq.

Əziziyəm yar qana,
Yar danışa, yar qana.
Ley qovlamış quşam mən,
Sığınmışam yarğana (38).

**Leylac** - qumarbazların başçısı, zirək, dünyagörmüş.

**Leysan kimi** – güclü yağış.

Ələsgərəm, dərdim budur, ay ağa,
Eynim yaşı leysan kimi a yağa ( Ələsgər).
Anlarım var:
Leysan yağışı kimi yağmış
Köyrək bir insan qəlbinə
Bitirdiyi çiçəklər mükafatdır mənə (167, s.18).

**Lələ köçüb, yurdu qalıb** - bir insanın əzizi gedəndən sonra onun gəzdiyi yerlər qalıb, axtardığın şeydən bir nişanə qalmaması.

Əziziyəm tur dağlar,
Gəl boynunu bur, dağlar,
Gəlmişdim lələ üçün
Lələ köçüb, yurd ağlar.

Aşıq Ələskər kəndə qayıdanda gördü ki, lələ köçüb, yurdu qalıb viranə. Səhnəbanı gedibdi (14, I cild, s.183).

Ziyadxan neçə-neçə adamları ilə keşişin bağına daxil olub gördülər ki, lələ köçüb yurdu boş (35, s.479).

**Ləpəni demə düyünü de, dünəni demə bu günü de/ dədənlə dədəmi deyincə özünlə özümü de-** keçmişdə nə olub keçib, insanlar öz əməyinə, şəxsiyyətinə görə qiymətləndirilməlidir.

**Ləpə tayı daşıyır** - ağır işin altına girmək.

**Ləşini sərmək** - birini vurub döyəndən sonra yerə uzatmaq.

**Lifləmək** - Birinin cibinə girmək, başına beh qoymaq, xərc açmaq.

Qarabəxt dağlara dırmaşsa, düşərmiş dumana,
Dağda da qəm lifəlir, bağda da möhnət xayalır (168).

**Loğma ki var - boğmadı** – yaxşılıq etməklə hamını özünə qul edə bilərsən.

Bilirsən, qardaşoğlu, deyir loğma ki var- boğmadı (72, c.III, s.51).

**Lotu** - adam aldadan, kələkbaz, fırıldaqçı, ələ salan.

İskəndər Şeyx Nəsrullaha tərəf çönüb gəlir onun qabağına və istəyir əl versin. --Lotusan həyə, əl ver! (195, c.II, s.47).

**Lotunun axır məclisidir** - şuluq adamın, bir xalqa əziyyət verən adamın birdən gəlib yaxşılıq etməsi.

**Löhdodaq** - həddən artıq yekə və qalın dodaq.

Löhdodağın sallama çün vərdənə,
Sən bunu mindirdin əzəl gərdənə (168).

**Lülük- yoluq cücə** - gücsüz, arıq, paltarsız və qorxaq adam.

**Lüveynin dönməsi** - ənənənin dönməsi, əxlaqın dönməsi.

Ölsəydi acından biri etməzdi şikayət,
Xəlqin lövünü döndü olub yolçu təbiət (168).

**Lül-qənbər** - çox içkili, sərxoş.

Başqa məqalələrdə o gündüzlər oruc tutan, gecələr isə lül-qənbər oluncayadək şərab işən təbrizliləri məsxərəyə qoyurdu (197, s.136).

**Lül vurub, mil durub** – çox içib.

İştirakçıların kefi ala buluddadır, hamı necə deyərlər lül vurub, mil durub (9, s.13).

**Lüt götdən tuman oğurlamaq** –tamahkar.





# -M-

**Mahna axtarmaq** – bəhanə axtarmaq.

Özün bilirsən ki, prokuror səni dolaşdırmağa mahna axtarır (129, s.416).

**Malaqanlıq** – Malakan Azərbaycanda yaşayan bir millətin adıdır.

Yox xəbərin binəva, heç özündən sənin,
Lap malaqanlıq yağır girdə gözündən sənin (267, s.112).

**Malalamaq** - bir eybi, xətanı ört-basdır eləmək.

Özgənin eybin açardıq, vəli öz eybimizi,
Suvaq üstən malalardıq,
O da bir günlər idi. (168, s.826).

**Malbasan**- qanmaz, özgənin haqqını tapdayan, tənbəl, yoğun adam.

**Mal can yonqarıdır** – dünya malı çox əzizdi.

Mal can yonqarıdır (37).

**Malı çox, günü qara**- var-dövlətindən insan kimi bəhrələnməyi bacarmayan adam.

**Malıvı bərk saxla, qonşunu oğru bilmə** -mal bir yana gedər, iman min yana. Malı itən adam hamıya şübhə ilə yanaşar.

**Maliyyatı yoxdur ki?** - əgər bir nəfər ağzından çıxan sözü vaqeətlərə əsasən deməsə, belə deyərlər. Yəni müftə sözdü, danışır də.

**Mama iki olsa, uşaq tərs gələr** - məsuliyyət bəlli olmayan yerdə nəzmü-intizam əldən gedər.

**Mamız yarmaq** - böyümək; həddi-buluğa çatmaq, təzə qüdrətə çatmaq.

Hər zaman da rast gələndə
Təzə mamız yarmışlara. (291, s.66).

**Marağa basdığıdır, ildə bir dəfə gələr** - birindən təkidlə bir şey istədikdə vermək istəmədikdə belə deyilir. Basdıq undan, doşabdan düzəldilən, içinə badam qoyulan şirniyyatdır. Əsasən Novruz bayramında gəlir.

**Mara uğramaq** - ilana rast gəlmək,
400 ildən artıq Fars əyalətinin iqtidarında olan mənada qaşqay türklərinin arasında rəmzi mənada ən gözəl qıza, sevgiyə tuş gəlmək mənasında işlənir.
Bir əfsuna gəlməz mara uğradım,
Kaş ki, tuş olmuşdum bir özgəsinə (261, s.318).
**Marıtda durmaq** - fürsət gözləmək.
Düşünür hara cumsun? Harda marıtda dursun?
İndi kimin yanında kimin puçunu vursun (264, s.131).
**Mart çıxdı, dərd çıxdı** - Novruz bayramı ayı (9, s.135).
**Maskeş** - qəvvat, qurumsaq, alçaq adam.
Sülhü təxirə saldı ol maskeş Amrika rəisi-xunxarı (301).
**Maşa gətirin atılır** - bir cür yeriyən adama deyilir.
**Matahın matah olunca, bazarın bazar olsun** - bəxtin olsun, gərək işin uğurlu olsun.
**Matı-qutu qurumaq** –heyrətdə qalmaq.
Evə girmək istəyəndə gördü, heç onun cəddi babası da belə ev görməyib, matı-qutu qurudu (46, s.136).
**Matı meyxanası** - başsız, hər şeyin biri-birinə qarışdığı yer. Təbrizdə Xaqani xiyabanının əvvəlində Rəngli bazara gedən əldə bir meyxana vardı ki, onu Fatma adlı qadın işlədirdi.
**Matına düşmək** - fürsət ələ düşmək; yeri düşmək.
**Mavala getmir ki, qarnım acar** - çox qıtmır/xəsis.
**Mayası turş ayrandı** – zatıqırıq.
Mayan turş ayrandır, zatın qırıqdır
Söyüd ağacında bar ola bilməz (329, s.120).
**Maygülü** – istehza ilə işlənir. Gic, səfeh.
Əli- bu maygülüdü səninlə pəs düşən, bu ha? ((9, s.149).
**Mazili göt** - ağır işlərə girən adamın bacarığı, qətiyyəti, cəsarəti olsun.
**Meydan qızışdırmaq** -- iki tərəfi biri-birinin canına salmaq.
Bir qətə yer üstündə qopub bir yekə dava,
Meydan ki qızışdı, olarıq məhv sərapa (267, s.78).
**Meydan oxumaq** - birini hədələmək.





Keçi şərab içsə dəvəyə meydan oxuyar (333, s.246).
**Meymun oynatmırlar ki** – nəyə baxırsınız?
Xalq oyandı, biz hələ yatsaq, qiyamətmi qopar
Kef edib meymun zad oynatsaq, qiyamətmi qopar (72, c.III, s.230).
**Mədədən danışır** - ağılla danışmır, boş söz deyir.
Azəristandı bizim millətimiz, tarixə bax,
Mədədən söyləmirik, fikri dumanlı deyilik (69, s.42).
**Mədəsi hacı-şeyx mədəsidir** - hər şeyi bəyənməyən, hər şeyin yaxşısını yeyən.
**Mədəsi həzm eləmək** – qəbul etmək.
Lakin Qızıl Arslanın yaşadığı əsrin avam xalqının mədəsi heç bir vaxt bu bişirilməmiş və çiy məsələni həzm edə bilməzdi (234, s.454).
**Məəttəl müşkül qalmaq** -çarəsiz bir durumda qalmaq.
Mən Əsliyəm, məəttəl- müşkül gəzərəm,
Yeddi ildir Kərəm deyib gəzərəm (117).
**Məgər sənin gözlərin qaradır?** - sənin başqalarından nə üstünlüyün var?
**Məhəbbətdən mərəz hasil olar** – biri birini çox sevsə, bəzən onun ziyanına bir iş görər.
Məhəbbətdən mərəz hasil olur əlhəq,
Deyərlərmiş bu söz doğru sözə bənzir,
Deyənlər həq deyərlərmiş (347, S.267).
**Məhəmməd dağa tərəf gəlməsə, dağ Məhəmmədə tərəf gələr** – kiçik adam böyüyü saymayanda böyüyün ona diqqət göstərməsi.
**Məhəmmədhəsən qalıbıdır** - düz əyninədir.
**Məkkədən gələn mən, xəbər gətirən sən** – sən yalandan söz uydurursan.
- Yox, oğul, mən nə biləcəyəm? –dedi. Məkkədən gələn sən, xəbər verən mən? (253, s.394-395).
**Məkkədən gözü palçıqlı gəlmək** - özünü başqalarından üstün tutan, iddialı adam.
**Mələr qoymaq** - dağ çəkmək, ağlar qoymaq.

Odur anaları oğulsuz, bacıları
Mələr qoyan ( S.42).

**Mələsə, əti halaldı** - dilsiz-ağızsız.

Allahın ağzı otlu bir heyvanı idi, hamı deyirdi ki, mələsə, əti halaldır (129, s.438).

**Məmə yeyəndən pəpə yeyənə** - kiçikdən böyüyə.

Hamı meydana tərəf getdi, niyə başınızı ağrıdım, məmə yeyəndən pəpə yeyənə hamı meydanda idi (46, s.23).

**Mən bilirəm bu nə toxumdu** – onu yaxşı tanıyıram.

Naşı bilmə, tanıram mən nə toxumsan gedə son,
Bir qonaq gəlsə sənə, axşamadək işlədəsən (168, s.554).

**Mən deyirəm damdan-dama, o deyir cırığımı yama/** Mən deyirəm fədəm dəmə, o deyir damdan dama- mənim dediyimin əksini başa düşür.

**Mən deyirəm fədəm dəmə, sən deyirsən damdan dama** - sözü tutmayan, bir-birini başa düşməyən.

İndi işimizə dördgözlü baxın, bundan sonra ümid edirəm ki, teatrda rolunuza artıq diqqət edib "fədəmdəmə"yə "damdan dama" deməyəcəksiniz ( "Həyat", №117, 1906).

**Mənə bax nə gündəyəm, yara bax nə sallanır?**- iki bir-birinə zidd istək.

**Mənə cücə qoymaq/ basdırmaq düşməz** - təklif olunan işdən xeyir görmərəm.

**Mənə gecə gündüz birdir** - mənə heç nəyin fərqi yoxdur.

**Mənəm-mənəm demək**– özünü öymək.

"Mənəm mənəm" deyənlərin inanma çox da qövlünə,
Gərəkli gündə onların qıçındakı fərarı gör (267, s.53).

**Mənəm-mənəmlik** -özündən çox razı olmaq, təkəbbürlülük.

Nə zekanu mədənəm mən, nə "mən" m, nə "mən mən" m...

Birinci "mən" təriqətdə "ənəlhəq", "həq mənəm" fəlsəfi kateqoriyasına ikinci "mən mən" isə yenə təriqət fəlsəfi kateqoriyası olub şairin vəhdəti-vücuda qovuşmadığına, "özündə şey" olduğuna işarədir. Nəbati göstərir ki, nə haqqa çatmışam, nə də "maddi" aləmdəyəm." Yəni bu iki aləmin arasındayam (Ə.Hüseyni, s.182).





**Mənə su olmasa, sənə ki çörək olar** - Qacar şahlarından Ağa Məhəmmədşah suyun iqtisadda və silahın savaşın taleyini təyin etməsində rolunu bilərək ölkənin abadlığı üçün İrəvanın Bayat tayfasından Hacı Mirzə Ağasını bu işə məsul edir. Onu bir tərəfdən top tökdürməyə, bir tərəfdən də ölkənin abadlığı üçün su çıxartmağa məsul edir. Bir gün Hacı Mirzə Ağası qazılan quyuların birinin üstünə gedib quyunun təkində olanların söhbətinə qulaq asır. Quyunu qazan deyir: axı, köpəkoğlu, daşdan da su çıxar? Hacı Mirzə Ağası əyilib quyuya deyir: əgər mənə su çıxmasa, sənə ki çörək çıxır, niyə narahatsan?·

**Məngənə tək sıxmaq** – həyatın ağırlığı.

Əfsus, məni məngənə tək sıxdı Marağa! (168, s.24).

**Mən girən kol deyil** – bu işi mən görə bilmərəm.

Ora mən girən kol deyil, yoldaş Namazzadə (1, s.112).

**Mən Haşıma gedəcəyəm, öz başıma gedəcəyəm** - qız öz sevdiyi adama getmək istədikdə, çox israr etdikdə deyilir.

**Məni deyəsən, özünü yeyəsən** - mənim arxamca nə qədər danışsan, ziyanı özünə çatsın.

**Məni iynə elə, yaxava sanc** - məndən ayrılma, məhəbbətini kəsmə.

**Mənim nə götümə yaraşır** - bir adam öz imkanından yüksək bir iş görmək istədikdə, kasıb baha bir şey almaq istədikdə deyilir.

**Mənimkini yeyək, səninkini oynadaq** - başqasından öz xeyrinə istifadə edən.

**Məni sənin qəbrinə qoymayacaqlar ki..** - birini danlayanda ki, niyə günah eləyirsən, belə cavab verər, yəni hərə öz əməllərinə cavabdehdir.

Vəcini qoysalar gər qəbrinə, sən onda danış,
Mən əgər talibi-küfrəm, ya dəyanət, sənə nə? (255).

**Məni yeyirlər** - var-dövlətinə, uğuruma görə başqalarının bir adamın arxasınca danışması.

**"Mən mən" deyən** – özünü öyən.

Böylə mən-mən söyləməkdən söylə, ey mən mən kiməm? (99, s.65).

**Mən mən deyiləm** - bir şeyin həqiqi mahiyyətinin inkar olunması.

Doktor əfşarların "Ayəndə" məcəllələrində buyururlar ki, biz azərbaycanlı deyilik. Biz yoxuq. Biz biz deyilik. Onlar bizi oğru kimi soyundururlar. Var-yoxumuzu əlimizdən alıb özlərinə çıxırlar.

**Mən onu heç ölü eşşək yanına da aparmaram** - ad çıxartmağına görə savadsız, bacarıqsız adam haqqında işlənir.

**Mən ölüm, sən öləsən** – çox təkid etmək.

Xülasə, mən ölüm, sən öləsən ilə boynuna qoyurlar (72, c.III, s.284).

**Mən ölü, sən sağ** – dediyim sözün düzlüyünü görəcəksən.

- Mən deyən olacaqdır, Nazı xanım! Mən ölü, siz sağ, görərsiniz ( 253, s.319).

**Mən təndirə girən seyid deyiləm** - məni aldada bilməzsən.

**Mən söz kefilsiyəm** - bir ağır sözdən, töhmətdən kədərliyəm, təsirlənmişəm.

**Məsciddə başmağını tapa bilməyən** – bacarıqsız.

**Məscid eşşək bağlamalı yer deyil** -sən burda qoçuluq eləyə bilməzsən.

**Məscidin qapısı açıqdı, itin həyasına nə gəlib?** - sənə hörmət edirlər, özünün abır-həyana nə gəlib?

**Məscid qapısıdır, nə sındırmaq olar, nə yandırmaq** - pis övlada və qohuma deyirlər.

**Məscid osdurmalı yer deyil** - burda başqasına zor demək, kimsənin haqqını tapdamaq olmaz.

**Məsləki qara** - tutduğu hünər də dərdə dəyməz, hər şeyi ürəyə yatmayan.

Bir adam ki, könül qara, məslək qara, üz qara (30, s.3).

**Məşhər olmaq** - bir çox yaxşı, yeməli, dadlı bir şey, yaxşı bir oyun, hadisə, bir də çox pis, xətərli bir hadisə.

"Məşhər" ərəb sözü olub qiyamət mənasında işlənir.





Bir yemək bişirmişdilər, məşhər idi.

**Mərənd qovğası** - şuluq yer, aləmin bir-birinə qarışdığı yer.

**Mərcıməksifət** -sözünün üstündə durmayan, tez-tez sözünü dəyişən.

**Mərifət yığıntısıdır** - anlağına görə hər cür fədakarlıq edər.

**Mərsiyə yazmaq** - ağlayan uşağa deyilir, yəni səsini kəs!

Bu gün mərsiyə oxumaq şəklində yaşayır. Biri haqqında, ölməsi münasibəti ilə deyilən, yaxud oxunan şer.

**Məzacı soyuq** – uşaqbaz.

**Mıxa-nala döymək** – ikiüzlülük etmək.

Bəziləri tək gah mıxa döy, gahi də nalə (72, c.III, s.279).

**Mıxı mismar eləyən var** – vəziyyət həmişə belə qalmaz.

Səhərlərə hamilədir,

Mıxı mismar eyləyən var (328, s.106).

**Mıxı möhkəmləndirmək** - uğur gətirmək, gəlir yerinin möhkəmlənməsi.

Qan tökən adamların, hakimlərin bir ölkəyə müsəlləț olması.

Hələ kudəta hökuməti ölkənin hər bir yerində öz istədiyi kimi mıxını yerə çalıb möhkəmləndirməmişdi (212, s.69).

**Mıxlamaq** - çoxlu şərab içmək.

**Mıxlanıb qalmaq** – bağlanmaq.

Midhətin səfəri məni Bakıdan tərpənməyə qoymur, bu istidə mıxlanıb qalmışam (197, s.177).

**Mıxlanmış** - yerindən tərpənməyən.

Sən harda unutdun fəsillərin adını,

Ürəklərindən ağaclar mıxlanmış fəsillərin (Lalə Cavanşir, s.8).

**Mırığa deyir, çırağı püflə** - şəraiti olmayan adamdan qeyri-mümkün iş tələb etmək.

**Mırtdanmaq** -deyinmək.

Öz-özünə mırtdanır. Çəyirtkənin qulaqları nəyimə lazımdı? (195, II, s.124).

**Mırt çıxıb yoğurt ağacına** - zarafat, şuxluq həddini aşıb.

**Mırtının başı yarımdı** - o deyən sözlər şuxluq əsasındadır, doğru deyil.

**Mısqıra-mısqıra** –ucadan, hökütmə vura-vura ağlamaq.

Baharın qəmli qızı mısqıra-mısqıra dağı çulğadı. Dağ itdi, göz yaşına batdı (204, s.22).

**Mısıq it** – yer altından yasa gedən, ikiüzlü, daxilini başqalarından gizlədən.

**Mısmırığını sallamaq** – qaşqabağını sallamaq.

Nədi a kişi qırığı, nə mısmırığını salamısan? (101, s.202).

**Mısmırığı açılmaq** - kefi durulmaq, sevinmək, qırışığı açılmaq.

**Mızqançılar dəstəsi** -zütutanlar, ara qızışdıranlar, yalandan ağlayan uşağa da "mızqanını kəs!" deyərlər.

Birinci dəfə olaraq Nəsrəddin şah Parisdən qayıdanda bir nəfəri özü ilə gətirdi və müzik dəstəsinin məsulu etdi ki, bu gün Avropada olan kimi şahın rəsmi görüşlərində və ya orduya baxan zaman müzik çalınsın. Şah bunlara mızqançı ləqəbi vermişdi.

**Mızraq çuvala sığmaz** – gün bulud altında qalmaz, xəlqdən heç bir həqiqəti gizlətmək olmaz.

**Midilənmək** - yalandan başını girləmək; özünü məşğul göstərmək.

**Milağı /milabı içinə düşüb** - dinib danışmır, sakit, kədərli durub.

Göllərdə suyun axıb gedən yerinə boru yekəlikdə bir ağac qoyardılar ki, su dayansın. Bura milab deyərdilər. Onu çıxardan zaman su səslə axardı.

**Milçək bir şey deyil, könül bulandırar** - kiçik bir şey insanın qanını qaralda bilər.

**Milçək qovalamaq** - işsiz olmaq, avaralıq etmək, alış-verişi uğurlu olmayan.

**Milçəkdən fil qayırmaq** - kiçik bir şeyi böyüdüb böyük məsələyə çevirmək.





**Mil durmaq** - öldürülmək; ayaq üstə dayanmaq; qulluğunda dayanmaq.

Ondan gör ki, bunlar o əfəl Bağırın qabağında ələm yesir olub mil durublar (9, s.172).

**Minarəyə xərci çıxmaq** - həddindən çox xərci çıxmaq.

Minarəyə xərci çıxmayan elə bilir yerdən göbələk çıxır. Ac qalmamısan, acların dərdini biləsən? (77, s.17).

**Minbərə çıxmaq** - xalqa öyüd- nəsihət vermək, başqalarına danışmağa imkan verməmək.

Taxta çıxmaq istəməz Mənsur olan, ya minbərə;
Hər ki Mənsur oldu çıxdı şahi-eşqin darinə (225, s.71).

**Min dona girmək** – simasız, hər gün bir fikrə qulluq edən.

Sifətin dəyişir sənin anbaan,
Min dona girirsən bir gün içində (328, s.114).

**Mindirsən itinin belinə, mindirirəm atımın belinə** - mənə kiçik bir hörmət eləsən, mən ondan da artıq hörmət edərəm.

**Minib kəllədə oturmaq** - birinin başına çıxmaq, üz görüb qudurmaq.

**Minmək** – başına oyun açmaq.

Minmişəm onları hər bir tərəfə mən sürərəm,.
Hər nə onlar qazanır, mən yeyərəm, kef görərəm (80, II, s.137).

**Minnət- sünnət eləmək** – çox xahiş eləmək.

Zərgər nə qədər minnət-sünnət elədisə də oğlan qalmadı (46, s.38).

**Mirzə Qələmdan** -yaltaq, düşmən baltasına sap olan.

**Mis səsi** -naləli səs.

Duyub bəs ki, mis miskərani Hüseyn,
Çıxıb sinələrdən göyə mis səsi (80, cII, s.37).

**Mis tək yanmaq** - son dərəcə ağır zəhmətlə üzbəüz olmaq.

**Mişar kimidir-** onun dalısına, qabağına keçməkdən, ətrafına dolanmaqdan ancaq ziyan gələr. Mişarın həm ağzı, həm də arxası kəsəndir.

**Miz tutmaq** -dövlət işində çalışıb başqalarına özünü göstərən haqqında işlənir.

**Molla fəndi** - kələk və dillə birinin ağzından söz çəkmək.

**Molla Nəsrəddin pişiyidir, arxası yerə gəlməz** - xüsusən siyasətdə hər gün bir dona girən adamdır.

**Mollanı minbər götürüb** – sarsaqlamaq.

**Mollanın əmmaməsi göydə fırlandı** – mollanı vurdular, papağı yerə düşdü.

**Mozalan** -gənədən böyük bir həşəratdır ki, ümumiyyətlə qoyun, xüsusən qaramalın dərisinin altına girib bozən dəli edir və ya xəstələndirir.

**Möhcəyarım** - zirək, köpəkoğlu.

**Möhür basmaq** – təsdiq etmək.

Fələk möhür basdı düşmən deyənə,
Bəs mənim verdiyim yadigar hanı (109, s.348).

**Mucunbara da gedə bilməz** -Mərəndin yaxınlığında kəndlərdən biridir. Yəni işdən düşüb, qocalıb.

**Muğan Muğan olsa, bir qoyuna iki quzu -Muğan Muğan olmasa, nə qoyun nə quzu** - iş əgər uğurlu gətirsə, var-dövlət başdan aşar. Əgər gətirməsə əldə olan da gedər.

**Muğan seçmək** -ən pisini seçmək;

**Mumaboy** - Qaşqaylar arasında ucaboy adama deyilir.

**Mum söndürənlər, tuman tökənlər** -bu deyimi gerçi şiələr türk dünyasında geniş yayılmış ələvilərə aid edirlər. Onların nəzərinə görə, Azərbaycanda ələvi və goran, əliallahi adlananlar, ələvilər ilin müəyyən bir gecəsində qadın və kişilər bir yerə toplanıb orada hamısı bir mərasim icra edərək işıqları söndürüb çılpaq olub bir-biri ilə cinsi əlaqədə olurlar. Elm adamları üçün bu mərasim qədim ənənələrdən biridir. Avropada arqo-müqəddəs əyyaşlıq adlı mərasim də bu mərasimin qalığıdır.

**Mum tək ərimək** - hicrandan, həsrətdən zəifləmək.

Fəraqın odunu gördükcə mum tək əridi,





Səbati səbrdə fulad gördüyün könlüm! (Füzuli).

**Murdar əski od tutmaz/ nə olsa yaxşıya olur-** pis adama bir şey olmaz.

**Murdarlamaq** – dua- cadu yedirtmək.

-Nə yedirtmisiz mənə? Niyə murdarladız məni?- dedi qarı (296, s.302).

**Musayi/yəhudi ilə səməni qoyduq** - Tikantəpə türklərinin inancına görə, oradakı yəhudilərin səmənidən xoşu gəlmir. Buna görə işi uyğun olmayan, uğursuz şəkildə başladıq deməkdir.

**Musiqisi özündən** - hər bir şeyçün çalıb oynayan, musiqi olmadan oynayan.

Hər könüldə şövq varsa, çal-çağır lazım deyil.
Tar qavalsız oynayan bu qübbeyi-dəvvarə bax (317, s.36).

**Muştuluq** - sonrakı hadisə əvvəlkindən daha dəhşətlidir.

Şah burada öz yaxın adamlarının başına daha böyük müsibətlər gətirirdi. Siz o müsibət çəkmişlərin yanında muştuluq olursunuz (29, s.180).

**Müftə çörək yemək** - işləməyib yemək.

**Müftəəlləzinə** - havayı.

**Müftə ip tapsa, özünü asar** -olduqca tamahkar, xəsis.

**Mürgüləmək** -ayaqüstü yuxulamaq.

Lal ol daha, bir guşədə vur mürgü danışma,
Düşdün moda, qoydun başa bu börkü, danışma (267).
Xudanəkərdə avanta bir az ki, mürgülədi,
Açar badamlığına hamısın suyun məşədi (301, s.110).

**Müştəri gözü ilə baxmaq** - diqqət etmək; almaq fikri ilə baxmaq.

Ancaq daha müştəri gözü ilə baxanda deyəsən heç belə can görməmişdi (253, s.332).

**Mütəcasir-** milli varlığa xor baxan hakimlərə təslim olmayıb və onlara dirsək göstərən mənasındadır. Məcazi mənada xain, hakimlərə ağ olan anlamındadır.

21 Azər inqilabı qəzəbkar imperializm nökərlərinin əli ilə söndürüldükdən sonra mən də mütəcasir adı adı ilə tutuldum (281).

# -N-

**Nağıl danışmaq** - boş söz danışmaq

Kimə nağıl danışırsan, maşenik köpəyoğlu? (142).

**Naxırı itirib alagöz dana dalısınca gəzir** - həyatda hər zadını əldən verib indi kiçik bir şeyi özünə mühüm sayır.

**Nala-mıxa vurmaq** - mətləbin üstündən keçmək, simasız mövqe tutmaq.

Kefimin gəlməsinə bax, nə gərək yaxşı yaman?
Mən gahi mıxı, gahı nəli döyüb tapdalaram. (Sabir).

**Nallamaq** - vurmaq, öldürmək.

Azərbaycan millət fədaisi, məcümənin 41 saylı, 22 yaşlı üzvü Abbas ağa Sərrafın Ətabəyi öldürməsinə işarədir.

Nalladılar Ətabəki, batdı bu üşədən səsi,
İndi necə oldu Molla əmi, mən deyən oldu, olmadı? (267)

**Naleyi qaz oxuma** - boş-boş danışma.

**Nalı oda qoymaq** - dədəsini yandırmaq, quldurları, dövlət adamlarını birinin canına salmaq.

**Namaz taciri** - fırıldaqçı din adamı.

Hamı görsün ki, namaz taciridir.
Elə məscid əlibəylər yeridir (168, s.27).

**Namusu belinə bağlamaq** - arsız, həyasız.

Bağla belinə, qeyrəti, namusu, həyanı,
Sən gəldərəni, hacəti neylərsən, əməoğlu (80, c.II, s.85).

**Nankor** - yaxşılığı bilməyən, sevgini dəyərləndirməyən.

Nə olar bax, belə bir gündə gedərsək hamımız,
Bunu nankorlar edərlər yalnız.

**Nanə təki ürəyim əsir** - həddən artıq səndən ötrü darıxmışam.

Qurbanlar kəsərəm, Bakıya gəlsən,
Nənə tək əsərəm, Bakıya gəlsən ( M.Rahim).

**Nəşəya zurna versən, yoğun başından çalar** - işi bilməyən adama tapşırsan, peşiman olarsan.





**Neçəsin doğdum, neçəsin boğdum** - kimsə gəlib çıxınca, həddsiz narahatlıq keçirdim.

**Neylirəm qızıl teştı, içinə qan qusam** – var-dövlətlə xoşbəxt yaşamayandan sonra onun nə faydası?

Neylirəm qızıl teşti, içinə qan qusam (335, s.280).

**Neysan kimi göz yaşı tökmək** - uzun müddət çox təsirli ağlamaq.

Tökdü göz yaşını kürd neysanı kimi,
Qopdu hay-küy səsi bir fəqan kimi ("7 gözəl").

**Nə ağ dindi, nə qara** - heç nə demədi.

**Nə ağzında dişi var, nə götündə kirişi** - işdən düşmüş, dişləri tökülmüş, taqətdən düşmüş, əldən düşmüş

Onda bəxtim mənə yar oldu, tökülmüşdü dişi,
Nə ağızda dişi qalmışdı nə g... (168, s 337)
Kaftar kimi indi qocalıbsan kirişin yox,
Bundan sonra çox başlama çox çünu- çorayə (69, s.128).

**Nə axırda tapınaq olar, nə naxırda** - heç yerdə tapılmır, itib batıb.

**Nə bahardır nə də güz , hardan gəldi bu nərgüz** – gözlənilməyən yaxşı bir hadisə.

Nə bahardır nə də güz, hardan gəldi bu nərgüz (26).

**Nə boğazına çatı salıbsan?** -ərincək, fərsiz adama deyirlər.

Nə boğazına çatı salıbsan?(129, S.48).

**Nə coraba yamaqdır, nə tumana bağ** - heç nəyə yaramayan adam

Bu Tərgəldi ki, var nə coraba yamaqdır, nə tumana bağ (9, s.155).

**Nə çağda ipək, nə tiyanda barama** - heç nə yoxdur

"Nə çağda ipək, nə tiyanda barama" təsərrüfatlı atalarım bu məsəlini də çəkib öz-özümə dedim ( 263, s.27).

**Nəfəsi ağır**- qarğışı tez tutan.

- Qarğıtma, dedi Nəfəsi ağırdı bu it uşağının (296, s.170).

**Nəfəsi isti yerdən gəlir** – varlı-kallı adam özünə arxayın başqaları haqqında mühakimə yürüdür

**Nəfəsi qaralmaq** – təngnəfəs olmaq, töyşümək.

Qalx, ovladım qalx! Deyə-deyə nəfəsi qarala-qarala müridləri bir-bir ayağa qaldırmağa başladı (144, s.174).

**Nəfəsini boğazına yığıb** - gördüyü işi qurtarmaq vəziyyətindədir.

**Nəfəs vermək** - azadlıq vermək.

Ömrü uzun olsun, nəfəs verib bizə, ağzımızı yuman yoxdu daha (142, s.123).

**Nə hamam, nə tas** - bir şeyi kökündən danmaq, birdən hər şeyin yox olması

Varlığım belənçi sona çatacaq,

Elə bil yox idim, nə hamam, nə tas? (338, s.139).

**Nəhəng adam** - mütəfəkkir, tanınmış, böyük işlər görmüş, böyük hünərlərə sahib olan adam.

Azərbaycan millətinin görkəmli övladı olan Nizami Gəncəvi dünya ədəbiyyatının nəhəng yaradıcılarından biridir.

**Nə indi, nə dindi** - etiraz üçün ağzını da açıb danışmadı.

**Nə ip qırılır, nə can çıxır** - yaman gün qurtarmaq bilmir.

Kankan deyər ip qırılmaz, can çıxmaz ( Şükuhi).

Məni biçarə məsciddə oturram, hərçi gün batmaz,

Qırılmaz ip və çıxmaz can, işim fəryadü - əfqandır (Şükuhi).

**Nə iti azıb** - burda nə işi var, ona nə lazımdı?

Firəngdə onun nə alıb verəcəyi var? Parisdə onun nə iti azıbdı? (5, s.25).

**Nə ki varıva hola qoşaram** - hər şeyini məhv edərəm, evini yıxaram.

**Nə qədər duz töksən, yenə də duzsuz çezir** - nə qədər çalışırsan ki, bəlkə düzələ, yenə daha pis rəftar edir.

**Nə qoyub, nə axtarırsan** - hər şey biri-birinə dəyib, sənin dediyin mümkün deyil.

Səni kor quş kimi basıb qəfəsə

Nə qoyubsan ki, nə axtarırsan (306, s.331).

**Nənədən əmdiyi süd burnundan gəlmək** - ağlagəlməz bədbəxtliklərlə üzbəüz olmaq, inama görə insan öləndə





anasından əmdiyi süd burnundan gəlib tökülər. Yəni ölüb yenidən dirildim.

**Nənəsinə qaş yaxandı** - ana -bacı tanımayan, pis üzlü.

**Nənəsinin əmcəyini kəsən/ dişləyən** - ana-bacı tanımayan, qohum-əqrəba bilməyən

**Nənəsi yerikləyəndə kərəney yeyib** - səsi çox uca və pis adama belə deyirlər. Kərəney samavarın üstünə qoyulana deyilir.

Nə **mığmığası var, nə milçəyi** - Təbrizdə hava lap soyuq olanda işlənir.

**Nəm-nüm eləmək** – naz eləmək.

Qarın Quliyev bir gənc alim və ştatdankənar münəqqid kimi bir balaca nəm-nüm elədi (9. s.27).

**Nə ölüyə hay verər, nə diriyə pay** - heç kimə xeyri dəyməyən adamdır.

**Nərgiz bildi, Təbriz bildi/ xalam bildi, aləm bildi** - sözünü elə adama demisən ki, sözü hər yerə yayacaq.

**Nə si.i kəsilib, nə başı qırxılıb** - isti-soyuq görməyib.

**Nə sünbəyə toxmaqdır, nə tüfəngə çaxmaq** – heç bir işə yaramayan.

Bu halınla sünbəyə nə toxmaq, nə də qardaş,

Tüfəngə çaxmaq oldun (328, s.98).

**Nə üzülə, nə düzülə bilmək** – biri ilə nə ayrıla, nə də yola gedə bilməmək.

- Düzü Sarabəyim, mən daha Şahqulu əmiuşağı ilə nə üzülə, nə də düzülə, düzələ bimirəm... ( 253, s.368).

**Nə tiyanda barama var, nə çarxda ipək** - yoxsulluq;

**Nə tökərsən aşına, o da çıxar qaşığına** – nə yaxşılıq, nə pislik itmir.

Xəbislərin axırı belə olur, nə tökərsən aşına, o da çıxar qaşığına (1, s.169).

Ey ağa, dari-dünyadır mükafatxana, nə atsan aşına, çıxar o qaşığına (318, s.129).

**Nə Urmiya biçinçisi kimi oraq götürmüsən** -iş almaq üçün təkid etmək.

**Nə verim bazarı** - ən ucuz bazar.

Yenə kölələr kimi satılacağıq nə verim bazarında (235, s.).

**Nə vurnuxursan?** - niyə narahatsan, nə etdiyini niyə bilmirsən?

**Nə yatdın ki, nə yuxu görəsən?** - nə qədər zəhmət çəkmisən ki, istəyirsən bəhrələnəsən.

**Nə yemisən- turşulu aş** - möhkəmcə döymək, şil-küt etmək.

Vurdu ancaq xanıma nə yemisən turşulu aş,
Əzilib qol-qıçı, quş tək dağılıb balü-pəri (168).

Qəbir qazan qəbirin içində qol qalxızıb oynayır, elə ki, bunu çoban xəbər verir ölü yiyələrinə nə yemisən turşulu aş, o ki var vururlar, çul təkin sərirlər qəbirin böyrünə (62, s.117).

**Nə yoğurdum, nə yapdım, hazırca kökə tapdım** - əziyyət çəkmədən bəhrə gördüm.

Nə yoğurdum, nə yapdım, hazırca kökə tapdım (335, s.119).

**Ninə- inə girmək** – gizlənmək.

Qaç get, inə Musaxan,
Gəlmədin dinə, Musaxan! (Məşrutə dövründə Hacı Musaxan Cocqaninin ünvanına söylənən şerdən)

**Niyə Urmiya oraqçısı kimi başının üstünü kəsmisən** - Ordubad keçən zamanlarda Təbriz varlılarının yaylağı olub, buna görə də hər lahazdan tərəqqi etmişdi. Başqa yerlərdən, o cümlədən Urmiyadan oraya işçilər gedərdi.

**Noxtasını qırıb** - qudurub, hamıya əziyyət verir.

O, səfil darda qalan, tülkü qovan, şir bağıranda
Şeytanın şıllağa qalxan qatırı noxta qıranda (306).
Qəryeyi -Lahicdə sabiq zaman,
Tutdular bir oğlana toy, şadiman.
Məşrub içən, noxta qıran, oynayan (168, s.261).

**Noxtavı versən qoduq əlinə, aparar salar arpa zəmisinə** - naşı və başsız adama taleyini etibar etsən, səni məhvə aparar.

**Noxudu gülmək** - xırıltılı, arasıkəsilməz gülüş eşidilirdi. Buna el arası noxudu gülüş deyirdilər (156).





**Novdana minmək məşqindən düş** – bu yanlış fikirdən əl çək. Təbrizdə novdan yağış suyunu yerə axıtmaq üçün evlərin üstünə, dama qoyulan tənəkəyə deyilir.

**Novdan başa işləmək** - çöldə qalmaq, evsiz yaşamaq.

Neçə il işlədi novdan, başıma bu kənddə,
İt ilə qol-boyun oldum, gecələr zülmətdə (301, s.129).

**Novdan buzu** - bir yerdə huyuxub duran, dinməyən.

**Novrağı pozulmaq** - dövranın, həyatın pozulması deməkdir.

Fələk vurdu novrağımız pozuldu,
Yoxdu gülşənimdə bağ nişanəsi (32, c.II, s.83).

**Nuh əyyamından qalmaq** – çox köhnə.

Görünür, o dəftərçə Nuh əyyamından qalıb, pas atıb (9, s.152).

**Nurələnnur olmaq** - gözlədiyindən artıq nəticə görmək.

Nuru evdə, Nurunun qızı da evdədi, dedi bu oldu lap Nurələnnur ( Hüseyn kişi).

# -O-

**O biri dünyaya gedib gəlmək** - ölümdən qayıtmaq, xətərli bir işdən, ya xəstəlikdən nicat tapmaq.

**Ocağı kor/lal** - sonsuz; fərsiz övladı olan.

Mərd ocağı kor olmasın,
Dünya varkən yanar olsun (284, s.91).
Biliram, bilirəm həqqin var sənin,
Övladsız ananın ocağı laldır (H. Tərlan, s.20).

**Ocağında bayquş qonsun** – evin viran olsun.

Ocağında bayquş qonsun (39, səh. 138).

**Ocağın sönsün** – evin dağılsın, viran qalsın, yaman günə düşəsən (39, səh.138).

İndi anladım ki, ocaq sönərmiş,
Ev əhli küsəyən, övlad küsəyən (74, s.50).

**Ocağı söndürmək** – evini yıxmaq, pis günə qoymaq.

Məhəmmədrza quldurluğuna son qoymağa görə, ölümdirimə, fədakarlığa əl vuran insanların ocağı islam inqilabı adı ilə söndürüldü. Necə deyərlər, inqilab öz balalarını yedi.

Sən nəçin bizim ocağımızı söndürürsən? Mən ki sənə bir yamanlıq etməmişəm (72, c.III, s.95).

**Ocaq közsüz olmaz, gəlin sözsüz** - gəlinlə qaynana arasında söz olar.

Ocaq közsüz olmaz, gəlin sözsüz (103, s.71).

**Ocaq yanmasa, tüstü çıxmaz** - bir şey olmasa, söz-söhbət çıxmaz.

**O dağa yağdı qar, bu dağa oldu xəbər** – bir şey olmamış hər yerə yayıldı.

O dağa yağdı qar, bu dağa oldu xəbər (103, s.72).

**Oda-közə vurmaq** - çox çalışmaq, bir tikə çörək, bir məqsəd üçün hər çətinliyə dözmək.

Gərəkdir aşiq olan eşq oduna odlansın,
Özün oda-közə vursun, yanıb alovlansın (M.Etimad).

**Oda-alova düşmək** – ağır vəziyyətə, pis günə düşmək.





Sən məni qurtardın alovdan-oddan (11, səh.101).

**Od aparmaq** –sevgini paylaşmaq.

Əzizim od apara,
Ay doğdu, o da para,
Yoxdu bir odu keçən,
Sinəmdən od apara (33, S.192).

**Od çörəyini bişirməz** - zalım, oğru.

**O divar sənin, bu divar mənim** - sərxoşluq etmək.

**Od qiyməti** - çox baha. Qonşu qəbilələrdən ibtidai icma dövründə odu almaq və saxlamaq çox çətin idi. Bu deyim həmin münasibətlərin izlərini daşıyır.

Bazarda hər şey od qiymətinədi (1, s.91).

**Odla oynamaq** - təhlükəli bir işlə məşğul olmaq.

**Odla su arasında qalmaq** - çıxılmaz vəziyyətdə olmaq.

Almanlara deyirəm mən iranlı yox, azərbaycanlıyam, deyirlər sübüt et. Alıman vətəndaşlığına keçmək üçün almanlar deyirlər iranlısan, İran gərək icazə verə. Qalmışam odla su arasında (M.Həsən Purimanı).

**Odlu tüpürcək atmaq** – haqlı olaraq birini tənqid atəşinə tutmaq.

«Ah mütərcim!» - deyə bir odlu tüpürcək atdı,
Şübhəsiz düşdü o da tərcüməkarın gözünə (267, səh 309).

**Od parçası** - zirək, bacarıqlı, diribaş.

**Odsuz -ocaqsız** - yoxsul, bir həsir bir məmmədnəsir olmaq.

**Odsuz ocaqsız yanmaq** - haqsız bir sözdən çox narahat olmaq.

O qədər yanmışam odsuz-ocaqsız,
Suyu da üfürüb içirəm daha (294, s.49).

**Od tutub yanmaq** - yalan bir sözün və ya haqsız bir hökmün müqabilində nifrətdən aşıb-daşmaq.

Tutuldum atəşi- hicrə, Arazla dərdləşdim,
Araz bu dərdimi bildikdə, od tutub yandı (Xaqani).

**Odu keçmək** – ürəyinin istiliyi azalmaq.

**Oduna yanmaq** – birinin qüssəsini çəkmək, cəfasına yanmaq, dərdinə qalmaq

Oduna yananı tanımadınmı? (264, səh. 72).

**Odun qoymaq** - qızışdırmaq, bir adamı bir xətərli işə təhrik etmək.

Sən ey Savalan, yandır odun, qoy hamı yansın (Savalan).

**Od götürmək** – bərk əsəbiləşmək.

Padişahı od götürdü, o yerindən sıçradı (9, s.81).

**Odu söndürüb küllə oynamaq** – əsas məsələni kənarda qoyub xırda bir işlə məşğul olmaq.

Bu ona bənzəyir ki, mən odu söndürüb, təsəlli olmaq üçün küllə oynayıram (1, s.219).

**Od yandırmaq** – birinin yolunu davam etdirmək, birinə aşiq olmaq.

O odu ki sən mənim içimdə yandırdın, o od heç vaxt sönməyəcək, ustadım! (144, s.168).

**Oğlan, qız kəsilməmiş qarpızdı** - heç kəs bilməz ki, evlənmək istədiyi qız, yaxud oğlan nə cürdür.

**Oğraş** - namussuz.

Oğraş qaşalan Həlmə gözü qaşdan ayırmış,
Cəllad qəməsiylə bədəni başdan ayırmış (306, s.66).

**Oğru yadına daş salmaq** – elə bir söz işlətmək ki, orda olanlar ondan istifadə etsinlər, və ya uşaqlar olan yerdə şirnidən danışmaq.

**Oğulu ataya qatmaq** -- yəni oğul ilə atanı bir yerdə vurmaq, döymək.

Vurulan zərbələrdən qocanın naləsi ucalır. Bu səhnəni tamaşa etməkdə olan kiçik yaşlı oğlu tab gətirməyib, özünü atasının üstünə atır. Şallaq vuran oğulu da ataya qatır (282, səh.125).

**Ox kimi** – öz dövrünün yeyinlik rəmzi.

**Oxlu söz** – qəlbə dəyən söz, adamı incidən söz.

Bəşir tək qəlbinin yurdu yıxılmış,
Çox oxlu sözə nişanəm, ey şəm (354, səh.54).





**Oxu atıb yayı gizlətmək** - əsl niyyətini, əsas mətləbi gizlətmək, əlavə mətləblərdən bəhs edərək əsas mətləbdən yan keçmək, yarısını deyib sonrasını deməmək.

**Oxu daşa dəymək** -- arzusu daşa dəymək, maneə ilə üzləşmək, hədəfə, məqsədə çata bilməmək.

Heç igidin oxu daşa dəyməsin
Yad olmasın mənim kimi elləri (35, s.488).

Təhsil almaq istəyi ilə fabrik, zavod məktəblərindən birinə üz tutanda, necə deyərlər, ilk oxum daşa dəydi (78, səh.163).

**Oxunu qara daşa çalmaq** -- məqsədə çatmamaq.

Hökuməti-Zöhhak ol Rüstəmi-Zal,
Oxun qara daşa çaldı da getdi (35, s.237).

**O qədər səmən var ki, yasəmən yada düşmür** – bu söz gileyli bir insanın dilindən çıxar. Yəni o qədər sevilməyə adam var ki, daha mən yada düşmürəm.

**Oldu olacaq, qırıldı nacaq** - iş işdən keşdi.

Nacaq qəssabların əti iri tikələrə bölmək üçün istifadə etdiyi alətdir.

**Olmayacaq duaya amin demək** - nəticəsi bəlli olmayan və ya baş tutmayan bir işə qarışmaq, sevinmək.

**Ona qırmızı qələm çəkmək** - bel bağlamamaq.

**On bir ayaq olmaq** – günəmuzd fəhlələr axşam ikinci çağları işin başa çatmaq vaxtını bilmək və iş saatını bildirmək üçün günəşin qabağında dayanaraq, öz kölgələrini ölçərdilər. Əgər kölgələri 11 ayaq uzunluğunda olsaydı, iş vaxtı qurtarıb deyə işi buraxarlar. Buna görə də Güney mahalı və xüsusilə Şəbustərdə «11 ayaq» deyimi axşam zamanı olduğunu ifadə edirdi (346, səh.788).

**On səkkiz əyar** – Azərbaycanda ən keyfiyyətli qızılın əyarı 18-dir. Eybsiz, ən yaxşı adam.

Keçmişinlə yox işim,
Hər rəngə əlvan olmusan.
İndi 18 əyar,
Ali müsəlman olmusan ("Gözəl Təbrizim").

**Onu, bunu bilməm** - mən daha başqa söz eşitmək istəmirəm, gərək bu işi görəsən.

**Onun ayağı biləni bizim başımız bilmir** – o çox savadlıdır.

Onun ayağı biləni bizim başımız bilmir (129, s.488).

**Ordu - orduna keçmək** - çox arıq.

Qışda qar, şaxtada yayda günəşin isti çağında,
Ordu orduna qəmdən dayanıb, can dodağında (338, s.159).

**O sayadan bu mayaya** - şükr etməlidir, gözə dəyən tərəqqidir.

**Osduraqçı** - özünü yekəxana aparan, şişirdən.

**Osdurub ayılmaq** - sonradan peşiman olmaq, bir mövzudan başı çıxmayıb müdaxilə etmək.

**Osman köynəyi eləmək** - bir zadı bəhanə edib, böyük bir faciəyə çevirmək.

Raşidi xəlifələrinin üçüncüsü Osmani Əffan Səlman Əli ilə öləndən sonra, Əli xilafətə yetişdi. Əli Müaviyəni Şam hakimliyindən götürdü. Müaviyə müxalifətə başlayıb, peyğəmbərin arvadı Aişənin köməkliyi ilə Osmanın qanlı köynəyini Dəməşq məscidinin qapısından asdılar. Və Əlini onun qatili kimi məruf edib qisas istədilər. Buna görə ki, Osman və Muaviyə hər ikisi Dəniyüməmə tayfasından idilər.

**Otura-otura ozanın, gəzə-gəzə Culfanın evi yıxılar** – bu deyim «Dədə Qorqud»dakı otura-otura yanımız axrıdı, yata-yata canımız – deyimi ilə eyni mənadadır. Yəni nailiyyət qazanmaqdan ötrü iş görmək lazımdır.

**Oturmaq** – "oturmaram", yəni boşanaram.

Ay kişi, apar bu qızları azdır, yoxsa səndə oturmaram (46, s.226).

**Oturtmaq** - birini nəhayət dərəcədə əzgin etmək, yormaq, taqətdən salmaq.

Vətən dərdi Sücaəti oturdub (294).

**Otururam dizimi görürəm, dururam özümü** – təkəm.

Otururam dizimi görürəm, dururam özümü (103, s.70).

**Ovcuma qoy, ovcuna qoyum** –rüşvət ver, işini düzəldim.





Gör mənə nə deyir, deyir, avcıma qoy, avcına qoyum, yəni pul ver, su apar (129, s.431).

**Ovcuna qoymaq** -xəbər vermək, tələbini çatdırmaq, birinin haqsız sözünə şəstlə cavab vermək.

Nazlı-bəs sənin o xəbərçi Xədicən nədir, mənim telefonuma qulaq asır, gəlir qoyur sənin ovcuna (9, s.187).

**Ovcunun içi kimi tanımaq** – yaxşı tanımaq.

İlxıdakı atların hamısını ovcumun içi kimi tanıyaram (174, s.6).

**Ovçuya ovu göstərməzlər, dağı göstərərlər** - yəni bir iş görən adam üçün bir balaca yardım da kifayətdir, o çörəyini tapar.

**Ovqatına/ kefinə soğan doğramaq** - qanını qaraltmaq, hər şeyi bir-birinə vurmaq.

Yaxşı ki, Rzaqulu iti tərpətdi, yoxsa gönü verəcək idi suya, ovqatımıza soğan doğrayacaq idi (1, s.14).

O gün ki, İran qalxdı öz inqilab atına,
Millət soğan doğradı şahın da ovqatına (161, №3).
Şahın ovqatına soğan doğranmışdı (46, s.65).

**Ovsarlamaq** – ovsar dəvənin yüyəninə deyilir. Birini ələ keçirmək, qul kimi etmək mənasındadır.

Lap bizi ovsarladılar, mindilər
Ay keçən əyyam, olasan indilər (267, s.151).

**Ovuc yazısı** – balaca kağız üstə yazılan sənəd, ərizə, məktub.

Ovuc yazısı ondan ibarətdir ki, Mirzə cənabları yazmaq istəyəndə, əvvəl ədəb ilə dizi üstə əyləşir, sonra cibindən qələmdanı çıxarır, davat (mürəkkəbliyə) bir qətrə su tökür, qoltuq cibindən bir ovuc yekəlikdə bir kağız parçası çıxarır. Və «bismillah» deyib, başlayır mətləbi yazmağa («Yeni yol», № 8, 1923).

**Oynaya bilməyən deyir ki, yerim dardır/ deyir otaq əyridi** – bacarıqsız adam öz zəifliyini ört-basdır etmək üçün gülünc bəhanələr uydurur.

Oynaya bilməyən deyir ki, yerim dardır (1, s.16).

**Oyuna girən gərək axıra qədər oynasın** - bir işi gərək axıra qədər gedəsən (253, s.188).

**Oyur-oyur oynamaq** – bir yerdə durmamaq.

Qızmış nər kimi oyur-oyur oynayır (174, s.9).

# -Ö-

**Öc adam** - çox yeyən, güclü, düşmən.

Qanlı öc papağım başında,
Qılıncım belində,
Ayağı atımın üzəngisində idi (219, s.79).
Qaynayır qəlbimin içində öcüm,
Bilirəm o nəhəngə çatmaz gücüm ( A.Şaiq).

**Ödü ağzına gəlmək** - iyrənmək.

**Ödüm partladı/ süzdü/ töküldü** – qorxdum.

**Öfkə baldan tatlıdı** - birinin adət etdiyi şey ona şirindi.

**Öküz** - qanmaz, anlamaz.

**Öküz inildəməkdən qanı cırıldayır** - zəhmət çəkən dinmir, başqası dillənir.

**Öküzün qaşqasını döyərlər** - qaşqa davakar, boyun əyməyən, bir də məşhur monalarında işlənir. Tanınmış adamı döyərlər.

**Öküzsənsə də doğ, inəksənsə də** - imkana nəzərə almayıb tələb etmək.

Vəzir mən heç şey bilmirəm, öküzsənsə də doğ, inəksənsə də. Qızı səndən istəyirəm (46, s.130).

**Öküzü/ iti öldürənə sürüdərlər** – işin səbəbkarı cəzasını çəkər.

- İndi bu müsibətləri görür, ikiəlli qapazı vururam başıma deyirəm ki, öz cəzandı çək, Mazan, öküzü öldürənə sürütdürərlər (1, s.288).

**Öküzün böyüyü hələ pəyədədir** - işin çətini hələ daldadır.

Sara bibi, hələ öküzün böyüyü pəyədədir.

**Öküzü yorulana çox söz deyərlər** - birinin işi əyilsə, ona danlaq edən çox olar.

**Öküz yorulanda sitirinə kəpənək qonar** - bir adam qüdrətdən düşəndən sonra hamı üçün oyuncağa çevrilər.

**Ölçmək** – vurmaq.





Ana fanıs ilə ölçdü qurdun başına, fanıs sındı.

**Ölçü - biçi bilməmək** - böyük-kiçik gözləməmək, danışmağını bacarmamaq.

Bilməyir heç bu ağız ölçü- biçi,
Hey ötür, sanki sınıb bəndi- biçi ( Əli Nəzmi).

**Öl desə öl, qal desə qal** – nə desə onu elə.

Rolları o bölmür ki.. Gülsabah bölür də. Desə ona öl, ölür, qal qalır (72, c.III, s.98).

**Öldürüm büldürüm** - hədə qorxu gəlmək.

**Öldü var, döndü yoxdur** – sözünün üstündə axıradək durmağı bacarmaq

Lərzəyə gətirdik biz göyü-yeri,
Öldü var, döndü yox şüarımızla (Nəriman Qasımoğlu).

**Ölmə eşşəyim, yaz gələr, yonca bitər, yeyəsən**- yalan ümid vermək.

Ölmə eşşəyim, ölmə yaz gələr, yonca bitər (335, s.303), (229, s.28).

Ölmə eşşəyim ölmə, yaz gələr, yonca bitər yeyərsən (9, s.157).

**Ölmək ölməkdir, daha xırıldamağa nə gəlib** – adam nə qədər pis vəziyyətdə olsa da, birinə ürək verməlidir, şərəflə yaşamalıdır.

Ölmək ölməkdi, xırıldamaq nə deməkdi (335, s.79).

Ölmək ölməkdi, xırıldamaq nə deməkdi (46, s.131).

Mənim ayağım dalımca gəlmirdi. Dedim ölmək ölməkdir, daha xırıldamaq nə deməkdir? (82, səh. 196).

**Ölmüş eşşək axtarır, palanın söksün/ çəksin** - tamahkar, xəsis, yoxsul.

**Ölmüş eşşək axtarır, palanın töksün** -keçmiş söhbətləri tökmək.

**Ölmüşəm, yerdən götür** – mənə kömək et, ağır vəziyyətdəyəm.

Ölmüşəm, gərək meyitimi yerdən götürəsən (9, s.30).

**Ölüb dirilmək** - ağır bir xəstəlikdən nicat tapmaq.

**Ölü it** – heç nəyə yaramayan, arıq adam.

Ölü bitik ki, dırnaq altında qalaq? (1, s.289).

**Ölü bit qabığı** - arıq, cansız.

**Ölü durub mürdəşiri yuyur** - əlsiz-ayaqsız bir adam güclü, bacarıqlıya ağalıq etmək istəyir.

**Ölü götünə pambıq təpmək** - Tələsə-tələsə yemək.

**Ölü inək südlü olar** - bəzi millətlərin içində mənfi xislətlərin yayılmasına görə, ölünün dəyəri diridən də artıqdır. Buna görə də, atalar bunu tənqid etməkdən ötrü yüzlərlə deyim və atalar sözləri yaradıblar. Nümunə olaraq «ölü götü ballı olar» deyimini misal göstərmək olar.

**Ölü gözündə yaş axtarmaq** - olmayan bir zada göz tikmək.

Bizə əcnəbilərdən insaniyyət, mərhəmət bəkləmək, ölü gözündən yaş axtarmaq kimidir (28, səh. 92).

**Ölü qəbristandan qayıtmaz** - gedən şey qayıtmaz.

**Ölülər elə bilirlər dirilər halva yeyir** – bəziləri yanlış olaraq elə bilir bizim vəziyyətimiz çox yaxşıdır.

Biz Həştərxana öz kefimizdən gəlməmişik, ölülər elə bilirlər ki, dirilər halva yeyirlər (1, s.66).

**Ölüm sükutu** - səssizlik, heç bir səs gəlməyən.

Cavan qız və oğlanları edama aparan anlarda həbsxananı bir neçə saniyə ölüm sükutu bürüyürdü ( Nəsim).

**Ölüm şərbəti içmək** – dünyasını dəyişmək, dünyadan köçmək, ölmək.

**Ölümü gözə almaq** - heç nədən qorxmamaq, hər xətərə sinə gərmək.

**Ölümü satın gəzmək** – ölümdən qorxmamaq, cəsur olmaq, özünü təhlükəyə atmaq.

Kərəm indi satın gəzir ölümü,
Fələk qırdı qanadımı, qolumu (35, s.530)

**Ölüm yuxusu** - çox bərk yatmaq, daş kimi düşmək.

**Ölüsünə də lənət dirisinə də** - dirisindən bir cür, ölüsündən də bir cür əzab çəkilən pis adamların haqqında işlənir,





**Ölü töyuğun gülməyi gəlir** - həqiqətdən o qədər uzaqdır ki, ölü toyuq belə gülər.

**Ömər sovdası** - davam tapmayan müamilə.

**Ömrü bada vermək** - ömrü bədbəxtlik içində yaşamaq.

Kərəm deyər: kam almadım dünyada,
Cəfa çəkdim, ömrü verdim mən bada (35, s.558).
Arifi müəzzəm, ey nuri-eynim,
Mənim təki ömrü bad olan varmı? (32, c.II, s. 81).

**Ömrün boşa getməsi** – faydasız bir işlə ömür sürmək.

Təəssüf ki, bu ömrümüz boşa gedir, anbaan (A.Bakıxanov, səh.13).

**Ömrün çeynənməsi** – ömrün boş yerə puç olması.

Yeníldi varlığın, çeynəndi ömrün,
Ömründə şadlanıb gülmədin bir gün (337, c.I, s.32).

**Ömrünə qaranlıq çöküb** – həyatı ağırlıqlarla üzbəüz olan, ölümlə üzbəüz olan insan.

Ömrünə qaranlıq çökənlər bilər (264, səh.88).

**Ömrün vəfa etməməsi** - bir arzuya çatmamış ölmək.

Azərbaycanda Milli Hökumətin fədailərinin ölümdən can qurtarıb diri qalanlarından bir çoxuna ömür vəfa etmədi ki, qantökən şahın sonunu görsünlər.

**Ömür billah** - heç bir zaman.

**Öpüb gözünə qoymaq** - müqəddəs saymaq, nəhayət dərəcədə qəbul etmək.

**Öpüb başa qoymaq** - sevə-sevə qəbul etmək.

**Öpüb gözünə qoymaq** – çox sevilən adam, müqəddəs bir adam haqqında işlənir.

Nəmi gözünə bağlar,
Kabab közünə bağlar,
Yarın gərdənin aşıq,
Öpər, gözünə bağlar (33, S.119).

**Örkən altına girmək** - böyük məsuliyyəti boynuna götürmək.

Hörmətli sədrimiz, lap örkən altına girəcəksiniz (156).

**Örkən nə qədər uzun olsa, dolanıb doğanaqdan keçər** - hər necə olsa, bir gün işin mənə düşər.

Amma gecə ağırsa da, axırda örkən doğanaqdan keçən kimi, səhərin qapısından keçməlidir («Kənd uşağı»).

**Ört-basdır etmək** - gizlətmək, üstünü örtmək.

Şəhriyarın Molla Pənah Vaqifin anadan olmasının 250 illiyi münasibəti ilə dəvətnaməsi ört-basdır edilmiş, ona verilməmişdi.

**Örtülü bazar, dostluğu pozar** –dostun-dostdan sirri olmamalıdır, hər şey açıq olmalıdır.

Əl əli yuyar, əl də üzü, örtülü bazar, dostluğu pozar (9, s.143).

**Öyündə yoxdu gecəlik, könlündən keçir xocalıq** – imkanından böyük iddiaları olan adam.

Öyündə yoxdu gecəlik, könlündən keçir xojalıq (103, s.70).

**Öz ağırlığı qədər** - külli miqdarda.

Öz ağırlığı qədərincə oxumağına pul qoymuşam (195, c II, s.23).

**Öz boğazından kəsmək** - balasına, bir insana yardım etmək üçün özündən kəsmək.

Öz boğazından kəsib ehsan edən himmətlidir,
Yoxsa hər kəs olsa tox, tullar itə əlcə çörək (317, s.28).

**Öz daşımız, öz divarımız** – bu deyimdə daş və divar – qız və oğlan anlamındadır.

Qaldı ki, qızımız varsa da, oğlumuz da var. Öz daşımız, öz divarımız. Səhnəbanını öz oğluma alacağam (13, səh 164).

**Öz dilini çeynəmək** - təhqir etmək, düzgün danışmamaq.

Kimsə öz tarixini, öz dilini çeynətmir,
Baba mirasına gəl baxma həqarətlə, oğul! (H.Düzgün, Yurd qəzəlləri, s.29).

**Öz əli, öz başı olmaq** - müstəqil yaşamaq, başqalarına möhtac olmamaq.

**Öz əlimiz, öz başımız** - azadlıq, siyasi mənada müstəqillik.





Torpağımız, dağ-daşımız, öz əlimiz, öz başımız.
Yaşasın Hürriyyət! («Təcəddüd», № 24).

**Özgə atına minən tez düşər** - birinə satılan adam müvəqqəti istifadə olunub kənara qoyular.

Od kimidir hər elin azadlığı,
Yansa o bir özgə əliylə əgər,
Olmaz onun istisi ( Zehtabi).

**Özgə baltasına sap olmaq** - düşmənə öz millətini qırmaqda köməklik eləmək, vasitəçi olmaq, öz millətinə xəyanət edib, başqalarına güvənmək.

Dallarını salma, kökünü qazma,
Özgə baltasına sap olma, dayan!( H. Düzgünün sürudlarına bir baxış, s.95).

**Özgə canı, divar yanı** - heç kəs adamın özü kimi ürək yandırmaz.

Özgə canı, divar yanı (103, s.71).

**Özgə dəyirmanına su açmaq** - düşmənə yardım etmək, boşboğazlıq, yalan, töhmət iftira.

Daldan boğma çıxartmaq bizim xoşumuza gələn işlərdən deyil. Bunu biz xainlik, azadlığa əngəl törətmək, müstəbidlər və mürtəcelərin dəyirmanına su açmaq hesab edirik (Pişəvəri).

**Özgənin xoruzu mənim damımda banlamasın** – bəzi qadınlara ərinin başqa bir qadınla gəzdiyini deyəndə, o özünü sındırmayıb belə deyər.

**Özgəyə quyu qazan özü düşər**- başqasına pislik etmək istəyən özü zərər çəkər.

Özgəyə quyu qazan özü düşər (335, s.290), (9, s.45).

**Öz gözündə tiri seçmir, özgə gözündə tir axtarır** – özünün böyük eybini görmür, başqasının kiçik nöqsanını gözə soxur.

Öz gözündə tiri seçmir,
Özgə gözündə tir axtarır (328, s.334).

**Özgə s..i ilə bəy durmaq** - özgənin imkanını öz adına istifadə etmək.

**Öz gücünə bel bağlamaq** - bir işə ciddi surətdə qərar vermək.

Əgər sərdari-milli Tehrana inanmasaydı, Xiyabani xain və minüzlü müşavirlərin sözünə əhəmiyyət verməsəydi, indiyədək Azərbaycan dünyanın ən mütərəqqi ölkələrindən biri olmuşdu. Öz gücümüzə bel bağlamalıyıq (30, 1324).

**Öz itim özümü qapır** - mənə dolaşan öz qapımda böyüyən, öz ailəmdə olanlardandır.

**Öz sözünün ağası olmaq** – yəni öz sözü üstündə dayanan, sözübütöv insan anlamında.

Sərhəngmalik hələ 1941-ci ildən Qulamyəhyanı tanıyırdı. Öz sözünün ağası olduğunu bilirdi ( «Fədai» jurnalı, səh. 43).

**Öz tükü üstündə durmaq** - başqalarına əziyyət verməyən, bir sifətli.

Otursa öz tükü üstündə hər kəs,

Tükü tərpənməz əsla, ey müqəddəs (147).

**Özündən çıxmaq** – əsəbiləşmək, əsəblərin tarım çəkilməsi.

Dedim ey şeyx, deyəsən sən ağlını itirmisən. Gördüm şeyx özündən çıxdı (80, səh 365).

**Özündən çıxıb özünə girə bilmir** - yaxşı imkana əl tapmaq üçün özünü itirib.

**Özündən qıllısına/ dəlisinə rast gəlməyib** - özündən qüdrətli, güclü, həyasız adam görməyib.

**Özünə çarıx bağı toxu** - öz fikrinə qal, gələcəyini düşün.

**Özünə dükan açmaq** -şəxsi mənafeyi üçün bir ideolojiyə, bir şeyə özünü tərəfdar göstərmək, bir meyvəyə, bir şeyə həssaslıq göstərmək.

Bir para adamlar üçün təşkilata üzv olmaqdan hədəf o deyil ki, o hizbin istəklərini həyata keçirsin, bəlkə o hizbdən bir dükan kimi öz mənafeyinə istəfadə edirlər. Təbrizli dostumuzun dili ilə desək, dükan açmayan sədaqətli adamlar da tapılır (6, 1323, xordad).





**Özünə əriştə kəsə bilmir, kənara kündə salır** – balaca bir işi bacarmayan kəs, özgələrinin məsuliyyətli işlərini boynuna alır (168, səh. 252).

**Özünə gəlmək** – ağlını başına topla.

Deyirəm ay kişi, gəl bir özünə, bu nə işdir, a kül olsun gözünə (267, s.183).

**Özünə gün ağla** - gələcəyinə fikirləş, ömrünü hədərə vermə.

**Özünə kol-kos qırmaq** - məsələni öz xeyrinə dəyişdirmək.

**Özünə maya qoymaq** – özünə təzə paltar alana, saçını vurdurana deyərlər.

Tahir- yaman özüvə maya qoymusan ha... başını əcəb qırxdırmısan (9, s.186).

**Özünə umac ova bilməz, özgəyə əriştə kəsər** – əlindən iş gəlməyə-gəlməyə özünü iş bilən kimi qələmə verir.

Özünə umac ova bilməz, özgəyə əriştə kəsər (335, s.95).

Özü üçün umac ova bilmir, başqasına əriştə kəsir (72, c.III, s.150).

**Özünü ayrı küçəyə vermək** - bilməməzliyə vurmaq.

**Özünü buğda bazarında görmək** - özünü çox təkəbbürlü aparmaq

Olmaya özünü buğda bazarında görübsən? (198, s.92).

**Özünü döşlü göstərmək** – özünü cürətli, igid sayan.

Özünü döşlü göstərən həmin oğlan əlini xəncərinin dəstəsinə qoydu (62, səh. 347).

**Özünü ələ almaq** - özünü tutmaq, təmkin nümayiş etdirmək.

Mən özümü ələ alıb – qorxma! – dedim, yaraların sağalar!(82, səh. 198).

**Özünü gözə soxmaq** - başqalarının nəzərini ələ gətirmək üçün həddən artıq əldən-ayaqdan getmək.

Çox zamandır çalışır, gözlərə soxsun özünü (338, s.59).

Özünü qurban verməkdən qeyri qurtuluş görməyib belə israrla ölümə gedirsənsə, necə ittiham edim mən səni?!. (144, s.176).

**Özünü itirən adam** – yəni bu gününü, sabahını düşünməyən adam, və ya qorxudan əl-ayağını itirən adam.

Bizim aramızda özünü itirən adamlar üçün yer yoxdur (249, səh. 31).

**Özünü qurban vermək** – özünün yox, başqalarının mənafeyini düşünmək.

**Özünü selə vurmaq** - çətinliklərdən qorxmamaq. Böyük qüdrətlərlə əlbəyaxa olmaq.

Mərd oğullar özün vurdu sellərə,
Aparsınlar salamımı ellərə. (Səhaf).

**Özünü sındırmamaq** – özünü əyməmək, alçaltmamaq.

Amma özlərini sındırmayıb heç kəsə də bir söz demədilər (46, s.181).

**Özünü tülkülüyə vurmaq** –biclik, hiyləgərlik etmək.

Balaxanım- özünü tülkü ölümcüllüyünə qoyma (9, s.169).

**Özünü ucuz tutmaq** - özünə hörmət etməmək, alçaltmaq.

Onlar nə qədər alovlu olsalar da, öz qiymətlərini anlayırlar, özlərini ucuz tutmazlar (91, s.57).

**Özünü yeddi qəpiklik çolpa kimi tutub** – təkəbbürlülük etmək.

Özünü yeddi qəpiklik çolpa kimi tutub (129, S.143).

**Özünü yemək** - hirsi bağırsağını kəsmək. bir zaddan ötrü son dərəcə narahat olmaq.

- Bir zad tapammayanda neynirsən? Özümü yeyirəm! (340, s.54).

**Özünü yuyub qoyub yarpız üstə** - öz eybini yaddan çıxartmaq.

**Özü öz içini yemək** – çox fikir çəkmək.

Özgələr bilməsin dedim dərdimi,
Özüm öz içimdə yedim dərdimi (328, s.289).

**Özü yıxılan ağlamaz** – öz əməllərinin cəzasını çəkən adam narahat olmamalıdır.

İndi ağlayırsan, ancaq nə fayda,
Özü yıxılanın ağlamağından (328, s.299).





# -P-

**Paxırın açmaq** - birinin iç üzünü göstərmək.

**Paxırsız ürək** - təmiz, saf ürək.

Dünyanın ellərin sevən yüksəlir,
İstəkli bir könül paxırsız qalır (88, s.71).

**Paklamaq** - günahlı və ya günahsız adamın birinə bığ yağı, rüşvət, bac, darana verib azad olması.

1320-ci ildə bir neçə nəfər Zünuz əhalisindən tutub Mərəndə gətirdilər. Müttəhim eylədilər ki, siz bolşevik məramına işləyirsiniz. Necə ki, siz ruznamənizdə göstərmişdiniz ki, Hacı Mirismayıl pul verib paklandı (30, №22, 1941).

**Palanı əyri** - bu gün pozğun qadın haqqında işlənir, ancaq məşrutə zamanında toplumun dəyişməsi barədə düşünən ziyalılara deyilirdi.

15 il ülumi-diniyyə oxuyandan sonra ki fiqh və üsul elmlərini qurtardım, başıma bir başqa şuru-şövq düşdü, gözüm bir başqa aləmin üzünə açıldı... Gözüm təməddünün işığı ilə açıldı. Bəzi həmvətənləri gördüm ki, bu gələn selin arasında durub onun gedişinə təslim olmayıb aşağıya sarı üz tutub qışqırırlar: "Qayıdın yuxarı ki, balayi-in səkəm səadət və yaşayışdır, aşağısı məhvi-nabud olmaq quyusu". Həmvətənlər də bu xeyirxaha etina etməyib onları mürtəd adlandırıb və özlərinin əyri baxışından onları palanı əyri deyirlər.

Bollaşıbdır nöhəxan, oğru, dilənçi cibkəsən,
Ehtiyata üz qoyub həm qız, həm oğlan, çox şükür!
Başqa nəşriyyatı vellə, kəcpələndır büsbütün,
Qalsa pəsdir "İttilaat" ilə "Keyhan" çox şükür.

**Palan- pürüt** - yekəpər, yoğun.

Dişsiz, palan-pürüt, amma istəməli Pöhrüz əmi (203, s.10).

**Palaza bürün el ilə sürün** -eldən qıraqda qalma. Mənfi mənada xalqın geriçiliyə tabe olması mənasını da verə bilər.

..Bala məgər eşitməmisən ki, palaza bürün, el ilə sürün, el gəlib rəy verməyə, mən də gəlmişəm, mən ki eldən ayrıla bilməm (246, s.378).

Palaza bürün, elnən sürün (9, s.101).

**Palaz qulaq** - yekə qulaqlı.

**Palçığa batmaq** – işi çətinə düşmək.

Heyvan kimi bir barədə palçıqda qalanda,
Sal fitnəli söz ortalığa, hövsələtəng ol (267, s.153).

**Pambığı qulağından çıxart** - özünü eşitməməzliyə vurma, bir də bu səhvi təkrarlama.

Çıxart pəmbə qulağından, gözün aç,
Ki həşr oldu və çalındı sur (225, s.271).

**Pambıq atmaq** - öskürmək.

Ya saqqalın oldu qapqara şəvə kimi, elə ki sübhədək öhö, öhö atıcı kimi pambıq atdın, oldun qoca (129, s.60).

**Pambıqla baş kəsmək** - zahirdə özünü yaxşı, canıyanan göstərib birinə böyük ziyan vurmaq, qanun naminə ziyan vurmaq.

Bir balıq tutana iş kəsənləri –
İpəklə, pambıqla baş kəsənləri (265).

**Papağı günorta yerindədi** - düz başının ortasındadı.

**Papağını göyə atmaq** – razı olmaq, sevinmək.

O, papağını göyə atsın ki, sənin oğlun onun qızını alır (46, s.130).

**Papağın biri papaq** - axmaq, başa düşməyən.

**Papağının altında** – adi vəziyyətdə.

Harda olacağam, papağımın altında, çəkməmin içində (9, s.132).

**Papağını tərsinə çevirmək** – birinə qarşı münasibəti dəyişmək.

Qəbul eləməz, biz də papağımızı tərsinə çevirərik (129, s.411).

**Papağın yerə girsin** - biabır olasan, utanasan.

**Papağını yerə soxmaq** – namusunu tapdalamaq, başını aşağı eləmək.





Həzrət Abbas haqqı, sən bütün kənddə mənim papağımı yerə soxmusan (72, c.III, s.39).

**Papaq eləmək** – işarə eləmək.

İldırıma papaq elədim, çox böyük dəstədi, görməyə bilməzlər (335, s.227).

Sən ancaq bizə papaq elə (9, s.68).

**Papaq kimi dəyişmək** - tez-tez dəyişmək.

Hər fasildə siz onları dəyişməyin
Papaq kimi (325, s.38).

**Papış tikmək** - kələk gəlmək.

Bundan başqa, dayınız qədim məşrutəxahlardan olduğuna görə qorxuram ona (təminat idarət-B.H.) papış tikib, töhmətləndirib və onun üçün əngəl törətsinlər (212, s.54).

**Papiros kağızı kimi** - lap incə, nazik bir şey. Təbrizdə bir vaxtlar elə nazik qabıq qarpız olardı ki, deyərdin ki, papiros kağızıdır.

**Paraya dəymə, bütünə dəymə, doğra doyunca ye** -çox xəsis adam.

**Paslı ərsinə dəyməz** –dəyərsiz, yaramaz.

Hər sözü təlim eliyir tərsinə,
Dəgməz o bir paslı dəmir ərsinə (267, s.188).

**Patlayan ayın on dördündə/ qum göyərəndə/ dəvənin quyruğu yerə dəyəndə** - heç vaxt.

**Patleti on şahıya dəyməz** - yoxsul adam və ya əskik adam.

**Payını çörək üstünə çəkmək** - hörmətsizlik etmək.

**Payız günü divar başında** - ömrünün qürubu, son çağı.

**Payız yeli** - sözünün üstündə durmayan, gah bu yana, gah o yana əsən adam.

**Pay verib dərdindən ölən** - gözü verdiyinin dalısınca olan.

**Peşəngin axırı torbakeş olar** - peşəng sürünün qabağında gedən erkək keçiyə deyilir. Zirək və yorulmaz, sonradan yaman günə qalan adam.

Sürünü çəkən keçi qocalandan sonra çobanın çörək dəsmalını daşıyır.

**Peyğəmbərlərdən niyə bəs cərcisi seçdin?** - niyə yaxşı adamları qoyub pis adamı seçirsən?

**Pəl vurmaq** - bir işin düzəlməsinə mane olmaq.

**Pəncə-pəncəyə qoymaq** - rəqabət etmək, bəhs etmək.

Heç kəs ilə pəncə-pəncəyə qoyma,

Heyifsən, bu ismin bərqərar olsun ( Zodlu Məmməd, s.103).

**Pəpə yeyəndən məmə yeyənə qədər** - uşaqdan böyüyə, hamı.

Axır çərşənbə od yandırmadan əvvəl damın üstündə novçanın dibində bir-bir ev adamlarının adına pəpə yeyəndən məmə yeyənəcən daş düzərlər (203).

**Pərdə çəkmək** – üstünü örtmək.

Bax dəyənəklə gəlmişəm indi Babanın üstünə,

Pərdə çəkir nəçin belə yaxşı-yamanın üstünə (72, c.III, s.286).

**Pərgarın pozulması** - həyatın çətinləşməsi, məcrasından çıxması.

Mərd ilə oturdum mərd ilə durdum,

Heç vaxt pozulmasın pərgarın, Güney! (Aşıq Qəşəm).

Yaman aşüftədir fikrim, pozulmuş sanki pərgarım (338, s.27).

**Pəstaha çıxartmaq** - gözlənilməyən bir iş görmək, hay-küy eləmək.

Şələni götür, düş yola, səndən çox pəstahılar çıxacaq (129, s.145).

**Pətənəyini dağıtmaq** - döyüb öldürmək; hədə qorxu kimi işlənir.

**Pətəsi suya düşdü** - rüsvay oldu.

**Pəzəkli səs** - gur səs.

Dəmir yolunun işçilərinin hamısının səsləri nədənsə bər olar, pəzgəli olar (203, s.8).

**Pıçını burmaq** – birini qızışdırmaq.





Mən bildim ki, sən piçini buracaqsan (9, s.156).

**Piçmöhrənin yalaq olması** - əl-ayağın sancıya düşməsi, bel-buxunun ağrıması.

Piçmöhrəm yalaq oldu.

Qəm qalandı, dağ oldu ( M.Xanlu, s.25).

**Pii oğlan!** - təəccüb əlamətidir, heyrət.

Mərhum Hacı imam-cüm.eyi Xoyi qırx il Tehranda yaşadığı halda özünün təkyə kəlamı olan "pii oğlan!" sözünü tərk edib ona münasib bir fars sözü işlədə bilməmişdi (S.C.Pişəvəri).

**Pilovluq olmaq** - ləyaqət sahibi olmaq; boy-buxunlu, qədd-qamətli.

Oğul, maşallah lap pilovluq olmusan ha. Ədə İzzət, doğrudan da, şəhər adamı dəyişir ha, maşallah, oğlanlar bulağından su içib ha (77, s.16).

**Pilovluq paltar** - ən hörmətli qonaqlığa geyilən təzə paltar.

**Pis yerdə axşamlamaq** – çətin vəziyyətə düşmək.

Əcəb pis yerdə giriftar olduq (80, c.II, s.309).

**Pişik artığı** -lap az yemək.

**Pişik asqırdı?** - birdən- birə nə oldu ki, belə dəyişdin?.

Mirzəyə fayton gərək olanda gah başı ağrıyırdı, gah da pişik asqırırdı (62, s.715).

**Pişik balasını yeyən kimi** – birinin malını mənimsəmək, haqqını yemək.

İnqilab inqilabdan sonra başlayır və ya inqilab öz yaradıcılarını ac pişik balasını yeyən kimi yeyir, aradan aparır (29, s.74).

**Pişik bəzəmə/ bu ki pişik bəzəmə oldu** - oyunbazlıq, baş sarıma, vaxtı tələf eləmək, özünü bilməməzliyə vurmaq.

Həmzə Mirzə bəzi vaxtlar neçə pişiyə ipək paltar geydirib boyunlarına qızıldan zınqırov bağlayıb dəstur verirdi ki, şeypur və kərəney çalsınlar, bu zaman özü çəpik çalıb şadlıq edirdi (68, s.118).

**Pişik kimi balasını dişində gəzdirmək** - birini qorumaq; təhlükələrdən xilas etmək.

Bağrımda gizlədəcəm,
Pişik kimi, dişimdə gəzdirəcəm (184, s.573).

**Pişik qırı vermək** - naz eləmək, razı ola-ola özünü narazı göstərmək.

**Pişirmək** - birini şirin dillə yoldan çıxartmaq; böyük bir faciədən, acı xəbərdən xəbərdar etmək üçün qarşı tərəfi hazırlamaq.

**Pişiyə dedilər poxun dərmandı, sıçdı üstün quyladı** - adi bir zadı əsirgəyən adam.

**Pişiyə dönmək** – yazıqlaşmaq.

Nə olubdur ki, dönübdür hamı pişiyə
Siz dəgilsiz məgər ol bəççeyi- şirani qədim (65, 1917, s.8).

**Pişiyə piştə deyəndə acığı gəlir** - düz sözü qəbul eləmir, hər bəhanə ilə dava eləyir.

**Pişiyi xəzə oxşatmaq** - çirkin adamı gözəl bilən adama deyilir.

**Pişiyimiz oğlan doğub?** - nə böyük hadisə olub? Qaranlıqlaşmamış çıraq yandırırsınız?

Gözümüz aydın olsun, pişiyimiz oğlan doğub (335, s.125).

**Pişiyim pişiyim eləmək** - şirin dillə birini yoldan çıxartmaq.

Qız-gəlinin irz-namusu əldən getdiyi vaxtda "pişiyim-pişiyim" kar kəsməz canım (62, s.793).

**Pişiyin ağzı ətə çatmayanda deyər: nə pis iy gəlir** - bir şeyi ələ gətirə bilməyəndə onu pisləmək.

Əlinə düşsə əgər, sən də bulardan birisən,
Pişiyin ağzı yetişməz ətə, murdar bilər (168, s.555).

**Pişiyini ağaca dırmaşdırmaq** - zor demək, qorxutmaq.

**Pişiyin quyruğu quvala/ qavala dəyən kimi yığışırlar** - gözə dəyməyən. Nəzərə mühüm bir hadisə gəlməsə də bir yerə yığışmaq..





Buna işarədir ki, pişiyin quyruğunun qavala dəyməsindən heç bir səs çıxmaz. Bu söz o ailələr, o millətlər haqqında işlənir ki, onların arasında böyük bir birlik var.

**Pişli qab** - ağır cərrahi əməliyyat görmək; çətin xəstəliyə düşmək; bir də çini qab az olan zaman sınanda onları piş vurmaqla yenidən yapışdırırlar.

Güzəm şalvar, kətan köynək geyinib,
Yamaq tikib, qab-qazanı pişləmək.

**Piyala göz** - iri, gözəl göz.

**Piyləmək** – yoldan çıxartmaq.

Söz dinləmədən, qıçlarını götdi havaya,
Həm iylədi, həm piylədi, ol mahi-cəmali.
Ey həzrəti ali! (80, c.II, s.89).

**Plov üstə omba olmaq** – yağlı tikə.

Yumuşaq Küveyt Səddam kimi bir ac, quduz təcavüzkara lap plov üstə omba idi ( "Yol", 1990).

**Poxdan konfet çıxar, filankəsdən adam çıxmaz** - heç dərdə dəyməyən adamı düzəltmək olmaz.

**Poxdan suvaq çəkmək** - bir işi başdansovdu yerinə yetirmək, dərdə dəyməyən şeydən bir şey düzəltmək.

**Pox quyusuna daş atmaq** - bir nanəcib adama haqlı söz deyib onun söyüşünü eşitmək.

**Pox quyusunda qara noxud axtarır** - faydasız iş görür.

**Poxsaqqal** - hörmətdən düşmüş, yaşının keçməsinə basxmayaraq xalqın adət- ənənəsinə arxa çevirən.

**Poxu cinni** - birdən hər şeyi qarışdıran, tez dəyişən adam.

Qonşumuz Molla poxu cinni idi, birdən evdə samavarı təpik ilə vurub calardı.

**Poxu çıxmaq** - əvvəlcə hamının yaxşı saydığı bir şeyin, bir adamın pis kimi qələmə verilməsi.

**Poxunu yiyən / poxunu qovuran** – tamahkar.

**Pox yedim kələyi qurmaq** - tövbə etmək, xatalı işi görməkdən vaz keçmək.

Türklərdə qayda olaraq dağların ətəyində, dağlara ziyarətə gedən zaman və ya başqa müqəddəslərin qəbri üstə gedən

zaman dağın ətəyində daşdan kələk düzəldib dağdan və ya tanrıdan günahlarının bağışlanmasını istərdilər.

**Pox yeməyi bəs deyil, həkimlik də edir** - pis iş görməyi bir yana başqalarına da məsləhət görür.

Qarğa oturub at təsləməsinin içindən bir neçə arpa tapıb yeyəndən sonra divar üstündəki qarğaya deyər: nə oturmusan, gəl sən də ye. Həm güclənərsən, həm də səfran kəsilər. Yoldaşı baxıb deyər: Pox yeməyi bəs deyil, həkimlik də edir.

**Pox yeyən itin qaşığı belində olar** - bir işə əl vuran adam özgələrə dil açmadan öncə gərək o işin əncamı üçün lazım olan şeyləri hazırlasın.

**Pörtmək** – utandığından, istidən qızarmaq.

**Pulun var giriş, pulun yoxdu sürüş** - mane olma, ya al, ya get.

**Püşk atdılar, mənə də bu düşdü** - bəxtindən narazı olmaq.





# -R-

**Radiatoru qaynamaq** - hər şeyi bir-birinə qarışmaq.

Məcnun idi yazıq, bezar neyləsin

Az qalırdı radiatoru daşsın, orda qaynasın ( Ə.Küçəbağ uşağı).

**Ramazandan çox razıyam, hələ peşvazına da gedəm** - bu danışdığımız adamın barəsində yaxşı fikirdə deyiləm ki, ona daha artıq xidmət edəm.

**Raybaray** – fikrini tez-tez dəyişən.

Raybaray, bilmirsən, yaydı, qışdı, payızdı (9, s.167).

**Rəhmət qapısı açıq olanda köpəyin yuxusu gələr** – talesiz adam xeyir gələndə ondan qaçar.

Rəhmət qapısı açıq olanda köpəyin yuxusu gələr (129, s.407).

**Rəngi uçmaq** – avazımaq.

Köynəyin çitdi sənin,<br>
Könlün məcnundu sənin,<br>
Çoxmu dərdə düşübsən,<br>
Rəngin uçubdu sənin (33, s.177).

Uçar rəngim üzümdən, vəslinə yetdikcə ey dilbər,<br>
Dizim titrər, dilim tutmaz sənin didarını görcək (Heyran xanım, s.17).

**Rəng verib rəng almaq** - pis hərəkətinin üstü açılanda bir adamın pis vəziyyətə düşməsi, utanmaqdan rəngi dəyişmək.

Nədən rəng verirsən sən rəng alırsan,<br>
Rəngin dutulanda gah qaralırsan ( Şəhrək, s.137).

Mən müharibə illərində anamın poçtalyon Pəri xalanın yar-yamaqlı çantasına necə fağır-fağır baxıb rəng verib rəng aldığını dəfələrlə müşahidə etmişəm (190, s.79).

**Rəngi zəfəran kimi olmaq** - kədərdən, qüssədən, xəstəlikdən rəngi saralmaq.

Var idi bir pişik bizim kənddə,<br>
Ac-susuz evdə bəs ki qalmış idi,

Rəngi zəfran kimi saralmış idi (Nazir Şərəfxaneyi, s.60).

**Rəyi yüngül** - yola gələn, üzüyola, xüsusən din rəhbərlərinin içində geriçi olmayana deyilir.

**Rəzbəsi boşalmaq** - sağlamlığını əldən vermək.

İşləməkdən boşuna rəzbəsi ömrün genəlib,
Hərz olubdur yeyilib dəndəsi sürtüldü ömür (168, S.76).

**Rus qaşığı ilə Fransa poxu yemək** - özündən böyük söz danışan, gop deyən.

**Ruzi dalınca dəvə tək löhləmək** - çörək pulunu min bir əziyyətlə qazanmaq.

Ruzi dalınca dəvə tək löhləyir (168, s.309).

**Ruzigarın gözü** – dünya.

Özü də bir ata minib, bir ata minib ki, ruzigarın gözü hələ belə at görməyib (174, s.11).





# -S-

**Saat bu saat** - haqqında danışlan hadisənin elə həmin vaxta təsadüf etməsi.

**Saçımın birini ağ hörəcəyəm, birini qara** – yəni hər cəfaya dözəcəyəm.

O tayınıza da qurban olum, bu tayınıza da. Saçımın birini ağ hörəcəyəm, birini qara. Qarıyıb ocaq başında qalsam da, gözləyəcəyəm. Kaş siz diləyinizə çatasınız (144, səh. 13).

**Sacın canı qızmasa, çörək bişirməz** - işləyən adamın yeməyi olmasa, yaxşı işləyə bilməz.

**Saçına dən düşmək** – saçların ağarmağa başlaması.

Ayrılıq məndən düşəndə,
Saçlarıma dən düşəndə (337, c.I, s.25).

**Saçı süpürgə etmək** - müqəddəs arzu, istək üçün başını ağartmaq.

**Saçlara qar yağmaq** – yaşa dolmaq, yaşlanmaq.

Ucaboy, enlikürək, saçlarına qar yağmış, mehriban bir adam idi (281, səh. 90).

**Sağ əl** - ən yaxın köməkçi.

Mən nə deyirəm ki, Nazlıya onda sən ol mənim sağ əlim (9, s.185).

**Sağ əlini çək mənim başıma** – sən uğur qazandın, arzuva yetişdin. Kaş mən də sənin kimi olam.

**Sağ qulağım qaşınır** - inama görə, xoş xəbər eşitmək mənasındadır.

**Sağmal inək/ sağmal qoyun olmaq** - özgələri tərəfindən daim istifadə olunmaq.

Məclis dedi: el bir sürü sağmalca qoyundur,
Qalmış deyəsən bir neçə şalvar, di soyundur (80, c.II, s.113).

**Sağ yeri qoltuq altında olmaq** – insanın, və ya bir şeyin hər yerinin yaralanması, cırılması

Mirzə Mehdi bir guşədə uzanıb yatmışdı. Yorğana bənzəyən bir şeyi də üstünə çəkmişdi ki, sağ yeri qoltuğu altında idi (115, № 2, səh. 67).

Şəhərin ortası – qəlbində – səlabətlə dayanmış
«Ərk»dir, el ürəyi – dağlı, yaralı,
Bilmirəm, sağ yeri qalmış harasında (326, səh. 38).

**Saxla, mən enim** - gop basana deyilir.

**Saqqa kimi yapışmaq** - əl çəkməmək, narahat eləmək, uşağa, ya hey gəlib gedən adama deyirlər.

**Saqqala gülmək** - birini məsxərə etmək, bəyənməmək, ələ salmaq, gördüyü düzgün olmayan işə görə ələ salmaq.

Benzi, kadilaki, sən min əmi, mən də ulağı,
Gül mənim saqqalıma, zor gətirmə vicdana ha (168, səh. 830).

**Saqqalda feyz olsaydı keçi şıxlıq alardı** – insanın şüuru saqqala görə deyil.

Saqqalda feyz olsaydı, keçi şıxlıq alardı (9, s.25).

**Saqqal darağı** – az lazımlı, ikinci dərəcəli, yararsız bir şey.

Nə deyəcəklər, hər şeyimiz vardı, bircə saqqal darağımız çatmırdı, onu da bizə mərhəmət göstərib faşistlər təklif eləyirlər (1, s.273-274).

**Saqqalı dəyirmanda ağartamışam ki?** - təcrübəm var, həyatın isti-soyuğunu görmüşəm.

Fələk gərdişdədir, sən evdə yatma,
Ki, saqqalın dəyirmanda ağartma ( Şükuhi, s.107).

**Saqqalı ələ vermək** – ailədə, cəmiyyətdə nüfuzunu itirmək.

**Saqqalım yoxdu, sözüm keçmir** -- ancaq yaşlı adamların sözünə baxırlar, mənim haqlı sözümü qəbul etmirlər.

Söylərəm qızlar qızıl xaç salmağa eylər həvəs,
Saqqalım yoxdur, sözümə guş qılmaz heçcə kəs (72, c.III, s.298).

**Saqqalına bağlamaq** - birinin ağzından çıxan sözdən istifadə edib bir şeyi onun boynuna salmaq.





**Saqqalına soğan doğramaq** – hörmətsiz etmək, sözünə baxmamaq, ələ salmaq, kefini pozmaq.

Biz razı deyilik, yox əgər bizim saqqalımıza soğan doğrayırsınız, onda özünüz bilin (72, c.III, s.33).

**Saqqalının altından keçmək** – yaltaqlanmaq.

Gərək bir Əvəz Əvəzovun saqqalının altından keçim (9, s.115).

**Saqqalı ələ vermək** - başqalarının əlində oyuncaq olmaq, özgəyə müti olmaq.

öz ixtiyarını özgələrə vermək, öz işini başqasına buraxmaq, birinə təslim olmaq.

**Saqqal keçidə də var** - insanın hörməti saqqal ilə deyil.

**Saqqallı sığır** - yaşına görə bacarıqsız.

**Saqqızını oğurlamaq** – yoldan çıxartmaq.

Saqqızını oğurlaya bildin. Hərisin aldın, onda onu Fərəcin canına salmaq mənim boynuma (9, s.173).

**Saqqalı ilə soğan doğrayır** - ara vurur, nifaq toxumu səpir.

**Saqqalı at quyruğu** - uzun, xoşa gəlməyən saqqallı.

**Saqqalım yoxdu, sözüm ötmür** - düz söz deyirəm baxan yoxdur.

**Saqqalın arada qalması** – iki tərəfin arasında qalmaq.

**Saqqalına gülmək** - ələ salmaq, sözünə dəyər verməmək.

Saqqalıma baxan gülür,
Sərzəniş eləyir, oğul (30, № 19).

**Saqqallı keçi** - əlsiz-ayaqsız adam, molla, saqqallı olmaq düşüncəli olmaq mənasında deyil.

Saqqal ilə kamil olsa hər kişi,
Nər keçiylə məşvərətləş hər işi.

**Saqqallı uşaq** – əlsiz-ayaqsız.

Mən saqqallı uşaqlar o kəslərə deyirəm ki, otuz və qırx yaşa çatıb, amma adlarını yazmağa acizdirlər (211, № 22).

**Salam verib borclu çıxmaq** - birinə yaxşılıq etdiyi halda onun bunu pislik başa düşməsi.

**Salavatla donuz meşədən çıxmaz** – yəni qanmaz düşməni yerində oturtmaq üçün, onu gərək dövrün texnologiyası və xalqın birliyi ilə yerində oturdasan.

**Sal daşı, sal buzu** – çox möhkəm, möhtəşəm bir daş.

Dağlar dağı Səhəndimin
Zirvəsinin sal buzuyam (155, səh. 30).

**Saman altına su buraxmaq** - hiyləgərlik eləmək.

**Saman çöpünü dirək etmək** - bir zadı çox böyütmək.

**Saman sənin deyil, samanlıq ki sənindi** - saman yemək, samanlıq qarın mənasındadır. Sağlamlığının qeydinə qamayıb həddən artıq çox yeyən adamlar haqqında işlədirlər.

**Sam yeli** – zəhərli yel, simasız adam, tez-tez fikrin dəyişən.

**Sancılanmaq** - birinə məhəbbət eləməkdən, birinin uğurundan narahat olmaq.

**Sapı çəkmək** – boşboğaz adamın faydasız danışığının qarşısını almaq anlamında.

Hey deyirsiz, bir-birindən köşənə
Tabekey bəsdir, dəxi, çəkdin nəxi (Mirzə Qaffar Mərəndi).

**Saplamaq** - tənə vurmaq, təhqirinin cavabını vermək.

Özün satıb, qul olub özgəyə danıb kökünü,
Onun bunun sözünü saplıri yaman dilimə (168, s.520).

**Sarala-sarala qalmaqdan qızara-qızara ölmək yaxşıdır** - düşmənin təhqirindən, ağır vəziyyətdən döyüşdə ölmək yaxşıdır.

**Sarı həsrəti** - bir əzizinin arxasınca həsrətlə baxmaq.

Üfüqdə göy gözlərin sarı həsrəti (R.Rza).

**Sarıqbaş** - molla, əmmaməli.

İşin düşdü sarıqbaşa,
Başın dəyər daşdan-daşa.

**Sarımsaq soğana deyir: iyin gəlir** - özünün eybini görmür, başqasında eyib axtarır.

**Sarımsaq yeməmişəm ki, ağzım iy versin** - günahım yoxdu ki, narahat olam.

**Sarısını udmaq** - bərk qorxmaq.





**Sarı sosar** - sarışın, hirs verən uşağa deyilir.

**Sarmaşıq tək suvaşmaq** – bir pis ənənənin toplumda yayılması, birinin-birinə mənfi surətdə yapışıb qopmaması.

Sarmaşıq tək suvaşıb, zülm sitəm cərməyə
Yük yük üstünən çatılır, tay basır insan çabalır (168, səh. 251).

**Sarsaq** – ağılsız, axmaq, beyni küt insan mənasında.

Olmasaydı cahanda sarsaqlar,
Ac qalardı yəqin ki, yaltaqlar (267, səh. 404).

**Saşısı əyilib** – saşı maşında bir vasilədir ki, maşını taraz saxlar. Əgər hər hansı bir adam birtərəfli yerisə, ona belə deyirlər, yəni müvazinətini itirib, vəziyyəti yaxşı deyil.

**Saşısı sınıb** - bir adam birtərəfli yeriyəndə, ona belə deyirlər.

**Savadı şeh çəkib/ savadı qıcqırıb** - istehza ilə birinin çox savadsız olduğunu bildirmək üçün deyilir.

Savad ərəbcə qara mənasındadır. Və ipi qara boyamaq üçün işlənir. Bu maddə nəm çəkdikdə xarab olur. Odur ki, savadı az adamlar bir yazını yaxşı oxuya bilmədikdə şuxluq üçün belə deyərlər ( M.Hesarı).

**Sayılı qoz** - ümumiyyətlə, dövlət işçilərinin və ya bir yerdən həmişə bir əndazədə gəliri olan adamların aldığı pula sayılı qoz deyilir. Bərəkətsiz, artımı olmayan.

**Sazaq qılınc kimi kəsir** - çox soyuq.

Gah şər qarışanda, gah da dan üzü
Sazaq qılınc kimi kəsəndə məni (337, c.I, s.124).

**Sazı sazbənddən alarlar/ çörəyi ver çörəkçiyə, birini də üstəlik/ zəri zərgərdən, sazı sazbənddən alarlar** - hər işi iş bilənə gördürərlər.

**Sazı sınıb** - qüdrəti əldən gedib, dövranı keçib.

Quldur Rzaxanın oğlu qaçandan sonra saqqal qoyub xalqa qan udduran müsəlmancığazların neçə vaxtdır ki, sazları sınıb.

**Serçə nədi, kəlləpaçası nə olsun** - kiçik bir şeydən böyük iş gözləyən adama deyilir.

**Sevinc yeli** - yaxşı yad etmək, xalqın xatirində yaxşı qalmaq.

Onun görən olmadı şad gününü heç zaman,
Sevinc yeli əsmədi dalısınca heç zaman (Xaqani).

**Seyidəhməd əli ilə ilan tutmaq** – birini xətərli iş dalınca göndərmək.

**Seyseyi eləmək** - bu gün sabaha qoymaq, vaxt keçirmək.

**Səbət götündən gilas tökülmür ki?** - niyə qulaq asmırsan?

**Səbir kasasının dolması** - dözümün, səbrin tükənməsi.

Gövhər xanım, daha bəsdir, səbr kasam dolub daşmış.

**Səbr elə halva bişər ay qora səndən** – səbr etməklə hər şey yoluna düşər.

Eybi yoxdur, qardaşoğlu, deyir səbrlə halva bişər ey qora səndən, saxlasan atlas olar tut yarpağından (72, c.III, s.50).

**Səbr kasasının daşması** – birinin zülmə, haqsızlığa qarşı səbrinin tükənməsi, etirazını bildirməsi.

Səbir kasam dolubdur, qarşımda mey camı tək,
Əyilməyi öyrəndi qamətim qaşlarından (80, c.II, s.49).

**Səbir səbir, axırda sınıq qəbir** - insan ömrü boyu səbr edir ki, həyatı düzələcək, axırda nəsibi bir qəbir olur.

**Səbrini basmaq** – dözmək.

İntəhası səbrini basıb hələ dillənmirdi (103, s.149).

**Səccadə (canamaz) suya çəkmək** – düzgünlüyə təzahür eləmək, xalqı aldatmağa çalışmaq.

Bu qədər çəkinə Kərimi suya səccadəvi sən,
Bala, dünya malı şirindir, dadın bilməmisən (168, səh. 555).

**Səfil-sərgərdan** – avara, *işsiz-gücsüz, evsiz-eşiksiz.*

Səfil Veysəl haqdan istər muradı,
Muradlar verəcək comərd qan oldu (18).

**Səhər cücü banından** – sübh tezdən, alaqaranlıqdan.

**Səhərin gözünə qan düşmək** – qızarmış günəşin ilk şüaları.

Poyus ayağına çatanda səhərin gözünə yenicə qan düşmüşdü (110, səh. 124).





**Səlmanılar boş qalanda, bir-birinin başını qırxarlar** – yəni dava axtaran adamlar, dava üçün kimsəni tapmasalar, öz canlarına düşərlər, qaşınmayan yerdən qan çıxarmaq istəyərlər.

**Səməndər quşu** - başqaları üçün özünü fəda edəyən adam.

Səməndər quşu tək sən də yanarsan,
Tufanlar içinə düşəndə aləm (337, c.I, s.40).

**Səmum yeli kimi əsmək** – bir ölkəyə fəlakət gətirmək.

Azərbaycanın Cəlayirilərdən əvvəlki hökmdarları Hülakülər səmum kimi əsib Şirvanı dəfələrlə yağmalayıblar (144, s.50).

**Sən atlı oldun, mən piyada** – ürəyin istədiyi bir zadın ələ düşməməsi, yəni axtarıram, tapa bilmirəm, sən varlısan, mən kasıb.

Təbiət acığın göstərdi bizə,
Yağış atlı oldu, günəş piyada (113, səh. 89).

**Sən aynada görənləri mən çiy kərpicdə görürəm** - məni özündən təcrübəsiz bilmə.

**Sənə aranla dağın nə fərqi?** - heç nəyin sənə isti- soyuğu yoxdu.

Səninçün aranla dağın nə fərqi, ay bəxtəvər? (84, s.166).

**Sənə bir toy tutaram, ata-ananın toyu yadına düşər** – başına bəla gətirərəm.

Sizə bir toy tutaram atavuzun, anavuzun toyu yalan olar (9, s.155).

**Sənə borc deyil** - sənə dəxli yoxdur, qarışma.

**Sənətin başında turp əkmək** – məsuliyyətlə bir işə yanaşmamaq.

Gəlin buraxmayaq məbədə yaxın,
Sənətin başında turp əkənləri (264, səh. 159).

**Sənət qızıl bilərzikdir** - sənət həmişə insanın özü ilə daşıdığı böyük sərmayədir.

**Sən gedəndə mən gəlirdim, sən oxuyanda mən toxuyurdum** - məni uşaq bilmə.

**Sən gəl bu daşları ətəyindən tök** - nahaq bir sözün üstündə durma, xeyirsiz işdən əl çək.

**Sən girən kol deyil** – bu iş sənlik deyil.

Sən girən kol deyil (335, s.112).

**Sən gündüz gedən yolları mən gecə getmişəm** - səndən çox təcrübəliyəm.

**Səninkini qaynadaq/yeyək, mənimkini oynadaq** - öz mənafeyini düşünmək.

**Sən kür, mən kür, at çaydan necə keçsin** – sən də, mən də sözgötürməyən, qabaqdan yeməz.

Koroğlu, aşıb-daşan çaya dedi: «Sən kür, mən kür, at çaydan necə keçsin? (108).

**Sən sağ, mən də salamat** - səninki səndə, mənimki məndə -bizim bir yerdə olmağımız sona çatdı.

**Sən saydığını say, gör fələk nə sayır** – yəni, insanın taleyi özünün istəyi əsasında qurulmur.

Yaxşı bir məsəldir deyib atalar,

Sən saydığın say, gör fələk nə sayar (Mərəndli Qərib).

**Sən vurmadın, mən də yıxılmadım** – sən bir iş görməsən biri yıxılmaz ki...

Elə qalmışam məəttəl, yaxşı sən vurmadın, mən yıxılmadım, bəs bu nə oldu (72, c.III, s.63).

**Sərbaz/ əskər nə bilir heyva kaldı** - şüursuz, cavan, kobud, rəftarını bilməyən adama deyilir.

**Sərçəni rəngləyib qənari əvəzinə satmaq** - kələk gəlmək.

**Sərin su, təzə kuzə** - təzə evlənənə deyirlər.

**Sərraf gözü** - baxan kimi hər şeyi bilən adam.

Gövhərin işdə qiymətin

Sərraf olan arif bilər (225, s.58).

Sərraf ki, hər şeyə qiymət verəndir,

Yoxdur bir arpası, bu gün nədəndir? ("Yeddi gözəl", s.54).

**Səsi alınmaq** – səs vermək hüququ yoxdur. 20-30-cu illərdə ortabab və varlı kəndlilərin səsvermə hüququ yox idi.

Sənin səsin alınıbdı (195, c.II, s.173).





**Səsi çıxmamaq** – razı olmaq, razılıq əlamətidir.

Müsəlləmdir, doyursan millətin qarnını, səsi çıxmaz (168, səh. 323).

**Səsi elə bil quyunun təkindən gəlir** – yəni səsi çox alçaqdan gəlir, səsi tutqundur.

**Səsi kallaşmaq** - səsi yorğunluqdan, ağır vəziyyətdən normal vəziyyətini əldən verib.

Uçub rəngin qızım, səsin kallaşıb (353).

**Səsini içinə soxmaq** – susmaq.

Universitetdə Azərbaycan türklərinin birliyinə şahid olan şovinist müəllim səsini soxdu içinə.

**Səsin sallar altından gəlsin** - öləsən.

**Səs-səsə vermək** - əlbir olmaq, eyni şeyi istəmək.

**Səssiz ölüm** – qəflətən ölmək.

Səssiz ölüm kaş hay sala ellərə (251, səh. 31).

**Sıçdın xan evinin kəraminə** - pis üz görsətdin, xəsislik elədin.

**Sıçıb suvamaq** - söymək, yaman demək, rüsvay etmək.

**Sıçmamış ocaq baçı qoymayıb** - hamını aldadıb, incidib.

**Sıxıb suyunu çıxartmaq** - əziyyət vermək, işlətmək, bərk qucaqlamaq, boğuntu ilə xalqın nəfəsini kəsmək, ruhiyyəsini öldürmək və ya evdə, iş yerində birini azadlıqdan, şadlıqdan məhrum etmək.

Sıxdılar, çıxdı suyum, bir para cahil, nə edim? (168, səh. 109).

**Sıxılmaq** - darıxmaq, özünü narahat hiss etmək, utanmaq, qıpçınmaq.

Yoxmu sənin incilərin, altun bilərziklərin?

Söylə yavrum, heç sıxılma! (206, s.62).

**Sımsığına dəyib** – xətrinə dəyib, inciyib.

Mən də partnixa gələcəkdi, çıxdım getdim, bu bunun sımsığına dəyib (72, c.III, s.83).

**Sındırmaq** – diz çökdürmək, yaxşı oynamaq.

İndi görürəm ki, hamısı əbəs imiş, səni sındırıblar! (144, s.127).

**Sınıq könül** – ürəyi birindən sınmaq, incimək.

Gözəl, sən də muradına çatmadın,
Bənna olub sınıq könül yapmadın (32, c.II, s.11).
Ac qarın doyurmuşam, sınıq könül sarımışam (144, s.84).

**Sınıq könül sarımaq** – birinə yaxşılıq etmək.

**Sınmaq** – çətinliklərlə üzbəüz olmaq, həyatda nakam olmaq.

**Sırıq çəkmək** - mümkün qədər zülm etmək, zor demək, bir evdə olan meyvəyə və ya bağa sırıq çəkmək.

Nə arvadım var, nə uşağım bala, mən bu zamanın adamı deyildim. Zəmanə mənə sırıq çəkdi (203, s.73).

Sırıq çəkdi İskəndər də Daraya,
Biz bilirik sən getmisən haraya (H.Həkimi).

**Sırımaq** - birinin başına börk qoymaq, çirkin qızı birinə ərə vermək, dəyərsiz bir şeyi satmaq.

Arvad: bütün kişilər fırıldaqdır, bu gün süd satan kişi mənə bir qəlp pul verib.

Kişi: hanı o pul, ver bazarda başqasına sırıyım. Arvad: qəssaba sırıdım getdi (205, s.23).

**Sısqa** - arıq, cansız.

Dur ver ki, bu sısqa bir-iki cam ilə doymaz
Ta düşməsə qanmaz (223, s.58).

**Sıtqın sıyrılması** - sədaqət və etimadın zay olması, ürəyin sınması.

**Siçan deşiyini satın almaq** – bərk qorxmaq, çox qorxub qaçıb gizlənmək.

Çıxardaq onları qaçıb gizləndikləri siçan deşiklərindən gün işığına (9, s.101).

**Siçan dəliyini satın almaq / mağara axtarır gizlənməyə** - qorxudan qaçıb gizlənmək, qorxudan, ölümdən nicat tapmaq üçün hər bir işə əl qatmaq.

Kütbeyin düşmən mağara axtarır gizlənməyə
Hər biri olmuş odur quli-biyabanım mənim (163).
Eşidən vaxta həvapeyma (təyyarə) muş dəliyin,
Satan olsaydı, alardıx, o da bir günlər idi (168, səh. 825).

**Siçan diş** – xırda, inci kimi dişləri olan uşaq.





**Sidiyi köpüklənmək** - oğlan uşağının yetkinlik yaşına çatması ilə əlaqədar işlənir.

**Siftəni kor eləmək** – alış- verişinin ilk müştəri ilə baş tutmaması.

Qədimdə alış-verişə gedəndə ilk alış-verən edənin verdiyi pula siftə deyərlərdi.

**S.. altda qalar, dil altda qalmaz** – hər sözə bir cavab verən adam.

Keçəl dil altda qalan adam deyildi – dedi, - Bəy sağ olsun (182, səh. 34).

**S..inən çibanı tanımamaq** - heç zaddan başı çıxmamaq.

**Si..və farsı öyrətmə** - özünü ələ salma, məni aldatma.

**Sikkəbərlik eləmək** – nahaqdan birinin qabağında dayanmaq, başına börk qoymağa çalışmaq.

Ay gözünə dönüm! O indi mənimlə sikkəbərlik eləyir (72, c.II cild, səh.175).

**Sikkə çalmamışıq ki** - havayı pul tapmamışıq.

**Silib süpürmək** – yığıb –yığışdırmaq.

Sövdagərlər yemədi, hamısı geri qayıtdı, hamısını silib-süpürüb ötürdü içəri (46, s.20).

**Sillə vurmaq** – gözlənilməz zərbə vurmaq.

Bununla Fəxrəddinə böyük bir sillə vuracağıq (234, s.443).

**Simləri qarışıb** - ruhi cəhətdən normal halda deyil.

**Sinə dağı** – unudulmaz yara.

Sızıldar yaralar eylərəm ox-ox,
Demirsən sinənin dağı nədəndi? (32, c.II, s.49).

**Sinədağlı** – ruzigardan əzab-əziyyət görmək, əzizlərinin ölməyinə şahid olmaq.

Zamanə indi edib sinə dağlı lalə məni ( X.Natəvan).

**Sinədəftər** – hər şeyi əzbər bilən.

On səkkiz yaşına kimi mollaxanada oxudu, bütün elmləri sinədəftər elədi (46, s.155).

**Sinəsi dolu** – ürəyi dolu.

Gördüm dostumun sinəsi doludur (9, s.52).

**Sinəsi düyünlü, dağlı** – dərdli adam.
Axırın yaz eylədin sən, ay bimürvət, bivəfa,
Aç sinəmdə düyünə bax, dağı gözlə, gözlə sən (32, c.II, s.29).
**Sinəsi düyünlü** –dərdli adam.
Sinəm düyünlüdü, ciyərim qara,
Əslisiz qalmışam qəmgin, avara (35, s.485).
**Sinəsinə dağ çəkmək** – ürəyini yaralamaq.
Bəxtımın qapısın bağlı qoyubsan,
Çəkib sinəm üstə dağlar qoyubsan (32, c.II, s.81).
**Sinəsinə köz basmaq** – yarasının közünü qopartmaq.
Basıbdı sinəm üstə bimürvət yanar közü,
Yandırır bu sinəmi ol atəşə, narə baxın (32, c.II, s.32).
**Sinəsinə yaman dağ çəkmək** – ağır yara vurmaq.
Neçə ildi mən gəzirəm dağları,
Bu sinəmə çəkdin yaman dağları (35, s.547).
**Sinəsini irəli vermək** – bir işi boynuna götürmək.
Qalxıb-enən təlatümlü sinəsini irəli verib qeyzlə:
-Mən dönük deyiləm, Dərviş Həsən!- dedi (144, s.140).
**Sino getmək** – çox istəmək.
Sözün düzü, padşah öz padşahlığı üçün də çox sino getmirdi (9, s.78).
Oğul, sözlərimdən belə məna çıxartma ki, Petya dayı, qadınsız yaşaya bilmir, evlənmək üçün sino gedir (1, s.176).
**Sinsin axtarmaq** -hər yeri bir-birinə vurmaq, nəyisə axtarmaqdan ötrü hər yerə baş vurmaq.
Bir gün bizi bu ölkədə sinsin arayarlar (168, səh. 31).
**Sirkə nə qədər tünd olsa, öz qabını çatladar** –birinin xasiyyəti nə qədər pis olsa, özünə zərər vurar.
Tündləşib öz qabını sındırmaq dərəcəsinə gələn sirkə kimi ömür yoldaşım yenə həmin çığır-bağıra başladı (253, s.153).
**Siz daş qoyan yerə mən baş qoyaram** - nə işə ol vursanız, mən orda candan keçməyə razıyam.
**Soğan kimi soyulmaq** – müflis olmaq, bərk əsəbiləşmək.
İndisə soğan kimi soyula-soyula: -qorxma- dedi. (296, s.185).





**Soğan tək sıxmaq /soymaq** - hər şeyini əlindən almaq.
Tarac edirlər taxılın, barın,
Soğan tək soyuban ellik, həm varın (107).
**Soğan yeməmisən, için niyə göynəyir?** - əgər bu işdə günahın yoxdu, niyə narahatsan?
**Soxa-sox** – yəni, böyük-kiçik tanınmayan yer.
Tutalım ki, zamanın həzrəti- İsası mənəm,
Bu soxasoxda necə möcüzə icad eləyim? (Vahid).
**Soxan- soxanlıq** – şuluq.
Çıxcaq ramazan girir məhərrəm,
Bu şıqda soxan-soxanlıq olmaz (338, s.52).
**Soxulcan qurdu** - tufeyli, xalqa faydası olmayan insan mənasında.
Soxulcanlar nakəsdən, kəmfürsətdən,
Xəbisdən mənalı yaşayırlar, ey ədəbi soxulcan (265, səh.186).
**Sona başı** - çayın üzərində bəzən parıltılı bir təbəqə görünür ki, buna deyirlər.
**Sonanı yasar aldı** - yaxşının pisə qismət olması.
Əzizinəm yasar aldı,
Gülnurum yasar aldı,
Tərlana xəbər olsun,
Sonanı yasar aldı (33, s.87).
**Soncuqlamaq** – birini vurmaq, döymək, əziyyət vermək.
Gələnə noxtasız eşşək kimi, soncuqlayırsan (168, səh. 329).
**Son səhər** – fəlakətin axırı, xoşbəxtliyin başlanğıcı.
Çəkər hələ son səhərin açılması (286, səh. 86).
**Sorulmamış alçı durur** -dindirməmiş hər işə qarışır.
**Soyub quyruğunda qoymaq** – bir işi lap qurtarmağa az qalmış yarımçıq saxlamaq.
Biz yorulduq söyləməkdən, sən sükutdan doymadın,
Saxladın quyruqda gön qaldı dayandın, soymadın (72, c.III, s.311).
**Soyuq baxmaq** – laqeyd qalmaq.

Bu xeyirli işə (Gəncədə açıqfikirli iranlılar tərəfindən bir „Nəşr-maarif" cəmiyyətinin olması) çox əşxasın (iranlıların) soyuq baxmağını gördükdə, idarə bunu cəhalətdən və əməlsizlikdən bilib (65, № 1, səh. 16, 1905).

**Soyuqdan bəy durmaq** - düppədüz durmaq, tərpənməmək.

Hey soyuqdan quruyub bəy dururam,
Kimdi yengə, müşata bilməyirəm ( Şəhriyar).

**Soyuq daş** – hissi olmayan ürək.

Soyuq daşa dönüb o gündən ürək
Ürəkdən asılan daşı neynirəm.

**Soyuq dillə dindirmək** – mehribanlıq etməmək, quru danışmaq.

Hər kimi dindirsən soyuq bir dillə,
Baxıb yadlar kimi yanından ötər (337, c.I, s. 42).

**Soyuqluq** - məhəbbətsizlik, kin-küdurət.

Şindivar(Azərbaycanın cənubunda yer adıdır) xanlıq yeri olmuş, xanı isə Marağada yaşarmış, nədənsə Baba Sultan ilə xanın arasında soyuqluq var idi (122, s.111).

**Soyuq olmaq** - mehriban olmamaq.

Şair var ürəkdən ah çəkib deyir,
Uşaqlıq, uşaqlıq harda qalmısan?
Kaş tapa biləydim səni bir kərə,
De niyə bu qədər soyuq olmusan?(210, s.61).

Bu xeyirli işə (Gəncədə açıq fikirli iranlılar tərəfindən bir "Nəşr-maarif" cəmiyyəti təsis olmağı) çox şəxsin (iranlıların) soyuq baxmasını gördükdə idarə bunu cəhalətdən və əməlsizlikdən bilib (65, 1917, №1, s.16).

**Soyuqsaqqal olmaq** – hörmətsiz.

Biz vətən azadlığı uğrunda verdyimiz vədə və sözlərə vəfalı çıxmasaq, xalqın yanında soyuqsaqqal olarıq.

**Soyumaq** –mehribanlığın azalması.

Mənim gözlərimdən od axır, sənsə,
Buz kimi soyumusan eşitmişəm ki (294, s.41).





**Sövdanı pul, davanı qılınc** – iş görmək üçün konkret imkan, iş görmək lazımdır.

"Sövdanı pul, davanı qılınc" – rəhmətlik ataların bu məsəlini yada saldı ( 253, s.107).

**Sövsək, zəvzək olmaq** – boş-boş danışmaq.

Çox danışma, çox yemə, çox yuxlama,
Bağla əngin, olma zəvzək, naz balam (168, səh.268).

**Söyüd ağacını qarışqa yeyər** - dərdə dəyməyən şey tez xarab olar.

**Söyüşü öpüşlə sındırmaq** - məhəbbətlə utandırmaq.

O söymək istədi məni, amma mən,
söyüşü öpüşlə sındırdım yaman ( Məhsəti).

**Söz altında qalmamaq** - layiqli cavab vermək.

**Söz atmaq** - birinə qaxınc etmək.

Burda bir-birinə "həmşəhri", "matışqa", "fəspapaq osmanlı", "acından ölən iranlı", "qulağı tüklü müsəlman", "yurdu bəlli olmayan" deyənlər çoxdur. Sənə elə söz atanın baş-qulağına bax, gör nə tükdə canavarddır (29, s.34).

**Söz beyninə batmaq** – bir sözü qəbul etmək.

Bic vələdəznalərə söz batmıyor,
Min də nağıl aç, birin aldatmıyor (267, s.128).

**Söz çeynəmək** – sözün çürüyün çıxarmaq, dönə-dönə təkrarlanmaq.

Söz deyən azdır, söz çeynəyən çox.

**Söz çıxmaq** – ixtilaf baş vermək, narazılıq.

Təraz tut haqq hesabı,
Ortamızdan qoyma söz çıxsın (255).

**Söz dağarcığı** – sirlərlə dolu bir insan, çoxlu maraqlı söhbətlər edən kəs.

**Sözdə əmması olmaq** – sözü qəti surətdə aydın olmamaq. Bir sözün düzgünlüyünə şəkk eləmək.

Yenə tutdu üzün xəlqə,
Dedi ay qomi-bisəlqə
Gərəkdi mən deyim xəlqə,
Sözü ki, onda əmma var (301, səh. 61).

**Sözdən söz çıxarmaq** –sözbaz, bəhanə axtaran.

Arvad ki, aldın onu əziz saxla gözündən,
Bəhanələr gətirib, söz çıxarma sözündən (80, c.II, s.61).

**Söz dəymək** – incimək, sözün xətrə dəyməsi.

Körpə uşaqlar təki söz mənə tez dəyir (204, səh 25).

**Sözə baxma, söyləyənə bax** - danışılan sözə diqqət yetir.

**Sözə qaravul qoymaq** – danışanda ağızdan çıxan sözə fikir vermək.

Qız belə dil-dil ötürmə, qaravul qoy sözünə (168, səh. 268).

**Sözə tutmaq** - məsxərə eləmək; başını qatmaq.

Varlı yalan desə yoxsullar gerçək,
Yoxsulun sözünü sözə tutarlar (12, s.40).

**Söz fır-fır fırıldayır** – yəni söz ağızlara düşür.

**Söz gəzdirən** - söz dolandıran, ara vuran, dedi-qodu ilə məşğul olmaq. Özgənin sözünü danışmaq.

Əgər hərzə danışmaq insanların təbiətində kök salsa, get-gedə onda söz gəzdirmək, eyb axtarmaq adət şəkli alar (A.Bakıxanov).

**Söz götürmək** – birindən minnət götürməmək.

İstolda oturmaram,
Ağır söz götürmərəm,
Gətir "Quran" əl basım,
Yardan əl götürmərəm (33, s.168).

**Söz güləşdirmək** – höcətləşmək, mübahisə etmək, cavab qaytarmaq.

Ərbab qolçomaqlarına deyir: «Tutun onu, aparın.... Ta bundan sonra söz güləşdirən olmasın» (340).

**Söz qalağı olmaq** – söz yığını.

Deyir mənə şairlərim belə-bilə
Böhtan dedi, başım oldu söz qalağı (265).

**Söz qanadına düzmək** – şer qoşmaq.

Dünya başına fırlanır, gözünə qaranlıq çökür. Handan hana ayılıb başına gələn qəziyyəni söz qanadına düzür (103, s.18).

**Söz qırtmaq** - bir söz qopartmaq, söz çəkmək.

Ondan söz qırtmaq da hər oğulun işi deyildi (288, s.182).





**Söz qurtdalamaq** - birinə söz çıxartmaq.

**Söz odur ki, həqqə vara** – söz gərək müqəddəs ola.

Həqq olan sözün dəyəri var (20, s.83).

**Söz oynadan** – hazırcavab.

Fikirləşdi ki, keçəllər söz oynadan olur. Qoy gəlsin kefimizi durultsun (103, s.145).

**Söz pəhləvanı** – əlindən iş gəlməyən, ancaq dildən pərgar olan insan anlamında.

**Söz sındıran** - sözü birinin ağzında qoyan, başqalarının fikrinə əhəmiyyət verməyən.

Söz sındıranın sözü sınar, boşa gedər, sözün yerə salarlar.

**Söz söz açar, söz göz açar, söz ovuc açar** – insanın biliyi nə qədər çox olsa, o qədər xoşbəxt yaşayar. Bilik əsasında fırıldaqçıların, yalançıların sirrin açar.

**Söz sözü gətirər, arşın bezi** – söhbət çox uzanar.

Gətirib söz-sözü, arşın da bezi,
Nahara saxladı axırda bizi (168, səh. 526).
Gətirdi söz-sözü arşın bezi,
Uzandı sözüm.
Qarışdı söz-sözə, şerin pozuldu mizanı (168, s.149).

**Sözsüz adam – soysuz adam** – yəni bir Adam elindən, tayfasından uzaq düşübsə, deməli milli mədəniyyətindən, milli kimliyindən uzaq düşüb. Ona görə də danışmağa sözü olmaz.

**Söz toxuyan** –şair, yalandan birinə dosye düzəltmək.

Babam toxucu olmuşdur, amma mən söz toxuyanam, sözləri nəzmə çəkənəm.

Mənəm bax bu günün əziz insanı,
Mənəm söz toxuyan şair Xaqani ( 163).

Xəyanətkar özünü xilas etmək, neçə günlük alçaq və iyrənc həyat sürmək xatirinə öz yoldaşlarını satıb zindan rəisləri ilə əməkdaşlıq edənlərdir. O yalan söz toxuyur, öz töhmət və iddiaları ilə guya sirləri açır (248, s.436-437).

**Sözü at yerə, söz sahibi götürər** - söz kimə aiddirsə, o bilər.

**Sözü bir hamamda danış, bir də məsciddə** - bu iki yerdə söz sürətlə yayılar.

**Sözü denən alana, qulağında qalana** – sözü eşidənə demək lazımdır.

Sözü denən alana, qulağında qalana (103, s.72).

**Sözü güllə yerinə işlir** - qüdrət sahibidir, sözünün hər yerdə keçməsi.

**Sözü keçən** – sayılan, nüfuzlu.

Ordu içində sözü keçən adamların əksəriyyəti həqiqətimizə istinad edər (144, s.177).

**Sözü kəsərli olmaq** – sözü keçmək.

Sizdən nigaran qalsam, sözüm kəsərli olmaz və Adıyüksəklə görüşüm lazımınca fayda verməz (144, s.148).

Millətlərin sazimanı yalançı bir yığıncaqdır, sözlərinin yox kəsəri (113, səh.110).

**Sözü maqqaşla ağzından çəkmək** - az danışan.

**Sözümü qürbətə/ qəribliyə salma** – inan, doğrudur.

Şairəm, sözümü qürbətə salma,
Qulaq as, dünyada gör bir nə səsdir (Səhənd).

**Sözün canı** – sözün məğzi, mahiyyəti, nəticəsi, əsli, kökü.

**Sözün çürüyünü çıxartmaq** - həddən artıq təkrarlamaq, ətrafdakıları bezdirmək..

**Sözün düşünü uşaqdan soruş** - uşaq yalan bilmir.

**Sözünə bir bağ sozi (kəvər) verməmək** – yəni əhəmiyyət, dəyər verməmək.

Sözünə bircə bağ sozi verməzlər,
Ustadı olsan da şerin, qəzəlin (291, səh. 59).

**Sözünə söykək durmaq** – tərəfini saxlamaq.

Mövlana Mahmud tapılsa, ümidvaram o da sənin sənin sözünə söykək durar (144, s.158).

**Sözün keçməməyi** – birinin etibarsızlığı əlamətindədir, qüdrətdən düşməsi.

Keçməz sözümüz bir pula sərdar yanında (267, səh. 46).

**Sözün qəlbdə düyün bağlaması** – sözü ürəyində qalmaq.

Tikançı söylədi nə üçün?
Dedi: söz qəlbimdə bağlayıb düyün (Türkoğlu, s.224).





**Sözün tez dəyməsi** – bir sözdən tez incimək, küsmək.

Abam hey nənəmin ağzın əyərdi,
Çox bilmiş qocaya söz tez dəyərdi (60, səh. 129).

**Sözün təkinə getmək** – bir söz barəsində uzun-uzadı danışmaq.

Ay adı xoş Səkinə,
Getmə sözün təkinə (193, səh. 66).

**Sözünü balla kəsim** - ehtiram əlaməti kimi birinin sözünü kəsəndə işlənir.

**Sözünü yerə salmaq** -- birinin xahişini həyata keçirməmək.

Söz dedim,
Sözümü yerə saldı. (167, s.76).

**Sözü oyza-buyza atmaq** - mətləbdən yayınmaq, əsl məsələnin üstündən keçmək.

Sözü oyza-buyza(o üzə- bu üzə) atmaq lazım deyil (195, c.II, s.50).

**Sözü üzə çəkmək** – bir nöqsanı, eybi birinin üzünə demək.

Keçən sözü çəkmə üzə, amandı,
Hədyan danışmışam, laf eyləmişəm (32, C.II, s.9).

**Su aydınlıqdır öz qapıva cala** - bu yaxşı işdir, özüvə rəva gör.

**Su başdan aşıb** - iş o qədər xarab olub ki, düzəlməyinə ümid yoxdu.

**Su başdan aşsa, ya bir qarış, ya min qarış** – yaman günə düşəndən sonra, yamanlığın qədəri önəmli deyil.

Bu aləmin nəşibə-fərazın (eniş-yoxuş) dolanmışam,
Su başdan aşsa, birdir ğəriqə dərin-dayaz (168, səh. 472).

**Su başdan bulanıqdır/ balıq başdan iylənər** - cəmiyyətdəki bəlaların səbəbi yuxarılardadır.

**Subaylıq sultanlıqdır** – subay adamın qayğısı az olar.

*Ay Zəki müəllim, subaylıq-sultanlıqdır (9, s.64).*

**Su bulanmasa durulmaz** - bəzən fikir ixtilafının qarşıya çıxması bais olar ki, münasibətlər daha da yaxşılaşsın.

**Su bülbülü** - tez-tez hamama getməyə ağrınan adam. Yağışdan bütün islanmış.

**Sudan quru çıxmaq** – günahkar olsa da, özünü günahlı göstərməmək, günahsızlığı məlum olmaq.

Yaxşı, bu saat, görüm bu şalbanın hesabı, sözü nədir ki, suya batmaq istəmir? (72, c.III, s.43).

**Su durardı, o durmazdı** - çalışqan, gecə-gündüz işləyən.

**Su gələn arxa bir də gələr** –imkanı olmuş adamın yenə imkanı olar. Ümid mənasındadır.

- Nə olar ki? Deyərlər, su gəlmiş arxdan bir də gələr? (253, s.443).

**Su gətirən deyil, giliflәri yaş edir** - bir iş görən deyil, vaxtı sərf ediir və bizə xərc açır.

**Su gətirməyib** - havayı gəlməyib.

**Suiçim** - bir an içində.

Bir suiçim saatda dörd bir tərəf oldu adam (148, s.183).

**Su içimi tək olmaq** - çox rahat, çox zəhmətsiz bir iş.

Bilirəm canım, sənin əlində su içimi kimidir ( 115, № 2).

**Su kəsir** - çox soyuq su.

**Su kimi axan nitq** – səlis danışıq tərzi.

Diqqətlə qarşımda bayılan mirzə, bu da Lermontovun dağlarda uçan ruhu, Puşkinin su kimi axan nitqi, Torlstoyun məsihanə fəlsəfəsinə vurulmuş bir uçitel idi (256, səh. 17).

**Su kimi içmək** – əzbər bilmək.

Onu mən<br>Sənələr keçdi ki,<br>İçdim su kimi (337, c.I, s.45).

**Su qiymətinə** – demək olar ki, havayı, ucuz..

Su qiymətinə hər nə mənə, bolluq, ucuzluq (168, səh. 20).

**Sultan haqqı** - gecə əri ilə yatan qadın bu barədə qonşulara bildirmək üçün hamam fitəsini şəritə asıb onları çay içməyə dəvət edirdi. Buna sultan haqqı deyirdilər.

**Suluya demə çəkmək** – xalqı avara qoymaq, ona pis başçılıq etmək.

Yığışıb əlli nəfər bir güruh icad eləyib,





Çəkir millәti bəzi suluya, bəzi demə (168, səh. 361).

**Sumaq sorur** - nəhayət dərəcədə ac, yoxsul olmaq.

**Sum-sum deyincə birdəfəlik sumaq de/ mus-mus deyincə birdəfəlik Mustafa de** - sözünün canını de, ürəyindəkini birdəfəlik açıq söylə.

**Su olan yerdə təyəmmümü olmaz** – böyük və təcrübəli adam olan yerdə təcrübəsiz adamın danışması düzgün deyil.

**Su öz yolun açar** – bir millәti həmişə zülm altında, təhqir altında saxlamaq olmaz.

**Su səhəngi suda sınar** - bir adam gördüyü işin qurbanı olur. Adətən xətərli işlərlə məşğul olanlar barəsində işlənir.

"Su səhəngi suda sınar"- dedi. Oğru da oğurluqda ölər (253, s.382).

**Su sonasıdır** - çox gözəl qız, qadın.

**Susuz aparıb susuz gətirrəm** - əlsiz-ayaqsız adama deyilir, yəni məni aldada bilməzsən. Mən səndən zirəyəm.

**Su təzə, bardaq təzə, içərlər məzə-məzə-** təzə evlənənlər haqda işlənir. Yəni dava-şava sonra olacaq (103, s.71).

**Su üstündə ocaq qalamaq** –olmayan bir iş görmək.

Suyun üstündə ocaq qalamaq istəyirsən, suyun üstündə ocaq yanarmı, dillən görüm? (296, s.173).

**Su və hava kimi lazım olmaq** – Cənubi Azərbaycanda Milli Azadlıq Hərəkatına hava kimi, su kimi lazım olan bir adam, bura gələndən sonra, yəni hərəkat dağıdılandan sonra tamamilə artıq insana çevrilmişdi (247, səh. 40).

**Suya dönmək** - inanılmaz bir sözdən heyrətə düşmək; zəhmətin hədər olması.

Mayan suya dönsün (38, s.138).

**Suya əl yetirmək** - tualetə getmək.

Rüfəqa əl yetirib orda suya,<br>Qılınub ta ki namaz oldu dua (168, S.29).

**Suya tökmək** – bir zadı həddən artıq ucuz satmaq.

**Su yerinə qan yerimək** – nəhayət dərəcədə boğuntu, adamı öldürmək.

Pəhləvi rejimi hakim olandan sonra su yerinə qan yeriyir (30, №3).

**Su yeri sudan soyuq** - yəni aşdan isti kasa, yas yiyəsi kiridi, yasa gələn kirimədi (26, səh. 74).

**Suyu ağaclı yerdən, qızı qardaşlı yerdən** – keçmişdə arxalı nəsildən evlənmək daha üstün sayılırdı (103, s.70).

**Suyu arxa çevirmək** -işləri yola salmaq, maneələri aradan götürmək

Güldən incə ürəyin Azər elin sevirdi,
Zay olmadı əməyin, suyu arxa çevirdi (352, s.333).

**Suyu boş** -tez yola gələn, hər sözü qəbul eləyən, əxlaqi cəhətdən möhkəm olmayan.

**Suyu bulandırır ki, balıq tutsun** - öz mənafeyi üçün ara qarışdırır, nifaq salır. **Suyu qiymətinə** - çox ucuz.

Ənquri fəravan, əriki su kimi ərzan,
Səhraları pur ləlavü-reyhandır, Əlican! (301, s.161).

**Suyu qurumuş dəyirman** – heç bir xeyir gəlməyən.

Qadam ağzıva, suyu qurumuş dəyirmana oxşayır (9, s.176).

**Suyumuz bir arxa getmədi** - yola gedə bilmədik, birlikdə işi görə bilmədik.

**Suyun lal /lam axanı, adamın yerə baxanı** - el arasında deyilir ki, yerə baxan adamlar ümumiyyətlə xain, ikiüzlü olurlar.

Yaxşı deyiblər, suyun lal axanı, adamın yerə baxanı (9, s.168-169).

**Suyun şırıltısına qulaq as** - gələcəkdə başqa şeylər olacaq, vəziyyət belə qalmayacaq.

**Suyu süzülə-süzülə** - peşiman.

Firuzu görməyə çox ümid eləyən Həmid mətbəədən suyu süzülə-süzülə qayıtdı (1, s.207).

**Suyu süzülə-süzülə getmək** – peşimanlıq əlaməti.

Suyun süzülə-süzülə dükandan çıxıb evə getdim (201, səh. 202).

**Suyu üfürüb içmək** – çox ehtiyatlı olmaq, qorxmaq.

O qədər yanmışam odsuz-ocaqsız,





Suyu da üfürüb içirəm daha (294, s.49).

**Süpürgə çəkmək** – hər şeyi yığıb aparmaq.

Bir hırsız dükanı soyub, soğana çevirmiş (2, səh. 16).

**Suyu süzülmüş siçan kimi olmaq** - həddən artıq islanmaq. Arxasınca getdiyi işdən naümid qayıtmaq.

**Suyu üfürə-üfürə içmək** - həddindən artıq ehtiyat eləmək.

Şəhər su idarəsi xəbərdarlıq edir ki, bir neçə ay ərzində suyu üfürə-üfürə içmək lazımdır (9, s.51).

Suyu üfürməmiş içə bilməyən,
İblisi ilbizdən seçə bilməyən,
Yuxuda Arazı keçə bilməyən
Bir dost itirmişəm dost hesabında (184, s.344).
O qədər yanmışam odsuz-ocaqsız,
Suyu da üfürüb içirəm daha (294, s.49).

**Süddən ağzı yanan qatığı püfləyə-püfləyə yeyər** - bir yerdən xətər görən adam ehtiyatla davranar.

**Süd gecə** - ay işıqlı, bəyaz gecə.

**Süd gölündə üzmək** – maddi vəziyyəti çox yaxşı olmaq.

Xanpərvər bəyimin sənə o qədər şəfaəti var ki, son süd gölündə üzürsən (335, s.87).

**Süd gölünə düşmək** - gözlənilmədən bütün işlərin yoluna düşməsi, firavan yaşamaq.

Olduqca əlverişli şərait
Düşmüşəm süd gölünə eynicə xamuş olanı,
Kəsdirin pərə et ey eşq rüsva, rüsva (223 s.92).

Süd gölünün içinə düşüb üzürsən, yenə sənə azcır? (129, s.412).

**Südlü inək** -xeyir verən.

İnsan ərbablar üçün o vaxta qədər ki, işləyir, südlü inək səviyyəsinə enir.

Onlar ərbabların qulları, bunlar xanın südlü inəyi (353).

**Südlü sümük oynamaq** – faydasız bir işə əl qoymaq.

Bir də kor olanla südlü sümük oynama, qardaş,
Alma çolağı boynuva, çıxma dama, qardaş (168, səh. 841).

**Südü daşmaq** - birinə məhəbbət göstərmək, öpmək, bağrına basmaq.

**Südünü göyə sağmaq** - olan bir şeyi vermək istəməmək, səhvini boynuna almamaq.

**Süfrədə əlini saxla, məclisdə dilini** –tamahkarlıq etmə, danışığına fikir ver (103, s.68).

**Süfrəni yuxarı başdan düzərlər, aşağı başdan yığarlar** - böyüklərin ehtiramını saxlamaq vacibdir.

**Süfrəyə salam etmək** – birinin minnətli çörəyini yemək.

Sər verib, süfreyi namərdə salam etmədilər,
Afərin hümməti valasına, mərdanələrin (151, səh. 119).

**Sümük kimi boğazda qalıb nə ata bilirəm, nə uda bilirəm** - yaxın bir adamı ilə məsələnin olması.

Zindəganlıq qurata bir şey olub,
Niyə lazım qurata, bilməyirəm
Bir sümükdür ki, boğazlarda qalıb
Kim ata, ya kim uda bilməyirəm (306).

**Sümüklərim islandı** - isti su gördüm, hamama getdim rahatlandım.

**Sümüklərin sürməyə dönməsi** – ölüb torpaq olmaq, yaman günə, pis günə düşmək.

Qabar əl kəndliyə düşdü,
Yumuşaq əl onlara.
Sürməyə döndü sümüklər,
Qurudu qanlarımız.

**Sümük sındırmaq** - təcrübə qazanmaq.

Çox zaman qoymaq, zəhmət çəkmək

Namərd oğlu biz bura bir otək pul qoymuşuq, sümük sındırmışıq (72, c.III, s.61).

**Sümsüyünü sallamaq** – qaşqabaq tökmək.

Vəli, iş adını eşidəndə sümsüyünü salladı (46, s.217).

**Sümüyə çıxartmaq** – ətini yemək, bir dəri, bir sümük olmaq.





Bir gün bizlərdən biri icbari iş ordusunda torsuz eşiyə çıxdı. Az zamanda mığmığalar onu didib sümüyə çıxartdılar (157, səh. 10).

**Sümüyümüzə girib** - qanımıza işləyib, ruhumuza hopub.

**Sümüyünə düşmək** - bir oyun havasının xoşa gəlməsi.

"Lambada" həm kişilərin, həm də qadınların sümüyünə düşmüşdü (91, s.31).

Biz sümüyümüzə düşən hava tapa bilmirik (296, s.309).

**Sümüyünə dammaq** - bir şeyin baş verəcəyini hiss etmək.

- Nəsə var, - dedi, yoox, sümüyümə damıb mənim (296, s.314).

**Sümüyünə işləmək/ qana, iliyə işləmək** –canına hopmaq.

Vətəni müdafiə etmək ata-babalarımızın sümüyünə işləmişdi.

**Sünbülündən su daman** - çox gözəl, təmiz, səliqəli geyinən kəslərə ünvanlanır.

**Süpürgə çöpü** - arıq adam.

Özü də süpürgə çöpü, napnazik, bilmirsən harasına yeyir? (84, s.27).

**Süpürgə-saqqal** – səliqəsiz, topa-uzun saqqal.

Mustafa bəyin məqalələrinin altında «Süpürgə saqqal» imzası qoyulmuşdur (297, səh.33).

**Sürüdən ayrı düşəni qurd yeyər** - tifaqı dağılan millətə düşmən qalib gələr.

Sürüdən ayrılan körpə quzunu
Ya qurt qapar, ya quş qapar- demişlər (Fəqani).

**Sürüşquluya dəm vermək** – aradan çıxmaq.

Gördüm iş şuluqdur, mən yavaşcadan sürüşquluya dəm verdim (72, c.III, s.126).

**Sürüyə qurd gəldi, vay bir keçilinin gününə** - toplumda baş verən ağır fəlakətlərdə ən ağır zərbəni yoxsullar görür.

# -Ş-

**Şadara göz** – yekə göz.

Şu gözlər sanki daş süzgəcinin şadara gözləridir,
İnsan o süzgəclərdən keçir, safa çıxır.

**Şaddığına şitlik eləmək** - sevinmək əvəzinə camaatı özünə güldürür.

**Şah bağışladı, şah qulam bağışlamadı** – bağçı bağına qıydı, bağban bir giləyə qıymadı.

**Şahburun** - burnu həddən artıq iri.

İran şahı Məmmədrzanın burnu həddən artıq böyük olduğuna görə böyük burunlu adama şahburun və ya Amerika şeypuru deyərdilər.

**Şahə qalxmaq** – atın iki ayağını göyə qaldırmağına deyilir.

**Şah gəldidən keçdi** - bir adamın həddən artıq gec gəlməsi.

Mirza Rza Kirmani Nəsrəddin şahı öldürəndən sonra şəhərdə qıtlıq başlayır. Həmişə olduğu kimi vəliəhd Təbrizdən Tehrana gedib orada şahlığı davam etdirir. Müzəffərəddin şahın Təbrizdən Tehrana getməsi çox çəkir. Şəhərin adamları vəziyyətin düzəlməsinə görə çox şeylərə o cümlədən şahın Təbrizdən Tehrana gəlməsinə ümid bağlayırlar. O vaxtdan hər bir adamın bir yerə getməsi uzanırsa, belə deyirlər.

**Şahındazlıq etmək** – yekəxanalıq, iddialılıq etmək.

**Şahını bəyənmirsən, abbası qoy** - azı bəyənmirsən, çox ver.

**Şah ikən şahbaz olmaq** - çox çirkin adamın daha da çirkinləşməsi zamanı işlənir.

**Şah ilə şilə yeməmək** –hər adamı bəyənməmək.

"Şah ilə şilə yemirəm, bığım bulaşar" deyən Şahqulu daha hansı gəlir hesabına varlanıb- pullanıb karlana bilərdi? (253, s.304).





**Şah oğlu yelə qənşər durur** - elə bil çox böyük iş görüb, biri kiçik bir işi böyük saysa, belə deyilir.

**Şah uçmaz, şahı müridləri uçurdar** - şah düz olsa yıxılmaz, onu ərafında oturanlar özləri yıxar.

**Şaqqavatlı adam** - çox gözəl, boy-buxunlu adam.

Ulu təbiət yenə öz vüqarı ilə, öz şaqqavatı ilə dayandı (204, s.43).

**Şaqqılıbadam** – uşaqlıqda öskürməyin nədən gəldiyini başa düşməyən analar, onun illətini göz dəyməkdən bilib, onu aradan aparmağa görə, uşağın boynuna şaqqılıbadam (bir- birinə yapışıqlı iki badam) salardılar (201, səh. 222).

**Şaqqı sındırmaq** - birinin istəyinin əksinə iş görmək.

Mən də atmışam söz tutarı tutur, qıymadım açıq şıqqı sındırım (338, s.50).

**Şalvarını/ətəyini başına çevirmək** - rüsvay etmək, biabır olmaq.

**Şam bahadı, korun nə vecinə** - bir adam bir şeyin dəyərini bilməsə onun nə vecinə?

Şam bahadı, korun nə vecinə (103, s.73).

**Şamı sönmək** – evi yıxılmaq, əzizini itirmək.

Sənin şamın sönüb, mənim büsatım,
Sənin nurun itib, mənim səbatım (80, c.II, s.273).

**Şami-qəriban** - dərdli bir gecə, dini baxışdan aşurada olan savaşın gecəsi.

Ya rəbb, sən özün eylə xilas, qürbətə düşdüm,
Olsunmu güman şami-qəriban Qarabağda?! (A.Bakıxanovun seçilmiş əsərləri, səh. 345).

**Şam kimi ərimək** – qüssədən, dərddən, pis gündən yaman hala düşmək.

Zavallı (Mirzə Cəlilin qardaşı Məşrutə inqilabının iştirakçısı Mirzə Ələkbər – B.H.) gündən-günə şam kimi əriyirdi (195, c.VI, səh.148).

Bəs ki, zəmanə verdi qulaq burması mənə,
Oldum şəpəqulaq, qulağım döndü yelpəyə (168, səh. 93).

**Şappadan** – qəflətən.

Mən sözü şappadan adamın üzünə deyən adamam (9, s.113).

**Şapur-şapur** - tök-dağıt ev, israfçı yer.

Olanda şapur-şapur,
Olmayanda haqqa şükür.

**Şapusun / şlyapasını məscidə atsalar, qayıdıb götürməz** - düşüncə yüksəkliyinə görə xürafata, məscidə görə müsbət nəzəri yoxdu.

**Şar buraxmaq** – bir yalan sözü yaymaq.

Hizbi Tudə şar buraxdı ki, şah dördü aban üçün Əmcədiyyəyə gəlsə, oranı oda çəkəcəklər. Şah bərnaməsini birbirinə vurub, ora gəlmədi (Məhəmmədəli Fərzanə).

**Şəbeh çıxartmaq** – oyun çıxartmaq, ətrafdakıları heyrətləndirmək.

Sən deyildin dünən adamışkavı gətirib oturtmuşdun camaatın gözü qabağında, şəbeh çıxardırdın? (9, s.177).

**Şeypurburun** - burnunun bacaları iri olan.

**Şeytana papış tikmək** - hiyləgər.

Əşi, bu Bağır şeytana papış tikirmiş, xəbərimiz yox imiş (9, s.169).

Görüm nə tövür fənd quracaqsan, sən ki, şeytana papaq tikənsən (335, s.123).

**Şeytan atına minmək** – cin atına minmək, əsəbiləşmək, bir sözün ucundan tutub xırdaçılığa getmək.

O, şeytan atına minib, düşmədi ki, düşmədi,
İki ayağını bir başmağa dirəyib dedi (82, səh.196).

**Şeytan barmağı olmaq** – əngəl törədən adamın bir işin qabağa getməsinə maneçilik törətməsi.

Həsi, sən öləsən, burda bir şeytan barmağı vardır, bizə papış tikirlər (82, səh. 194).

**Şeytan fəhləsi** - müftə işləyən adam.

**Şeytan / dev qulağına qurğuşun** - çox şükür, şər qüvvələr eşitməsin.

**Şeytan quyruğunu buladı** - işlər pisləşdi.





Bu gözəl bayram büsatının sonunda şeytan quyruğunu buladı (288, s.159).

**Şəqqül-qəmər eləmək** - sual kimi işlənən zaman bu anlamdadır ki, elə mühüm bir iş görməmisən. İslami baxışa görə, imamlardan, peyğəmbərlərdən biri barmağını aya tutaraq, ayı ikiyə bölməyə işarədir.

Böylə qaşla-qamətə etsin nəzər,
San qiyamətdir olub, şəqqülqəmər (Qudsi).

**Şələni bağlamaq** - oğurluqla, rüşvət almaqla var-dövlət yığıb aradan çıxmaq.

Çapdı iranlıların var- yoxunu, yağlı gedir,
Laybalay cibləri puldur, şələsi bağlı gedir (69, s.229).

**Şələnin partlaması** - işin düz gəlməməsi, ləngiməsi.

Çox çətindir çata onlar bu uzaq mənzilə ha,
Biriya, mən görürəm pıtlayacaqdır bu şələ (69, S.93).

**Şənbə bacadan baxır** - bu deyimi cümə gecəsi deyərlər.

**Şənliyə su səpmək** - bir acı hadisə ilə bir şənliyin sona çatması.

Yanıb kösövə dönmüş bir maral balasını gətirirlər, elə bil şənliyə su səpilir ("Bilmirəm maral yana", s.84).

**Şəpəqulaq olmaq** - yekə qulaq.

**Şər deməsən xeyir gəlməz** - hər işin gərək pisini də fikirləşəsən.

İşdir, şər deməsən xeyir gəlməz, şir sizi görsə, şir qızlarının canına and verin (46, s.190).

**Şəritdə yarma sərmək** - bəhanə gətirmək, bir zadı verməmək üçün yalan, mümkün olmayan şeyləri bəhanə gətirmək.

**Şər qarışmaq** - axşam düşməsi.

Daha gözləmək olmaz, şər qarışdı, vaxt keçdi ( Ə.M. s.42).

Münəvvər-Allah sənə and verirəm bu şər qarışan çağı qərib imam Rzanın adına, bütün qəriblərin işinə fərəc ver (77, s.15).

**Şəstini sındırmaq** - ürəyini sındırma, ləyaqətinə toxunma.

**Şəvədən qara gözlərinə qurban** - şəvə qara rəngdə qiymətli daş adıdır.

Biri şox naz edəndə ona məsxərə üçün deyirlər.

Xanımın ətəyində bir sıra əşrəfi, boynunda qızıllı şəvəsi var idi (Y.V.Çəmənzəminli).

**Şipir– şuxum, hamısı bir tuxum** – hamısı bir bezin qırağıdır, ilanın ağına da lənət, qarasına da.

**Şirağa** - torpağından istifadə etməyən.

Şirağanın Marağada bağı var,
Üzümü yox, yarpağı var.

**Şirazəsi dağılmaq** - işləri alt-üst olmaq.

**Şimri-Sənan** - rəhmsiz. İmam Hüseyni öldürən məşhur ərəb sərkərdəsinin adıdır. Bu ad şiə müsəlmanların nəzərində qəddarlıq, rəhmsizlik rəmzidir.

**Şirbaz** - dili ilə birini tovlamağa çalışan, yalandan məhəbbət göstərən

**Şirim-şəhrə etmək** - nəhayət dərəcədə birini vurmaq, döymək.

Yaranın bir vəziyyətinə güneydə şirim şəhrə deyirlər.

Gedin, gedin gətirin tez bu bağa bir dəhrə,
Vurun bu qoz ağacın, eyləyin şirim-şəhrə (301, s.111).

**Şirin dilinə, çoxlu puluna?** - nə insanlığın nə də var-dövlətin var.

**Şir yatanda çaqqal dönüb şir olar** - şir yatanda çaqqallar da fürsət tapıb şirə dönər.

Məskən salsın gərək hüma, səadətin sarayında (80, c.II, s.49).

**Şişə çəkmək** – zülm eləmək, siyasi-ictimai mənasında boğuntuda saxlamaq.

Şişə çəkib, çoxları eylər kabab,
Kaş olaydı diri hacı Turab.
Göreydi eylər nə fəqan əskinaz? (Mirzə İsmayıl Qasir, səh. 130).

Yar bizə sahib olubdu başı saçlı cağalar,
Cücələr tək bizi çəkməkdədirlər şişə, əmu (206, səh. 191).





**Şiş uzatmaq** – Marağada göy qurşağına deyilir.

Cırdı yaxasın, fori yaşıl pərçəm uzatdı,
Zoğ verdi yoğun, qarı nənə quya şiş uzatdı (168).

**Şit aşıq** - ürəyə yatmayan, sırtıq.

**Şorakənddə eşşək tapılmışdı, qalmışdı erkək, dişisi** – bir yerdə ki, əsas lazım olan şey tapılmır, başqa xırda şeyləri soruşmaq mənasızdır. Şorakənd- bir susuz yer, məhsul verməyən obadır. 1940-cı ildə fars şovinizminin çoxdan tətbiq etdiyi siyasət əsasında Azərbaycan yenə də qurbanlıq əti kimi parçalanmışdı. 1993-cu ildə Ərdəbili əyalət etmək bəhanəsi ilə Azərbaycandan ayırdılar.

Əsli kökdən Astara övladi Azərbaycan,
Hansı əllər eylədi Gilanə ehsan, Ərdəbil?
Bir Şorakənd vermədi, vəchində də Gilan bizə,
Bu sözümdən sən ayıl, ol bir hərasan, Ərdəbil! (168).

**Şorgöz** - qadına, qıza pis gözlə baxan.

**Şor sudan qaymaq tutmaq** – bacarıqlı, işbilən mənasında.

Əli dadlı, üzü duzlu matandır,
Maşallah, şor sudan qaymaq tutandır (168, səh. 166).

**Şot yalatmaq** - birinin gününü qaraltmaq, zor demək, əziyyət vermək.

**Şpexterin/ inspektorun başını gətirmisən?** - elə bil böyük, mühüm bir iş görüb.

Bu istilah bəzən Müzəffəriyyənin qəbaləsini gətirməklə də bərabər işlənir.

E.Müctəhidinin yazdığına görə, "şpexter" fransızca inspektor sözünün azərbaycanlaşmış formasıdır. Fətəli şah zamanında rus sərdarlarından biri inşpextor ünvanında Qafqaza məmur göndərilir. Fətəli şahı qorxu götürür, öz ətrafında olan adamlardan onun şərini azaltmağı istəyir. Təsadüfən Molla Məhəmməd Əxbari çillə tutmaqdan bir neçə gün sonra bir totiə nəticəsində ölüb çillə qurtulmamışdan qabaq onun başını Tehranda şaha verirlər ("Azərbaycan, əmsal və hekəmləri", s.196-197).

**Şuxumda şıllaq atmaq** – bir adam adi işi görə bilməyib böyük iddialar etsə deyərlər.

Bu oldu bizdə təməddün, məsəldi düz yerdə,
Bizim ulaq gedə bilmir şuxumda, şıllaq atır.

**Şuxum yerin ilanı** – hiyləgər.

**Şumda şərtləşmək** – hər hansı bir şərikli işə başlamazdan əvvəl, onu dərindən götür-qoy etmək lazımdır.

Odur ki, deyirəm, şumda şərtləşək, xırmanda yabalaşmayaq (142, səh. 365).

**Şüşəki salmaq** - qaxınc vurmaq.

hər gələn ağzını büzdü bizə saldı şüşəki,
Nə be in şüruye şur, nə be in binəməki (168, s.429).

**Şüvəranməcaz** - uşaqbaz, hamı ilə həməqidə olan.





## -T-

**Tabut zınqırovu** - yaşlı bir adamın uşağı olması.

Təbrizdə Mirhəbib Dağçının uşağı yox idi, bir gün dedim ki, niyə evlənmirsən ki, uşağın ola. Dedi istəmirəm, öləndə desinlər ki, uşağı onun tabut zınqırovu idi.

**Ta gözün dörd olsun** - yəni mənim meylim bunadır, sən qəbul etmirsənsə, özün bilərsən.

**Tağı ölmüş şamama** - rəngi lap sapsarı, taqətdən düşmüş.

Rəngi oldu tağı ölmüş şamama (168, s.28).

**Taxça-buxçada gəzmək** -yenidən hər şeyi töküb yenidən baxmaq.

Gəzirəm günlərin taxça-buxçasın
Bir üskük sevinc yox, hər şey havadır (Urmulu).

**Taxtaya bağlamaq** - birinə danışmaq icazəsi verməyəndə deyilir.

**Tale köhləninin yolda qalması** – uğursuzluq.

Çatmadım dünyada məqsuduma, hey axtarıram,
Taleyin köhləni, yollarda qalıb, yorğundur (80, II, s.196).

**Tale quşunun çiyinə qonması** – işləri uğurlu gətirmək.

Tale quşu salmış başıma kölgə, görürsən,
Bir böylə gözəl hali, pərişan eləmə (80, c.II, s.128).

**Taleyini tapşırmaq** – həyatını etibar etmək.

Ruma dərvişliyi Nəsimiyə tapşırmaqla Fəzl karvanının taleyini də ona tapşırmışdı (144, s.175).

**Taleyi gülmək** – bəxtin açılması.

Sonradan məhkəmə suçsuz buldu,
Gülərək taleyimiz yar oldu (Cavid, s.40).

**Tambura çalmaq** – tambura türklərin musiqi alətlərindəndir. Burda xoşagəlməz bir sözün danışılmasına, boş danışmağa bir işarədir.

Ney və tambura ən qədim və məşhur türk musiqi aləti olmuşdur (346, səh. 350).

Gəl bənim sarı tamburam,

Sənin aslın ağacdandır,
Ağac dersəm könülləmə,
Qırmızı gül ağacdandır (Pir Sultan, s.198).
Tikan verdim, əkmək aldım,
Tamburam, cıngı, cınqı!
Əkmək verdim, qoyun aldım,
Tamburam cınqı, cınqı (238, s.150).
Saqi dedi bəsdir, bu qədər tambura çalma,
Qismət, yazı insanı xəyalətə salandır (H.Səxamer).
İçim oyuq – boş,
Atam Sarı tambura,
Sən nə üçün inlirsən?
İçim oyuq, dərdim böyük
Bən anınçın inlərəm (125, səh 258).

**Tamah dişini çəkib atmaq** - səndən heç nə istəmirəm.

Ağalar (general-konsulluğun məmurları- B.H) tamah dişlərini çəkməli və öz yerində sakit *oturmalıdırlar* (N.Nərimanov).

**Tana koraçı** – bu deyim islam hakimiyyəti zamanında yaranıb. Köhnə paltarları satan yerə deyilər.

Az-çox tana kora eyləyib milləti rahət.

**Tanrına niyə təpik atırsan?** - taleyinə niyə təpik atırsan? Niyə yaxşı bir işdən, qismətdən imtina edirsən?

Tanrına niyə təpik atırsan? (129, s.412).

**Tanrı böyük, altı gen** – dünya təkcə buradan ibarət deyil ki?

**Tanrının günü** - hər gün.

**Tarazın əmması** – birinin işinin ləng getməsi.

Qəm-qüssə yeməkdən ənib tarazın, fələk sarı çəkir dad Qaradağlı (63, səh 72).

**Tarixi –Nadiri yarıya qədər oxumaq** - savadsız deyiləm, bir şey oxumuşam, özünü savadlı saymaq. Tarixi –Nadir cəmi bir neçə səhifədən ibarət olduğu üçün bu deyimi işlətmək gülüş doğurur.

**Tartan-partan danışmaq** - boş söz danışmaq.

Be mən tartən hacı quyəd bezur,





Nə rəftəm be Məkke, be həqqe şəkur (301).

**Tasası /tası yatmaq** - hirsi yatmaq, qəzəbi soyumaq, heyfini almaq.

Biz dedik o baza müdiri tutulandan sonra bunun da tası yatar, bu daha da qudurub (9, s.180).

Həsən kişinin qızı nə qayırır, tasası yatıbdırmı? (129, s.415).

**Tası damdan düşmək** - hamı mənim vəziyyətimi bilir, rüsvay olmuşam.

Bu gün bir kimsədən yoxdur hərasım,
İş-işdən keçdi damdan düşdü tasım (83, s.102).
Tas quzarişkərinin də tası düşdü damdan (168, səh. 81).

**Tasına qum salmaq** – diqqət göstərmək (Səid Zənganlı).

**Ta (süheyl) çıxmaya, xurma kəsilməz** – yəni hər işin bir vaxtı var.

**Taybaşı** - boşqaba qoyulan meyvələrin ən yaxşısına deyilər. Deyimdə isə mənfi mənada işlədilir. Dərdə-dəyməyən, faydasız.

Həqiqi mənada Azərbaycanda meyvənin yaxşısını səbətin başına qoyub bazara gətirərdilər.

Sən ki, dadaş şerdə çox naşısan,
Fikr eləmə ay bala taybaşısan (299, s.75).

**Tazının hizliyindən dovşan pəyədə bala qoyar** -bir şəhrin qayda-qanunsuzluyğundan insanlara zor deyərlər.

**Tel-tel olmaq** - həsrətdən, ən nəhayət darıxmaqdan ürəyin kövrəlməsi.

Dil tellərinə bağlamışam gər inanmasan,
Tel-tel edib ürək dəxi bir ara könlümü ( Aşiq, s.70).

**Tezbazar** – bir işi tez həll etmək.

Biqəm- bu lap tezbazar oldu ki (9, s.188).

**Tez ol ki içindən zünuzlu çıxar** - bunu yemək yeyəndə deyərlər. Yəni hara getsən orada zünuzlu olar.

**Təbənə göz** – balaca göz, xırda göz.

**Təbil çalmaq** – kimliyini bildirməyə çalışmaq.

Ey baş götürüb hər biri bir səmtə qaçanlar,

Dünya oyanıb, zənci də təblin çalır indi (348, səh. 50).

**Təbrizdə dövrəli börk dalısınca gəzmək** - Kirmana zirə aparmaq. Bir yerdə bir şey ki hamının var, onu aparıb orada satmaq, mühiti tanımamaq.

**Tədbir tökmək** – çarə etmək.

Öz özünə götür-qoy elədi ki, bunun tədbirini dədə-baba qaydası ilə tökmək gərəkdi (103, s.24).

**Tək əldən səs çıxmaz** - dirilik, güc birlikdədir, yəni hər bir ictimai işin, xalq üçün problem olan bir məsələnin həllində xalqın birliyi lazımdır.

Gəl əl-ələ verib dolanaq səhni-gülşəni

Tək bir əlin vücudu var, amma sədası yox (113, s.66).

Səttarxan: Ağalar mən nə xidmət etmişəm, millətin köməyi ilə elədim. Və illah tək əldən səs çıxmaz ( «Qiyami Azərbaycan», səh. 54-55).

**Təkəlli tutmaq** – gücsüz, arxasız bilmək.

Sən məni təkəlli tutma ə, mənim də qardaşımın arvadının dayısı nəvəsi böyük qulluqdadır (9, s.167).

**Təkfir topu** - birini rüsvay etmək, pis işlərinə görə daim tənqid etmək.

Tupe-təkfire ay oğlan, çevirin Tehrana,

Gərək ol şəhr ola viran, o bəd nam üstə (300, S.49).

**Tək səbirin düşər düşməzi olar** - tək səbir bir işə başlamağa pis işarədir.

Tək səbir düşmədi hitlerçilərə, ay əmican,

Cürbəcür uydurulan şayiələr oldu yalan (69, s.22).

**Tələ sahibi gələcək** – işin həngaməsi sonradır.

O adam ki, tələ qurub nə istəsə edəcəkdir, ya tələyə düşəni azad edəcək, ya şikar kimi götürəcək.

**Tələsən təndirə düşər**- tələsmək zərər gətirər.

Tələsən təndirə düşər (103, s.4).

**Təməlsiz divar tez uçular** – bir zadın təməli olmasa tez məhv olar.

Zahirdə axtarma sən ləyaqəti,

Divar tez uçular axı təməlsiz (328, s.114).





**Təmiz ad** – xalqa zərər keçməyən və boynuna alığı məsuliyyətləri şərəflə yerinə yetirən.

Məni isə qane etdi bir təmiz ad (A.Bakıxanov, Seçilmiş əsərləri, səh 422).

**Tənbəl Əhməd** - bir yerdə ən tanınmış tənbəl adam.

**Təndirə girən seyid deyiləm** – aldada bilməzsiniz məni.

**Təndirdə yanmaq** - həyatını boş yerə tələf eləmək.

Çıraq yandırmasan əgər elmdən,

Varlığın təndirdə yanacaq həmən.

**Təndirin isti vaxtı** - hər şeyin qızğın vaxtı, münasib vaxtı.

**Təpədən dırnağa qədər** - bütün vücudu, hər yeri.

Ah bacım! Ürəyin çəkildi dara,

Təpədən dırnağa geyindin qara. (337, c.I, s.33).

İlan Cümşüdü təpədən dırnağa süzdü, ondan xoşu gəlib dedi (39, səh 298).

Təpədən dırnağacan odlar yurdunun odu olduğuna bələdəm (266, Səh. 188).

**Təpə-tıxa yemək** - doyunca yemək.

**Təpik atmaq** – harınlamaq.

Bu əsrdə yaşamaq istəsən bir az dinc dur.

Qəni kimi təpik atma, gər cibin boşdur (300, səh.8).

**Tərbiyəli meymun kimi** – sözəbaxan, hər işə yarayan.

**Tərcüman olmaq – təmsilçi olmaq.**

Əsiri qəhr olub dilsiz biçarələr yeksər.

Dil açdı, tərcüman oldu, o canlı «Tərcüman»ından (166, səh. 265).

**Tərcüman vermək** -girov qoymaq, öhdəsinə götürmək.

Əgər bu işi yerinə gətirə bilməsəm, qolumu tərcüman verirəm.

Gözlərindən süzülən yaş, sözünün tərcümanı,

Canımı, ruhumu oxşa, dilinə qurban ana!

**Tərəzinin ağır tayı aparar** – insanın düzgünü, düşüncəlisi qalib gələr.

**Tərəzinin bir gözünə atmaq** - dəyər verməmək, hesaba qoymamaq.

**Tərxan öyrəşmək** – sərkərdə, böyük dövlət xadimi və heç günah üzərindən sorğu-suala çəkilməyən adam.

**Tərlan yerinə sar gəldi, yağış yerinə qar** – gözlənilən zadın əksi baş verdi.

**Tərlan yuvalan dağlar** – zirvəsi buludlara girən, möhtəşəm Azərbaycan dağları

Qartal düşüncəli, şair xəyallı.
Tərlan yuva salan, dağlar oğluyam (148, səh.259).

**Tərləmək** – xərci çıxmaq.

Sən ölsən, yenə filan qədər tərləməli oldum (9, s.144).

**Tərs damarının üstündə durmaq** – sözündən dönməmək, səhv fikrini dəyişməmək.

İndi yenə də sən durmusan öz tərs damarının üstündə (253, s.153).

**Təzə gəldi bazardan, köhnə düşdü nəzərdən** - biri təzə dost tapanda, köhnəni yaddan çıxaranda deyirlər.

Təzə gəldi bazardan, köhnə düşdü nəzərdən (103, s.69).

**Təzə qafa** - aydın, zamanın gedişi ilə ayaqlaşan

Xəzinə bol edən lotu,
Taza qafadu Naciyə (301, səh. 94).

**Təzə səlmani gəlib kakili yandan qoyur** -köhnə bazara təzə nırx qoymaq, özündən təzə qanun çıxarmaq.

**Tıx deyincə yemək** – doyunca yemək.

Tay tıx deyincə yedim, üstündən də on- on beş stəkan porrəngi çay - xoruzquyruğu (9, s.139).

**Tıxmaq** - acgözlüklə yemək; birinə narazılıqla yemək verəndə də "tıx" deyirlər.

Deyirdin: ey gözüm nuru, acıxdın?
Deməzdin: boynu sınmış indi tıxdın! (147).

**Tiftək/ tiftik adam** - dərdədəyməz, ağılsız, lümpən.

Səslər ucalan tək qaçaqaç düşdü sərasər,
Çöndər üzünü divara tiftək.... (343, səh. 112).

Tanımazduq urus kimdi, Amrika hansı tiftikdi? (168, s.325).





**Tikəmiz ovsanata düşdü** - problemin asan həlli, xilas olmaq.

Tikəmiz ovsanata düşdü (1, s.27).

**Tikəsi düşmək** – bir insanın mənfi ya müsbət xüsusiyyətlərini bir adama ki, guya uşağın nənəsi ikicanlı olan zaman ondan tikə alıbdır, ona işarədir.

Düşməyib tikəm qorxudan mənim,
Çəkməyib suyum da qaçanlara (338).

**Tikənin söyünməsi** - bir tikə əldən düşəndə deyərlər ki, tikə sahibi sevinəcək.

**Tir-tir əsmək** - ən qorxulu vəziyyətdə qərar tutmaq və ya birinin dostunun, sevdiyi adamın intizarını çəkməyə işarədir.

Ürəyim tir-tir əsir. Cüt qanad həvəsiylə, azadlıq nəfəsiylə (210, səh. 63).

**Toxmaq gəlir** – bu deyim bir-iki il öncədə birinci dəfə olaraq Tehranda metro düzəldəndən sonra yaranıb. Camaatın çoxluğundan, metroya minməyə yer olmayan zaman, bir neçə dəfə boynu yoğun dövlət adamları camaatı dümsükləyərək, itələyərək qatara mindirirlər ki, qapılar bağlansın.

**Toxum əkmək** - ara vurmaq, ixtilaf salmaq.

**Toqqanın altını bərkitmək** – doyunca yemək.

Ey cavan, məndə çörək var, heç fikir eləmə, toqqanın altını bərkidib yola düşərsən (46, s.105).

**Top kimi** - sağlam, ətli-canlı.

**Top-tüfənglə gəlmək** – dava istəmək.

Siz içəri gəlirkən elə bil top-tüfənglə gəldiniz ki, hamımız özümüzü itirdik (72, c.III, s.90).

**Topuq çalmaq** – çaşmaq.

Xaşıl daşa dönüb diş sındıranda
Yaman topuq çalır dili dünyanın (328, S.137).

**Topun ağzında olmaq** - ən ağır vəziyyətdə olmaq, xətərin içinə düşmək .

**Tora düşmək** - aldanmaq, düşmən əlinə düşmək.

**Torbada pişik var** - bilinməyən bir sirr var.

Yaman gülürsən, sənin də deyəsən torbanda pişik var (84, s.365).

**Torpağını at yorbası ilə daşıtmaq** – birinə düşmənçilik eləmək, birini pis günə salmaq.

Əgər qızını mənim oğluma verdin, səninlə işim olmayacaq, yox verməsən, onda bütün torpağını at torbalarında daşıyıb Araza tökdürəcəyəm (46, s.107).

**Torpağın misə dönməsi** - torpağın ölməsi, çox bərkiməsi.

Nə şum dağlardılar, torpağı misə çönüb, təravət ölüb (204, s.41).

**Torpağın üzü soyuq olar** – ölən tez unudular.

**Torbakeş** – qədim ənənələrə görə çobanlar ən qocalmış, əldən düşmüş heyvanın – qoyunun və ya keçinin çörək torbasını boynundan asardılar.

Zülmün girdabında düşmüşəm ləngə,
Torbakeşlər tənə qılır pəşəngə (13, səh 46).

**Torpağı torba ilə daşımaq** – birinə ən nəhayət dərəcə nifrət etmək.

Oğul, Əbülfəz haqqı, torpağını torba ilə daşıyacağam (72, II cild, səh. 271).

**Torpaq aparmaq və ya torpaq çəkmək** – ölən zaman qürbətdə yaşayan adam əgər vətənə sarı gedib, orda ölsə, bu deyimi işlədərlər.

**Torpaqbasdı haqqı** - kənddən, başqa yerlərdən gətirilən şeylərə kəndlilərdən vergi almaq.

Mirzə Cəlil Məmmədquluzadə Təbrizdə olan zamanlar müəllimlərin hüququ Altı ay verilmir. Maarif idarə rəisi və b. belə qərar qoyurlar ki, hər yüklü eşşəyin şəhərə girməsindən torpaqbasdı haqqı alıb, müəllimlərin aylığı verilsin. C.Məmmədquluzadə bu ictimai fəlakəti 1920-ci ilin yazında 31-də çıxan «Molla Nəsrəddin» jurnalının 4-cü nömrəsində bir karikatura ilə tənqid edir ki, o nömrə həmən gün satılır və daha tapılmır (197, səh. 131).

**Tosqun** - balacaboy, kök.

Hardansa tosqun bir kişi peyda oldu (91, s.79).





**Tosu** - xırda, balacaboy, zirək adam.

**Toşuvu al** - dincəl, istirahət et.

**Toydan sonra nağara /toydan sonra hənanı g..ə yaxarlar** - hər işin öz vaxtı var.

Məşhur ifaçımız güngörməz Bayramalı toydan qayıtdıqdan sonra nağara çalacaqdır (9, s.51).

**Toydan sonranın hənası** - dava-dərmanın da vaxtı keçsə, faydası yoxdur.

**Toy da olsa toyuğun vayıdır, vay da olsa** – yəni birinə isti-soyuğun fərqi yoxdur.

Toy da olsa, toyuğun vayıdır, vay da olsa (103, s.68).

**Toy Təyyibəsiz olmaz** – bacarıqlı qadına, və ya adama bir işarədir.

**Toy tutmaq** - zor demək, qan qusdurmaq.

Arazın başı ilən
Dibinin daşı ilən
Sənə bir toy tutaram
Gözümün yaşı ilən.

Mənim Uçuya verəsi suyum yoxdur. Uçu bu kəndə toy tutub ki, tüstüsü təpəsindən çıxır (254, S.18).

**Toyu gördü, tərəngə yadından çıxdı** - böyük adamlarla oturub durmağa görə kiçikləri yadından çıxartmaq.

**Toyuğu anbara salsan eşənək atar** - birini təzqiq altında saxlasan üzünə qabarar.

**Toyuğun banlayanını seyidə verərlər** – arvad artıq-əskik danışsa, cəzalandırılar.

**Toyuq bir qıçlıdır ki, bir qıçlı** - -dediyi nahaq bir sözün üstündə durmaq

O başını bulayıb dedi ki, toyuq bir qıçlıdı ki, bir qıçlı (1, s.123).

**Tökülən dolmaz** – keçənə təəccüblənmə.

Qatıq üçün qışda ağlamaq olmaz,
Atalar deyibdir tökülən dolmaz (329).

**Tövbə, tövbə os..raqlı götə nə tövbə?** - O adam ki, pis işə adət edib onun düzəlməsinə inanmaq səfeh bir işdi.

**Tövbəsi keçi tövbəsidir** -- tövbəsinə inanmaq olmaq.

**Tufağın dağılsın** – qarğış anlamında, evin dağılsın, birliyin yox olsun.

Talan olan cəlalı, tufaqı nifaq olan,

Ey izzəti gedib, ciyəri qan olan vətən! ( «Naleyi Vətən», №1. səh.14).

**Tuği-lənət olub boğazına keçmək** - əl çəkməmək, birinə əziyyət vermək.

Bisavadın ən yekəsi sənsən ki tuği-lənət olub keçmisən bizim boğazımıza (288, s.108

**Tula itdən murdar** – ikisi bir-birindən murdar.

Tula itdən murdar (9, s. 171).

**Tulanbar eşşəyi məxmər palan?** – iki biri-birinə uyğun olmayan adam.

Bir qadın Kəblə Nəsir kişinin yanına gəlib deyir ki, gəlmişəm qardaşım üçün qız bəyənməyə. Kəblə soruşur ki, qardaşın kimdi? Deyir yaşı altmışdan bir az yuxarıdır, iki qıçı şildi, bir gözü kordu. Deyir bəs qız kimdi? Cavab verir: 14 yaşı tamam omayıb, səkkizinci sinifdə oxuyur. Kəblə Nəsir onun sözlərinə qulaq asandan sonra deyir: Tulanbar eşşəyi, məxmər palan? (211, №25, s.97).

**Tula payı** – çox az bir pul.

İşləməkdən qarağac kimi qabıq qoyuruq, ayda bir tula payı da muzd almırıq (148, s.116).

Bizim hərəmizə də bir "tula payı" verəcəkdir (253, s.283).

**Tullanıb düşmək** - yalandan hay- küy salmaq.

Bizim indi belə tullanıb düşməyimizin heç bir mənası yoxdur (118, c.II, s.195).

**Tuman bağına lağ eləmək** - birini günahlandırmağa bəhanə axtarmaq.

Həzrətin tuman bağına lağ eləyir ki, guya nəüzibillah (195, c.II, s.156).

**Tumançaqqulu** – ac, yoxsul.

Ədə, bu lüt tumançaqqulunun danışmağına bax (9, s.148).





**Tumanı batırmaq** – qorxmaq, mübarizədən üz döndərmək.

Batıracaqsız hamı tumanınızı,

Şimr-ləin, gər gəlsə meydanınıza (300, səh. 12).

**Tumanına pişik balası salmaq** –həddən artıq təzyiq göstərmək, narahat etmək.

**Tumanının bəndi qırılana qədər qovalamaq** – birini nəhayət dərəcədə təqib etmək, izləmək.

Sən hər yerə qaçsan da, bil ardınca qovmaqdayıq.

Ta qırılsın qaçmaqdan lap bəndi-tumanın sənin (338, səh.84).

**Tumanın çıxartmaq** – biabır eləmək.

Mən də hələ belə gedirəm kənd sovetinə, əgər sənin tumanını çıxartdırıb miyantəginə döydürməsəm, məndən köpəkoğlu adam yoxdur, düş qabağıma (72, c.III, s.142

**Tumansız qalmaq** – çox kasıb olmaq.

Əzizim cansız qaldım,

Dinsiz, imansız qaldım,

Əlli il rəncbər oldum,

Dibində tumansız qaldım.

**Turp kimi** - sağlam, qırmızı sifət, ətli, canlı.

**Turşu küpünə qoymaq** - qızını gələn elçilərə verməyib evdə saxlayanda deyilir.

Bas turşu küpündə qızını saxlagilən sən,

Bu hal ilə ağa, qapına gəlmək olurmu (69).

**Turşulu aş** - döymək, əzişdirmək.

Vurdu ancaq xanıma, nə yemisən turşulu aş (168, S.301).

**Tutar qatıq, tutmaz ayran** – düzəlsə düzəlib, düzəlməsə bir şey olmaz..

Əli aşından olanlara Vəli aşı, Vəli aşından olanlara Əli aşı təqdim edirlər. Qonaqlara tutanda qatıq, tutmayanda ayran təklif edirik (9, s.48).

**Tutduğunu buraxmamaq** – yapışdığından əl çəkməyən.

Özləri də elə üzlü, elə həyasız olublar ki, tutduqlarını buraxmırlar (148,`S.121).

**Tuti dilli** – xoş söhbət, şirin dilli.

Əzəldən aşiqəm tuti dillərə (230, səh 27).

**Tutması tutmaq** – halı dəyişmək, xəstəliyi baş qaldırmaq.

-Yenə tutdu tutması- gəlin dizlərini ovuşdura-ovuşdura ağlayırdı (296, s.305).

**Tutulmaq** - çaşıb qalmaq.

İstəmədim ki, mənim tutulduğumu, ya şaşdığımı Salahov hiss edə (288, s.113).

**Tükdən asılı olmaq** – həyatı, işi, güzəranı balaca bir bəhanə ilə də aradan gedə bilər.

Bağladı dinimi möhkəm iki zunnar zülfi,
Bir tükündən asılı qaldı, bu möhkəm dindar (Nizami).

**Tükü tərpənməmək** -heç bir təsiri olmamaq.

Min bir alçaqlığa baş əyir hər gün
Tükü də tərpənmir bu yaşamaqdan (215, səh 49).

**Tükütükdən seçmək** – çox ayıq –sayıq olmaq.

Mən kişi adamam, uzaqdan baxana loru təsiri bağışlasam da, arifəm, tükü-tükdən seçirəm (1, c.II, s.290).

**Tükü üstündə durmaq** – öz işinin üstündə durmaq.

Əstəğfürullah deyə çıxdım, tükü üstə durun. Nəbada, nəməbud işlərlə özünüzü məşğul edəsiniz (300).

**Tülkünü nallamaq** – hiyləgər, xalqın başına börk qoyan.

**Tünbətün** – lənətə gəlsin; qəbir-qəbir dolaşsın. Söyüşdü, ölən adama ünvanlanır.

A səni əkən-doğan tünbətün düşsün (195, c.II, s.52).

**Tülkü olsan, dərin on beş şahıya dəyməz** – dəyərsiz, əlindən bir iş gəlməyən

**Tülkü sifət** – hiyləgər, qorxaq .

Düşmən nə qədər tülkü sifət olsa da olsun,
Biçarədir, qorxaqdı o aslan qabağında ( 27, s.33).

**Tükdən asılı yoxdur**-heç bir zaman xüsusilə bir xəlqin ağır həyat yükünün nazik tükdən asıldığı vaxt da əslən yorğunluğa, ruh düşkünlüyünə qapılmamalı (153, s.13).





**Tüklərin biz-biz durması** - qorxudan, təəccübdən, heyrətdən tüklərin biz-biz durması. Bunu xoşluqdan quduran arvada deyərlər. Təhdid mənasında işlənir.

**Tükləri biz-biz durmaq** - qorxmaq, diksinmək.

Elə bir halə düşərsən ki, tükün biz-biz olar,
Əyninə geyməyə şey tapmasan, astar üz olar (267, s.159).
Başında hər nə tük var, biz-biz oldu (147).

**Tük tökmək** – qorxmaq.

**Tükü tökülüb** - hövsələdən düşüb, daha zor deyə bilmir.

**Tülküdurmaz** - lap səhər erkən.

Sədrin günü- diriliyi var? Tülküdurmazdan çölə aparmışam onu (84, s.161).

**Tülkü kimi aradan çıxmaq** - qorxub qaçmaq.

İndi onun qaçıb siqaret bəhanəsi ilə tülkü kimi aradan çıxmağı da bunu aydınca göstərir (118, c.II, s.199).

**Tülkü qud-qudu** – nifaq salan, ara vuran danışıqlar.

**Tülkünün quyruğu** - pis adamlara, qüdrətdə olanlara yaltaqlıq edənlər.

Burada yaman işsizlikdir. Yalnız onların işi vardır ki, tülkünün quyruğudurlar (M.Səlamət).

**Tülkü poxu dərmana gəldi, sıçdı, üstünü örtdü** – bir qanmaz adamın köməkliyinə ehtiyac olan zaman naz eləməsinə və əsirgəməyinə işarədir (261, səh. 113).

**Tülkü suvaqlı bağa girməz** /ilan vuran ala çatıdan qorxar -aldada bilməzsən, mən səni yaxşı tanıyıram.

**Tünbətün düşmək** - pis adam öləndə deyirlər.

Sizə lənət gələydi ey ölülər,
Məni saldız bəlayə tünbətünlər.

**Tüpürdüyünü yalamaq** – yəni danışdığı sözün üstündə durmamaq.

Səfərəli: kişi tüpürdüyünü yalamaz. Mən sən qoyan qərarla razılaşdım (122, səh. 49).

**Tüpür, üstünə də bir daş qoy** – yəni ağzın qanlı olsa da, tüpürmə, və ya bildiyin bir zadı heç yerdə demə ( 261, səh.113).

**Tüstü bərkdir** - yəni vəziyyət çox ağırdır, yaxşı deyil.

**Tüstüsü dabanından çıxmaq** – bərk qəzəblənmək.

Zərgər xəncəri alanda gördü özü qayırdığı xəncərdi, tüstü dabanından çıxdı (46, s.39).

**Tütəyin dilini çəkmək** - səssiz olmaq, dinc oturmaq.

Çox uzun getmə, həqira, bəs elə,
Çək tütəyin dilini, çalma dəxi (318, S.382).

**Tütəyinə sarımaq** - ələ salmaq, başda dolandırmaq.

**Tüyünmək** - özünü ora-bura vurmaq, can atmaq, bir işə çalışmaq.





# -U-

**Uca küllüyün külünü sovurmaq** – varlı ailədən qız almaq. Onun girdiyi kol deyil, yəni o, bu işə müdaxilə edə bilməz.

**Ucdantutma** –hamısı.

Kənardakı ağacların hamısı ucdantutma yanmışdı (1, s.315).

**Ucubunıq** - həddən artıq uzun, ucaboy adam.

**Ucu güləbətinli** – bəzəkli, gözəl.

Ariflə Aslanın dilindən dəyirmançıya ucugüləbətinli bir kağız yazdılar (46, s.186).

**Ucundan, qulağından** – bildiyimdən.

Ucundan qulağından başa düşdüm
Amma əməlli-başlı yox (35, s.470).

**Ucundan tut, göyə çıx** – bu istilah arasıkəsilməz, şıdırğı yağış haqqında işlədilir.

Bu dəm bir selləmə yağış tökülür ki, ucundan tut, göyə çıx (220, səh. 76).

**Uçurtmaq** - şişirtmək, yalan danışmaq, gop basmaq.

**Udquna bilməmək** – qorxudan, nigarançılıqdan, iztirabda yaşamaq.

İnqilab anı gələndə şahların rəngi saralır, udquna bilmirlər (29, səh, 35).

**Uf-uf demədən**- etiraz etmədən çətinliklərə sinə gərmək, dözmək.

Bir ömür könül uf demədən cövrüvə dözdü (308, səh. 18).

**Ulduza hürən** - faydasız işlə məşğul olan.

**Ulduz axmaq** - Türklərin inamına görə hər insanın bir ulduzu var, dünyasını dəyişən insanın göydə ulduzu axır.

Azər elinin parlaq olan ulduğu axdı,
Şərqin çırağı söndü, fəqan göylərə qalxdı (R.Haşimi, s.488).

**Ulduzların barışması** – yəni iki nəfərin, iki millətin sülhdə, şadlıqda yaşaması.

**Ulduz oldu asimana getdi/ su olub yerə girdi** - birdən-birə yox oldu.

**Ulduzu barışmaq** – qızla oğlanın yola getməsi, yaxşı yaşaması. Evlənmək haqqında işlənir.

Ey qız, gəl ulduzlarımızı barışdıraq, bəsdi bu zindanda qaldığın (46, s.351).

**Uman yerdən küsərlər** - özünə yaxın bildiyi adamdan inciyər.

Amansız gözün yuman ayrılıq,
Can cızlığından uman ayrılıq (Şəhriyar).

**Uma-uma döndük muma** - istəyimizi ələ gətirincə əldən düşdük, çoxlu əzab-əziyyət çəkdik.

**Un çuvalına dönmək** - evdə qarıyıb qalmış qıza deyilir.

İndi yasa batıb, un çuvalına tay olub, qalıb qardaşının evində (142, səh. 58).

**Urus Allahı** – zalım, rəhmsiz.

Nə urus Allahı kimi başımın üstünü almısan?

**Urus gələndə matışqadı, osmanlı gələndə cocuq** - şəxsiyyətsiz, hər gün bir dona girən.

**Uşaq sıçdı bir yana, gəlin yaxdı hər yana** - işi bilməyən adam işi düzəltmək əvəzinə onu daha da xarablar.

**Uzaqdan döyüş adama asan gəlir** - əziyyət görməyən hər şeyi asan bilər, insan hər hansı bir işin içində olmasa, o işin çətinliyindən xəbər tutmaz.

**Uzaq yerin holasını / xərmənini xoruz ilə döyərlər** - tanımadığı yer barədə nə desən, inandırmaq olar, yalan danışır. Bizi bilməz hesab edib, ağzına gələni deyir və şişirdir.

**Uzun dilin qısa olması** - gözükölgəli olmaq, hörmətdən düşmək

Uzun dilim qısa ola, cavab verə bilməsən,
Yoxsulsan alçaqdan yeri, varınan işin nədi? ( M.Qasımlı).

**Uzun qulaq** - anlamaz, qanmaz.

O da o səbəbə inanır ki, qulaqları çox uzundur (195, c.II, s.51).





# -Ü-

**Üç badam bir qoz** - ürəyə yatmayan bir durum, mənasız bir mahnı çalmaq.

Mənim bəxtimin rəngi üç badam, bir qoz oldu (340, s.17).

**Üçlük gəlmək** – kələk gəlmək.

Əli ədə mənə üçlük gəlirsən? (9, s.143).

**Ümidi qırılmaq** –həyatda gözlədiyinin baş tutmaması.

Qırılır ümidi, tutulur yenə
Bir küncə qısılır bəyənilməyən (328, s.326).

**Ümidin puç olması** - həyatda bütün istək və arzuların məhv olması.

**Ümid körpüsü** - son ümid.

Elatın dəvəsi itmiş di, oxuya-oxuya gedirdi, bir nəfərə tuş gəldi, dedi qardaş dəvə görməmisən, dedi yox, dedi: amma dəvən itsə də kefin çox sazdı, elat dedi: ümid körpüm o qabaqkı dərədədir. O da yıxılsa, gör neylərəm.

**Ümidin xəzəl olması** – gözlədiyinin əksinə olması.

**Ürəkbir** - çox yaxın, birini sevən, yaman gündə bir-birinə arxa olan

**Ürəkdən gəlməmək** - utanmaq, razı olmamaq olanəti kimi səslənir.

Gəlmədim məktubu yazmağa bəlkə,
Ürəyin gəlmədi, əlin gəlmədi (152, səh 43).

**Ürəkdən tikan çıxartmaq** - birinin qisasını başqasından almaq.

**Ürəkdəkiləri oxumaq** – başqasının istək və arzularını başa düşmək, anlamaq.

Ürəklərdən keçənləri oxuyaq (264, səh. 98).

**Ürək-dirək olmaq** - arxa olmaq, təsəlli vermək, birini ovundurmaq, ümidvar etmək.

Dədə Şəmşirin oğlu Qənbər oğlu dedi: «Əgər dövlət səviyyəsində təcili və tutarlı kömək olmasa, Kəlbəcəri faciəli şəkildə itirəcəyik». Prezident Elçibəy ürək-dirək verdi: «Siz nə

danışırsınız? Kəlbəcəri itirmək, Azərbaycanı itirməkdir»(78, səh. 7-8).

**Ürək-göbəyi düşmək** –qorxmaq.

Çaydan keçəndə qurbağadan qorxub ürək-göbəyi düşüb, dəli olub (17).

Alə, ay evin tikilsin, neynirsən ürək-göbəyimiz düşdü ki (1, s.13).

Ay oğul, indiyəcək haradasan? Ürək-göbəyim düşdü (1, səh. 107).

**Ürək qızdırmaq** - inanmaq, birini təşviq eləmək.

Əlizaman oğlu, madam ki, sən mənə ürək qızdırıb bu cür sözlər deyirsən, onda sənə bir sualım var (1, s.294-295).

**Ürək qoyub can yandırmaq** – bütün varlığı ilə bir yolda çalışmaq.

Ürək qoyub can yandırıb hər bir sözün mənasına,
Deyirəm ki, salam verim şeri-sənət dünyasına (337, c.I, s.119).

**Ürəksiz** – qorxaq, hissiyyatsız.

Adına bağlayım bir yeni dastan,
Bir yığın sümükdür ürəksiz insan (337, c.I, s.39).

**Ürək süfrə deyil** – ürəkdə olanı hər kəsə açmaq olmaz.

Bir buynuzlu qoçam mən
Yerim yoxdu qaçam mən
Yürəyim süfrə deyil,
Hər gələnə açam mən (33, S.123-124).

**Ürək vermək** - təsəlli vermək, dayaq olmaq.

**Ürə olmaq** - odun yaranda əvvəlcə odunda yer açan şeyə ürə deyilir. Mane olmaq mənasındadır.

**Ürəyə dağ vurmaq** –müsibətlərlə üz-üzə olmaq, dözülməz şəraitdə qərar tutmaq.

Biz qanlarla yazılan bir kitab idik,
Axdıq, tarix də bizləri oxuya bilmədi,
O da bir dağ idi (1997-ci il 21 may. Mirəli Seyidsəlamət).

**Ürəyə dammaq** – ilham olmaq, bir zadın baş verməsindən xəbərdar olmaq, barat olmaq, əyan olmaq, hiss etmək.





Ürəyimə dammışdı ki, sən bu gün zəng edəcəksən,
Bu qızılgül kainatı bir cüt çələng edəcəksən ( S.204).
Sanki onun ürəyinə nə isə dammış idi (197, səh. 182)..

**Ürəyə xal düşmək** – niskilli insan, əzizini itirən kəslərə aid olan anlam.

Şaxta vurmuş çiçəklərə baxanda
Yarpaq kimi ürəyimə xal düşür (299, səh. 33).

**Ürəyi açıq** – təmiz ürəkli, mehriban bir insan anlamında.

Bu qazaxlar yaxşı camaatdır. Oğul, çox ürəyiaçıq adamlardır (110, səh. 125).

**Ürəyi ağzına gəlmək** - iyrənmək; qorxmaq.

**Ürəyi ağzından çıxmaq** –çox həyəcanlanmaq.

Qoca İskəndər Nayıbın sinəsi **atlanmışdı**, ürəyi ağzından çıxırdı. Gözləri xorxun piyaləsi tək dolmuşdu (203, s.68).

**Ürəyi atlanmaq** - birinə ucadan, ya qışqıra-qışqıra etiraz etmək.

Sürgünə gedən maralların tükləri par-par parıldayırdı. Bir adam, bilmədim kim onlardan birini vurdu, budarladı, burda yenə qoca İskəndər Nayıbı qəhər basdı, ürəyi atlandı, ağladı (203, s.71).

**Ürəyi ayağının altına düşmək** - başqasının xoşbəxtliyini istəməyən, qorxmaq.

**Ürəyi bəyaz etmək** – kədərdən, nigarançılıqdan nicat tapmaq.

Yudum ürəyimi, bəyaz eylədi, sildim könül pasın, ayaz eylədi (117, səh 53)..

**Ürəyi boz** -qorxaq, mərhəmətsiz.

Məni insafsız, ürəyi boz eyləməsin (52, s.126).

**Ürəyi dabanına düşmək** – darıxmaq.

**Ürəyi dağ boyda olmaq** - fərəhlənmək, hədsiz sevinmək.

Dayımla bərabər at sürərək kənddən çıxanda ürəyim dağa dönmüşdü (Ə.Məmmədxanlı).

**Ürəyi dara çəkilmək** – çox əzab-əziyyət çəkmək.

Ah bacım! Ürəyin çəkildi dara,
Təpədən dırnağa geyindin qara (337, I, s.33).

**Ürəyi kabab olmaq** – birinin halına yanmaq, kiməsə yazığı gəlmək və ya yaşarının ağırlığından ürəyinin tab gətirməməsi.

Kababı vədə verməkdən, bu zəxmi mədəyə axər,
Yanarkən nari-həsrətdə özü istəyir kabab olsun (338, səh. 67).

**Ürəyi qırılmaq** - incimək.

**Ürəyi qubarlanmaq** – kövrəlmək.

Kərəm baxdı ki, öz dağları uzaqdan görünür, ürəyi qubar eylədi (35, s.501).

**Ürəyi quş kimi çırpınmaq** - kiçik bir zaddan qorxmaq.

**Ürəyim bərk sıxılır** – nigaranam, darıxıram.

Ürəyim bərk sıxılır. Kaş biz də fədailərin yanında olaydıq (77, səh. 21)..

**Ürəyim dağa döndü** – ümidvar oldum, qorxmadım.

**Ürəyimdə yağ qalmadı** – dözümüm qalmadı.

Xurmatıda bağ olmaz, qara salxım ağ olmaz.
Qaşı sürmə qız sevən, ürəyində yağ olmaz (24, səh 154).

**Ürəyim əfil-əfil əsir** - bir adami görmək, bir arzuya çatmaqdan ötrü həddən artıq darıxmaq.

Ürəyim bir zərrə qayğı,
bir zərrə məhəbbət üçün
Əfil-əfil əsir (Səhənd).

**Ürəyimin bəndi qırıldı** – hər hansı bir hadisədən qorxmaz, ürpəşmək.

Ürəyimin bəndi tirə bağı kəsildi (13, səh. 34).

**Ürəyim sənə qızır** – sənə inanıram, sənə güvənirəm.

**Ürəyi nanə yarpağı kimi əsmək** – həsrətdən həyəcanlanmaq.

Qardaş adı eşidən kimi onların ürəyi yumşaldı, ürəkləri nanə yarpağı kimi əsdi (46, s.191).

**Ürəyin başı yanmaq** – çox təsirlənmək.

Dağların başı yanar,
Dibinin yaşı yanır,
Yar yadıma düşəndə
Ürəyimin başı yanır (33, s.186).





**Ürəyin boşaltmaq** - sirrini açmaq; birinin cavabını vermək, ürəyindəki dərdi, sirri, arzunu dilə gətirmək.

Tamaşadan sonra Fikrət Əmirovu təbrik edəndə mənə: "Axır Bolşoy Teatrda ürəyini boşaltdın"- dedi (292, s.337).

**Ürəyindən daş asılmaq** – qəmlənmək.

Qaya boyda daş asılar mənim ata ürəyimdən
Gülər görüm, oynar görüm
Xoşbəxt görüm hər vaxt sizi (337, c.I, s.120).

**Ürəyindən keçmək** – yadına düşmək, bir nəfəri xatırlamaq.

Balağaya da heç nə deməmişəm, ürəyimdən keçirdi ki, deyim (1, s.160).

**Ürəyindən qara-qara qanlar axmaq / Ürəyindən qara qan axmaq** - həsrətdən, bir şeyi ələ gətirmək üçün fikirləşməkdən ötrü qəm-qüssə yemək.

Ürəyindən qara qan axa-axa sərv ağacını qucaqlayıb (35, s.477).

**Ürəyindən tikan çıxmaq** – çox xoşuna gəlmək, bir şeydən çox xoşhal olmaq.

Canımçün, lap ürəyimdən tikan çıxartdın (9, s.20).

Həmid onların sözləşməsini eşidirdi, oğlan onun ürəyindən tikan çıxarırdı (1, s.116).

**Ürəyinə bıçaq sancmaq** – böyük təsir qoymaq, böyük zərbə vurmaq.

Birdən-birə bu palçıq içinə döşənib üzünü onun başmaqlarına sürtən çılğın məhəbbət Fəzlin ata ürəyinə bıçaq sancdı (144, s.173).

**Ürəyinə çarpaz dağ çəkmək** – böyük zərbə almaq.

Dərdli Kərəm qan ağlayar
Ürəyin çarpaz dağlayar (35, s.516).
Əslim Qarabağlıdır,
Sinəm çarpaz dağlıdır.
Nə gələn var, nə gedən,
Demə yollar bağlıdır.

**Ürəyinə daş bağlamaq** – mərhəmət etməmək, acımamaq.

Əziyiyəm baş bağlar,
Başın yuyar, yaş bağlar,
Yarından ayrı düşən
Ürəyinə daş bağlar (33, s.179).

**Ürəyinə dağ çəkmək** – birinə yara vurmaq, təhqir eləmək.

Bir dağ çəkdin ürəyimin başına,
Bu dağı sinəmdən al qoşa-qoşa (32, c.II, s. 52).

**Ürəyinə daş kimi düşmək** – ağır təsir etmək, ürəyini sındırmaq.

Ömründə bir dəfə də ona qışqırmayan atasının "sus" kəlməsi Gövhərşahın ürəyinə ağır daş kimi düşmüşdü (144, s.44).

**Ürəyinə yatmaq** – xoşuna gəlmək.

Əvvəlcə bir de görüm, o sənin ürəyinə yatırmı? (1, s.171).

**Ürəyin getməsi** - huşunu itirmək, həddən artıq qorxmaq.

**Ürəyin gəmirmək** - qorxmaq, düşmən baltasının sapı olan adamı yenidən görmək.

Savaka işləyəni görəndən yenə də bir nifrət, şübhə ürəyimi gəmirir (X.Qəffari Cabbari).

**Ürəyini buz kimi saxla** - rahat ol, arxayın ol.

**Ürəyini qana döndərmək** – həddsiz qəmləndirmək.

Aşıq sənə nə olub ki, yanıqlı-yanıqlı oxuyursan, ürəyimizi lap qana döndərdin (35, s.486).

**Ürəyin quş tək döyünməsi** – ürəyin həddən artıq döyünməsi, tez-tez vurması.

Ürəyim sinədə quş tək döyünür. Yəqin istərdi ki, uçsun oradan (32, səh. 164).

**Ürəyi qan olmaq** – çox narahat olmaq.

Ey dərbədər gəzib ürəyi qan olan cocuq,
Bir loqma nan üçün gözü giryan olan cocuq! (267, s.110).

**Ürəyinin kötəyini yeyir** - özgəyə inanmaq, inandığı adamlardan zərbə almaq.

**Ürəyin paslanması** - kədərə qərq olmaq, şadlığa, şənliyə yad olmaq.





Bir zaman çəkərəm yası,
Ürəyimdən getməz pası (117, s.31).

**Ürəyin şişməsi** – ayrılıqdan, dərddən, iztirablardan xəstə olmaq.

Ayrılıqdan, dərd əlindən ürəyimiz şişmişdi (264, səh. 76).

**Ürəyi paslı** – həddsiz kədərdən qüssələnmək.

Dərdli Kərəm deyər gözəlim Əsli,
Gözlərim yaşlıdı, ürəyim paslı (35, s.485).

**Ürəyi səksəkəli** -- pis bir xəbər gözləyən.

Bu saat camaatın ürəyi səksəkəlidir ki, sentyabra salamat çıxsın, sən martdan dəm vurursan (9, s.135).

**Ürəyin sərinləməsi** - birindən intiqam almaq, hayıfını çıxmaq.

**Ürəyi sıxılmaq** - nəhayət dərəcədə darıxmaq.

Könül quşumun ürəyi sıxılır. Dağların, çayların o tayında da heç bir isti ocaq, heç bir isti qucaq çağırmadı mənim könül quşumu (219, s.34).

Ürək sıxılmasın, ürək cəhənnəm,
Axı sən ordasan, sən sıxılarsan ( S.Səxavət).

**Ürəyi soğan qabığı kimi soyulmaq** - ürəyi yanmaq, darıxmaq.

**Ürəyi soyumaq** -- qəzəbi soyumaq, hirsi yatmaq.

Beləliklə, mənim ürəyim soyumaz. Mən gərək onu öz əllərimlə diri-diri soyam (148, s.102).

**Ürəyi şam kimi ərimək** - gözləməkdən, həsrətdən, dərddən ürəyin həddsiz dərəcədə gücdən düşməsi.

**Ürəyin talvasalanması** - darıxmaq, ürəyi sıxılmaq.

Ay qız, o pəncərənin tayını bir az aralı qoy. ürəyim talvasalandı (259. s.185).

**Ürəyin tel-tel olması** - bir xatirədən kövrəlmək, həsrət çəkmək, hər hansı bir həsrətdən, sevgidən baş verir, darıxmaq anlamında işlədilir.

Qocanın ürəyi tel-tel olur.

**Ürəyi uçmaq** - sevinmək.

**Ürəyi üstünə gəlmək/yerinə gəlmək** - əvvəlki arxayınlığı ələ gətirmək, rahat olmaq.

**Ürəyi yanmaq** - susuzluq, birinin halına yanmaq.

Çırağın yüz il yansın,
Kəs başın, yüz il yansın,
Qarğıyam balan ölsün,
Yürəyin yüz il yansın (33, s.143).
Dənizdə qaya balıq,
Ürəyim sənə yanıq (24, s.144).

Ürəyi yandı. Özünü alovun içinə atıb qutunu kənara çıxartdı (148, S.98).

**Ürəyi yaralı** – dərdli.

Sizdən mənim də ürəyim yaralıdır (148, s.99).

**Ürəyini yemək** - qorxmaq, narahat olmaq.

**Ürkək-ürkək durmaq** – yəni nədənsə çəkinərək, qorxaraq, ətrafa baxmaq, boylanmaq.

Qalın meşəlikdən talaya çıxdın,
Durub ürkək-ürkək dörd yana baxdın (152, səh. 55).

**Üst-başı tökülmüş** - kasıb geyimli, köhnə paltarlı.

Deyirdi ki, onun üst-başı tökülürdü, bəlkə heç kişinin Bakıya gəlməyə yolpulusu yoxdur (1, s.191).

**Üstələmək** – qalib gəlmək.

Dərviş mollanı üstələdiyini görüb tez "bəli, bəli" deyə cavab verir (148, S.123).

**Üstü açıq** - açıq, birbaşa söz.

İraqda yaşayan türklər üstüörtülü sözlərlə, ya üstü açıq sözlərlə öz etiraz səslərini ucalırlar.

**Üstümü unlu görmə** - məni yaxşı tanımırsan.

Üstümü unnu görüb o, arvadının yanından oğurlayaram onu (84, s.369).

**Üstümü unlu görüb, adımı dəyirmançı çağırma** – mənim də təcrübəm var.

Üstü unlu olan hər arif qoca,
Öz ürək sözünü deyər doyunca (337, c.I, s.43).

**Üstündən dağ götürülmək** – yüngülləşmək.





Elə bil üstündən bir dağ götürüldü (1, s.201).

**Üstünə aftafa götürmək** - başqalarının yanında bir yalan danışan, pis adamın eybini açmaq.

**Üstünə it əsnəyib** - işləri düş gətirməmək.

**Üstünə yoxdur** - bundan yuxarısı yoxdur.

**Üstünü palazlamaq** – gizlətmək.

Belə hala düşməsəydilər, onun üstünü birtəhər palazlamaq da olardı (253, s.18).

**Üstüörtülü, ya üstüaçıq** – sözü birbaşa, ya dolayı yolla demək.

Üstüörtülümü, üstüaçıqmı Şahquluya meydan oxuyan Pirqulunun azğınlığına son qoysun! (253, s.379).

**Üz bürüyən dağ aşar** - özünü hazırlayan, yaman günə dözən hər zada qalib gələr.

**Üzdə pambıq əkmək** – yəni dəllək birinin üzünü qırxan zaman, çox kəsib, yerinə pambıq qoyursa, o zaman bu anlam işlədilir.

Sürgün olduğumuz «Ələştər» maliklərindən çox adlı-sanlı olan xan çox ehtiramla: «Bəs mənim üzümü islah edin» eyib oturdu. Əllərim əsə-əsə üzündə hesabı pambıq əkdim. Canıma qorxu düşdü. Lor xəlqinin güzəştinə heyran qaldım (281, səh. 94).

**Üzə çəkmək** - olmuş bir hadisəni bir adamın üzünə demək; bir adama yardım eləyib onun uğur qazanmağına kömək etmək.

Yəqin sənin adamın olmayıb səni üzə çəksin (195, c.II, s.128).

**Üzə gəlmək** - birinin qabağında dayanmaq, etiraz etmək, sağalmaq

Oğlancığın yaraları üzə gəldi, sap-sağ oldu (284, s.163).

**Üzə girmək** - danmaq, bilə-bilə inkar etmək.

**Üz ətdəndir** – insan utanandır.

**Üz-göz olmaq** - savaşmaq, arası dəymək.

Almaz, mən sənin üstündə bütün kənd əhli ilə üz-göz olmuşam (72).

**Üz-göz turşutmaq** - qaş-qabaq tökmək.

Şeyx Zeynal Hüseyn ağanın dostunu görən kimi üz-gözünü turşutdu (201, s.66).

**Üz-gözündən zəhər yağmaq** – nəhayət dərəcədə qəzəbli olmaq.

Şahın üz-gözündən zəhər yağırdı
Kədəri sonsuzdu, dərdi ağırdı (328, s.171).

**Üz-gözünü qırışdırmaq** - qaş-qabağını sallamaq.

**Üzr bəttərəz günah** – üzrü günahından betərdi.

Nəsrəddin şah: Kim deyə bilər, ürz bəttərəz günah, nəmənə?

Müxtəlif cavab verdilər. Heç kəs, heç biri şahı razı salmadı. Nəsrəddin şah sarayın təlxəyindən Kərim Şireyidən soruşdu. O da dedi: «Qurban, bu belə aləm bacara bilməyən bir halda, mən bir təlxək haradan bacara bilərəm?» Üç gün keçəndən sonra Nəsrəddin şah Gülüstan sarayında qədəm vuran zaman Kərim Şireyi sütunların birinin dalısından çıxıb, başladı Nəsrəddin şahı öpməyə. Nəsrəddin şah əsəbiləşib, dedi «köpək oğlu, bu nə işdi?». O isə cavabında «üzr istəyirəm, xəyal etdim ki, həzrəte- mələkədir». Nəsrəddin şah dedi: «Utanmaz, sən mənə üzr bəttərəz günah gətirirsən. Mirqəzəb gəlsin bu qanmazın başını vursun». Şah bir az aram olandan sonra Kərim dedi: «Bəli, qurban, buna deyərlər, üzr bəttərəz günah» (169, səh. 70-73).

**Üz sürtmək** - səcdə etmək.

Bu bağı-cənnətin xakinə mən də,
Həsrətlə üzümü sürməyə gəldim (165).

**Üzsüzlükdü** - ayıb sayılan bir sözü işlətdikdə deyərlər.

**Üzüağ olmaq** - xalqın yanında, dostlar arasında başı uca olmaq.

Qəbrə qədər həmişə mən üzüağ olaydım (264, səh. 26).

**Üzü ayağa salmaq** - alçaq könüllülük, saf təmiz ürəklə bir inama xidmət etmək, birinə mürid olmaq, birinə nəhayət dərəcədə vurğun olmaq, məhəbbət yetirmək.

Ayağına yüzünü kim ki saldı əz sere-sidq,
Səriri-səltənət üstündə möhtəşəm qaldı (132, s.92).





**Üzü bərk** – çox dözümlü.

Üzüm bərkdi, mənə nə olacaq? Evdən vaxtında çıxmışdım (1, s.380).

**Üzü dönmək** – birindən narahat olmaq.

Hələ sözünü qurtarmamış Yusifin üzünün döndüyünü hiss etdi (144, s.121).

**Üzü götündən qırmızı** - həyasız, sırtıq adam.

**Üzü gülmək** – şad olmaq, səmərə vermək.

Göyün gözü ağlamasa, yerin üzü gülməz.

**Üzü qara** – bir pis işdər və ya yoxsulluqdan birinin yanında xəcalət çəkmək.

Allah onun üzünü qara eləsin (195, c.II, s.37).

Bəlayi fəqrə düşdüm razı ol, biçarə, səbr eylə,
Üzün oldu isə, gər külfət yanında qarə, səbr eylə (267).

Onda sizin bacınızın yanında üzüqara olaram (35, s.254).

**Üzüm ayağının altına** – bağışla, ədəbsizlik eləyirəm.

Zarafatım var səninlə, kiçiyinəm, üzüm ayağının altına (84, s.115).

**Üzümdən kəsmədi** - deməyə utandım, hörmət qoydum.

**Üzümün suyu töküldü** - abır-həyam getdi, utandım.

Yüzüm suyun üzüm suyundan ötrü su kimi tökdüm (317, s.70).

Bir dəmir qapı, balaca dərbəçə, onun üstündə dəmirdən toru, onun dalında qart bir təvvab, çoxdan tökülmüş üzünün suyu (Nəsim).

**Üzün ayazlaması** – ölüm vəziyyətində, çox həyəcanlı olanda rəngin ağarması.

Sanki qəfil ayrılığın təşvişindən kişinin üzü ayazımışdı. Bəli, ağ üzü daha da ağarmışdı.

**Üzündən iraq** - səndən uzaq, pis adam.

Bəs ki bu üzdən iraqlar ilə yoldaş oldum,
Şərbəte qənd ikən şireyi-xəşxaş oldum (222, s.55).

**Üzünə dan yeli dəyməyib** - həyasız, utanmaz.

Dan tanrı gəldi,
Dan tanrı özü gəldi,

Durun hamı bəylər, qardaşlar,
Dan tanrını övək (331, 1365).

**Üzünə gün doğsun** - əziz qonağı yola salan zaman güzgünü günəşə tutub onun işığını qonağın üzünə salmaq türklərdə bir adət idi. Deyim o zamandan qalıb. Xoşbəxtlik, səadət arzu etmək deməkdir.

**Üzünə qan gəlib** - yaxşılaşıb, sağlamlığını ələ gətirib.

**Üzünə ölü tozu qonub** - ağır vəziyyətdə, xəstəhal, rəngi-rufu qaçmış, incardan düşmüş, ölümqabağı hal, ölümdən qabaqkı vəziyyət

**Üzünə toz qondurmur** - vecinə deyil, zahirən özünü rahat göstərmək.

Qəbri görür, toz qondurmur üzünə (307, s.50).

**Üzünü başmaqlarına sürtmək** – ayaqlarına döşənmək, səcdə etmək.

Birdən-birə bu palçıq içinə döşənib üzünü onun başmaqlarına sürtən çılğın məhəbbət Fəzlin ata ürəyinə bıçaq sancdı (144, s.173).

**Üzünün örtüyün vermək** - pis yola düşən, təhqir olunan adam belə deyir. Örtük ağ kəfən mənasındadır.

Allah ya burdan qurtarsın, ya da birdəfəlik üzümün örtüyünü versin (82, s.231).

**Üzünün suyu tökülmək** – abırsız, həyasız bir insan olmaq.

Vallah, bizim zəmanədə cavanlar elə sırtıqlaşıblar ki üzlərinin suyu tökülüb (9, s.20).

**Üzü olmamaq** – utanmaq, xəcalət çəkmək.

Qapını döyməyə üzüm olmadı (291, səh. 18).

**Üzü sillə ilə qızartmaq** - güclə ailə dolandırmaq, sirrini heç kəsə açmamaq.

**Üzü sulu qayıtmaq** - peşiman olmaq, utanmaq, abri-həyası tökülməmiş qayıtmaq.

Day mənim bu evdə qalmağım yaramaz, abır-həya ilə, üzüsulu çıxıb getməliyəm (1, s.61)

**Üzü turşutmaq** – qaş-qabaq sallamaq.





Üzünü turşutdun, alanda salam (264, səh 118).

**Üz-üzdən utanar** – biri-birini görsə, ürəyindəki incikliyi deyə bilməz, xahişini eşidər.

Elə bir şəxs sənə ağız açır ki, keçə bilmirsən, üz üzdən utanır (1, s.351

**Üzü üzlər görmüş** - çox təcrübəli; çox əxlaqsız qadın.

**Üz verəndə astar istəyir** - yaxşılıqdan sui-istifadə edir.

**Üz vurmaq** - təkid etmək.

Kişi çox çalışdı, üz vurdu, qardaşları geri döndərə bilmədi (14).

# -V-

**Valay vurmaq** - düz işləməmək.
Elə bil ki, sənin beynin valaylıdır (219, s.110).

**Valı/ səhifəni dəyişmək** – münasibəti dəyişmək.
İbişli- deyəsən valı dəyişmisən, drujok? (9, s.181).

**Vara yalvarmaq** - varlıya, imkanı olan adama hamı üz tutar.
Yoxsul olan gedər vara yalvarar,
Mən necə yalvarım bir özgəsinə? (261, s.318).

**Var evi kərəm evi, yox evi dərdinən vərəm evi** - yoxsulluqdan Allah da bezardır, imkanlı adamın dostu çox olar.

**Var-gəl etmək** - gəzinmək, bir salonun, otağın içində nigaranlıqla o yan-bu yana gedib gəlmək.
Mirzə Cəlil həyəcan keçirir, arası kəsilmədən papiros çəkir, var-gəl edirdi (197).

**Varlığa nə darlıq** – varlı adam üçün bütün qapılar açıqdır.
Varlığa nə darlıq, bu köpəkuşağının topları, tankları, təyyarələri də bizimkindən çoxdur (1, s.232).

**Vayqanlı tutmaq** - nahaqdan səbəbkar bilmək.

**Vedrə bağlamaq** - arxasınca söz çıxarmaq.
Kənddə mən şalvar geyib küçəyə çıxsam, dünyadan xəbərsiz bu avam adamlar mənim dalımca vedrə bağlayacaqlar.

**Verən aşı içərlər** - namus barəsində işlənir, bir qadın öz namusunu küçəyə atırsa, kişi də ondan istifadə edə bilər.

**Vərdənə dodaq** – yekə dodaq.

**Vərə - vürd eləmək** – götür-qoy eləmək.
Dəmirçi vərəvurd elədi, dedi (46, s.141).

**Vəziri qarğa olanın dimdiyi poxda olar** - alçaq adamları özünə yoldaş eləsən, axırın çox pis olar.

**Vur başına, çörəyini al** - yazıq, əlsiz-ayaqsız.

**Vurdu daşa, çıxdı başa** - var-dövlətinin axırına daş atmaq, həyatı məhv eləmək.
Amma onun şəmatəti Allaha xoş gəlməyibən,





Getdi mənim həyatımı vurdu daşa, çıxdı başa (306, s.131).

**Vurdular s..i yaxasından çıxdı** - bərk döymək.
Yoldaşı puldu məhəkdən çıxaran,
Çıxmasa vur s..i çıxsın yaxadan (168, s.785).

**Vurmaq** - içmək.
Vurub yıxılırdı kolların arasına (84, s189).

**Vur-tut** - cəmi, olub –qalan.
Kəblə Qurbanın dar dünyada vur-tut Səhnəbanı adlı bir göyçək qızı var idi (13, s.158).

**Vurulmaq** - birinə aşiq olmaq.

**Vur çatlasın** - dava-dalaş.
Necə deyim vur çatlasın, axı vuran qardaş, ölən qardaş! (306).

**Vurdular mil durdu** - həddindən artıq döymək.

# -Y-

**Ya Allah** - bu müxtəlif mənalarda işlənir. Məscidlərdə yer dar olan zaman yeri genişləndirmək mənasında, bir qonaqlığın, bir iclasın sonunun çatdığını elan eləmək, görüşən zaman işlənir. İslam hakimiyyəti qurulandan sonra camaatın dinə və din başçılarına inamsızlığı nəticəsində ümumiyyətlə, məscidlərdə 3-4 nəfərdən artıq olmur. Bir qrup qabağından yeməyən adamlar şeyxləri və məscidi idarə edən adamları təhqir etmək üçün deyir: "Ya Allah!" deyin, gələn var.

**Ya eşşək ölər, ya da xan** – iki tərəf bir-birini aradan aparmayınca, vəziyyət belə olacaq.

Ya eşşək ölər ya da.. (9, s.173).

**Yağışdan çıxıb yağmura düşmək** - əvvəlkindən ağır vəziyyətə düşmək.

- Vəzir, yağışdan çıxdıq, yağmura düşdük (46, s.107).

Yağışdan çıxdım, yağmura düşdüm, keçəldən çıxdım, danqara düşdüm - buna deyiblər (129, s.45).

**Yağı yalan, qış gerçək** – çox soyuq qış.

Yağı yalan, qış gerçək (229, s.15).

**Yağ içində böyrək kimi saxlamaq** - çox qayğı göstərmək.

Cəlalı yağ içində böyrək kimi saxlayırdı (84, s.157).

**Yağ kimi canına yayılmaq** - çox xoşuna gəlmək.

Təklik yağ kimi canıma yayılırdı (118, s.191).

**Yağ kimi getmək** – lap rahat.

On min misra yazmışam, yağ kimi gedirdi (9, s.109).

**Yağlı/ yavan səs** - xoşagələn, gözəl səs.

Qırx ildi dustağam, qala bilməz o yağlı səs,

Yağsızsa da qəbul elə məndən yavan səsi (306, s.116).

**Yağlı söz** – acı söz, tənqidi söz.

"Süpürgə saqqal" imzası ilə yazan Mustafa bəy Mirzə Cəlilin ünvanına daha bir neçə yağlı söz dedi (197, s.32).





**Yağlı əlini çək öz başına** - səndən xeyir gəlməz, təklif etdiyin işi özünə rəva bil.

**Yağlı əppək olub göyə çəkilmək** – birdən yox olmaq.

Elə bil ki o, bir yağlı əppək olub göyə çəkilmişdi (46, s.102).

**Yağlı müştəri** - var-dövlətli, qazanc verən müştəri.

**Yağlı yerdəndi** - varlı ailə.

İşdi yetim olmasa, onda gərək yağlı yerdən olsun (9, s.117).

**Yağmadı, bitmədi** - birdən belə olmadı.

İşdir olmadı, yağmadı, bitmədi (335, s.109).

**Yağmasa da guruldayır** - işdə olmasa da, sözdə dayaq durmaq.

**Yağ tək canına/döşünə yayılmaq** - çox xoşuna getmək.

Yağ tək yayılardı cana ay şəbi- çillə (168, S.20).

Lotu İbrahimin öz dilimizdə oxuduğu qoşmalar yağ kimi döşümə yayılırdı (112, s.84).

**Yağ yağ üstə gedər, yarmalar yavan qaynar** – dövlətlilər bir-birin tapar, kasıba dayaq duran olmaz.

Çalxalandıqca, dolandıqca zaman nehrə kimi,
Yağı yağ üstə çıxır, ayranı ayranlıq olur (267, s.106).
Dağ üstə duman qalar,
Yağışa güman qalar,
Yağ yağ ilə qarışar,
Yarmalar yavan qalar (33, s.200).

**Ya Həsən keçəl, ya keçəl Həsən**- fərqi yoxdur.

**Yaxa bağlamaq** - şəmşir gücü ilə müsəlman olub, din başçılarının fırıldaqlarına şahid olan adamlar orucluğa bir həftə qalandan daha da içkini, çaxırı çoxaldar ki, orucluğa zorakılıqla manеə törədən qanunların yerini doldursunlar.

**Yaxadan əl çəkmək** – buraxmaq.

Mənim dostum mənə məndən yaxındı,
Əcəb ki mən hələ uzağam ondan.
Kimə mən deyim ki, yar yanımdadır,
Yenə də yaxamdan əl çəkmir hicran.

**Yaxalamaq** - bir pis işin üstündə tutmaq, birini ələ gətirmək.

**Yaxanın əldə qalması** - birinin üstünə məsuliyyəti atmaq.

Ay yel baba, yel baba,

Taxılımız yerdə qaldı, yaxamız əldə qaldı.

**Yaxasını it yeyənin əməyini bit yeyər** - nankor adama yaxşılıq etməyin axırı zərərli olar.

**Yaxasını cırmaq/ yırtmaq** - yalandan havar çəkmək, haqlı olmadan qabaqdan gəlmişlik etmək, haqlı bir sözü dönə-dönə təkidlə təkrarlamaq.

Neçə vaxtdı yaxamı cırıram ki, belədi, inanmırsız ( İbiş kişi).

Yaxasın yırtmayaydı, vurmayaydı başına silli, nə edeydi bəs bu millət elmü-ürfan olmayan yerdə (301).

**Yaxasını kənara çəkmək** – kənar durmaq.

Biz Azərbaycan xalqına milli hökumət istədiyimiz zaman bütün milli zülmdən cana gəlmiş millətlərə də azadlıq yolunda yardımçı olmaq fikrindəyik. Biz heç vaxt yaxamızı kənara çəkməyəcəyik.

**Yaxasını tanımaq** - yaxşı və ya pis işlərə görə birinin ad çıxarması, birinə yapışıb ondan sui-istifadə etmək.

Atalıqdan da bu dünyada tapılmaz çətin iş,

Bil Nəsira, atanın da tanınıbdır yaxası (241, s. 37).

**Yaxasız köynək** - kəfən, özlərini müsəman adlandıran, Avropa tipli köynəklərdən imtina edənlərin geydiyi xüsusi köynəklər.

Tənin ortaya açıla, yaxasız köynək biçilə,

Bizi bu asan vəchlə, duyanlara salam olsun! ( Y.İmrə).

**Yaxına gəlmə iyin gəlir, uzağa getmə canım çıxar** - nə istədiyini bilməmək.

**Yaxın yoldan qaytarmaq** - ən göz qabağında olan səbəbi göstərmək.

**Yaxşı başlamısan Mavərənnəhri** – qarğış, dedi- qodu başlamaq.





Afərin, sabah ertə yaxşı başlamısan Mavərənnəhri (335, s.54).

**Yaxşı dost adama qəlyədaşı yedirdər** - adamın başını aşağı eləmək.

Azərbaycanda şor yerlərdə bir cür ot bitər ki, onu yandırdıqda daş kimi bir şey olur. Ondan istifadə edib quru meyvəcatı və bəzi şeyləri çürüməkdən, qurd qoymaqdan qoruyurlar.

**Yaxşı igid dayısına çəkər/ qoç igid dayısına çəkər, xanım qız xalasına** – mənfi mənada işlənir. Yəni bu nəsildən bundan artıq adam çıxmaz.

Deyəsən, Qüdrət, yaxşı igid dayısına oxşar, ayağını götürüb ayağını son qoymusan axı (109, s.138).

**Yaxşıları yer tanır** - yaxşı adamlar tez ölür.

**Yaxşılığa yaxşılıq hər kişinin işidir, yamanlığa yaxşılıq ər kişinin işidir** - hər adam yamanlığa yaxşılıq edə bilməz.

Yaxşılığa yaxşılıq hər kişinin işidir, yamanlığa yaxşılıq ər kişinin işidir (46, s.297).

**Yaxa yırtmaq** – özünü ora-bura vurmaq.

Girəndə məscidə fəqət ağla,

Bahadı çilvar, yırtma yaxan, Məmmədəli (301).

**Yalan ayaq tutar, amma yeriməz** - yalan sözlə hamını həmişə aldatmaq olmaz.

Yalançının biri deyirdi: İsfahanda yüz iynə boyu tullanırdım. Biri deyər: İsfahan burda deyil, amma yüz iynə boyu burdadı, gəl tullan. Yalançı deyər, yox, İsfahandan gətirin. O adam cavabında deyər: yalan ayaq tutar, amma yeriməz (38, s.234).

**Yalançının evi yandı, heç kəs ona inanmadı** – bir adam bir dəfə yalan desə, sonra düz sözünə də inanmazlar.

Evi yandı yalançının derlər,

Ona bir kimsə etmədi bavər (267, s.383).

**Yalığın nəyi var, yoluğa versin /acda nə var, yalavaca nə versin** - yoxsul adam başqasına nə verə bilər?

**Ya lələ şələni basar, ya şələ lələni** – iki tərəfdən biri qalib gələr.

Ana, mən bu qızın dalınca gedəcəyəm, ya lələ şələni basar, ya şələ lələni (46, s.33).

Ya şələ ləlɘni bassın, ya da lələ şələni! ( 253, s.280).

**Yal quyruğu yoluq** – pis vəziyyətə düşmüş, rüsvay.

Soyaram libasın, allam sazını,
Yal quyruğu yoluq yola düşərsən (32, c.II, s. 15).

**Yalquzaq /qurd–** xətərli, tək.

Sən məndən, mən də səndən,
Tanrı ikimizdən uzaq,
Ay doğacaq indicə,
Sən canavar, mən yalquzaq (208).

Sərhəng yalquzaq canavar tək gözlərini Sədinin gözlərinə dikir (77, s.27).

**Yamacdan yaldan danışmaq** - əsas mətləbdən yayınmaq.

Ədəb- mərifətdən söhbət düşəndə,
Görərsən yamacdan, yaldan danışar (15, s.22).

**Yamaqlı torba** - dərdə dəyməyən bir şey, aldadıcı bir söz.

Burax görüm əmi, sən lap qəmişliğa keçdin,
Apar vur öz başına, bu yamaqlı torbanı (168, s.144).

**Yaman günün ömrü az olar** – gərək naümid olmayasan.

Düşdü qılınc kimi ortadan Araz,
Fəqət günün ömrü çox olmaz (337, I, s.33).

**Yaman yerdə axşamlamaq** - çətin vəziyyətə düşmək.

Sən de görək, mənə papiros verərsən, çünki qağa, yaman yerdə axşamlamışam (9, s.103).

**Yaman yeyənin olsun, yaman deyənin olmasın** - bir adamın arxasınca danışsan, o adam haqqında fikir dəyişər.

**Yanağından qan damır** - sağlam, gümrah, dağ adamı.

**Yanan yerdə ot bitməz** - birinin qol-qıçı sınsa, ürəkdən çətin şad ola.

**Yana-yana qoymaq** – düşmənə qalib gəlmək, çox həsrət çəkmək.

Məni qoyub yana-yana,





Sallanıb gəzənim getmiş (35, s.478).

**Yan baxmaq** - ayrı -seçkilik qoymaq, əyri baxmaq.

Tale mənə yan bakıyor,
Həm gülümsər, həm ağlıyor (Cavid).
Mənə yan baxsa əgər anlamayan,
Sanma eylər buna ruhum üsyan (75, S.38).

**Yandı-qındı vermək** - acıq vermək.

Arzu göz qalmış idim öz ana yurdum vətənə,
Yandı-qındı verir indi ana yurdum da mənə ( 178, s.224).

**Yanıb kabab olmaq** – çox təsirlənmək.

Qəmli övrətlərin nəvasından
Eşidənlər yanıb kabab oldu (267, s.325).

**Yanıqlı səs** - dərdli, təsirli səs.

C.Məmmədquluzadənin kamançada çaldığı son hava o dərəcədə təsirli və yanıqlı idi ki, adamın ürəyini yandırırdı (197, s.189).

**Yanıram tüstüm çıxmır** – içimdə dərdim çoxdu, bilinmir.

İçəridən alışıb yanıram. Tüstüm çıxmır, boğuluram (1, c.II, s.365).

**Yan gözlə süzmək** – saymamaq.

Anlayanlar belə yan gözlə süzər,
O baxışlar məni üzdükcə üzər (75, c.IV, s.338).

**Yan gözü ilə baxmaq** - saymamaq, adam yerinə qoymamaq.

**Yan keçmək** -görməməzliyə vurmaq, yad kimi nəzərə almaq.

Çərxi-fələk gör nə günə qalmışam,
Yapalaq bəyənmir, sar da yan keçir.

**Yanmayanda yanmaz ,istər püflə, istər ətəklə** - iş düz gəlməyəndə nə etsən, xeyri yoxdur.

Yanmasa yanmaz, püflə ya vur ətək (168, S.392).

**Yansan yan, donsan don** – əlindən gələni əsirgəmə.

Gözün çıxsın vermərəm bir qranı
Yansan yan, donsan da don, Səfərəli!

**Yan seçmək** – saymamaq.

Xeyir-şərdə kasıbı yan seçərlər,
Salam versə, kölgəsindən keçərlər (32, c.II, s.38).

**Yansın çırağın, gəlsin işığın** - sənin sağlamlığını xoşbəxtliyini istəyirəm, heç bir umacağım yoxdur.

**Yanşaq it kimi hürmək** - çox deyinmək.

Hələ burada oturub bir neçə gün də yanşaq it kimi hürəcək (129, s.174).

**Yapma adam** –çirkin.

**Yaralı barmağa işəməz** - heç kimə fayda verməyən.

**Yaranın açılması** – dərdin təzələnməsi.

Biz burda xəstəydik,
Bilmədik ancaq
Vyetnamda açıldı yaramız bizim (328, s.348).

**Yaranı deşmə** - dərdimə, acı xatirələrimə toxunma, ağzımı açma, ta etdiyin pis işlərdən danışam.

**Yaranın közmələnməsi** - dərdin yavaş-yavaş yaddan çıxması, aram olmaq.

Dedi oxu, oxu ey gözlərimin ağ-qarası,
Mən oxuduqca onun közmələndi dil yarası ( 352, s.460)

**Yaranın qövr etməsi** - köhnə dərdin təzələnməsi.

Hanı o Nuh, su üzündə dövr etdi,
Hanı Əyyub yaraları qövr etdi (97, s.62).

**Yarıcan olmaq** - xəstə düşmək, sağlamlığını itirmək, həsrətdən, nigarançılıqdan sağlamlığını itirmək

O biri gün də çıxıb gedərsən Gəncəyə, ordan da Qubaya, yarı canım qalacaq yanında (1, s.170).

Div o qədər sordu ki, qız yarımcan düşdü (148, s.97).

Yarı canım bu tayında Arazın,
Yarı canım yanındadır Şəhriyar (264).

**Yarıdıq, yaza çıxdıq** – işlərimiz düzəldi.

Yarıdıq, yaza çıxdıq (335, s.71).

**Yasar adam** - qorxaq, səfeh.

**Yastığın yüngül olsun** - xəstəyə şəfa arzulamaq.

**Yastı-yastı danışmaq** - qəti söz deməmək.





**Yas yiyəsi ovunub/kiriyib, yasa gələn ovunmayıb/ kiriməyib** - kasanın aşdan isti olması, birinin yalandan canıyananlıq göstərməsi.

**Yaşa dolmaq** – sinni keçmək, ahıl.

Nəsiminin bütün ömrünü pirlərdə, ibadətgahlarda keçirib yalnız yaşa dolduqdan sonra Bakıda oturuşmuş atası Seyid Məhəmmədin mülkü (144, s.128).

**Yaş da qurunun oduna yanır** - günahsız bir adam birinin xatasına düşür.

Demə quru çatır ocaq,
Yaş da oda yanır nahaq (325, s.34).

**Yaşı at bazarında soruşarlar** - insanın dəyəri yaşda yox, onun bacarığında, bilgisindədir.

**Yaşı nə, başı nə?** - təcrübəsiz, yaşı az.

**Yaş odun satmamışam ki** - birini aldatmamışam, günah etməmişəm.

**Yaş yuyub quru sərib** - biabır eləyib, hörmətdən salıb.

Dərsə bir müəllim gəlib, səni yaş yuyub, quru sərib (84, s.121).

**Yatan ölməz, yetən ölər** - əcəl xəstəliyə, sağlamlığa baxmaz.

**Yatma, qaçarsan** - ömrünü hədər etmə, sonra peşiman olarsan.

**Yavan aş içmək** - bir adam işləyə bilməsə belə deyərlər, yəni gücsüzdü, tərpənə bilmir.

**Yaytək sıxılıb, oxtək atılmaq** – ağrıdan qıvrılmaq.

Başında ağrının artdığını hiss edən kimi ipək yorğan-döşəyin arasında yay tək sıxılıb oxtək atılırdı (144, s.88).

**Yazan sən, pozan sən** - hər şey sənin əlindədir.

Yazan sən, pozan sən,
Kim deyir yalansan, hər zad sənin əlində.

**Yaz buludu kimi ürəyim doldu** - həsrətdən kövrəldim.

**Yaz buza, qoy günə** - Kərkük türkləri „yaz divara, qalsın bahara" şəklində işlədir. Biri-birinin borcunu vermək istəmədikdə belə deyir.

Demə buza yazılır sözlərim, ucuzdur hədər
Yozar mənim yuxumu bir zəmanə bu sözlər (80, c.II, s.184).
Bilən dedi: qəm nişanın bil yenə,
Yalqız, bala, sən yaz buza, qoy günə (338, s.141).

**Yaz əkinçi, qış dilənçi** - çox çalışıb, az yemək, zəhmət çəkməyinə baxmayaraq gün çörəyinə məəttəldi.

Özünüz də yaz əkinçi, qış dilənçi (129, S.318).
Qara gəldi ruzgarımız,
Talan oldu hər varımız,
Yaz əkinçi, qış dilənçi
Yenə boşdur anbarımız (337, c.I, s.34).

Ələştər böyük bir nahiyə idi, əhalisi məxsusən kəndlilər necə demişkən, yaz əkinçi, qış dilənçi idilər (281, s.90-91).

**Yazın oğlan çağı** - yazın lap gözəl vaxtı.

Yazın lap gözəl vaxtı idi (201, S.22).

**Yazısı tərs yazılmaq** – taleyi uğursuz.

Yazım tərs yazılıb qəza vurubdu,
Keyik bilib xan Kəlbini öldürdüm (103, s.18).

**Yazıya pozu yoxdur** – fatalistlərin inamına görə, insan doğulanda taleyi alnına yazılır.

Səksən yaşlı qocalara baxıb öz-özümə deyirəm Murtuz da yaşasaydı.. Ay oğul, yazıya pozu yoxdur (1, s.129).

**Yeddi aylıq deyilsən ki?** - niyə səbir etmirsən?

**Yeddi canlı** - canı möhkəm.

**Yeddidən yetmişə** - hamı, uşaqdan böyüyə.

Xalqımız bunu da unutmayacaq ki, Şuşanın ikinci müharibəsində müsəlmanların yeddi yaşdan yetmiş yaşına qədər qocaları silah işlədib erməniləri müqavimətdən aciz qoyurdular (232, s.74).

**Yeddi dərənin suyunu bir-birinə qarışdırmaq** – əsl mətləbdən uzaqlaşıb hər şeyi bir-birinə qatmaq.

- Onlar, müsəlman ağıçıları, yeddi dərənin suyunu bir-birinə qatandırlar, ha! (253, s.114).





**Yeddi qara kağız, yeddi bəd xəbər** - yeddi rəqəmi türk mifoogiyasında mənfi və müsbət baxımdan on qüdrətli rəqəmdir. Yeddi qardaş, yeddi qat, ölünün yeddisi və s.

Ümmanlar qədərdi kədərin sənin,
Yeddi qara kağız, yeddi bəd xəbər (48, s.86).

**Yeddi qatından keçmək** - dərin təsir etmək, yandırıb yaxmaq.

Bu fikirlər necə deyərlər İskəndərin yeddi qatından keçir, onu sarsıdır (E.Əlibəyzadə).

**Yeddi qələm bəzənmək** - Azərbaycan ənənəsində yeddi qələm bəzənmək gözəlləşmək deməkdir.

Bəzənibsən yeddi qələm,
Bürünübsən şalı, Göyçək! (14).

**Yeddi löyün/ çərşənbə yemişi girdəkansız, badamsız** - bir zad üçün lazım olan mühüm şeylərin olmaması.

Çərşənbə yemişinə Təbrizdə yeddi löyün də deyilirmiş. Fındıq, püstə, kişmiş, meviz, əskəri, səbzə, dizmarı, hüseyni, basdıq, xurma, sucuq, əncir, iydə, armudun yaxud hulunun içinə çəkər və badam unu doldurulub qurudulmuşu. Yeddi löyün isə duz, sikkə, balıq, güzgü, sarımsaq, sumaq, səmənidən ibarətdir.

Yetişdi axır çərşənbə hazır eyləməli,
Bərayi yeddi ləvün bir tümən, Məhəmmədəli (301, s.155).

**Yeddi mərtəbəli söyüş** – ağır söyüş söymək.

Söyüşün yeddi mərtəbəsini birnəfəsə çıxdım, liftsiz, zadsız (9, s.145).

**Yedək çəkmək** – hörmət göstərmək, qulluğunda durmaq.

Qabağınca neçə yedək çəkilə,
Səni görcək xanzadələr çəkilə.

**Yediyi çörəyə dal çevirmək** –nankorluq.

İnsafı danana aman verməmək,
Yediyi çörəyə dal çevirməmək (328, s.320).

**Yediyi, içdiyi zəhrimar olmaq** – rahat olmamaq, ağır vəziyyətdə yaşamaq.

Döyünən qəlbinə köksün dar oldu,
Yediyin, içdiyin zəhrimar oldu (337, c.I, s.33).

**Yediyini yel aparar** - kökəlməz.
**Yediyin yağlı fətirin yeri göynəyir?** - xoş günləri əldən verib onun xiffətini çəkən adama deyirlər.
**Yekan bəyi** - özünü böyük bilən, fors satan.
**Yekəbaş** - anlamaz, dərrakəsiz.
Adətdir marala gülər qurbağa,
Maral qurbağa tək yekəbaş deyil.
**Yekə gözün işığı olmaz** - axtardığı şeyi tapa bilməyən adama deyərlər.
**Yekə həngamə** - çox hadisə baş verib.
Xurşid- yekə həngamə olubdur, biz bilməmişik (72, c.III, s.118).
**Yekə tikə boğazı yırtar** - adam gərək tamahkarlıq etməyə.
**Yekə-yekə danışmaq** - özünü öymək, lovğalanmaq, kiçik uşağın və ya yaşlı adamın böyük iddiası.
Mən ölüm, Həsənəli, yekə-yekə danışma. Əgər sən kişi idin, binəva Süleymana vaxtında patron yetirə idin, darda qalmaya idi.
Əyə, sən kimsən ki, mənim qabağımda belə yekə-yekə danışırsan? (174, s.16).
**Yel alıb aparmaq** – puç olmaq.
Atalar yurdunu viran etmişdik,
O viran binayı yel aldı getdi (165, s.174).
**Yel atına minmək / yel kimi gəzmək** - vaxtı boşuna keçirmək, fikir etmədən gəzmək.
**Yel əsib, qoz tökülüb?** - burda nə var?
**Yelə vermək** - hədərə vermək, puç eləmək.
Şah qafil yaşasa xalqdan,
Zövq alsa ancaq eyşü-işrətdən,
Dövlətin əsası verilir yelə ( Qüdsi).
**Yel gətirəni sel aparar**- zəhmətsiz qazanılan şey tez əldən çıxar.
"Yel gətirəni sel aparar"- dedi.





**Yel hayandan gəlsə, o yana çönmək** - çörəyi gün qiymətinə yemək.
**Yel qabağında kəpənək** - böyük qüdrətlərin qarşısında sayılmayan bir adam, özündən böyük, gücü çatmayan biri ilə üzbəüz olmaq
Sağ-sol yuxarım dal-qabağım pul,
Pulsuz kişi meh-yel qabağında kəpənəkdi (168, s.714).
**Yelli** – sürətlə, qəzəblə gəlmək.
Pah atonnan, zalım balası, gör nə yelli gəlir (9, s.128).
**Yellə gələn sellə gedər** – fırıldaqla gələn fırıldaqla gedər.
Yellə gələn sellə gedər (129, s.419).
**Yel olub yanından ötmək** – heç nə edə bilməmək.
Vu adə, dəlisən nəsən, kim cürət edib Xanmirzə bəyin yanından ötə bilər (335, s.190).
**Yel tozuna çatmamaq** - ən yeyin, sürətli.
Dağ dərədə yel tozuna çatammaz,
Əgər atın beli üstə yata, türk (299, s.28).
**Yel vurub yengələr oynayır** – xaraba qalmaq.
Metro, lift yox idi, konka var idi, yel vurub yengələr oynayardı (9, s.127).
**Yemə, içmə xəttü xalına, gül camalına tamaşa elə** - çox gözəl oğlan, qız.
Yemə, içmə xəttü xalına, gül camalına tamaşa elə (148, s.59).
**Yeməmiş, gəyirmə** - bir işi görməmiş niyyət eləmə.
Ay Ərəbzəngi, yeməmişdən gəyirmə, hələ nə mən sənin gücünü görmüşəm, nə də sən mənim gücümü (35, s.255).
**Yeməyən qurd barama sarımaz** / bağa baxsan bağ olar, baxmasan dağ olar
- bir şeyə baxmasan məhsul verməz.
**Yemi artıq düşmək** –qudurub.
Haqqa deyiblər: deyəsən sənin,
Yemin bir balaca artıq olubdur (328, s.351).
**Yemişəm min tümənivi** - malını yemişəm belə məndən inciksən? Niyə bəs qaşqabaq sallayırsan?

**Yendirmək** - saymaq, adam yerinə qoymaq.

Ay qız, təmiz danış, sən nə yekə adamsan ki, mənə yendirmirsən? (46, s.299).

**Yenə də həmin su, həmin dibək** - heç nə dəyişməyib.

Bu günlər aldığım məlumata görə, yenə də həmin su həmin dibəkdir, kənd məktəblərini yenə də məhsul yığılmasına cəlb edirlər (328).

**Yengim ye dünyası** - insanın şəxsiyyətinə, düşüncəsinə yox, onun paltarına, var-dövlətinə hörmət qoyurlar.

Tutub hər yanda yerin zabitənin rabitələr,

İllah İranda bu qanundur ki, yengimye mənim! („Çığır bağır", s 110).

**Yengəsi gülüm olanın başına külüm olar** - bir adam kiminlə hansı işi gördüyünü bilməsə, bütün zəhməti hədər gedər.

**Yer ayrılsa, yerə girərdim** - çox xəcalət çəkmək, utanmaq.

**Yer bərk olanda öküz öküzdən görər** - şərait çətin olanda adamlar bir-birindən görür.

Məsəldi yer ki bərk oldu öküz öküzdən inciyər,

Hey dartılır ipin qıra, yoldaşıyla bir savaşa. (306).

**Yer eləmək** - bir yerdə özünə yer tapan kimi başqalarını bəyənməmək; pis təsir eləmək, bir sözdən bərk narahat olmaq.

**Yerə batasan** - pis işə görə qarğışdır.

**Yerə girmək** - xəcalət çəkmək, utanmaq.

**Yerə göyə zəncir salmaq** – şuluqluq eləmək, hər şeyi bir-birinə vurmaq.

**Yerə qulaq asmaq** – yatmaq.

**Yer- göy qaçır** - hər şey bir-birinə dəyib.

Bir uşaqlıqda xoş oldum, o da yer göy qaçaraq,

Quş kimi dağlar uçub yel kimi bağlar keçdi (306, s.179).

**Yeri dar etmək** - mane olmaq, çağırılmamış yerə getmək.

Saz-söz əhli arif olar bilginən,

Çağırılmamış yeri dar eyləməyin (Aşıq Nabat).





**Yeri göyü bir-birinə düyünləmək** - hər şeyi bir-birinə qatmaq, qeyri-mümkün işlərlə məşğul olmaq.

**Yeriməmiş yüyürür** - cahil adamlar kimi bir zaddan başı çıxmasa da özünü alim başçı adlandırır.

**Yerim yerdə yandı, göyüm göydə** - haqsızlıqla üzbəüz olmaq, bir sözün çox pis təsir etməsi.

**Yerin damarın qırmaq** – yolun çoxunu getmək.

Oğlan bərkitdi çarıqların dabanın, qırdı yerin damarın, az getdi, çox getdi ta ki Abşerona çıxdı (148, S.116).

**Yerində donmaq** – mat qalmaq.

Qardaşlar yerlərində donub qaldılar. Handan hana böyük qardaş ona baxıb dedi (148, S.117).

**Yerindən durana qədər daş daşdan ayrılır** – ərincək, ləng adam.

Amma bu elə ərincək idi ki, yerindən qalxınca daş-daşdan ayrılırdı (46, s.213).

**Yerindən oynamaq** - təslim olmaq, boyun əymək, həyatı dəyişmək.

**Yerində oturmaq** - xalqa ehtiram qoymaq, qanuna riayət eləmək.

Biz bunu açıqca deyirik: əgər jandarm rəisləri başladıqları cinayətlərdən əl götürməsələr, əgər dövlət məmurları yerlərində oturmasalar, xalq özü qalxar, onları öz yerində oturdar (Pişəvəri).

**Yerini acı eləmək** – bir hərəkəti, sözü ilə gələcəkdə vəziyyətini pisləşdirmək.

Rəis müavini onun işdən çıxarılma məsələsini qaldırsa, yerini acı eləyər (1, s.351).

**Yerini eləmək** - lazım olan bir şeyi soraqlaşıb tapmaq.

Rüstəm bəy, hə yadıma düşdü, dəvə yunu tapşırmışdım, heç yerini eləyə bildin?

**Yeriyirəm ayağıma minnət, - deyirəm dilimə minnət** - dilimə zor gətirincə ayağıma minnət edib öz işimi görürəm.

**Yer qulaqlıdı** – hər sözü eşidən olar, sirr bir gün açılar.

Bax ha, yer qulaqlıdı...(296, s.282).

**Yerlə bir eləmək** - birini rüsvay etmək, bir yeri viran qoymaq.

**Yerli yerində** -qayda-qanunla.

**Yersiz gəldi, yerli qaç** - nankor, yaxşılığı itirən.

İndi mən sahibəm, mən bu ocağa,
İşə bax!
Yerliyə yersiz qaç dedi (328, s.303).

**Yer yatağı ilə** - ətraflı, təfərrüatı ilə, dəlil və sübutla.

Qonşu and-aman eləyir, hal-qəziyyəni yeri-yatağı ilə danışır (103, s.9).

**Yer yiyəsiz qalanda donuz təpəyə çıxar** - bir ölkədə ləyaqətli adamlar iş başında olmasa, ləyaqətsiz adamlar iş başına keçər.

**Yetənə yetir, yetməyənə bir daş atır** – hamıya əziyyət vermək.

Yetənə yetir, yetməyənə bir daş atır (72, c.III, s.97).

Yetdiyinə yetib yetmədiyinə bir daş daş atan dəliqanlı kimi görmüşdü (142, s.9).

**Yetən gedər, yatan getməz** - ölüm xəstəliklə deyil, əcəllədir.

Qaldı arvadın məsələsi, yetən gedər, yatan getməz (84, s.72).

**Yetim cib** - pulsuz, işsiz, gəliri olmayan adamın cibi.

Yan ciblərin qapısını açıb baxdı,
Əlsiz-qalan yetim cibi (283).

**Yetim doyuran** - lap böyük stəkan, qazan, qab.

Bu adamın boğazını da yaşlamaz ki..(335, s.187)

**Yetim əlində qoğal əcaib görünər** – kasıbın hər şeyini söz edərlər.

Nədi ki, yetim əlində qoğal əcaib? (9, s.65).

**Yetimin qarnı doyar, gözü doymaz** – görməmiş adam acgöz olar.

Yetimin qarnı doyar, gözü doymaz. (84, s.367).

**Yetim quzudan qoç olmaz** - ata-ananın uşağın igid və sağlam olmağında böyük rolu.





**Yetim quzu kimi mələmək** – ürəkdən ağlamaq, bir şeyi istəmək.

Nazlı da qalıb indi yetim quzu kimi mələyə-mələyə (9, s.178).

**Yetimsən, qıvrıl yat** – imkanın yoxdu, hər şeyə qane ol.

Bu sözü qatlayıb döşəyin altına qoysun, yetimdir qıvrılsın yatsın, hər kəsin öz tay- tuşu var (46, s.97).

**Yetmiş qarın** - nəsilbənəsil varlı ailə.

**Yeyərsən qaz ətini, görərsən ləzzətini** – başına gələr, görərsən.

Yeyərsən qaz ətini, görərsən ləzzətini(129, S.37).

**Yeyib üstündən su içmək** - mənimsəmək.

Rzaqulu diri-diri yeyəcək Çopur Abdullanı, üstündən də bir dolça sərin su içəcək (1, s.14).

Tüncünü də onlar yesin, üstündən də su içsinlər! (253, s.373).

**Yeyin gedən tez yorular/ tələsən tərsə/ təndirə düşər** - ictimai məsələləri nəzərə alaraq bu deyimi işlədirlər ki, hər bir ictimai dəyişiklik uzun proseslərdən sonra baş verir.

**Yığır çinədanına** - sözü yığıb birinə xəbər vermək.

**Yığvalı yeyin** – taleli.

Gözün aydın olsun, ay Göyçək, yığvalın yeyindi (103, s.47).

**Yıxılana balta vuran çox olar** - birinin işi əskik olsa, dünən yaltaqlıq edənlər də ona qarşı çıxarlar.

Yıxılana balta vuran çox olar (9, s.158).

**Yıxılı evin dirəyi** - yaxşı arvad haqqında işlənir.

A yıxılı evin dirəyi, harda qalmısan? (84, s.177).

**Yırtıq böyük yamaq kiçik** - xərc gəlirdən çox.

**Yoğunamaq** - ciddiləşmək.

Hüsən anlayırdı ki, iş yoğunuyacaq (84, s.47).

**Yoğurmadım, yapmadım, hazırca kökə tapdım** - əziyyət çəkmədən naz-nemətə sahib çıxmaq.

Yoğurmadım, yapmadım, hazırca kökə tapdım (335, s.61).

**Yoğurtdan qılı çəkmək kimidir** - bu işi yerinə gətirmək mənim üçün çox ağırdı.

**Yoğurt qurtulandan sonra batman alan çox olar** - iş-işdən keçəndən sonra müştəri çıxan çox olar.

**Yoğurt tökülsə yeri qalar, ayran tökülsə nəyi qalar?** - varlı, mərifətli adam nə qədər yaman günə düşsə bir şey qalar, özünü itirməz, mərifəti, ağalığı qalar.

**Yola düşmək** - işin yol-yöndəmini ələ gətirmək, işin düzəlməsi.

**Yola getmək** – dil tapmaq, anlaşmaq.

Duyğuları, ağrıları ovutsun,
Necə gedim öz-özümlə yola mən (328, S.225).

**Yol azmısan?** - nə yaxşı bizə gəlmisən?

**Yol böyüyün su kiçiyin** - öz yaşına görə hamıya sayğı göstərilməlidir.

"Yol böyüyün, amma su kiçiyindir" (328, s.321).

**Yolçuluğa gedən çölməyini dalısında tutmaz** - bir işin arxasınca gedəndə o yolda hər şeyi qəbul etmək lazımdır.

**Yolçunun paydan küsməsini görməmişdik/** xan verən atın dişinə baxmazlar - hədiyyə hər necə olsa, qəbul eləmək lazımdır.

**Yolçu yolda gərək** - bir işə qərar verirsənsə, gərək həmişə onun dalısını tutasan.

**Yoldan azmaq** –düzlükdən üz döndərmək.

Məni bu qəzetçi aldatdı, yolumdan azdım,
Öz əlimlə özümə çahi-bəlanı qazdım (72, c.III, s.238).

Allah sizi heç bir zaman düz yola dəlalət etməsin, məni yolumdan azdırdınız (234, s.503).

**Yoldan azmış** – qudurmuş, əyri yola gedən.

Din və Allah yolundan azmış sultanı altı ay himayə etdiklərinə görə və İsfahana peyğəmbərin bayrağı ilə gələn orduya təlavət verdiklərinə görə bu qurban bayramı günü isfahanlılar Əmir Teymurun hər əskərinə bir qurban verməli idilər (144, s.56).





**Yoldan çıxanı yol vurar** - düz yola getməyən axırda cəzasın alar.

**Yoldan keçənə yumaq səritdirir** - hər bir fürsətdən öz xeyrinə istifadə edir.

**Yoldan qalmaq** – geri qalmaq.

Yoldan qal, yoldaşdan qalma (168, s.10).

**Yoldan yola dönmək** – tez-tez fikrini dəyişən.

Göz yolda, ayaq yolda, ürək yarda əmanət,
Yoldan yola döndüm, dəxi, yollar da yoruldu (155, s.29).

**Yol kəsmək** – soyğunçuluq, mane olmaq.

**Yolları yollara yamamaq** –keşməkeşli yollar keçmək.

Keşməkeşli yollardan keçdim. Yol Azərbaycan ənənəsində inam, sənət-peşə simvoludur.

Vüsal həsrətiylə Araz boyunca,
Yolları yollara yamayan canım! (264, s.78).

**Yolu kəsmək** - yola davam etmək.

Məndən eşitsən gecə ikən yolu kəs, get (203).

**Yoluq qarğa** – arıq, çılpaq adam.

**Yolun damarını kəsmək** – yolun çoxunu qət etmək.

Yel kimi yolun damarını kəsə-kəsə gedib bir vağzala çıxdı (148, S.117).

**Yolunu boş qoymamaq** – ideyasını davam etdirmək.

Sən bir dava ver, biz də sənin yolunu boş qoymarıq, hərdən bir yağdan, şordan gətirərik (195).

**Yol ölçmək** - boş-boş gəzmək, o yan-bu yana qaçmaq.

O qədər malı bazardan bura kürəyində daşımaq üçün gərək səhərdən axşamacan yol ölçsün (269, s.172).

**Yolsuz** - heç bir inama, fikrə bağlı olmayan.

Olmasaydı o yolsuzun dərdi,
Məni Bağdada kim sürüklərdi? (75, s.97).

**Yolunu gözləmək** - birini görməkdən ötrü intizar çəkmək.

**Yolunu kəsmək**- maneə törətmək, birini görməkdən ötrü intizar çəkmək.

**Yolunun üstündə çəpər olmaq** – maneə törətmək.

Yolumun üstündə bala bir çəpər

O tərəfdə arzum, bu tərəfdə mən (328, s.288).

**Yol uzunu** - başlanışdan sona çatana qədər.

**Yorğan davası** - bu hay-küy hamısı bizim başımızı qatmaq, konkret bir məqsəd üçündü.

Dedi: yorğan üçün imiş bu təlaş,
Yorğanı qapdılar, kəsildi savaş (267, s.388).

**Yorğanı qalın** - varlı-karlı, qohum əqrəbalı adam, sirri öz içində qalan.

**Yorğan savar** - Xoy Makudan, Güneydən, Urmiyaya üzüm dərməkdən ötrü yorğanlarını bellərinə bağlayıb gedənlərə deyirdilər.

**Yorğun eşşək, hoş məəttəli** - tənbəl adam işləməkdən boyun qaçırmağa bəhanə axtarır.

**Yorğun eşşəyə gülmək** - birinin ağır vəziyyətinə, uğursuzluğuna həqarət etmək.

**Yudu, arıtdı qoydu kənara** - birinin pis işlərini haqlı sözlərlə üzünə demək.

**Yuxarı tüpürürəm bığ, aşağı tüpürürəm saqqal** - çıxılmaz vəziyyətdə qalmaq, iki tərəfdən də keçə bilmirəm, odla suyun arasında qalmışam, iki tərəf də mənim yaxın adamımdı.

Yuxarı tüpürürəm bığdı, aşağı tüpürürəm saqqal (335, s.76), (9, s.100).

**Yuxarıdan aşağı baxmaq** - saymamaq, adam yerinə qoymamaq.

Onun ucbatından hamı mənə yuxarıdan aşağı baxır (84, s.121).

**Yuxa ürək** - həssas, kövrək.

Axı padşah yaman yuxa ürək padşah idi (9, s.80).

**Yuxudan baş qaldırmaq** –bir vəziyyətdən oyanmaq, ayılmaq.

Ağ gündən müjdələr vermədi sana,
Yatdığın yuxudan baş qaldırsana (337, c.I, s.33).

**Yuxusu ərşə çəkilmək** – yata bilməmək.





Yuxusu ərşə çəkilmiş qocalarla bərabər cavanlar da, mələk, huri timsalında zər-zibalı gözəllər də gəlirdilər (144, s.47).

**Yuxusunu almaq** - yatıb dincəlmək.

**Yuxuya haram qatmamaq/ yerişə haram qatmamaq** - çox rahatlıq sevən adam, adi yuxusunu, yerişini dəyişməyən adam.

Gecə-gündüz müharibə yerdə göydə tapdı davam,
Vətən oğlu, vətən qızı yuxusuna qatdı haram (373, s.27).
Yuxusuna qatıb haram, bir qız dedi aram-aram (Gilani)

**Yuxuya daş bağlamaq** – oyaq qalmaq.

Lay-lay quzum ağlama,
Ürəyimi dağlama,
Yat, yuxun şirin olsun,
Yuxuma daş bağlama (38, s.112).

**Yumaq kimi büzüşmək** – qol-qanadı sınmaq.

Bayaq o adamlar ki, dayanmışdı dağ kimi,
Sükutun siqlətindən büzüşdü yumaq kimi.

**Yumruğunu batman bilir** - özündən güclü adam bilmir.

El yumruğunu görməyən öz yumruğunu batman sayar.

**Yumruq sıxmayan** - düşmənə qarşı üsyan etməyən, mübarizə etməyən, qorxaq.

Bir ölkə ki, səsi- ünü çıxmaya,
Haqsızlığa qarşı yumruq sıxmaya,
O bir məzarlıq ki, görənlər şaşar,
İçində həp canlı ölülər yaşar (145, s.304).

**Yumurta alsan, sarısı çıxmaz** - xeyir verməz, şarlatan.

**Yumurtadan çıxan** - təcrübəsiz, uşaq.

Buzbulağın təzə yumurtadan çıxanları.. xiyarlığa arabir möhkəm divan tuturdular (118, s.257).

**Yumurtadan yun qırxan** - xəsis, tamahkar.

Yumurtadan yun qırxan (21, s.142).

Özün öz başına açmısan oyun,
Qırxmaq istəyirsən yumurtadan yun (264, s.114).

**Yumurtamadı, falı da içdi** - xeyir vermədi, mayanı da yedi.

**Yumurtanı/fındığı düyünlə buna söz qandır** - bir şeyi başa salmaq çox çətindir, anlamaz.

**Yumurtanın sarısını bu gün, ağını sabah yeyir** - mal sevən, xəsis.

**Yumurtanı suda qızdırmışam?** - hörmətsizlik, pislik eləmişəm?

**Yumurta pulu / çay pulu** – rüşvət.

Yazıq günə salınmış dövlət məmurları günün günorta çağı yumurta pulu, çay pulu adı ilə soyğunçuluq edirlər.

**Yumurtasına görə qaqqıldamamaq** - imkanından, ləyaqətindən yuxarı, iddialı.

**Yumurtası tərsə düşmək** - vurnuxmaq, narahat gəzişmək.

Alə, sənə nə olub, yumurtası tərs düşmüş toyuq kimi yerində vurnuxursan? (1, s.114).

**Yumurtaya qulp qoymaq** - sözbaz, irad çıxardan.

**Yumurta yükü daşır** - çox ağır gündə yaşayır, borca, ağır işə düşüb.

**Yurt yiyəsiz qalanda donuz təpəyə çıxar/** Dərə xəlvət tülkü bəy - alçaq adamların böyük yerlərdə oturması, düşmənin bundan istifadə edib o ölkəyə sahib olması.

**Yuyub arıtmaq** - birinin eybini üzünə demək, birini haqsız danlamaq.

Əlinə bir qalıb sabun alaraq,
Hey məni danladı, yudu, arıtdı (291, s.57).

**Yuyulmamış qaşıq kimi özünü ortaya atma** - sənə dəxli olmayan işə qarışma.

**Yuvarlanan daş yosun tutmaz** - işlənən dəmir paslanmaz, çalışqan adam sağlam olar.

**Yuvanı dağıtmaq** - ailəni bir-birinə vurmaq, ailədən ayrılmaq.

**Yuvası dimdiyindədir** - heç nəyi olmayan, köçəri, yoxsul.

Köçəri quşlar dönəndə,





Yuvasını dimdiyinə taxıb gedən
Quş da dönəcək ( L.Cavanşir).

**Yuvasından oynatmaq** – didərgin salmaq.

Aramsız çaxnaşmalar zəmanəsi tezliklə onu da öz yuvasından oynatdı (144, s.49).

**Yüksək olma, təpə-təpə yerə endirərlər, alçaq olma, basa-basa yerə keçirərlər/ Müşəklə adamı göyə qaldırıb çətirsiz yerə vurarlar** –hədsiz təkəbbür, həm də hədsiz sadəlik ziyan gətirər. Öz yerini tanı.

Yüksək olma, təpə-təpə yerə endirərlər, alçaq olma, basa-basa yerə keçirərlər (229, s.15).

**Yükü əyilmək** - birinin durumunun pisləşməsi.

Mərdin yükü əyilsə,
Namərd vurar adamı (158).

**Yükünü tutub** - yaxşı var-dövlət yığıb, mənfi mənada oğurluqla, əyri yolla var- dövlət toplayan.

Dedi: vallah, bu işi sanma ki pünhan görürəm,
Hamı tutmuş yükünü, sən kimi sohman görürəm.

Şah və xanədani- Pəhləvi qabaqdan yüklərini tutub ortadan çıxmışdılar (281, s.114).

**Yük-yapın çatmaq** - yola, köçə, işə hazırlaşmaq.

Nə yaman yerdə köçdü karvanımız,
Nə yeyin yük-yapın da çatmış idi (306, s.181).

**Yüngül adam** - şəxsiyyətsiz, fikrinin tez dəyişən, hər bir işə qarışan

Tez coşar yüngül olanlar içiboş sözlərdən (316, s.12).

**Yüngülsaqqal olmaq** – hörmətsiz olmaq, yüngül adam.

Məni elə yellər apara bilsəydi, mən heç yüngülsaqqal olub abi-həyat suyu axtarmağa çıxmazdım (46, s.205).

**Yürük ata baha olmaz** - bacarıqlı və çalışqan adamların zəhməti para ilə ölçülməz.

**Yüyənini qırmaq** - cızığından çıxmaq, həddini aşmaq.

**Yüyürən at özünə qamçı yedirtməz** - işləyən adam danlanmaz.

**Yüz altun danışanı yüz kişi danışammaz** - pul çox böyük qüvvədir.

Pulu qələmə ağacının altına qoysan, əyilib onu götürər (Hüseyn Selablı).

**Yüz arxın suyunu bir arxa qatmaq** – hər şeyi bir-birinə qatmaq.

Bəsdir dözdüyümüz ölümdən betər,
Köhnə bazardakı o köhnə nırxa.
Milləti yüz yerə caladın yetər,
Yüz arxın suyunu qatma bir arxa (52, s.129).

**Yüzbaşının şahidi çavuş olar/ ermənin şahidi üzüm ayaqlayan olar** – hər kəs özünə layiq adamla iş görər. Yüzbaşı, minbaşı Qacarlar zamanına qədər orduda işlənən rütbə adlarıdır. Böyük adamların şahidi onların tabeliyində olanlar olar.

**Yüzə dözən yüz birə də dözər** - çətin şəraitə öyrəşən adam ondan da ağırına dözər.

**Yüz həştad dərəcə dönmək** - mövqeyini tamam dəyişmək.

Kişini yüz həştad dərəcə döndərdim üzü bəriyə (118, 207).

**Yüz kuzə düzəltsə, birinin qulpu olmaz** - yalançıdır, xeyir verməyəndir.

**Yüz mama yığışsa güc doğana düşər** - əsas ağırlıq işin sahibinə düşər.

**Yüz ölç, bir biç** – düşün, sonra bir iş gör.

Pentaqon düşündü
Vuruşdan əvvəl,
Yüz ölçdü bir biçdi, hər şeyi təkrar (328, s. 330).

**Yüzü yüz ayə desən** - sənin sözünü mən qəbul etmirəm.

Odur ki, yüzü yüz desən
Dünyanı, insanı dana bilmirəm.
Baş verən ən kiçik hadisəni də,
Mənasız, səbəbsiz sana bilmirəm (70, s.196).

**Yüz-yüz itən olsun, min-min bitən var** – ölənlərin yerini yeni nəsil doldurur.

Yüz-yüz itən olsun, min-min bitən var (328, s.49).





# -Z-

**Zağ-zağ əsmək** - ən nəhayət dərəcədə qorxuya düşmək.

Qəhrü-xəşmindən onun zağ-zağ əsir qəlbi-hərami,
Başım ondan ucalıbdır dayanıb ərşü-əlayə (N.Şərəfxaneyi, s.470).

Göylərdən ələnən odlu bombalar,
Elə nərildəyir yer zağ-zağ əsir (Saplaq).

**Zaman axtarmaq** - fürsət axtarmaq.

**Zamanın imzası** – zamanın istəyinə uyğun əsər.

Sizin bəstələdiyiniz himni zaman özü imzalayıb.

**Zamanı öldürmək** - vaxtını boş keçirmək, düşmənə bir zərbə endirmək üçün onun başını qatıb fürsət qazanmaq.

**Zart -zurt etmək** - haqsız olaraq qışqır- bağır salmaq, zor demək.

**Zatıqırığın qatı da qırıq olar** -əsli olmayandan yaxşı bir şey gözləmək olmaz.

Zatı qırıq olanın qatı da qırıq olar (131, s.129).

**Zatıqırıq** – utanmaz, əsli-nəsəbi olmayan, qanmaz, etibarsız, adam tanımayan, rəhmsiz, yaxşılığı bilməmək.

Abdulla Qəmbərov zatıqırıq idi (1, s.204).

Öz yavuqlarına pislik çox edər zatıqırıq,
Şəmşirin ilk yarası öz qınına qismət olar (317, s.41).

**Zehni açıq** - mövhumatdan uzaq, aydın fikirli.

**Zehni açılmaq** - bir şeyi dərk etmək; əhvalı açılmaq.

**Zehni durulmaq**- bir xəstənin və ya kədərli adamın təzə şəraitə düşdükdə xoşhal olması.

**Zehni koralmaq** - yorğunluqdan, həvəssizlikdən, fiziki zəiflikdən yaddaşın korşalması.

**Zeynal adamı** - kişi tərəfin qohumları.

**Zeynəb adamı gələr, qapıdan tox gedər, Zeynal adamı gələr, aşpazxanadan ac qayıdar**- arvad öz tərəfinə yaxşı yetişər, kişi tərəfə yox.

**Zeynəb adamı** - Təbrizdə arvad tərəfin qohumlarına deyilir.

**Zəfəran hambalı** - özünü əziyyətə salmayan, yumşaq yerin işçisi.

**Zəfəran tək saralmaq** - ağır vəziyyətdən, həsrətdən, təbii rəng-rufunu itirən adam.

Zəfəran tək məni saraltmışdı,
Kor qəza öz yolun gedən vəqti (306, s.81).

**Zəfərli yer** – bədənin ən vacib yerləri.

Yaxud, Şahqulunun zəfərli yerindən tutmadı, onda bəs necə olsun? (253, s.375).

**Zəhərin tökmək** - intiqam almaq, acıqlı olduğu bir adamdan fürsət düşən kimi intiqam almaq.

**Zəhri yarılmaq** – bərk qorxmaq.

O, qalxmaq istədi, dəmir sarıldı,
Xortdan xəyal edib zəhri yarıldı (74, s.186).

**Zəqqəto** - bir yemək, ya bir dərman həddən artıq acı və ya duzlu olanda işlənir.

**Zəqqəto yaxud, zəqqəm çörək** - acı və keyfiyyətsiz çörək.

**Zəmanə uşağı** - zamanın tələblərinə uyğun tərbiyə almış, köhnə ənənələrdən uzaq.

**Zəncəfil lazım olub** – O gündən ki müctəhid Hacı Mirzə Həsən və başqaları məşrutə ilə düşmənçilik etdilər, şəhərin bir çox əhalisi onların dalısınca düşüb məşrutədən üz çevirdilər. Məşrutəyə ürəklərində kin-küdurət bağladılar. Məşrutəçiləri dinsiz adlandırdılar. Məşrutəçilər öz işlərində irəliləyişi gördükdə parça və ya kağız üstündə "Müstəbidlər, zəncəfil hazırdır!" cümləsini yazıb mağazalarının qabağında asırdılar. Bəzən də zəncəfili boşqabda mağazalarının qarşısına qoyurdular.

Təbrizdə qısqanclığı ürək ağrısı mənasında işlədirlər. Xalqın fikrincə, zəncəfil soyuqdan gələn ürək ağrısı üçün də dərmandır. Biri birinin nailiyyətinə paxıllıq edib qəzəblənəndə belə deyərlər.





**Zəncir gəmirmək** - bir işə hədsiz şəkildə can atmaq, qəzəblənmək.

Aşıq Hüseynin düşmənləri çox idi. Azadlıq düşmənləri bu sazlı, sözlü bahadırın əlindən zəncir gəmirirdilər (324, s.83).

**Zəri yavaş gəl** - bu deyimi qışda toy edənə, çox şuluq edən adam haqqında işlədərlər.

**Zər qədrin zərgər bilər** – yaxşı adamın, hünərli adamın qədrini cahil adam bilməz.

Bizim eldə,
Bizim dildə,
Bir məsəl var:
Bilsən əgər : "Zər qədrini zərgər bilər" (337, c.I, s.30).
Zər qədrin zərgər bilər (335, s.84).

**Zığlı çəmənə qədər qovmaq** - Zığlı çəmən Ərdəbil şəhərinin yaxınlığında bir çəmənin adıdır. Bu şəhərdə ruhi xəstəliyə düçar olmuş bir insan onu dəli adandıraraq həmişə qəzəbləndirməyə çalışan uşaqları Zığlı çəmənə qədər qovarmış. Bu gün bu deyim həqli, haqsız bir adamın axıra qədər öz sözünün üstündə durması zamanı işlənir.

**Zıqqıldamaq** – hey şikayətlənmək.

Zarafat, zarafat, milyonun oldu, yenə zıqqıldayırsan (296, s.197).

**Zınqırovlu ibarələr** - klassik ədəbiyyata tənqidi baxan adamlar bu deyimi yaradıblar.

Və illa idarəmizin şəninə müfəssəl və zınqırovlu ibarələri tərif, təsifləri yazmağa və oxumağa bizim vaxtımız nahaq yerə zaye olur (211, 14 şaban, 1339).

**Zırna çalma** - faydasız danışma, sənə dəxli olmayan işə qarışma. Şəhərlərdə müasir musiqinin dəb olması nəticəsində bir sıra xalq alətləri kimi zurnaya da təhqiramiz münasibət hakim olmuşdur.

**Zırna götə gedəndə çox gedər, pul tutanda az tutar** – dərdə dəyməyən adamdır, əziyyəti xeyrindən çoxdur.

**Zibilə çalmaq** –xataya salmaq.

Özün cəhənnəmə, məni zibilə salarsan ( 296, s.226).

